**Nağdəli Zamanov**

# HEYDƏR ƏLİYEV VƏ AZƏRBAYCAN NİTQ MƏDƏNİYYƏTİ

**"Elm və təhsil"**
**Bakı-2020**

*Monoqrafiya AMEA Nəsimi adına Dilçilik İnstitutu Elmi Şurasının 24 yanvar 2020-ci il tarixli iclasının 1 №-li qərarına əsasən çap olunur.*

Elmi redaktor: **Möhsün Nağısoylu**
*Akademik*
Rəyçilər: **İsmayıl Məmmədli**
*Filologiya elmləri doktoru, professor*
**İsmayıl Kazımov**
*Filologiya elmləri doktoru, professor*
**Qara Məşədiyev**
*Filologiya elmləri doktoru*
**Natəvan Hacıyeva**
*Filologiya elmləri doktoru, professor*
Ön sözün müəllifi: **Nizami Cəfərov**
*Akademik*

**Nağdəli Zamanov**
**Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti (IV kitab). Bakı, "Elm və təhsil", 2020, 544 səh.**

Monoqrafiyanın IV hissəsində Umümmilli Lider Heydər Əliyevin çıxışlarında Azərbaycan xalqının milli ruhunu əks etdirən, nitqin ekspressivliyini yüksəltməyə xidmət edən frazeologizmlər tədqiqat mövzusu olmuşdur. Monoqrafiyada siyasi lider Heydər Əliyev dilində səslənən frazeologizmlər mətnlər əsasında araşdırma mövzusu olmuş, koqnitiv dilçiliyin müasir tələblərinə uyğun olaraq frazeologizmlər müxtəlif üslublarda və istiqamətlərdə tədqiqata cəlb edilmiş, eləcə də bu hissədə Heydər Əliyevin dilində səslənən frazeologizmlərin lüğəti verilmişdir. Monoqrafiya dilçilik, ədəbiyyat, diplomatiya, fəlsəfə, tibb və digər sahələrdə fəaliyyət göstərənlər üçün dəyərli vəsaitdir.

**ISBN 978- 9952-8384-2-8**

# ÖN SÖZ

Azərbaycan Tibb Universitetinin dosenti Nağdəli Zamanovun müəllifi olduğu "Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti" monoqrafiyasının IV cildi oxucuların ixtiyarına verilmək üzrədir. Əgər I cilddə Heydər Əliyevin nitqlərində ekspressivliyi gücləndirən nitq elementləri (səmimiyyət, qətiyyət, nikbinlik, proqnozlar, fəlsəfi fikirlər, poetik duyğular), üslublar (elmi, publisistik, məişət, dini) II cilddə əsas və köməkçi nitq hissələrinin üslubiyyat yaratması, ritorik suallar, antroponimik sıralanmalar, sinonimlər və s. Ciddiyyətlə araşdırılmışsa, III cilddə isə müəllif Ulu Öndərin nitqlərini müşayiət edən etik və estetik mətnləri nitqin təsir gücünü artıran vasitələr kimi tədqiq etməyə müvəffəq olmuşdur. Müəllif haqlı olaraq etika və estetikanı dialektik qanunların şamil olduğu elm sahələri kimi ayırmış, Heydər Əliyev nitqlərinin təsir gücünü artıran etik və estetik elementləri şifahi, spontan söylənilən nitqlərdə aydınlaşdıra bilmişdir. Dosent Zamanov bu cilddə – IV cilddə isə xalqın milli ruhunu əks etdirən frazeologizmləri tədqiqata cəlb etmiş, eləcə də siyasi lider Heydər Əliyev dilində frazeoloji lüğətin tərtibinə nail olmuşdur.

Dosent Zamanov "Heydər Əliyevin nitqində frazeologizmlərin mətndə yeri" fəslində mətnlə frazeologizm arasında daxili dialektik vəhdəti ortaya qoya bilmişdir. Haqlı olaraq qeyd edir ki, bəzən bir frazeologizmin mənası bütöv bir çıxışı özündə əks etdirə bilir. Nağdəli müəllim "Heydər Əliyev xarakteri frazeologizmlərdə" fəslində təsadüfi olaraq qeyd etmir ki, "gələcəkdə frazeologizmlərin araşdırılması yolu ilə yazıçı, şair, ictimai-siyasi şəxslərin xarkterlərinin təyini mühüm olacaqdır". Bu fəsildə Heydər Əliyev nitqində frazeologizm-

lərlə insan şəxsiyyətlərinin, onun tiplərinin oxucunun gözləri qarşısında açılmasını da maraqlı sitatlarla araşdıra bilmişdir.

Müəllif təsadüfən qeyd etmir ki, Heydər Əliyev nitqinin gücü təkcə frazeologizmlərlə məhdudlaşa bilməz ki, bu frazeologizmlər digər nitq elementləri ilə harmoniyada öyrənilməlidir. Eləcə də ədatlar, ritorik suallar, feil şəkilləri, təkrarlar, müqayisələr və s. frazeologizmləri öz əhatəsinə alaraq maraqlı, rəngarəng, auditoriyanı öz cazibəsində saxlayan möhtəşəm Heydər Əliyev nitqi yaradır.

Monoqrafiyanın bu cildində somatik frazeologizmlərə xüsusi yer ayrılmışdır ki, bu mənim fikrimcə müəllifin ixtisasca həkim olmasından, Azərbaycan Tibb Universitetindəki elmi-pedaqoji fəaliyyətindən irəli gəlir. Müəllifin istinad etdiyi ədəbiyyat siyahısına diqqət etdikdə Vətən və xarici ölkə alimlərinin bu sahələrdəki fikirlərinə hörmətin, bu fikirlərə tənqidi yanaşmanın, məhz bu tənqidi yanaşma üsulu ilə Heydər Əliyev təfəkküründən süzülüb gələn nitqlərin araşdırılmasının şahidi oluruq.

Müəllifin feilin lüğəvi mənaları əsasında formalaşan frazeologizmlərlə bağlı yazdığı fəsil də maraqlıdır. Bu frazeologizmlərin yaranma və inkişafı baxımından az maraq doğurmur.

Həcm etibarilə 2000 səhifədən yuxarı, 4 clddən, 60-dan çox fəsil və yarımfəsildən ibarət "Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti" monoqrafiyası ümummilli mədəniyyətimizin mühüm bir qolu olan nitq mədəniyyətinin tədqiqinə və inkişafına mühüm töhfədir.

Qeyd etmək yerinə düşər ki, 2018-ci ildə Nağdəli müəllimin AMEA Folklor İnstitutunun elmi şurasının qərarı və akademik Muxtar İmanovun elmi redaktorluğu ilə "Aşıq Şəmşir yaradıcılığında fəlsəfi fikirlər" monoqrafiyası işıq üzü gö-

rüb ki, bu da müəllifin Azərbaycan folkloruna, Azərbaycan fəlsəfi dünyagörüşünə yaxından bələdliyindən xəbər verir.

İnanıram ki, ATU-nun dosenti, AMEA Nəsimi adına Dilçilik İnstitutunun dissertantı Nağdəli Zamanovun "Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti" monoqrafiyasının IV cildi də elmi ictimaiyyət tərəfindən dəyərli tədqiqat işi kimi qəbul ediləcək. Müəllifin ciddi məsuliyyətlə Heydər Əliyev irsinin öyrənilməsinə xidmət edən bu dördcildlik monoqrafiyası müxtəlif ixtisas sahiblərinin stolüstü kitablarına çevriləcək.

**Nizami Cəfərov,**
***Akademik***

***Müəllifdən***

## BU NECƏ BİR NİTQ?!

Salam, nitqə, danışığa, bəlağətə həmişə yüksək səviyyədə önəm verən Azərbaycan oxucusu! “Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti” monoqrafiyasının I hissəsinin nəşrindən 7 il keçdi! Bu günsə mən sizlərlə IV cildlə, bütövlükdə monoqrafiyalarla bağlı düşüncələrimi bölmək niyyətindəyəm.

Monoqrafiyaların yazıldığı son on il ərzində yaşanılan maraqlı məqamları sizlərlə birgə bölüşmək yerinə düşərdi.

2010-cu il, 2 iyul isti bir yay günü. Şair Mehdixan Kəlbəcərlinin Gəncə Dram Teatrında 70 illik yublieyi keçirilirdi. Çıxışa dəvət olunmuşdum. Çıxış gərginliyi məni çulğamışdı. Bu məqamda beynimdən bir fikir keçir: “Nə olub sənə?! Heydər Əliyev saatlarla rahat, rəvan, həyəcansız danışır ki!”. O vaxt çıxış müqayisəsini mən Azərbaycanımızın çoxsaylı natiq övladları ilə yox, məhz Heydər Əliyevlə apardım. Demək, Azərbaycan natiqlik etalonu sövqitəbii doğru-düzgün seçilmişdi! Sonrakı dövr ritorika ilə bağlı, nitq mədəniyyəti ilə bağlı elmi ədəbiyyat toplamağa başladım və diqqətimi XX əsr Azərbaycan natiqliyində Heydər Əliyevlə bağlı yazılar cəlb etdi.

Bu yolda akademik Bəkir Nəbiyevin redaktəsi ilə işıq üzü görən, Dövlət Mükafatına layiq görülən “Heydər Əliyev və Azərbaycan ədəbiyyatı”, akademik Ağamusa Axundovun “Heydər Əliyevin dili və Heydər Əliyev dil haqqında” eləcə də, professor Nizami Xudiyevin “Heydər Əliyev və Azərbaycan dili” monoqrafiyaları belə bir fundamental elmi-tədqiqat əsərlərinin meydana gəlməsinə münbit şərait yaratdı. Bu məqamda dünyasını dəyişmiş alimlərimizə Ulu Tanrıdan rəhmət, fəaliyyət göstərənlərə sağlam uzunömürlülük diləyirəm. Və nitqlə bağlı ədəbiyyatlarla tanışlıq Azərbaycan dilinin yenidən

ciddi şəkildə öyrənilməsi olmadan bu məsələlərin həllini tapa bilməyəcəyimi mənə nişan verdi.

2011-ci il! İlk məqaləmi "Heydər Əliyevin nitqində neologizmlər" rəsmi dövlət qəzeti "Azərbaycan"a yönəldirəm. Bir ay gözləyirəm. Nəhayət məqaləm işıq üzü görür. Necə deyərlər nöqtə-vergülünə toxunulmadan. Özümün bu sahədəki qüvvəmə inamımı artıran ilk məqalə! İlk elmi araşdırmalı məqalə! Rəsmilərin, elm adamlarının, geniş oxucu kütlələrinin görə bildiyi ilk məqalə! Demək yanılmamışdım. Demək davam etməyə dəyərdi. 2012-ci il! "Azərbaycan" qəzeti, 1 yanvar bayram nömrəsi! İkinci məqalə. "Heydər Əliyevin nitqinin gücü onun səmimiyyətindədir"! Beləliklə monoqrafiyanın I cildinə doğru bir elmi yolun yolçuluğu başladı.

2013-cü il! Monoqrafiyanın I hissəsi işıq üzü görür. Bu hissədə nitqin arxitektonikası, məntiqi ardıcıllıq, üslublar (publisistik, elmi, məişət, dini), nitqin ekspressivliyini yüksəldən nitq elementləri (səmimiyyət, qətiyyət, nikbinlik, poetik duyğular, proqnozlar,) araşdırma mövzusu olur. Aşıq Şəmşir Mədəniyyət Ocağı İctimai Birliyinin təşəbbüsü ilə keçirilən təqdimatı tarixçi alim professor Fəxrəddin Məmmədov aparır. Monoqrafiyanın təqdimat mərasimindəki çıxışımda "Heydər Əliyev ixtisasca həm də tarixçiydi, elə bu gün də bu tədbiri tarixçi aparır" deyə qeyd edirəm. Tədbirdən sonra monoqrafiya dilçi alimlərin maraq dairəsinə daxil olur, akademik Nizami Cəfərov bütün cildlərə ön söz yazır, humanitar sahə əməkdaşları çoxsaylı rəylər verirlər. Bu gün müxtəlif mətbu orqanlarda işıq üzü görən 40-a yaxın rəy mövcuddur.

Yazımı Heydər Əliyevin həyatda çox sevdiyi şair Seyid Məhəmmədhüseyn Şəhriyarın bir sözü ilə davam etdirirəm: "Bizdən də bir söz qalacaq dünyada". Bu gün bizlərə Ulu Öndərin nitq, bəyanat, çıxışlarının toplandığı 40 cilddən yuxarı əsərləri qalıb. İcazə verin o ecazkar nitqlər barəsində qısaca da

olsa öz təəssüratlarımı sizlərlə bölüşüm və ritorik sualla – “Bu necə bir nitq” davam edim.

***Bu nitq möhtəşəm girişlər və sonluqlarla müşayiət olunan bir nitq!*** Bu giriş və sonluqlarda hər kiçik təfərrüat belə nəzərdən qaçmır. Auditoriyanın peşə tərkibindən, siyasi və mənəvi dünyagörüşündən, çıxışların baş verdiyi ictimai-siyasi dövrlərdən, məkan və zamandan asılı olaraq girişlər və sonluqlar öz yerini tapır. Nitqin girişləri ilə böyük natiq auditoriyanı təəccübləndirə, düşündürə və heyran qoya bilir. Ordu ilə bağlı çıxışlarda Heydər Əliyev əsgərə olan hörməti, qayğını önə çəkməklə bütün dövlət strukturlarınən diqqətini Azərbaycan əsgərinə yönəlir: “Əziz əsgərlər, zabitlər, döyüşçülər” müraciəti səslənir, sonluqlarsa “Azərbaycan əsgərinə eşq olsun!” xitabı ilə bitir. Sonluqlara gəldikdə əgər uşaqlar və gənclər auditoriyasında bu “əziz balalar, mən sizi sevirəm, hər birinizi öpürəm” tipli kövrək cümlələrlə bitirsə, Prezident sarayında çatışmazlıqlarla bağlı çağrılmış müşavirələrdə sonluqlar “hər kəs öz məsuliyyətini hiss etməlidir”, “bu işlərlə ciddi məşğul olmaq lazımdır”, “bir daha tələb edirəm ki”, “tədbirlər görülməlidir” ifadələri ilə yekunlaşır.

***Bu nitq ruhuna fəlsəfilik hopmuş mütəfəkkir filosof nitqi!*** Bu fəlsəfi nitqlərin köməyi ilə dialektik qanunlar auditoriyalara rəvan, axıcı, səlis Heydər Əliyev dili ilə yol alır. Dialektikanın əksliklərin vəhdəti və ziddiyyəti qanunu qaçqınlar auditoriyasında belə səslənir: “Mənim də həyatımda çox əziyyətli günlərim, illərim olubdur. Çox faciəli illərim olubdur. Ancaq yenə də taleyimdən çox razıyam. Bu mənim taleyimdir – onun çox *parlaq cəhəti* də, *faciəvi cəhəti* də mənim taleyimdir. Amma bu gün zəhmətdən, əziyyətdən savayı heç bir şey yoxdur. Mən bunu da özümə böyük xoşbəxtlik hesab edirəm ki, xalqıma belə böyük çərçivədə xidmət etmək imkanı əldə etmişəm”. Bu kiçik parçada taleyin parlaq və faciəvi

cəhətləri, əziyyətli illər və xalqına geniş miqyasda xidmət etmək imkanı kimi əksliklər ziddiyyətdə olduğu qədər, həm də vəhdətdədir.

Dialektikanın forma və məzmun kateqoriyalarının vəhdəti Heydər Əliyev nitqində tez-tez səslənir. Görkəmli şəxsiyyətlərə ucaldılan heykəllər haqqında onun fikirləri bu sıradandır. *Heykəllər* Heydər Əliyev üçün *formadır*. Əsas məzmun, ana məzmunsa heykəlin qoyulduğu şəxslərin şəxsiyyəti ilə səciyyələnir. *Heykəllər* Heydər Əliyev üçün *vasitədir*. Şəxsiyyətlərin öyrənilməsi yolunda, xalqın yaddaşının qorunması yolunda, məzmuna açar olmaq yolunda heykəllər mühüm vasitədir. "Biz bu gün, bu el bayramı günü Məhəmməd Füzulinin Azərbaycanın paytaxtı Bakıda, Füzuli meydanında ucaldılmış heykəlinin önünə getdik, onun heykəlinin qarşısına güllər qoyduq. Ancaq Füzulinin özünün yaratdığı mənəvi heykəl bizim hər birimizin qəlbindədir. O əbədi yaşayacaq, gələcək nəsillərin qəlbində yaşayacaqdır".

Bütövlükdə fəlsəfi dünyagörüşsüz təsəvvür olunmayan Heydər Əliyev nitqi səmimiyyətlə yoğrulmuşdur. ***Bu nitq səmimiyyətlə yoğrulmuş bir nitq!*** Səmimiyyət müxtəlif çeşidli auditoriyalarda, nitq üslublarında, bir sözlə bütün məqamlarda Heydər Əliyevin çıxışlarını tərk etmir: "Böyük natiqin nitq və çıxışlarında tez-tez təsadüf etdiyimiz, səmimiyyətin üzə çıxmasına yardım edən ifadələri sizlərlə birgə yada salmaq pis olmaz:" Mən çox açıq danışan adamam", "mən hər şeyi açıq deyirəm", "gəlin aıçq danışaq", "səhvlər də olacaqdır, nöqsanlar da", "çatışmamazlıqlarımız hələ çoxdur", "qəlin bu gün səmimi olaq", "tarixi qaralamaq olmaz", "müstəqillik xalqa məxsusdur", "xalqdan heç kəs inciyə bilməz", "bu, həqiqətdir", "müxalifətə bundan sonra da böyük hörmətlə münasibət göstərəcəyik" "gəlin açıq danışaq" və s. yüzlərlə səmimi ifadələrlə nitq qurulur.

***Bu nitqin gücü*** çıxışlara sözyaratma qazandırmaq baxımından, çıxışların məna yükünü-semantikasını gücləndirmək baxımından çətin görünən nitq hissələrini nitq prosesinə qoşmaqdadır. Məsələn "bir" miqdar sayının sözyaratmadakı rolunu XIV əsr Nəsimi poeziyasında və XX-XXI əsr siyasi natiq Heydər Əliyevin çıxışlarında müqayisəsi, paraleli yerinə düşər. Nəsimi divanında:

*Bir əcaib dilbərə düşdü könül,*
*Bir əli yetməz yarə düşdü könül.*

Heydər Əliyevin dilində: "Ancaq eyni zamanda mən bu gün onu da *bir daha* bəyan etmək istəyirəm ki, heç vaxt, *heç bir* zaman Azərbaycan torpaqlarının *bir qarışı* belə *başqa bir* ölkənin əlində ola bilməz" Bir cümlədə 4 yerdə bir miqdar sayının gözəl nitq nümunəsi yaratmasının "bir daha" ədatının fikri qüvvətləndirməsinin, "heç bir" inkar əvəzliyi ilə Azərbaycan dövlətinin prinsipial mövqe nümayiş etdirməsinin, "ola bilməz" qətiyyətli ifadənin formalaşmasında "bir qarış" və "başqa bir" ifadələrindən uğurla istifadə olunmasının şahidi oluruq. Təkcə, bu müqayisə Azərbaycan dilinin möhkəm dayaqlar üzərində bərqərar olmasına, dil varisliyimizə mühüm işarədir.

***Bu nitq poetik çalarlı bir nitqdir.*** Poetik ruhlu bu nitq Azərbaycan xalqının poetik bir xalq olduğunu dünyaya bəyan edir. Poetik ruhlu nitqlərlə auditoriyaları nitq cazibəsinə salmaq, qəlbləri fəth etmək, gərgin ictimai-siyasi münasibətləri düzgün və doğru məcraya yönəltmək fenomenal nitq ustası Heydər Əliyevə xasdır. Poetik duyğular bir sıra hallarda Azərbaycan şairlərinin şeirləri ilə auditoriyalara ayaq açır. Özbəkistanda səfərdə olan ulu öndər görkəmli Azərbaycan şairi Süleyman Rüstəmin bir parça şeiri ilə Özbəkistan adlı bir

türk respublikasının, çoxmilyonlu özbək xalqı auditoriyasının məhəbbətini qazanır: "Mən bu qədim torpağa, özbək xalqına, hörmətli dostlar sizin hamınıza bir daha dərin ehtiramımı bildirirəm. Mən sözümü görkəmli Azərbaycan şairi Süleyman Rüstəmin özbək qardaşına həsr etdiyi şeirndən bir parça ilə tamamlamaq istəyirəm:

*Candan əziz torpağını*
*Anam kimi, balam kimi sevirəm.*
*Düşmənlərin qabağında əyilməyən başımı*
*Qardaş kimi qarşınızda əyirəm.*

Monoqrafiyanın II cildi çap olandan sonra ATU-nun elmi işlər üzrə prorektoru professor İbrahim İsayevin "doktor siz bu monoqrafiyaları doktorluq dissertasiyasına da çevirə bilərsiniz" fikri 2018-ci ildə akademik Rafael Hüseynovun başçılıq etdiyi koordinasiya şurasında akademik Möhsün Nağısoylunun elmi məsləhətçiliyi ilə "Heydər Əliyevin nitqinin arxitektonikası, ekspressivliyi və üslubi-qrammatik xüsusiyyətləri" mövzusunda doktorluq mövzusunun təsdiqi ilə reallaşdı.

***Bu nitq şəxs əvəzliklərinin köməyi ilə şəxsiyyət anlayışını açmaqda əvəzsiz rol oynayan bir nitq!*** Birinci şəxsin təki olan "mən" əvəzliyi Heydər Əliyevin nitqində ölkənin birinci şəxsinin sözü təkin səslənir, "mən" müəyyən şəxs əvəzliyini eşidən auditoriya səfərbər olunur. Xalqın mandat verdiyi prezidentin dilində "mən" əvəzliyi təminat rolunda çıxış edir: "Sən" müəyyən şəxs əvəzliyini Heydər Əliyev özünə doğma hesab etdiyi görkəmli elm, mədəniyyət, ictimai-siyasi xadimləri ilə görüşlərdə tez-tez işlədir. 19 noyabr 1997-ci ildə görkəmli bəstəkar, Azərbaycanın xalq artisti Tofiq Quliyevin 80 illiyinə həsr edilmiş yubiley gecəsindəki çıxışda "sən" ikinci şəxsin təki olan müəyyənlik əvəzliyi təkrar-

lanaraq nitqdə doğmalıq hissləri yaradır: "*Sən* böyük işlər görmüsən. Bu günkü bu mərasim sənin üçün bəlkə də azdır. *Sən* bundan da böyük şöhrətə və hörmətə layiqsən. Azərbaycan xalqı 60 ildir ki, *sənin* mahnılarının təsiri altında yaşayır. *Sənin* mahnıların bizim xalqımıza, təkcə bizim xalqımıza yox, bəşəriyyətə, dünyaya böyük töhfələrdir. *Sənin* mahnıların, musiqin bizim xalqımıza sevinc gətirir, ilham verir, hər bir insan üçün yaşamağa, yaratmağa güc verir".

Böyük natiqin təfəkkürə və təcrübəyə söykənən şəxsiyyət olduğunu nəzərə alsaq onun nitqlərində feillərin mühüm yer tutması qənaətinə gələ bilərik: "Böyük şairimiz Molla Pənah Vaqif XVIII əsrdə şeir dilini xalq dilinə daha da yaxınlaşdırdı. Onun yazdığı şeirləri xalqın bütün təbəqələri həm *anlaya*, həm *qavraya* bildi, həm də sevdi". Bu cümlədə anlamaq, qavramaq təfəkkür feilləridirsə, sevmək hal-vəziyyət bildirən feildir.

Felin qəti gələcək zamanı gələcəyə tuşlanan nikbinliklə dolu çıxışlarda özünü bariz şəkildə göstərir: "*Ümidvar olmaq* istədiyimi bildirirəm ki, işıqlı gün uzaqda deyil, Azərbaycan bu qaranlıqdan, bu bəladan *çıxacaq*, xalqımız daha da *ucalacaq* və müstəqil Azərbaycan Respublikası dünya birliyində öz layiqli yerini tutacaqdır"

Üslubiyyat yaratmaq baxımından Heydər Əliyevin nitqlərində zərflər də digər nitq hissələrindən geri qalmır. İşini zamanla, vaxtla uyğunlaşdıran, zamana və vaxta qiymət qoyan Heydər Əliyevin nitqlərində zaman zərflərinin yeri həmişə var: "*Dünən* və *bu gün* biz respublikamızın həyatı üçün çox böyük əhəmiyyəti olan məsələləri ətraflı müzakirə etdik". Başqa bir mürəkkəb zaman zərfi "gecə-gündüz" böyük natiqin dilində bir sıra həyati vacib məsələlərin həlli yolunda çalışmağı ifadə edir: "Mən çox məmnunam ki, bizim apardığımız işlər müsbət nəticələr verir. Bu rəqəmlər çox asanlıqla əldə

olunan rəqəmlər deyildir. Biz bu işlərlə *gecə-gündüz* məşğuluq".

Heydər Əliyevin natiqlik məharətinin bir məziyyəti də ekspressivlik yaratması çətin görünən nitq hissələrini təkrarlaya, auditoriyanı nitq cazibəsinə sala bilməkdədir: "Amma indi Dağlıq Qarabağ dünyanın bütün ölkələrində məşhurdur. Məşhurdur bu müharibəyə görə, məşhurdur bu münaqişəyə görə. Eyni zamanda, məşhurdur ermənilərin apardıqları təbliğata görə, işlərə görə". Sadə bir qoşmanın, ismin yiyəlik halına qoşulan "görə" qoşmasının köməyi ilə bütöv bir fikir auditoriyaya aşılanır.

Böyük natiqin nitqində inkarlıq bildirən "nə", "nə də" bağlayıcıları ciddi siyasi-psixoloji məqamlarda, prinsipial məsələlərin həllində öz yerini tapır: "Ancaq ***nə*** o vaxt, ***nə də*** 1994-cü ilin oktyabrında mən hakimiyyəti qoyub heç yerə qaçmadım. ***Və*** televiziya qarşısında bəyan etdim ki, Azərbaycan xalqı qarşısında məsuliyyət daşıyıram" .

Üslubiyyat yaratmaq baxımından nitq prosesində heç ədatlar da geri qalmır. Elə olur ki, Heydər Əliyev nitqində bir cümlədə müxləlif ədatlar işlənir. "Belə layihələr doğrudan *da* varsa, onlar həqiqətən işə yarayırsa, diqqətə yarayırsa, onda *qoy* onlar bu barədə lazımı qərarlar qəbul etsinlər. *Yox*, elə deyildirsə onda *qoy* onlar təzədən işlənsin, təkmilləşdirilsin. Bir sözlə biz bu sahədə gecikməməliyik. Amma, nə gizlətməli çox gecikmişik. *Bəli*, çox gecikmişik". Bu nitqdə *qoy* – əmr, *yox* – inkar, *bəli* – təsdiq, *da* – qüvvətləndirici ədatları bir-biri ilə uzlaşır, harmoniya yaradır.

İctimai-siyasi dövrlərdə çox işlədilən modal sözlərin də özünəməxsusluğu diqqət çəkir. Məsələn, auditoriya Heydər Əliyevin nitqlərində güman bildirən modal sözlərin sonda güman olmadığı qənaətinə gəlir. Heydər Əliyevin "gümanları" gələcəkdə həyata keçirilən gümanlardır: "Eyni zamanda qeyd

etmək istəyirəm ki, əgər dünyanın böyük ölkələrinin neft şirkətləri Azərbaycanın neft yataqlarına maraq göstərirlərsə, ***güman edirəm ki***, o ölkələrin dövlət dairələrini Azərbaycan Respublikasının bugünkü ictimai-siyasi vəziyyəti də maraqlandırmalıdır. Güman edirəm ki, neft şirkətlərinin əksəriyyəti təmsil olunduqları dövlət dairələri ilə sıx bağlıdırlar". Bu modal sözlər "Azərbaycanın ictimai-siyasi vəziyyət, durumu həmişə sabit olmalıdır" prinsipini dövlətçilik yolunda hər bir vətəndaşa anladır.

"Güman edirəm ki" modal sözü böyük natiqin nitqində ilk baxışdan, güman bildirirsə, zaman Heydər Əliyev nitqində gümana yer qalmadığını göstərir.

Böyük natiqin dilində sinonimlər təkrarlarla çulğalaşa, yüksək nitq effekti yarada bilir: "Strateji nöqteyi-nəzətdən isə Ermənistan təcavüzünün qarşısının alınması üçün *Ağdam* şübhəsiz ki, çox əhəmiyyətli bir nöqtə idi. *Ağdam* ***qorunmalı*** idi, *Ağdam saxlanılmalı* idi, *Ağdam müdafiə* olunmalı idi. *Ağdamın* işğalı yolverilməz idi". Heydər Əliyevin nitqində işlədilən sinonim cərgənin elementləri həm yüksək kitab leksikasına, həm də ümumişlək sözlər qrupuna aid olur:

Təkrarlar Heydər Əliyevin nitqində çıxışın həsr olunduğu məsələlərin daha dəqiq əks olunması, auditoriyanın nəzər-diqqətini cəlb etmək baxımından mühüm nitq ünsürüdür. Böyük natiqin çıxışlarında təkrarlardan istifadə ilə yanaşı o özü də "təkrar edirəm" ifadəsi ilə təkrarların nitqdəki rolunu bir daha gündəmə gətirir: "Ali Sovetin sədri seçiləndə də məndən soruşdular ki, nə ***vəd edirəm***? Cavab verdim ki, mən peyğəmbər deyiləm. Azərbaycanın bu vəziyyətdən necə çıxacağını deyə bilmərəm. Ancaq əgər mən bu vəzifəni öz üzərimə götürürəmsə, deməli, Azərbaycanı bu vəziyyətdən çıxarmağın yollarını arayıb-axtarmağı bacararam. İndi də ***təkrar edirəm ki,*** mən heç bir ***vəd vermirəm***. Yalnız bir şeyi

***vəd edə*** bilərəm: Azərbaycan xalqına, millətimə, torpağıma sadiq olmuşam və ömrüm boyu da sadiq olacağam. Həyatımın son dəqiqəsinədək xalqıma xidmət edəcəyəm və ömrümün bundan sonrakı illərini də xalqıma bəxş edirəm". "Vəd etmək" frazeoloji birləşməsini üç yerdə təkrar etməklə böyük natiq auditoriyada yüksək psixoloji mühit, poetik ovqat yarada, nitqi yaddaqalan edə bilir.

***Bu nitq auditoriyanı fikirləşməyə, düşünməyə, nəticə çıxarmağa sövq edən ritorik suallarla zəngin bir nitqdır.*** "Bəli" təsdiq ədatı ilə auditoriyanın fikrinə qoşulan böyük natiq sonda ritorik suallarla vəziyyəti izah edir: "Mənim fikrim belədir. Qiymətim də budur. Burada dedilər, mən yenə də qeyd edirəm: Bəli, həmin zonada, həmin bölgədə sosial-iqtisadi problemlər var. *Ancaq gəlin fikirləşək: Azərbaycanın hansı zonasında sosial-iqtisadi problemlər yoxdur? Dedilər Lənkəranda işsizlər var. Azərbaycanın hansı zonasında işsizlər yoxdur?*".

***Bu ecazkar nitqlər antroponimik sıralanmalarla auditoriyani keçmiş tarixmizə apararaq onun şanli səhifələrini açır***: "İlk Azərbaycan Demokratik Respublikasının yaradıcıları, rəhbərləri *Məmməd Əmin Rəsulzadə, Fətəli xan Xoyski, Əlimərdan bəy Topçubaşov, Nəsib bəy Yusifbəyov* və başqaları Azərbaycan xalqının tarixində böyük xidmətlər göstərmişlər və Azərbaycanda ilk dəfə müstəqilliyin, müstəqil dövlətçiliyin, demokratiyanın əsasını qoymuşlar".

***Bu əksər təsadüflərdə müqayisələrlə, paralellərlə aparılan, sonda yekun nəticəyə gəlinən bir nitqdir.*** Heydər Əliyev dünyagörüşləri, zövqləri, duyumları müqayisə edir. Bu müqayisələrdə auditoriyalar zaman və dünyagörüşü arasındakı fəlsəfi əlaqənin şahidi olur: "O vaxtlar 50-ci və 60-cı illərdə, yəni Səttar Bəhlulzadənin ilk əsərləri yaranan zaman bəziləri onu anlamırdılar, bəziləri qəbul etmirdilər. Bəziləri isə bu

əsərlərin nə qədər qiymətli olduğunu bilmirdilər. Ona görə də bəzən klassik üslubda çəkilən əsərlərə üstünlük verilirdi, Səttar Bəhlulzadənin əsərləri kənarda qalırdı. Ancaq zaman keçdi və Səttar Bəhlulzadə çox inadla öz yaratdığı üslubu, öz məktəbini davam etdirdi və yeni bir rəssamın yaranmasını ***nəinki*** Azərbaycana, həm də ***bütün*** dünyaya nümayiş etdirdi".

Bir qisim hallarda isə yekun nəticə auditoriyaya açıqlanır, açıqlamadan sonra müqayisələrə keçilir.

Monoqrafiyaların I və II hissələri üzərində iş gedərkən siyasi liderin dilində "mənəviyyat" və "hissiyyat" ifadələrinin tez-tez işlədilməsi etik və estetik mətnlərin şifahi, spontan nitqdə necə işlənməsinin araşdırılmasına həsr olunan III cildi ərsəyə gətirdi. Bu hissədə müasir etikanın əsas istiqamətlərinin Heydər Əliyev dilində auditoriyalarda hansı ekspressivliklə işlədilməsini araşdırdıq.

Öncə ümumetik dəyərlərin səslənməsinə diqqət yetirdik. Qeyd etmək yerinə düşər ki, bu cildin üzərində iş aparılması etika və estetikanın ayrıca fənlər kimi ümumfəlsəfi qanunlara tabe olduğunu üzə çıxardı. Ümummilli liderin bu problemlərə incəliklərinə qədər bələd olduğunu, bu azmış kimi bu incəlikləri, bu dərinlikləri Azərbaycan dilinin şirinliyi ilə auditoriyalara bəyan etməsidir. III cild məni etika və estetikaya aid ədəbiyyat araşdırmalarına sövq etdi. Yol AMEA-nın Fəlsəfə İnstitutuna apardı. Bu cildin elmi məsləhətçisi elə həmin institutun direktoru İlham Məmmədzadə oldu. Monoqrafiyanın III cildində Aristotel və Kantın etik kredoları ilə yanaşı XX əsr Heydər Əliyev etik kredosunu – milli və dini dünyagörüşümüzün hopduğu etik kredonu təqdim edə bildik. Gəlin, ümumetik dəyərlərlə qısaca da olsa Heydər Əliyevin dilində səslənən sitatlarla tanış olaq.

***Bu nitq insanlığa münasibətdə Heydər Əliyevin etik kredosunu ortaya qoyan bir nitqdir!***

– Biz dünyəvi dəyərlərlə yaşamalıyıq. Amma eyni zamanda biz öz milli-mənəvi dəyərlərimizi itirməməliyik, onları yaddan çıxarmamalıyıq. Onları bizim millətimizə yad olan hansısa dəyərlərlə əvəz etməməliyik ;

– Həyatın mənası ondan ibarətdir ki, dünyaya gələn, böyüyən, ərsəyə çatan hər bir uşaq, həyat fəaliyyətinə başlayan insan cəmiyyətə, millətə, ölkəsinə, vətəninə layiqli xidmət etsin, fayda versin;

– "Vətəndaş" sözü böyük sözdür, müqəddəs sözdür. "Vətəndaş" sözü o deməkdir ki, hər bir vətəndaş öz vətəninə sadiq olmalıdır, onu göz bəbəyi kimi qorumalıdır və vətəninin uğrunda, torpağının uğrunda, anasının, atasının müdafiəsi yolunda şəhid olmağa hazır olmalıdır;

– Əgər insan öz fikirlərinə sadiq olmasa, öz ideyasına inanmasa və öz ideyasının həyata keçməsi üçün vuruşmasa, savaşmasa, mübarizə aparmasa, o, qalib gələ bilməz;

– Bir şey ədalətsizliklə olubsa, ədalətsizliklə ədaləti bərpa etmək olmaz. Ədaləti bərpa etmək lazımdır;

– Qanunsuzluğu aradan qaldırmaq lazımdır. Qanun-suzluğa qanunsuzluqla cavab vermək lazım deyil;

– Xalqdan heç kəs inciyə bilməz;

– Bilirsiniz, insan bir iş görürsə, onun qiymətini alırsa, həm o iş görmüş adam, həm də qiymət vermiş adam – ikisi də yüksək səviyyədə olanlardır. Amma insan bir iş görürsə, bu qiymətini alırsa, bundan sui-istifadə etməyə başlayırsa, əvəzinə 10–15–20 qat çox nəsə tələb edirsə, artıq bu onun keçmiş xidmətini ləkələyir və heçə endirir;

AMEA Fəlsəfə İnstitutunun etika ilə bağlı mütəmadi çap olunan konfrans materiallarından, qədim yunan filosoflarının dövlətçilik ideyalarının öz əksini tapdığı əsərlərdən, Azərbaycan klassik ədəbiyyat xadimləri və filosoflarının fikirlərindən yararlandığımız "siyasət və etika" yarımfəslində Ulu

Öndərin müxtəlif auditoriyalardakı çıxışları araşdırma obyekti olmuşdur.

***Bu nitq auditoriyanı təəccübə salan iqtisadçı alim nitqidir.*** Heydər Əliyevin nitqində iqtisadi məsələlər, bu məsələlərlə bağlı insan amilinin yeri və rolu, etik münasibətlər mübahisə doğurmayacaq dərəcədə zərgər dəqiqliyi ilə seçilməsilə fərqlənir. Bunun kökündə zənnimizcə, iqtisadi etikanı kitablardan oxuyan filosof alimlərdən, təsərrüfatla məşğul olmamış, "baş girləyən" siyasətçilərdən fərqli olaraq Heydər Əliyevin uzun illər partiya-təsərrüfat sistemindəki təcrübəsindən doğan ideyalar dayanır.

***Bu nitq ekoloji problemləri həssaslıqla araşdıran alim-ekoloq nitqidir.*** Ekoloji etikanın müvəffəqiyyət qazanmasında dövlət və vətəndaş birliyinin əhəmiyyətini açıqlayır : "Havanın təmizlənməsini ağaclardan başqa *heç bir* yol ilə, *heç bir* vasitə ilə təmin etmək olmaz. *Yəni* bunu *heç bir* şeylə əvəz etmək olmaz. Ağacların, yaşıllıqların havanı təmizləməsi heç bir başqa vasitə ilə əldə oluna bilməz. *Yəni* başqa bir üsul bunun əvəzini verə bilməz. *Məhz* buna görə də mən Bakının yaşıllaşması işinə başlamışam.

***Bu nitq böyük Azərbaycançının nitqidir!***

Heydər Əliyevə görə, azərbaycançılığın əsas tərkib hissələrindən biri və birincisi də dildir. Müstəqil Azərbaycan dövlətinin əsas ideyası *azərbaycançılıqdır*. "Biz bundan sonra da Azərbaycan dilinin inkişaf etdirilməsi üçün səylərimizi davam etdirəcəyik" feilin qəti gələcək zamanında işlədilən cümlə dövlət başçısının prinsipial mövqeyini ortaya qoyur: "Hər bir azərbaycanlı öz milli mənsubiyyətinə görə qürur hissi keçirməlidir və *azərbaycançılığı – Azərbaycanın dilini*, mədəniyyətini, milli-mənəvi dəyərlərini, adət-ənənələrini yaşatmalıdır. Azərbaycan dilinin inkişafı haqqında bizim qəbul etdiyimiz geniş qərar məhz bu məqsədi daşıyır. Biz Azərbaycanın latın

əlifbasına keçməsi haqqında qərar qəbul etdik. İndi Azərbaycanda hamı, bütün dövlət orqanları yalnız latın əlifbasından istifadə edir. Bu da bizim milliliyimizi, azərbaycançılığımızı göstərən çox mühüm bir amildir. Biz bundan sonra da Azərbaycan dilinin inkişaf etdirilməsi üçün səylərimizi davam etdirəcəyik".

***Bu nitq dini dəyərlərimizin təbliğində mühüm gücə malik bir nitq!*** Dini etik dəyərlər böyük natiqin dilində "Allaha şükürlər olsun ki" modal sözü ilə auditoriyalara ayaq açır. Qurani-Kərimin müddəaları sadə xalq dilində insanlara ünvanlanır: "İndi əgər biz burada *keçmişimizi qurdalasaq*, qaldırsaq, – nə təhər oldu, nə cür oldu, bunlar bizə xeyir gətirməyəcəkdir. *Allaha şükür olsun ki*, müstəqil dövlətimiz var. *Allaha şükür olsun ki*, ictimai-siyasi sabitlik yaranıbdır. *Allaha şükür olsun ki,* tam sülh olmasa da, sülh şəraitində yaşayırıq. *Allaha şükür olsun ki*, hamımız bir yerdəyik. Vaxtilə kimin başına nə gəlib, nə təhər olub, filan olub – bunlar keçmişdə qalıbdır. Mən bunları unuduram. Xahiş edirəm siz də unudasınız". Bu kiçik mətndə "Allaha şükürlər olsun ki" modal sözün dörd yerdə təkrarlanması, "keçmişimizi qurdalasaq", "nə təhər oldu", "nə cür oldu" ifadələrinin yarıməişət, yarıdini bir üslubda, ümumişlək sözlərin ekspressivliyi fonunda işlədilməsi ilə ağsaqqal öyüdü tipində nitq yaradılmasının şahidi oluruq.

***Deontoloji baxımdan bu nitq həkimlərin cib dəftərçəsində gəzdirilməli bir nitq!*** Xəstələrin sağalması yolunda sözün ilahi gücündən istifadə yeni bir şey deyildir. Heydər Əliyevin xalq yazıçısı Yusif Səmədoğluya onun xəstəliyi ilə əlaqədar baş çəkməsi zamanı söylədiyi məişət üslublu nitq diqqətçəkəndir. İnsanların müşkül bir işə düşdüyü, xəstəliyə düçar olduğu hallarda dini dəyərlərə qiymət vermək gündəmə gəlir. Xəstələrin dini dünyabaxışlarına uyğun sözlərə ciddi

ehtiyac yaranır. "İnşallah", "Allaha şükürlər olsun ki" dini üslubun tələb etdiyi terminlər işə düşür. Qəti gələcək zamanda işlədilən "xəstəliyin ötüb keçəcəkdir", "sağalacaqsan, duracaqsan və on illərlə yaşayacaqsan" ifadələrinin xəstəyə olan təsirini izaha ehtiyac duyulmur. "Düzdür" gerçəkliyə münasibətdə qəti təsdiq modal sözünün istifadə olunduğu "düzdür, bu, həkimlərin öz işi deyildi" ifadəsi ilə həkimlik peşəsinə olan ülvi sevgisini də auditoriya üçün açıqlayır: "Sənin bu ***xəstəliyin ötüb keçəcəkdir. İnşallah***, hər şey keçəcək və ayağa duracaqsan. Ona görə də sənin vaxtını çox almaq istəmirəm. Mən bilirəm, çünki özüm də vaxtilə xəstə olmuşam. Bilirsiniz ki, mən üç ay Moskvada xəstəxanada yatmışam. Özü də elə xəstə idim ki, deyirdilər heç ayağa dura bilməyəcəkdir. Çoxları da deyirdi ki, o, ayağa dursa yaşaya bilməyəcəkdir. Hətta həkimlər də deyirdi. ***Düzdür***, bu, həkimlərin öz işi deyildi. O vaxt Qorbaçov onlara göstəriş vermişdi və onlar bütün professorlar, akademiklər gəldilər, yığıncaq keçirdilər. Mənə dedilər ki, sən işləyə bilməyəcəksən. Mən dedim ki, siz nə istəyirsiniz? Dedilər ki, sən ərizə ver, get, səni işdən çıxarsınlar. Mən də dedim ki, yaxşı, buradan çıxandan sonra işləyə bilməsəm, onda işdən çıxaram. Sonra xəstəxanadan da çıxdım və iki aydan sonra vəzifədən də getdim. Ondan sonra da, *Allaha şükürlər olsun ki,* yaşayıram. İndi *sən* də *sağalacaqsan, duracaqsan və on illərlə yaşayacaqsan*.

Estetika "hissiyyatlar" haqqında bir elmdir desək, səhv etmərik. Bəs bu hissiyyatlar necə ifadə olunur?! Azərbaycan xalq dastanlarını ifa edən aşıqlar dastan qəhrəmanlarının dili ilə deyərdilər: "İcazə verin dərdimi sazla deyim, sözlə desəm dilim od tutub yanar". Deməк dərin hissiyyatların, estetik dəyərlərin adi danışıqla, adi eşitmə və görmə ilə ifadə oluna bilməməsini böyük natiq zamanında anladır, estetikanın bir mühüm qolu olan bədii ədəbiyyata, şeirə hər zaman ehtiyac

olduğunu dilə gətirir: “Azərbaycan mənim ürəyimdir. Azərbaycan mənim nəfəsimdir. Azərbaycan mənim həyatımdır. Azərbaycan haqqında hər bir vətəndaş öz ürək sözlərini deyə bilər. Mənim ürəyim daim öz doğma vətənim Azərbaycanla bağlı, Azərbaycan haqqında hissiyyatlarla dolu olubdur. *Bu hissiyyatları sözlə demək mümkün deyildir.* Hətta böyük şairimiz Səməd Vurğunun dediyi sözlər də bunun hamısını əhatə etmir. Ancaq şerə ehtiyac olduğuna görə Səməd Vurğunun sözlərini bir daha təkrar etmək istəyirəm:

*El bilir ki, sən mənimsən,*
*Yurdum, yuvam məskənimsən.*
*Anam doğma vətənimsən,*
*Ayrılarmı könül candan?*
*Azərbaycan, Azərbaycan!*”

Gözəllik haqqında qədim yunan filosoflarından tutmuş müasir estetlərə qədər müxtəlif fikirlərin mövcudluğu yeni bir şey deyildir. Alman filosofu Kanta görə gözəllik xalis forma anlayışıdır. Bu, əşyanın zahirini, görkəmini seyr etməkdən doğan valehlik hissidir. Burada məqsəd, məna, xeyir, fayda axtarmaq lazım deyildir. Beləliklə, Kant fəlsəfənin əsas məsələlərində olduğu kimi, estetikada, xüsusilə gözəllik probleminin şərhində də aqnostik mövqe tutur, məzmunla formanı qarşı-qarşıya qoyur. O, gözəlliyi xalis formaya aid edir. Heydər Əliyevin gözəlliyə münasibətinə gəlincə fəlsəfənin ümumi dialektik qanunları estetik sahəyə də şamil olunur. Belə ki, Böyük Natiqin nitqlərində forma və məzmun ayrılmır: “Azərbaycan qadınlarının bir xüsusiyyəti də vardır: Azərbaycan qadınları çox gözəldirlər. Ümumiyyətlə, gözəllik anlayışını insanlar cürbəcür anlayırlar, dərk edirlər. Bu da təbiidir. Təbiətin də gözəlliyi vardır, hər bir insanın da gözəlliyi vardır. Amma gözəllik əsl mənada cəmiyyətdə olan gözəl-

likdir və bu, sadəcə, bir xarici görünüş deyildir. Gözəllik *həm* xarici olur, *həm də* daxili olur. Ancaq bu gözəllik anlayışının daşıyıcısı həmişə qadınlar olur. Hər bir millətin gözəlliyini nümayiş etdirən qadın olur".

Estetik zövqün hər bir kəs üçün fərqli olduğu Heydər Əliyevin nitqlərində tez-tez səslənir: "Tofiq Quliyevin mahnıları çoxdur, lakin "Sənə də qalmaz" bunların zirvəsidir. Onun oğlu bugünkü gecənin rejissoru idi və gözəl də təşkil etmişdir. Rauf Abdullayev bu gün fəqlənirdi, orkestri çox yaxşı idarə edirdi. Mən heç kimə heç bir dərəcə vermək istəmirəm, *hər bir* müsiqisevərin öz rəyi var".

"Hər bir" təyin əvəzliyinin köməyi ilə incəsənətə – musiqiyə münasibətdə estetik zövqlərin müxtəlifliyi başa düşülür.

Ulu Öndərin xalqımızın estetik dünyagörüşünün formalaşmasında mühüm rolu olan teatrla bağlı fikirləri, əsasən onun mədəniyyət və incəsənət xadimləri ilə, teatr tamaşalarından sonra yaradıcı kollektivlə, mədəniyyət abidələrinin açılışlarında, incəsənətin kino və bədii ədəbiyyat kimi növləri haqqında olan söhbətlərdəki nitq və çıxışları əsasında tədqiqata cəlb olunmuşdur. İncəsənətin canlı növü olan teatr bu estetik zənginliyi auditoriyaya daha asan bir dildə çatdırır. Elə bu estetikliyin çatdırılması Heydər Əliyev dilində belə səslənir: "Güman edirəm ki, Bəxtiyar müəllim inciməz – bu əsəri səhnədə görməyən adam kitabı oxusa, bu təəssüratı ala bilməz. Məsələn, siz özünüz yazdığınız şeiri kitabdan oxuyanda ola bilər ki, onu yarıya qədər oxuyasan, yarısını oxumayasan. ***Elə*** bu əsərin özü də mürəkkəb əsərdir. Fəlsəfi əsərlər həmişə çətin olur. Səhnədə sizin ifanız Bəxtiyar müəllimin bu əsərinin ***məzmununu, mənasını, əhəmiyyətini çox gözəl*** açıbdır. Quruluşçu rejissorun da işi təqdirə layiqdir və hər birinizin ifa etdiyiniz rollar da çox gözəldir. Mən tamaşaya çox diqqətlə baxırdım. Hərə öz rolunu yaxşı ifa edirdi. Hamınızı təbrik edirəm və

təşəkkür edirəm ki, bizə bu gün yeni bir tamaşa təqdim etdiniz, çox sağ olun" [XIIIc.s.173].

***Bu nitq ədəbiyyatımızın təbliğinə yönələn bir nitq!*** Əgər müəyyən məqamlar üçün ədəbiyyat Heydər Əliyev nitqlərində poetiklik liyə xidmət edirsə, digər bir hallarda isə estetik dünyagörüşümüzün inkişafında ədəbiyyatımıza olan sevgi üzə çıxır. Ulu Öndərin çıxışlarından onun təkcə Azərbaycan yox, digər xalqların da ədəbiyyatına dərindən bələd olması aydınlaşır. Mirzə Fətəli Axundovun "Puşkinin ölümünə Şərq poeması"ndan bir parçanı əzbər deməsindən Heydər Əliyev şəxsiyyətinin ədəbiyyata hansı səviyyədə əhəmiyyət verməsi bəlli olur: "Mirzə Fətəli Axundov onu özü rus dilinə tərcümə edib, o vaxtlar yayılıbdır və yüksək qiymətləndirilibdir. Bu poemanı oxuyanlar Mirzə Fətəli Axundovun Puşkinin yaradıcılığına nə qədər yüksək qiymət verməsini, güman edirəm ki, müşahidə ediblər. Çünki o qədər məzmunlu ifadələr işlədilibdir ki, oxuduqca insanı heyran edir. Orada çox gözəl sözlər var. Ancaq mənim ən çox xoşuma gələn misraları bu gün burada oxumaq istəyirəm:

*Səddi-Çindən Tatarıstanə qədər çar əli var,*
*Lakin ol şairin aləmdə yanan məşəli var*" .

"Çarın əli nə qədər böyük olsa da, şairin məşəli aləmləri bəzəyir". Elə Mirzə Fətəli Axundovun bu misralarını əzbər deməklə auditoriya Azərbaycanın mütəfəkkir övladlarının eyni düşüncə tərzində olduğunu görür, heyranlığını gizlətmir.

Frazeologizmlərin izahında Heydər Əliyev dilçi alim kimi öz sözünü bəyan edir, necə deyərlər heç frazeologizmin izahına ehtiyac da qalmır: "Bəli, bu sözlərin hamısını deyəndə mənim qəlbimdəki sarı simlərə toxundunuz. Siz bilirsiniz sarı sim nədir? Azərbaycanda tar aləti var. Tarın bir neçə simi var. O cümlədən biri sarı simdir. Tar çalan simin birində çalır, o

birisində çalır, sarı simə keçəndə insana daha da çox təsir edir. Ancaq bu sözləri deməklə, eyni zamanda, onu da bildirmək istəyirəm ki, mən nə qədər çox yol keçmişəmsə, nə qədər çox işlər görmüşəmsə, xalqımın, millətimin, türk millətimin qarşısında bütün vəzifələrimi hələ yerinə yetirməmişəm. "Siz bilirsiniz sarı sim nədir" ritorik sualı və bu suala verilən cavabla frazeologizmin izahı auditoriyada yaddaqalan nitq effekti yaradır.

Dil məsələlərinə münasibətdə Heydər Əliyevin dəyərli fikirləri bu gün də dilçi alimlərin də, geniş ziyalı kütlələrinin də diqqət mərkəzində olmalı, bu fikirlər həmişə araşdırılmalıdır. 26 iyun 2002-ci ildə Bilkənd Universitetində İhsan Doğramacının abidəsinin açılış mərasimindəki nitq dilin müdafiəsində, özü də təkcə Azərbaycan dilinin yox, bütünlüklə türk dillərinin müdafiəsində mühüm rola malik bir nitqdir. "Bir az korlamaq" frazeologizmi ilə yumşaq şəkildə problemə toxunan böyük natiq Türkiyədə keçirilən dil islahatlarına olan tənqidi fikirlərini auditoriyaya açıqlayır. Elmi-məişət üslublu bu nitq parçası dil millətçiliyindən uzaq, dil təəssübkeşliyi ilə zəngin bir nitq parçasıdır. Heydər Əliyevin polad məntiqinə söykənən bu nitq parçası dilçi alimlərə hələ uzun illər mayak olacaqdır: "Dedim bəli, doğudakı dil çox aydındır, amma İstanbuldakı ləhcəni bir az korlamısınız, o qədər yaxşı deyil. Mən bir dəfə söhbət edirdim. Dedim ki, biz, mənim kimi yaşlı adamlar İhsan Doğramacı ilə, başqa yaşlı adamlarla danışanda bir-birimizi yüz faiz başa düşürük. Türk dilində, Azərbaycan dilində bu sözlər dəyişilməyibdir, daha çox avropa sözləri götürülübdür. Məsələn, "siyasət" sözü var, onu "politika" etmisiniz. "Siyasət" yaxşı bir sözdür. Nə fərqi var, "siyasət" ərəb sözüdür, "politika" avropa sözüdür. Bu öz işinizdir".

2008-ci il. AMEA-nın Dilçilik İnstitutunda "Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti" monoqrafiyasının III hissəsinin təqdimatı keçirildi. ATU-nun rektoru prof. Gəray

Gəraybəyli böyük bir heyəti elmi işlər üzrə prorektor dosent Rauf Bəylərovun başçılığı ilə necə deyərlər AMEA-ya ezam edir. Həkimlərlə dilçilərin, tibb sahə alimləri ilə filologiya sahələrinin alimlərinin bir araya gəldiyi kitab təqdimatı! Burada da Ulu Öndərin ideyaları xalqın alim övladlarını bir ideya ətrafında-azərbaycançılıq ideyası ətrafında birləşdirir.

Təqdimatın sonunda akademik Möhsün Nağısoylu müəllif kimi mənə söz verir. Mən: “Böyük ideyalar, maraqlı fikirlər mötəbər məclislərdə açıqlanır. Bu gün sizlərə deyə bilərəm ki, xalqın milli duyğularını, milli fikirlərini özündə əks etdirən frazeologizmlərin Ulu öndərin nitqində özünəməxsusluğunu tədqiq etməyin, eləcə də frazeoloji lüğətin tərtibinin vaxtı çatmışdır” fikirlərimlə auditoriya qarşısında söz verirəm.

Artıq IV hissənin üzərində işləməyə davam etdim. Yorulurdummu? – Yox! Yorulardumsa Heydər Əliyevin aşağıdakı sitatı köməyimə çatırdı: “Təsəvvür edin, biz gəlib elə bir mərhələdə dayanmışıq ki, buradan nə geriyə çəkilmək, nə də yerində durmaq mümkündür. Amma irəliyə getmək üçün, necə deyərlər, gərək qolumuzu da, qıçımızı da çırmayıb çox cəsarətlə hərəkət edək. Bunun, şübhəsiz ki, çətinliyi olacaqdır”. Və Şəhriyar demiş:

*Sevmədiyin sənət qocaldar səni*
*Sevdiyin sənət ucaldar səni.*

Böyük çillənin boz günləri. Şaxta yoxdur. Xəzrinin ulartısı adamda bir üşümə hissi yaradır. Bu üşümənin içində bir ılıq bahar nəfəsi duyuram. Bu ılıq bahar bütün yaradıcılığım boyu məni müşayiət edib və edir.

Mən Azərbaycan dilindən yazıram. Bu dildə danışmaqdan özü demiş “ləzzət” alan Heydər Əliyevin nitqindən yazıram. Hamının qəbul etdiyi bir siyasi lider nitqindən yazıram və yaza-yaza, Azərbaycan dilinin şirinliyini duya-duya bu

yaradıcılığı davam etdirirəm. Bu yolda arabir yoruluram da! Bu yorğunluq yaradıcılıqdan aldığım zövqün yanında heç nədir. Bu mübarizə yolunda insan yorula da bilir, tükənə də bilir. Bu yorulma yolunda, bu tükənmə məqamlarında yaxın dostların, doğma insanların, vicdanlı alimlərin dəstək verməsi "bu kitab o birilərindən zəif ola bilməz" deyən Kəlbəcər rayonu 58 saylı orta məktəbin müəllimi Famil Tapdıq oğlu Zamanova xüsusi minnətdarlıq edirəm.

Müasir koqnitiv dilçilik baxımından frazeologizmlər tədqiqata cəlb olmamışdır. Monoqrafiyanın IV hissəsində bu məsələlər işiqlandırılmışdır. Eləcə də bu hissədə siyasi lider Heydər Əliyevin dilində işlənmiş frazeologizmlərin lüğəti tərtib olunmuş, frazeologizmlərin siyasi mənaları diplomatik baxımdan işiqlandırılmışdır.

***Bu nitqin gücü frazeologizmlərlə siyasi lider xarakterini auditoriyalara açmaq gücündə olan bir nitqdir.*** Məsələn, Heydər Əliyev qətiyyətli dövlət başçısıdır. Bu özünü bir sıra frazeologizmlərin, xüsusilə nitqlə bağlı frazeologizmlərin səslənməsində göstərir: "Mən bir prezident kimi Azərbaycan Respublikasının bu ali dövlət vəzifəsini öz *üzərimə götürərkən* xalqa *söz vermişəm*, mən öz *sözümün üstündə durmuşam* və axıra qədər duracağam, son damla qanımadək, son nəfəsimədək *sözümdən dönməyəcəyəm*. Heç kəs də iradəmi qıra bilməyəcək". Bir böyük cümlədə "üzərimə götürmək", "söz vermək", "sözün üstündə durmaq", "sözdən dönməmək", "iradəni qırmaq" frazeologizmləri növbəti cümlədə işlənən "heç kəs" inkar əvəzliyi ilə birgə prinsipial, geridönməz, qətiyyətli bir nitq nümunəsi yaradılır.

***Bu nitqin daha bir gücü mətnin sonunda frazeologizmləri səsləndirməklə əksər vaxtlarda yaddaqalan sonluq yaratmağa, bu zaman digər nitq hissələri ilə harmoniya yaratmaqdadır***:

***Somatik frazeologizmlərlə nitqə xəlqilik vermək Heydər Əliyev nitqinin başlıca xüsusiyyətlərindəndir.*** Azərbaycan xalqının bu tip frazeologizmlərdən çox istifadə etməsi onun siyasi xadiminin də dilində səslənir: “Əgər böyük dövlətlər bəyanat verirlərsə ki, biz Azərbaycanın ərazi bütövlüyünü tanıyırıq, sonra da Azərbaycanın ərazisinin 20 faizinin Ermənistan silahlı qüvvələrinin işğalı altında olmasını görür və buna göz yumurlarsa və hətta deyirlərsə ki, özünüz dil tapın, danışın, deməli bunlar iki üzlülük edir, məsələyə ikili standartla yanaşırlar”. Yuxarıdakı mətndə 3 yerdə somatik frazeologizmlərdən (“göz yummaq”, “dil tapmaq”, “iki üzlülük”) nitq ustalığı ilə istifadə olunmuşdur. Bir bütöv cümlə, bir mətn, üç somatik frazeologizm. Bax, budur fenomenal natiqlik. Təkcə “ikiüzlülük etmək” frazeologizminin ikili standartla qarşılığının verilməsi bir daha izahedici Heydər Əliyev nitqindən xəbər verir.

Frazeologizmlərin semantik vahid olması elə böyük natiqin dilində öz əksini tapır: Məsələn, “özünü öldürmək” frazeologizmini əsasən də xalq dilində çox təsadüf olunan bu frazeologizmi elm adamları qarşısında (Azərbaycan Dövlət İqtisad Universitetinin 70 illik yubileyinə həsr olunmuş təntənəli mərasimdəki çıxışda) dilə gətirir. “Mən bunu məcazi mənada deyirəm” deməklə dilin dərin qatlarına bələdliyini nitqində səsləndirməklə frazeologizmlərə öz Heydər Əliyev süzgəcindən gələn izahını verir: “Bilirsiniz, indi zaman keçib, bəzi şeyləri demək olar. Mən Rəşid Behbudovu Sosialist Əməyi Qəhrəmanı adı verilməsinə təqdim edəndə dedilər ki, SSRİ-də bu janrdan olan heç bir artist belə ad almayıbdır. Mən dedim, ola bilər, almayıb, amma Rəşid Behbudov onların hamısından üstündür. Demək, o, almalıdır. Dedilər ki, yox, siz niyə elə düşünürsüz Rusiyada da çox böyüklər var. Dedim, var, onlara verin, mən sizə mane olmuram. Ancaq Rəşid Behbudov almalıdır. İndi bunu da deyim ki, birinci dəfə keç-

mədi. Bir ildən sonra yenə də məsələni qaldırdım və buna nail oldum. Əgər bir dəfə alınmadısa, alınmadı, Rəşid Behbudovdan ötrü özümü gedib orada öldürməliydim?! Amma etdim, *özümü öldürdüm* – yəni məcazi mənada deyirəm – ancaq nail oldum" [XXXIXc.s.101].

Monoqrafiyanın oxucularımızın ixtiyarına verilməsində çalışdığım ATU-nun və dissertantı olduğum AMEA rəhbərliyinə, elm məbədi sayılan kitabxanalarımıza-Axundov adına Milli Kitabxanaya, Prezident Kitabxanasına, AMEA-nın Mərkəzi Elmi Kitabxanaya, ATU Əsaslı Kitabxanasının əməkdaşlarına, tədqiqatla bağlı məqalələrin çap olunduğu elmi jurnalların redaksiya heyətlərinə, monoqrafiyalara rəy verən ziyalılarımıza, elmi redaktora, rəyçilərə, ön söz müəllifinə, texniki heyətə, "Elm və təhsil" nəşriyyatının kollektivinə və nəhayət bu kitabların formalaşmasında mənəvi dəstəklərini əsirgəməyən doğma insanlara minnətdarlıq edir, həmin kollektiv və şəxslərə möhkəm cansağlığı, səadət arzulayıram.

Sonda üzümü gənclərimizə tutub deyirəm: "Gənc dost! Bu gün sənin malik olduğun maddi və mənəvi dəyərlərin ən qiymətlisi dilimizdir. Öyrənin əcnəbi dilləri, mənimsəyin digər türk ləhcələrini! Amma gəlin unutmayaq ki, əsrlərin keşməkeşlərinə, viranedici müharibələrə sinə gərib bu günümüzə saf şəkildə, büllur şəkildə qorunub çatdırılan bir dilimiz var! Azərbaycan dili! Heydər Əliyevin dili! Allah dilimizi qorusun! Amin!"

# I FƏSİL
# HEYDƏR ƏLİYEVİN XARAKTERİ FRAZEOLOGİZMLƏRDƏ

Bir sıra frazeologizmlər xalqların istehsal sahələri və xalqın ictimai-siyasi həyatı ilə əlaqəli olduğundan onların motivasiyasını təyin etmək, heç şübhəsiz ki, danışan şəxsin hansı ictimai professional əhatəyə aid olduğunu müəyyən etmək lazım gəlir [13]. Bu baxımdan Heydər Əliyevin çıxışlarında işlətdiyi frazeologizmlər bu dahi şəxsiyyətin xarakterini açmaqda mühüm əhəmiyyət kəsb edir [45, 60, 61].

Koqnitiv dilçilik dili işarələr sistemi kimi dərk edərək, sistemin ciddi struktura malik olmasından çıxış edən, strukturalizmdən fərqli olaraq dili milli təfəkkürün ən vacib göstəricisi kimi qəbul edir [46, 88, 212, 287].

Yalnız koqnitivizm yox, ümumiyyətlə antroposentrik yanaşma insan amilini vacib sayır. İnsan amili isə formal əlaqələrdən uzaqlaşır və mənaya yaxınlaşır. Strukturalizm dilçiliyi dəqiq elm etmək cəhdi kimi də dəyərləndirilə bilər. Koqnitiv dilçilik dildə milli özünəməxsusluğu axtarır, milli psixologiya və milli təfəkkürün izlərini bərpa etməyə çalışır ki, elə bu baxımdan Ulu Öndərin nitqlərində məhz Azərbaycan milli təfəkkürünü, bu təfəkkürün nitqdə özünü göstərməsini açmağa çalışdıq.

Müasir koqnitiv dilçilik elm qarşısında tamamilə yeni məqsədlər və vəzifələr qoyur. Ənənəvi struktur-semantik baxışlar inkar olunmasa da, koqnitiv dilçilik xalq təfəkkürünün izlərini prioritet tədqiqat kimi ön plana çəkir [191, 245, 246].

Dilçilik elminin obyekti olan dil idrak-koqnisiya prosesinin son mərhələsinin məhsulunu özündə cəmləşdirir. Dil vahidləri isə həmin prosesin nəticəsi, məhsulu kimi diqqəti cəlb edir. Dil predmetinin dilin sistem-struktur mahiyyətlərindən uzaqlaşması dilçilik kontekstində dilin statusunu dəyişir.

Aydın məsələdir ki, söhbət obyektin xüsusiyyətlərindən yox, subyektin yanaşmasından, nəzər baxışından gedir.

Qrammatik birləşmənin özü və ya onun tərkibində olan sözlər məcazi mənaya keçərək mütəhərrikliyini itirdikdə sözlər arasında əlaqə və münasibətlər yaradan vasitələr donuq bir hala gəlir və o bir məfhumu ifadə edən sabit söz birləşməsinə çevrilir. Dildəki sabit söz birləşmələrinin öyrənilməsi ilə frazeologiya elmi məşğul olur [156].

Frazeologiyanın banisi Ş.Balli hesab olunur ki, o yazırdı: "Dilə möhkəm surətdə daxil olan birləşmələrin öyrənilməsinin xüsusi üsullarının zəruriliyini əsaslandırmaq lazımdır" [238]. Azərbaycan dilçiliyində ədəbi dilimizin frazeologiyasına dair bir sıra əsər və məqalələrdə ilk dəfə professor M.Hüseynzadə təşəbbüs göstərərək, "Müasir Azərbaycan dili" kitabında ayrıca olaraq "frazeologiya" bölməsi ayırmışdır.

Professor Ə.Dəmirçizadə [54] "Azərbaycan dilinin üslubiyyatı" kitabında "idiomlar və yaxud idiomatik ifadələr" başlığı ilə frazeoloji birləşmələri üslubi cəhətdən tədqiq etmişdir. Professor Y.Seyidov "Azərbaycan ədəbi dilində söz birləşmələri" kitabında "Sərbəst və sabit söz birləşmələri" adı altında frazeoloji birləşmələrə münasibətini bildirmişdir [187, 188].

Professor Afad Qurbanov da Azərbaycan dili frazeoloji vahidlərinin əmələ gəlməsini, onların məna növlərini və mənaca qruplarını geniş şəkildə izah etmişdir [124,128, 129]. Frazeologizmlər dilin xalqla ünsiyyət vasitəsi, varlıq və zəka zənginliyidir. Onların həm məzmun, həm də dildə həddindən artıq işlədilməsi alimlərin diqqətini özünə cəlb etmişdir. Frazeologizmlərin daxili məna quruluşunun və xarici strukturunun onların ayrı-ayrı dillərdə yeri və mövqeyinin açıqlanması, tərcümə olunma imkanlarının öyrənilməsi, milli və beynəlmiləl mahiyyətinin şərhi, onların işlənmə xüsusiyyətlərini və istifadə olunma sahələrinin təhlili həm nəzəri, həm də praktik cəhətdən aktuallıq kəsb edir [156].

Müəlliflər [54, 129, 187] təsadüfən yazmırlar ki, frazeologizmlərdən istifadə insanlara öz fikirlərini dəqiq, qısa və idiomatik ifadə etmək imkanını verir. Onlar məfhumu dolayı olsa da, konkret ifadə edir. Frazeologizmlərin əsas xüsusiyyətlərindən biri onların obrazlı, emosional, ifadəli dilin ekspressivliyində, onun emosionallığında xüsusi rol oynamasıdır. Onlar bu və ya digər anlayışı ayrı-ayrı sözlərdən dəfələrlə təsirli və obrazlı əks etdirir [30, 79, 107].

Frazeologizmlərdən həm bədii, həm publisistik, həm də digər üslublarda istifadə olunur. Onlar ədəbi dilin yazılı növündə, əsasən bədii üslubda yazılan əsərlərdə, xüsusi üslubi rola malikdir. Frazeoloji birləşmələr yazıçı fikrinin tutumunu böyüdür, bədii əsərin emosionallığına, üslubi keyfiyyətlərinin zənginləşməsinə xidmət edir [129, 187].

1. Yazıçı frazeoloji birləşmələri cümlədə işlədərkən mətnlə frazeoloji birləşmənin qarşılıqlı münasibətini əsas götürür, yəni mətn frazeologizmlərin semantik çalarlarını dəqiqləşdirir, frazeologizmlər isə mətnin. Böyük yazıçı və şairlərin əlində frazeologizmlər bu və ya başqa surətin danışığını fərdiləşdirmək, tipikləşdirmək üçün əsas vasitələrdən birinə çevrilmişdir [98, 187, 192, 193] Siyasi xadim dilində frazeologizmlərin mətndə yaratdığı semantika isə Azərbaycan dilçiliyində az öyrənilən sahələrdən biri olmuşdur [101, 182].

Bunun bir mühüm səbəbi sovetlər dönəmində siyasi diskursun geniş kütlələrə yaxın qoyulmaması idi.

Ümumilikdə frazeoloji birləşmələrin əsas xüsusiyyətləri bunlardır:

2. Frazeoloji birləşmələrin tərkibi dəyişməz olur;
3. Bu ifadələr dildə hazır şəkildə mövcud olur;
4. Frazeoloji birləşmənin tərkibinə daxil olan sözlər öz ilkin həqiqi mənalarını itirir və yalnız məcazi mənada işlənir;
5. İki və daha artıq sözdən ibarət olur;

6. Frazeoloji birləşmələr bütöv leksik vahidlərdir, lüğətlərə düşürlər;

7. Əksəriyyəti bir sözlə ifadə olunurlar;

8. Tərkib hissələrinə ayrılmadan bütöv bir cümlə üzvü olur.

İstər leksik tərkibinə və istərsə də leksik quruluşuna görə sabit olan frazeoloji vahidlər söz kimi dildə hazır şəkildədir. Bu əlamətinə görə frazeoloji vahidlər çox asanlıqla nitq hissələri üzrə təsnif edilir. Frazeoloji vahidləri sözə yaxınlaşdıran da onun məna cəhəti və qrammatik funksiya daşımasıdır. Buradan da söz ilə frazeoloji vahidin leksik məna və qrammatik kateqoriya kimi ümumi əlamətə malik olması meydana çıxır. Bu iki xüsusiyyət frazeoloji vahidin məzmununu təşkil edir. Yəni, leksik-qrammatik səciyyəsi onu frazeoloji vahidlərin müəyyən qrupuna aid etməklə, cümlədə sintaktik vəzifəsini müəyyənləşdirir. Bundan başqa frazeoloji vahidin leksik mənası onu sözün sinonimi edir, qrammatik kateqoriyanın olması isə cümlədə sözlə əlaqəsini yaradır [143, 229].

Deməli, frazeoloji vahid sözə məna və qrammatik funksiyaca yaxındır, lakin sözün eyni deyildir. Belə ki, eyni məna, eyni anlayış həm söz, həm də ifadə ilə verilə bilər. Lakin ifadə ilə verilən mənanın emosional boyası daha qabarıqdır, sünbülündən su daman – təmizkar, qara sudan qaymaq tutan – zirək, bacarıqlı və s. mənasında olduğu kimi.

Çünki frazeoloji birləşmələr hər bir publisistik və bədii mətnin, danışıq dilinin məna tutumunu çox asanlaşdırır. Danışıq dilində frazeologiyanın işlənmə tezliyi danışanın dil zənginliyini göstərir.

Danışıq vaxtı hərfi tərcümə olunmayan frazeoloji vahidlər yeni məna dəyəri daşıyaraq dilin estetik təsirini gücləndirir. Dildə belə zənginlik və idiomatiklik həyatımızı, insani münasibətlərdə hissi intuativliyi zənginləşdirərək canlılıq yaradır [71, 267, 305]. Poeziyada "Dil lövhə yaratmaq üçün söz sə-

nətkarının fırçasıdır, söz isə xarakteri, mənəviyyatı tam aydınlığı ilə canlandırmaq üçün onun boyalarıdır" [8, 83, 105, 166, 175, 198] fikri frazeoloji vahidlərin rolu və funksiyası isə daha tutumludur. O, özlüyündə bütöv bir obrazlı bədii lövhədir, poetik təfəkkürün məhsuludur. O, yaranışından xalqın yaddaşından süzülüb gələn cilalı deyim vasitəsidir. Həbib Mirzəyev [159] frazeoloji vahidlərdən istifadədə H.Arifin dil duyumu qabiliyyəti, obrazlı təfəkkürünün təkrarolunmazlığını araşdırmışdır. Dilin bədii təsvir və ifadə imkanlarını özündə birləşdirən frazeoloji dil faktları şeir dilində estetik tələbin bütün meyarlarını özündə ehtiva edir. Onlar bədiiliyin sınaqdan çıxmış ölçüləri ilə qavranıldığı üçün üslubi effekt yaradıcılığında fəal görünürlər [65, 159, 193, 236, 292]. Şeir dilindən fərqli olaraq siyasi səhnədə milyonların qəlbini ələ almaq gücündə olan Heydər Əliyevin çıxışlarına hakim olan frazeologizmlər heç də təsadüfən tədqiqata cəlb olunmur.

Siyasi mətn gördüyümüz kimi, natiqin iztirabını, hiss etdiyi acını və eyni zamanda qətiyyətini və millətinə verdiyi sözü tam mənasi ilə əks etdirə bilir. Bu zaman istifadə olunan frazeoloji birləşmələr oxucunu, yaxud dinləyicini natiqin səmimiliyinə inandırır və söylədiyi mətnin içindən gələn ürək sözləri olduğunu sübut edir. Auditoriya ilə ünsiyyət birbaşa və danışanın dil strukturu ilə bilik strukturu arasında əlaqənin əsasında əks olunur. Bununla bağlı R.Uodakin yazır: "Siyasi diskursun gücü mənanın tarixən böyümüş makrostrukturlarının təsirindən və insanların iştirakçıları olduqları dil oyunları vasitələrindən asılıdır. İştirakçıların fərdi təsiri həmin makro-strukturların dəyişməsinə töhvə verə bilər. Siyasi diskurs mətnini göndərən siyasi lider dilin bütün imkanlarından istifadə edərək öz verbal və qeyri-verbal auditoriyasına təsir edə bilir. Burada siyasi diskursun mətnindən daha çox danışanın məntiqindən doğmuş biliklərin ifadəsi də əsas təsir gücü hesab oluna bilər. Məlumatın mətnində frazeoloji birləşmələr-

dən istifadə diskursun ifadə gücünü artırır [118, 245]. Frazeoloji birləşmələrin linqvistik tədqiqatı ona görə lazımdır ki, həmin dilin frazeoloji fondu haqqında hərtərəfli informasiya əldə edilsin.

Frazeologizm və söz problemində iki əsas istiqamət qeyd edilir. İfadənin dar mənasında, leksikoloji anlamda, frazeologiya leksikologiyanın tərkib hissəsi kimi başa düşülür, geniş mənada isə frazeoloji birləşmələr linqvistikanın vahidi kimi anlaşılır [305]. İstedadlı yazarlar əsərlərində həmişə frazeoloji vahidləri geniş işlətmişlər. Bəzi yazıçılar isə hətta özləri frazeoloji ifadələr yaratmış və bir növ əsərləri vasitəsilə bu ifadələrə yaşamaq hüququ vermişlər [71, 297]. Şekspirdən əvvəl yaşamış yazıçılar da əsərlərində frazeoloji vahidlər yaratmışlar, lakin bu danılmaz faktdır ki, ingilis dilinin frazeoloji fondu Şekspirin adı ilə bağlıdır [71, 297].

Bəzi dilçilər Şekspir tərəfindən yaradılan sabit birləşmələrin sayının beş yüz, bəziləri isə mindən artıq olduğunu söyləyirlər. Apardığımız tədqiqat işində bir sıra frazeologizmlərə lüğətlərdə rast gəlmir ki, biz bunların siyasi liderin dilində işlədildiyinin şahidi oluruq: “Dili əritmək”– dili assimilyasiyaya məruz qoymaq anlamında işlədilən frazeologizmdir: “Amma eyni zamanda, bir *dili* başqasının içərisində *əritmək* lazım deyil” [VIIc.s.22].

“Dünyaya yenicə gəlmiş körpəyə bənzəmək” – yenicə yaranmaq, yeni təşəkkül tapmaq; “Bunlar da *dünyaya yenicə gəlmiş körpəyə bənzəyən*, yaranmaqda olan Azərbaycan ordusuna böyük zərbələr vurmuşdur” [XXVIIIc.s.329].

“Ədavətləri kənara qoymaq” – düşmənçiliyi aradan götürmək, ədavət toxumu əkməmək, Vətən yolunda bir olmaq; ~ nifaq salmamaq; “Bu yolda hamı həmirəy, bir olmalı, bütün *ədavətlər bir kənara qoyulmalıdır*, bu yolda hamımız Vətənin siravi əsgəri olmalıyıq ” [IIc.s.13].

Araşdirmalar göstərir ki, siyasi arenada ritorikadan, nitq fiqurlarından çox istifadə olunur. Elə Aristotelin adını qeyd etdiyimiz "Ritorika" əsərində istifadə etdiyi üslubu fiqurlardan siyasətçilərin çox istifadə etdiyi hallara rast gələ bilərik. Ümumiyyətlə, siyasi diksurs və ritorika arasında qarşılıqlı əlaqə əsrlərlərdir ki, mövcuddur. Qarşılqlı əlaqədə olan siyasi diskurs və ritorika bir-birinə təsir imkanına malikdir. Bununla bağlı A.Məmmədov və M.Məmmədov yazırlar: "Siyasi diksursun formalaşması ritorika qanununa tabe olmalıdır və yalnız bu halda uğur əldə edilə bilər" [118].

"Siyasi diskursun ifadə olunmasında ən çox rast gəlinən hal cəmiyytədə hökm sürən psixoloji, ideoloji, fərdi-mənəvi, kultural proseslərin əks olunmasıdır" deyə bilərik. D.Conson və R.Conson yazırlar: "Psixoloji baxımdan siyasi diskursun məqsədi vətəndaşlar arasında konsensus yaratmağa xidmət edir, çünki onun vasitəsilə kasıblıq, cinayətkarlıq, irqi ayrıseçkilik kimi problemlərin həlli asanlaşır". Daha sonra onlar yenə də yazırlar: "Siyasi diskurs əsaslandırılmış baxışların formal mübadiləsidir və bu baxışlara münasibətdə müxtəlif alternativ fəaliyyətlərin reallaşdırılması cəmiyyətdə mövcud problemlərin həlli üçün lazımdır" [118, 304].

İctimai düşüncə tərzi, ayrı-ayrı fərdlərin fəaliyyəti, sosial-iqtisadi amillər, kultural özünüdərk və s. siyasi diskursu müəyyənləşdirən amillər sırasına daxildir. Bu sadalanan amilləri siyasi diskursun kontekstinə aid edirlər [118]. Amma siyasi diskursun mətnini göndərən formalaşdırır. Mətni qəbul edən və mətni göndərən iki əsas iştirakçı hesab olunur və prosesin özü isə real zaman kəsiyində baş verir. Göndərilən ilə qəbul edən arasında ünsiyyət verbal (məsələn, görüşlər, yığıncaqlar və s.) və canlı şəkildə yayımlanan elektron kütləvi informasiya vasitələri ilə həyata keçirilir.

Mətni göndərənlə qəbul edən arasında əlaqə elə qurulmalıdır ki, onlar bir-birini anlasınlar. Xüsusilə də, əsas ağırlıq

mətni göndərənin üzərinə düşür. Məsələn, siyasi mətni göndərən şəxs auditoriyasına uyğun olaraq göndərəcəyi mətnin məzmununu qurmalıdr [118].

Frazeoloji vahid iki və ya daha çox tam mənalı sözün tarixən birləşməsindən ibarət komponentləri sintaktik və semantik cəhətdən parçalanmayan, quruluşca sərbəst söz birləşməsinə və ya cümləyə oxşayan, mənaca sözə, söz birləşməsinə və ya cümləyə ekvivalent olan, dildə hazır şəkildə mövcud olub, ənənəyə görə ya bir formada, ya da qrammatik cəhətdən dəyişdirilərək işlədilən konstruksiyalara frazeoloji vahid deyilir. Hər bir dil mürəkkəb frazeoloji sistemə malikdir. Hər hansısa bir dilin frazeologiyasını bilmək həmin dilə mükəmməl yiyələnməyin yollarından biridir. Bu dildə mənimsənilən ən çətin laydır. Dildəki frazeoloji vahidlər dilin daşıyıcısı olan xalqın tarixi, onun psixologiyası, düşüncə tərzi ilə birbaşa əlaqədardır. Bu baxımdan Azərbaycan dili frazeologiyasının keçdiyi inkişaf yolunu araşdırmaq həm xalqımızın tarixi, həm də oğuz qrupu türk dillərinin frazeoloji layının öyrənilməsində böyük əhəmiyyətə malikdir [150].

Sonrakı dövrlərdə getdikcə frazeoloji vahidləin işlənmə tezliyi artır. XIII əsrdə işlənən frazeoloji vahidlər, əsasən, türk-mənşəli baş sözlər əsasında formalaşır. Məsələn: ayrı düşmək, aradan çıxmaq, əldən qoymamaq və s. Artıq XVI əsrdən etibarən Füzulinin dilində türk mənşəli frazeoloji vahidlərlə yanaşı, baş sözləri fars və ərəb mənşəli olanlara da rast gəlinir. Məsələn: göftar düşmək, tab gətirmək və s. Aparılan tədqiqatlar onu göstərir ki, sonrakı əsrlərdə işlədilən frazeoloji vahidlərin bəziləri müəyyən dəyişikliyə uğramış, bəziləri arxaikləşərək passiv fonda keçmişdir. Ancaq müasir dövrə qədər frazeoloji vahidlərin kəmiyyət artımı sürətlə davam etmişdir. Müasir dövrümüzdə işlənən frazeoloji vahidlər, demək olar ki, əvvəlki dövrün frazeoloji vahidlərindən fərqlənirlər [150]. *Elə tədqiqatımızdan da məqsəd Ulu Öndərin nitqində*

*siyasi səhnədə dilimizin zənginləşməsinə kömək edən frazeologizmləri araşdırmaqdır*.

Heydər Əliyev şəxsiyyəti millilikə, xəlqiliklə yoğrulmuşdur. Bu özünü onda göstərir ki, dinləyicilər böyük auditoriyalardakı heyranlığını gizlədə bilmir. 26 fevral 2003-cü ildə Amerika Birləşmiş Ştatlarında – Vaşınqtonda "sözü havadan deməmək" kimi inkarlıqda işlənən, nitqlə bağlı frazeologizm elə bu sıradandır.

"Havadan deməmək" üçün geniş informasiyaya, haqqında danışılan məsələ ilə bağlı ətraflı, dərin məlumat və biliyə malik olmaq lazımdır: "İkinci məsələ Bakı-Tbilisi-Ceyhan haqqındadır. Görünürdü ki, o bu işlər barədə, bizim burada gördüyümüz işlər haqqında görüşdən əvvəl də məlumat almışdı. Elə birinci məsələ barədə də. Təbii ki, o bu sözləri *havadan demirdi*. Ona öz nazirliklərindən, müvafiq orqanlardan məlumatlar verilmişdi və bunun nəticəsində belə fikirlər söyləyirdi. Bakı-Tbilisi-Ceyhanla bağlı mən ona bizim keçirdiyimiz konfrans haqqında dedim. Onun səbəbləri, nə üçün Gürcüstan, Türkiyə, ABŞ ilə bir yerdə keçirməyimiz barədə dedim. Çünki siz görürsünüz, biz nə qədər çətinliklərlə rastlaşırıq. Bəzən Azərbaycanın daxilində bunu o qədər də hiss etmirlər, elə siz jurnalistlər də. Çünki biz istəmirik ki, hər bir şeyi mətbuata çıxaraq və hər şeyi problemə çevirək" [XLIVc.s.124].

"Demək" nitq feilini təkrar etməklə informasiyanın çatdırılmasından danışır, informasiyaya söykənməyən məlumatı "havadan demək" kimi auditoriyaya bəyan edir. Məhz xalq arasında ümumişlək olan bu frazeologizm Heydər Əliyev xarakterindəki xəlqiliyi bir daha açıqlayır.

Heydər Əliyev qətiyyətli dövlət başçısıdır. Bu özünü bir sıra frazeologizmlərin, xüsusilə nitqlə bağlı frazeologizmlərin səslənməsində göstərir: "Mən bir prezident kimi Azərbaycan Respublikasının bu ali dövlət vəzifəsini öz üzərimə götürərkən

xalqa *söz vermişəm*, mən öz *sözümün üstündə durmuşam* və axıra qədər duracağam, son damla qanımadək, son nəfəsimədək *sözümdən dönməyəcəyəm*. Heç kəs də *iradəmi qıra bilməyəcək*" [IIc.s.109]. Bir böyük cümlədə "üzərimə götürmək", "söz vermək", "sözün üstündə durmaq", "sözdən dönməmək", "iradəni qırmaq" frazeologizmləri növbəti cümlədə işlənən "heç kəs" inkar əvəzliyi ilə birgə prinsipial, geridönməz, qətiyyətli bir nitq nümunəsi yaradılır. Heydər Əliyev Azərbaycanın dünya birliyində layiqli yer tutması yolunda çalışan liderdir. Onun əsas məqsədi respublikamızın "adını, şanını-şöhrətini dünyaya yaymaqdır". Dünyəvi dövlət quruculuğu yolunda gənclərə böyük önəm verən dövlət xadimi "dünyaya yaymaq" frazeologizmlərindən yerindəcə yararlanır. Xalqını dünyaya təqdim etmək, xalqını tanıtmağı özünə bir nömrəli vəzifə hesab edirdi: "Bəli, *xalqımızı tanıtmaq* lazımdır. Xalqımızı tanıtmaq lazımdır. Mən neçə illərdir çalışıram, işləyirəm, bir məqsədim var: xalqımızı tanıtmaq" [VIIIc.s.341].

Milli Elmlər Akademiyasının 50 illik yubileyinin keçirilməsi ilə bağlı 31 yanvar 1997-ci ildə Azərbaycan Elmlər Akademiyasının rəhbərliyi, həqiqi və müxbir üzvləri, institut direktorları və aparıcı alimləri ilə görüşdə Heydər Əliyev "yaxadan tutmaq" frazeologizmi ilə elmə hansı müsbət səviyyədə yanaşmasını göstərir. Azərbaycan elminin inkişafını həmişə diqqət mərkəzində saxladığını auditoriyaya açıqlayır: "Mən bu sahədə ilk addımı atmışam – sizin, Elmlər Akademiyasında çalışan bütün işçilərin məvacibinin 50 faiz artırlıması haqqında bu gün qərar qəbul etmişəm. Bununla yanaşı, bizim görkəmli alimlərimiz – hansılar ki, Elmlər Akademiyasının həqiqi, müxbir üzvləridir – şübhəsiz ki, seçilməlidirlər. Keçmişdə rütbə məvacibləri olub, indi də var. Bu rütbə məvaciblərinin də xeyli artırılması haqqında qərar qəbul etmişəm. İndi akademikliyə görə nə qədər alırsınız? Yerdən: Əlli min manat. Heydər Əliyev: Müxbir üzvü nə qədər alır? Yerdən:

İyirmi beş min manat. Heydər Əliyev: bunu on dəfə artırsam necə olar? (Alqışlar) On dəfə artırmışam... Doğrudur, bəlkə bundan da çox olmalı idi, ancaq hesab edirəm ki, bu artım müəyyən qədər təsirli olacaqdır" [VIIIc.s.362].

Sonrakı nitq mərhələsində yalnız alimlərə aid ola biləcək ərk mənasında "yaxadan tutmaq" frazeologizmini rəva bilir. "Yaxamızdan tutaydınız" ifadəsini eşidən auditoriyanın sevgi dolu heyranlığı ölçüyə gəlməz nitq effektinə işarədir: "Təəssüf ki, belə təşəbbüs, cəhdlər Elmlər Akademiyasının rəhbərliyi tərəfindən göstərilməyibdir. Mən dünən akademiyanın prezidenti Eldar Salayev ilə danışarkən ona bu barədə dedim. Dedim ki, mən demişdim akademiyanın əlli illik yubileyini keçirmək lazımdır, sizin də borcunuz o idi ki, *yaxamızdan tutaydınız* ki, gəlin bunu keçirək. Belə olsaydı, bu yubiley çoxdan, yəni bir il bundan öncə keçirilmiş olardı" [VIIIc.s.361].

Heydər Əliyev dövlət və hüquq dialektik vəhdətini həmişə əldə rəhbər tutan, hüquqi etikanı incəliklərinə qədər bilən siyasi liderdir. "Kökünü kəsmək" frazeologizmi "qarşısını almaq" söz birləşməsi ilə müqayisədə auditoriyada daha təsirli və sərt səslənən, yüksək semantik yükə malikdir: "Mən hüquq-mühafizə orqanlarına göstəriş vermişəm ki, son iki ildə aşkara çıxarılmış silahları, sursatları cəmləsinlər, ümumi bir hesabat versinlər ki, 1995-1996-cı illərdə Azərbaycanda həm o cinayətkarlardan həm də ayrı-ayrı insanlardan, heç bir cinayət etməmiş adamlardan nə qədər belə silahlar, sursatlar yığılıb toplanıbdır. Bunlar onu göstərir ki, əvvəlki illərdə Azərbaycanda ictimai-siyasi kriminogen vəziyyət nə qədər gərgin idi. Məhz bunun nəticəsində də hər bir adam gedib özbaşına avtomat da, pulemyot da, qumbara da ala bilərdi, aparardı, saxlayardı, istifadə edərdi. Biz bunların qarşısını almışıq, bundan sonra da alacağıq, kökünü kəsəcəyik. Ancaq indi çalışmaq lazımdır ki, ümumiyyətlə bütün vətəndaşlar, xüsusən gənclər bir daha bu yola getməsinlər" [VIIIc.s.392].

"Özü öz həyatını qurmaq" frazeologizmi Heydər Əliyev şəxsiyyətinin uzaqgörənliyini bir daha sübuta yetirir. Bu uzaqgörənlik tarixi faktları analitik yolla auditoriyalara çatdırmaqda özünü göstərir: "Bu beş il onu göstərdi ki, bizim ölkəmiz müstəqil ola bilər, xalqımız azad, sərbəst, heç bir başqa dövlətdən asılı olmayaraq yaşaya bilər. *Özü öz həyatını qura bilər*. Bu beş il onu göstərir ki, bu yolda – milli azadlıq yolunda, müstəqillik yolunda qarşımıza çıxan bütün maneələri, bütün müqavimətləri dəf etməyə biz qadirik. Bunları dəf etdik, bunların hamısını məğlub etdik, öz müstəqilliyimizi bütün dünyaya sübut etdik" [VIIIc.s.188].

"Tərəqqi ilə ayaqlaşmaq", "əlindən gələni etmək" frazeologizmlərinin işləndiyi 10 dekabr 1997-ci ildə İslam Konfransı Təşkilatının üzvü olan ölkələrin rəhbərlərinin VIII zirvə görüşündəki nitq Heydər Əliyevin dünyəvi dövlət qurmaq xarakterini, yüksək dini-fəlsəfi dünya görüşə malik olmasını bir daha gündəmə gətirir. Auditoriya İslam ölkələrinin tərəqqisi yolunda öz sözünü deyən bir müsəlman ölkəsi liderini görürlər. "Ayaqlaşmalıyıq", "səviyyəsinə qalxmalıyıq" qətiyyətli ifadələrlə – frazeologizmlərlə ətalət və süstlükdən çıxaraq İslamın proqressiv din olmasını həyatda sübut etməyə çağırır. Öz ölkəsinin də bu tərəqqi yolunda fəaliyyətini bəyan edir: "Müsəlman xalqları və ölkələri dünyada gedən mürəkkəb proseslərlə üzləşirlər. Bir tərəfdən elm və texnika güclü surətdə inkişaf edir, yeni ixtiralar, texnologiyalar Yer kürəsinin simasını dəyişdirir, o biri tərəfdən bir çox xalqlar aclıqdan, yoxsulluqdan, cəhalətdən əzab çəkirlər. Ona görə biz *tərəqqi ilə ayaqlaşmalıyıq*, inkişaf etmiş ölkələrin *səviyyəsinə qalxmalıyıq*. Son illər ərzində Azərbaycanın müsəlman ölkələri ilə siyasi, iqtisadi, ticarət və mədəni əlaqələri xeyli inkişaf etdirmişdir. Həm İslam Konfransı Təşkilatı, həm də başqa beynəlxalq təşkilatlar çərçivəsində əməkdaşlığımız məhsuldar və faydalı olmuşdur. İslam aləminin qlobal miq-

yaslı məsələlərinin həllində çoxtərəfli əməkdaşlığın inkişaf etdirilməsi üçün Azərbaycan Respublikası əlindən gələni etməkdədir" [XIIIc.s.339].

Hadisələrin düzgün qiymətləndirilməsi, hadisələrə ayıq baxış baxımından "ağı-qaradan seçmək" frazeologizmi işə düşür. Frazeologizm mətndə yekunlaşdırıcı kimi çıxış edir: "Amma Azərbaycanın içində olan, özlərini müxalifət adlandıran qüvvələr hay-küy saldılar ki, "biz burada uduzmuşuq, Ermənistan tərəfi udub." Belə dərdimiz də vardır. Amma bunlar heç, ölkəmizin daxilində olan işlərdir, böyük şey deyil. Biz bunların öhdəsindən gəlirik. Yəni xalq hər şeyi görür, adamlar *ağı qaradan seçirlər*. İndi əvvəlki vaxt deyil" [XIc.s.357].

Heydər Əliyevin dilində tez-tez işlədilən "əlləri kəsmək" frazeologizmi qətiyyətli, ölkənin başının üstünü qara buludlar alarkən sərt tədbirlər görmək gücündə olan lider surəti yaradır. Vaxtında müstəqilliyə qarşı yönələn "əllərin kəsilməməsi"nin hansı bəlalar törətdiyini gələcək nəslə, gənc nəslə çatdırır. Bu somatik frazeologizmə qədər Dağlıq Qarabağla bağlı XX əsrin əvvəlindən sonunadək ermənilərin apardıqları təcavüzkarlıq siyasəti və Azərbaycanlıların buna müqaviməti sadə, anlaşıqlı dildə çatdırılır. Sonda isə kəsərli olmayan siyasət və kəsərsiz başçıların fərasətsizliyi müstəqilliyimizə uzanan əllərin vaxtında kəsilməməsinə gətirib çıxarır: "Dağlıq Qarabağ Muxtar Vilayəti həmişə Azərbaycanı susdurmaq, Azərbaycana diktə etmək, respublikamızın sərvətlərindən, imkanlarından başqalarının istifadə etməsi mənbəyi olubdur. Ancaq həqiqət naminə demək lazımdır ki, həm 20-ci, 30-cu, 40-cı, 50-ci, həm də sonrakı 60-70-ci illərdə əgər bu məsələ vaxtaşırı qalxıbsa, onun qarşısı da alınıbdır. Onun qarşısı bir tərəfdən Azərbaycanı idarə edən şəxslər tərəfindən alınıbdır. İkinci tərəfdən isə, ədalət naminə demək lazımdır ki, o vaxt Sovetlər İttifaqında hökm sürən qanun-qayda çərçivəsində alınıbdır. Azərbaycanın belə bir tarixi xalqımız, xüsusən respublikamızı idarə edənlər,

siyasətlə məşğul olanlar üçün daim dərs olmalı idi. Dərs olmalı idi ki, Azərbaycan təhlükə altındadır. Dərs olmalı idi ki, Azərbaycan bütün daxili problemləri kənara qoyub xarici qüvvələrin respublikamıza uzatdığı *əlləri kəsə bilsin*, onların bu qəsbkar meyllərinin qarşısını ala bilsin və Azərbaycanın bütövlüyünü qoruyub saxlaya bilsin" [VIc.s.79].

İşlətdiyi frazeologizmlərdə Heydər Əliyev gənclərə öyüd verən, onları düz yola, haqq yoluna, dövlətçilik yoluna dəvət edən ağsaqqal obrazı qazanır. 27 avqust 1997-ci ildə Varşava şəhərində "Polşadakı Azərbaycan icmasının nümayəndələri ilə görüşdəki söhbətdə" bu obraz auditoriya üçün aydınlaşır. Bu obraz "ağlı başına yığmaq", "başa salmaq" somatik frazeologizmlərlə auditoriyalara ünvanlanır. Çıxışı eşidən və bu çıxışla sonralar tanış olanlar ağsaqqal dövlət başçısı necə olur sualına cavab alırlar: "Ona görə də siz *ağlınızı başınıza yığın*, cavan adamlarsınız, öz işinizlə məşğul olun. Əgər təbliğat işi ilə məşğul olursunuzsa, Azərbaycan dövlətinin, hökumətinin siyasətini, Azərbaycanın nailiyyətlərini təbliğ edin. Amma bu jurnalda başdan-ayağa Azərbaycan ən çirkin vəziyyətdə əks olunubdur. Ona görə də buna baxandan sonra mənim köməkçilərim dedilər ki, prezidentin onları qəbul etməsi lazım deyildir. Çünki bu işi görürlərsə, layiq deyillər ki, prezident onları qəbul etsin. Mən isə dedim ki, yox, onları görmək, onlarla tanış olmaq istəyirəm. Əgər onlar həqiqətən belə fikirdədirlərsə, qoy olsunlar, mən onlara öz fikrimi demək istəyirəm. Bəlkə onlar aldanıblar, onları *başa salmaq* istəyirəm" [XIIc.s.97].

"Yox" inkar, "qoy olsun" qüvvətləndirici ədatı ilə prinsipial ağsaqqallıq missiyasını Heydər Əliyev dönmədən həyata keçirir. Başqa bir nitq məqamında qanunları pozanlara, "yolunu azan"lara, "quyunun dibinə getmək" frazeologizmi ilə öyüd-nəsihət verir: "Necə deyərlər, adam *yolun azanda*, *əyri yola düşəndə* lap *quyunun dibinə gedir.* Kazino tikməyi bəs deyil, sonra da gəlib Nazirlər Kabinetinə, maliyyə nazi-

rinə, ona-buna təsir edib ki, bu kazinonu vergidən azad edin" [XVc. s. 19]. Bir cümlədə üç frazeologizmlə öyüd vermək, ağsaqqal sözü demək, düz yola dəvət etmək nitq prosesində tək-tək dövlət xadimlərinə müyəssər ola bilər.

"Vaxt almaq" frazeologizminin müxtəlif çıxış məqamlarında təkrarı Heydər Əliyevin vaxta, zamana hörmətinin, daha doğrusu sevgisinin sübutudur: "Hörmətli mer mənim İtaliyaya səfərimdən danışdı. Ona görə *vaxtınızı almaq* istəmirəm. Təkcə bunu demək istəyirəm ki, səfərimin gedişindən də, nəticələrindən də, prezident Skalfaro cənabları ilə, baş nazir Prodi ilə söhbətlərim və danışıqlarımdan da, imzalanmış dövlətlərarası, hökumətlərarası sənədlərdən də, habelə "Eni" şirkəti ilə Azərbaycan Dövlət Neft Şirkəti arasında bağlanmış iqtisadi sazişdən də son dərəcə məmnunam" [XIIc.s.251-252].

Prinsiplərə, amallara, əqidələrə əks gedənləri "dönük çıxmaq" frazeologizmi ilə damğalayır. Düz yola dəvət olunanların sonradan yollarını azmağına isə təəssüf edir. Lakin "dönüklər də, yolunu azanlar da dövlət başçısının diqqət mərkəzində durmalıdır" müddəasını irəli sürür: "Mən bunu açıq deyim, – çünki o vaxtlar, kommunist rejimi dövründə mənimlə işləyən kadrların bir çoxu nə təhər deyim, *dönük çıxdı*. Ona görə də mən, bu cavan adamları öz ətrafıma topladım, onlar da mənimlə bir müddət işlədilər, ancaq burada Xalq Cəbhəsi hakimiyyətə gələndən sonra, təəssüf ki, başladılar korlanmağa" [1, XIIIc.s.43].

Bir qisim frazeologizmlərdə Heydər Əliyev xarakterinin poetik-fəlsəfi tərəfləri, eləcə də dini-psixoloji cəhətləri özünü göstərir. Belə ki, Azərbaycan yazıçılarının X qurultayında söylədiyi nitqin bir parçasındakı kimi: "O vaxtkı yaşlılardan, deyəsən, heç kim qalmayıb, təkcə Mirvarid xanım buradadır. Vaxtilə Anar, Yusif, Elçin və başqaları ilə gənc nəslin nümayəndələri kimi görüşürdük. Mən hesab edirəm, indi də gəncdirlər, çünki özüm də gəncəm. Ancaq necə olsa da, özümüzü

nə qədər gənc hiss etsək də, *yaş özünü göstərir*, gün keçir, ay keçir, il keçir, *yaş üst-üstə gəlir*" [XIIIc.s.9]. "Yaş özünü göstərmək", "yaş üst-üstə gəlmək" tipli frazeologizmlər özünəməxsus Heydər Əliyevin nitq qəlibindən süzülərək auditoriyaları fəth edir.

Dövlət dilinin qorunması ilə bağlı Heydər Əliyevin Yazıçılar Qurultayında işlətdiyi "hakim dil etmək" frazeologizmində dilə münasibətdə sərt mövqe nümayiş etdirən dövlət başçısının xarakteri açılır. Auditoriya öz qarşısında dil məsələlərinə münasibətdə geridönməz lider xarakterinin şahidi olur: "Ancaq biz dünyada öz dilimizlə tək yaşayırıq. Bizim birinci nailiyyətimiz o olmalıdır ki, öz dilimizi Azərbaycanda *hakim dil etməliyik*. Hər bir azərbaycanlı öz ana dilini bilməlidir, bu dildə səlis danışmalıdır və bu dili sevməlidir. Bununla yanaşı biz çalışmalıyıq ki, məktəblərimizdə, universitetlərimizdə gənclərimiz bir neçə dil öyrənsinlər. Mütləq öyrənməlidirlər. Biz artıq dünyaya qovuşmuşuqsa, Dünya Birliyinə daxil olmuşuqsa, gərək insanlarımız bir neçə dil bilsinlər – ingilis dilini də bilsinlər, rus dilini də bilsinlər, fransız dilini də bilsinlər" [XIIIc.s.136]. "Hər bir" təyin əvəzliyi, "bilməlidir", "səlis danışmalıdır", "sevməlidir", "mütləq öyrənməlidirlər" eləcə də feilin əmr şəklində səslənən iki yerdə "bilsinlər" ifadələri ilə dilə münasibətdə möhtəşəm, qətiyyət duyulan nitq və bu nitqin yaradıcısı Heydər Əliyev şəxsiyyəti göz önünə gəlir.

Azərbaycan xalqına daxilən xas olan poetiklik hissi ümummilli liderin də nitqlərində özünü biruzə verir. Hətta iqtisadi məsələlərdə danışanda belə bu poetiklik auditoriyaları əfsunlayır: "Türkiyənin iş adamları bəzən bizim qanunlar çərçivəsində imkan yaranmadığından şikayət edirlər. Bu şikayətlər ola bilər. Ancaq bilirsiniz, hesab edin ki, biz böyük bir cığır içərisindəyik. Biz bu çığırı, yolu aça-aça gedirik. Əlbəttə, bu çığırı açanda qarşımıza daş da, kəsək də, qaya da çı-

xacaq, – bunlar olacaqdır. Bunlardan qorxmaq lazım deyil. Əsas odur ki, biz irəliyə gedirik və gedəcəyik" [XIVc.s.273]. Burada cığır açanda sinonim cərgə ilə (daş da, kəsək də, qaya da) maneçiliyin olacağını da poetikcəsinə auditoriyaya çatdırır.

"Ayaq üstündə möhkəm dayanmaq" frazeologizmi Heydər Əliyev xarakterində yeni bir cəhəti – mətinliyi, dövlət başçısı üçün vacib əhəmiyyət kəsb edən dayanıqlığı, tarazlı siyasət yeritməyi göstərir: "Qarşılaşdığımız bir sıra çətinliklərə baxmayaraq, ötən illər ərzində biz çox işlər görmüşük. İndi Azərbaycan müstəqil dövlət kimi *ayaq üstündə möhkəm dayanan* və öz suverenliyinin, öz dövlət müstəqilliyinin, öz milli azadlığının keşiyində möhkəm dayanan bir dövlətdir" [XIIIc.s.236-237].

"Dünyaya səpələnmək" frazeologizmi ilə böyük azərbaycanlı obrazını yaradır: "Dünyada gedən müharibələr, inqilablar, hərbi münaqişələr ictimai-siyasi proseslər nəticəsində Azərbaycan parçalanmış, azərbaycanlıların bir qismi yerlərindən-yurdlarından sürgün, deportasiya olunmuş, parçalanma nəticəsində bir-birindən ayrı düşmüşlər. Bəziləri isə özlərinə iş aramaq, təhsil almaq üçün doğma torpaqlarını tərk edib başqa ölkələrdə məskunlaşmışlar. Beləliklə, tarix boyu böyük Azərbaycan torpağından azərbaycanlılar *dünyaya səpələnmişlər*" [XIVc.s.13-14]. "Dünyaya səpələnmək" frazeologizminin ardınca növbəti nitq mərhələsində "sıx olmaq" frazeologizmi gəlir: "Ümidvaram ki, altı il bundan öncə təməli qoyulmuş bu bayram günü bütün dünya azərbaycanlıları tərəfindən qeyd olunaqcaq və azərbaycanlıları bir-biri ilə qovuşmaq, bir-biri ilə sıx olmaq üçün, daha da böyük fəaliyyətə dəvət edəcəkdir" [XIVc.s.15].

Bir sıra frazeologizmlər nitqlə, natiqliklə bağlı olub Heydər Əliyevin dilində xüsusi yer alır. Belə ki, "vurğulamaq istəmək", "nəzərə çarpdırmaq", "qələmə vermək" frazeolo-

gizmlər auditoriyanın diqqətini nitqə cəlb etməkdir. “Vurğulamaq istəmək” deməklə ümuminin içərisində xüsusini ayırmaqla dinləyiciləri səfərbər edə bilir: “Onu da *vurğulamaq istəyirəm* ki, 1996-cı ilin martında Tbilisidə və 1997-ci ilin fevralında Bakıda Azərbaycan ilə Gürcüstan arasında imzalanmış böyük əhəmiyyətli sənədlər dövlətlərimizin qarşılıqlı surətdə faydalı əməkdaşlığının genişləndirilməsi üçün yaxşı əsas olmuşdur. Nəzərə çarpdırmaq istəyirəm ki, ölkələrimiz bir-birinə bənzər eyni problemlərlə qarşılaşmışdır” [XIVc.s.171].

“Qələmə vermək” qarşı tərəfə yönələrək əksər hallarda mənfi mənada işlənir. “Özünü gözə soxmaq” frazeologizmi şifahi xalq ədəbiyyatı dövründə öz yerini tutduqca, yazılı dövrümüz üçün “qələmə almaq”, “qələmə vermək” daha çox məqsədəuyğun sayılır: “Biz bunları həyata keçirdiyimiz və bir çox nailiyyətlər əldə etdiyimiz halda, bəziləri özlərini bu sahədə böyük bir alim, yaxud da ki, dahi bir şəxs kimi qələmə verərək müəyyən tələblər irəli sürürlər... Mən belə düşünürəm ki, qoy onlar danışsınlar, yazsınlar, desinlər, biz isə öz işimizlə məşğul olaq” [XVc.s.121].

Təsadüfi deyildir ki, mətndə “danışmaq, yazmaq, demək” nitq feilləri irəli sürülür. Bir çox frazeologizmlər Heydər Əliyev xarakterindəki qətiyyəti hadisələrə qəti mövqeyini açmaqda bilavasitə kömək edir. “Güclü addım atmağı” əldə rəhbər tutan ümummilli liderin bu frazeologizmini eşidən auditoriya qətiyyətə yüklənir. Böyük natiqin feilin lazım şəklində işlətdiyi “yanaşmalıyıq” ifadəsi “güclü addımla” uzlaşır: “Məsuliyyətimiz Azərbaycanda demokratik dövlət quruculuğu sahəsində yeni bir *güclü addım atmaqdan*, Azərbaycanda prezident seçkilərini müasir tələblərə, demokratik prinsiplərə uyğun keçirib xalqın istədiyi adamın prezident seçilməsini təmin etməkdən ibarətdir. Xalq kimə səs verəcəksə, o da prezident olacaqdır. Xalqın iradəsi hər bir şeydən üstündür. Hər

birimiz də xalqın iradəsinə hörmətlə yanaşmalıyıq” [XIVc.s.251].

Satirik üslublu çıxışlar Heydər Əliyevin nitqlərində heç də az təsadüf olunmur. Satirik dillə ən dərin, ən incə mətləblər xalqa çatdırılır. Şəxsi həyatında Cəlil Məmmədquluzadə sevgisi Heydər Əliyevin nitqlərinə də hakimdir: “Ona görə bu beş ildə Azərbaycan dilinin dövlət dili kimi yaşaması, möhkəmlənməsi, inkişaf etməsi də bizim ən böyük nailiyyətlərimizdən biridir. Bu, təkcə dil məsələsi deyil, Azərbaycançılıq məsələsidir. Azərbaycançılıq bizim üçün böyük Azərbaycan nöqteyi-nəzərindən çox vacibdir. Biz özümüzü bir ölkənin *quyruğuna bağlaya* bilmərik. Biz heç kəsin *quyruğuna bağlanan* bir xalq deyilik. Biz böyük xalqıq, müstəqil xalqıq, öz adımız, öz dilimiz, ədəbiyyatımız, mədəniyyətimiz, musiqimiz və öz ölkəmiz var” [XVIc.s.412].

Frazeologiya – sabit söz birləşmələrinin qanunauyğun inkişafını, mənşəyini, yaranmasını, xüsusiyyətlərini, forma və məzmun zənginliyini, işlədilmə imkanını, semantik və qrammatik strukturunu, söz və sərbəst birləşmələrlə əlaqəsini və s tədqiq edir.

Frazeologizmi təşkil edən sözlər onun tərəfləri, yaxud komponentləri hesab olunur. Onlar frazeologizmlərdə üzvi surətdə elə birləşir ki, onları bir-birindən ayırmaq və hər bir sözü müstəqil mənada düşünmək qeyri-mümkündür. Frazeologizmi təşkil edən sözlərin hamısı ümumilikdə bir məna ifadə edirlər. Frazeologizmlər dilin xalq fizionomiyası onun original vasitəsi, varlıq və zəka zənginliyidir [24, 245, 287].

Frazeologizmlərdən istifadə insanlara öz fikirlərini dəqiq, qısa və idiomatik ifadə etmək imkanını verir. Onlar məfhumu dolayı olsa da, konkret ifadə edir. Frazeologizmlər dilin ekspressivliyində, onun emosionallığında xüsusi rol oynayır. Onlar bu və ya digər anlayışı ayrı-ayrı sözlərdən dəfələrlə təsirli və obrazlı əks etdirir. Frazeologizmlər möhkəm milli xüsusiyyətə

malikdir. Hər hansı xalqın frazeologizmlərini öyrənməklə biz həmin xalqın mədəniyyəti, tarixi, həyat və yaşayış tərzi ilə yaxından tanış oluruq.

Rus dilçilərindən A.A.Bulaxovski frazeologiyaya hazır şəkildə işlədilən sitat materialı kimi baxaraq, ümumiyyətlə fikir mübadiləsi zamanı istifadə edilən sabit söz birləşmələrinin hamısını frazeologiyanın tədqiqat obyekti hesab edib, ona belə tərif vermişdir: “Frazeologiya, adətən, dildə məna cəhətdən parçalanmayan, lakin işlək sitat material kimi möhkəmlənən atalar sözləri, məsəllər, yazıçıların “qanadlı sözlər” şəklinə düşmüş ifadələr və bunun kimiləri daxildir. Onlar müəyyən bütövlük təşkil edən söz birləşmələridir” [24].

Ferdinand de Sössür yazırdı: “Biz hər şeydən əvvəl, külli miqdarda ifadələrə rast gəlirik ki, bunları dilə aid etmək lazımdır. Bunlar elə hazır nitq parçalarıdır ki, adətən daxilindəki ayrı-ayrı mənalara malik halda bu, məqbul sayılmır. Bu söz birləşmələrinin ənənəyə görə daşıdığı məna komponentlərinin bütövlükdə mənasından və sintaktik quruluşundan asılıdır. Bu cür söz birləşmələri düzəldilmir, bunlardan dildə hazır şəkildə istifadə olunur” [283].

Ş.Balli [238] frazeoloji birləşmələrin əlamətini müəyyənləşdirməkdə birləşmənin həm zahiri, həm də daxili cəhətinə nəzər yetirməyi mühüm şərt hesab edirdi. O, sabit söz birləşmələrini öz əsərində leksik-semantik və üslubi-məna cəhətdən şərh etmişdir. Dilçilik tarixində sabit söz birləşmələrinə bu şəkildə yanaşmaq tamamilə yeni idi [238].

Y.Seyidov öz monoqrafiyasında dildəki sərbəst və sabit söz birləşmələrindən bəhs edərək, sərbəst söz birləşmələrindən əsil qrammatik birləşmə kimi söz birləşmələri haqqında sintaktik təlimin əsas və vahid obyekti olduğunu, sabit söz birləşmələrinin isə dilin tarixi inkişaf prosesində yarandığını və dilimizdə dəyişmədən, yəni hazır şəkildə işlədildiyini gös-

tərir. Sabit söz birləşmələri sərbəst söz birləşmələrinin məna inkişafı, məna dəyişikliyi nəticəsində yaranmışdır [24].

Onu da qeyd edək ki, Azərbaycan dilçiliyində "sabit birləşmə" termini ilə yanaşı, eyni mənada "frazeoloji birləşmələri' də işlədilir. Bu halda sabit birləşmələrlə frazeoloji birləşmələr bərabərləşdirir [48, 49]. Bir sıra əsərlərdə isə frazeoloji birləşmələr sabit birləşmələrin, yuxarıda qeyd edildiyi kimi bir növü hesab edilir [36, 38].

Bu göstərir ki, sabit birləşmələrin əhatə dairəsi də hələ dəqiq şəkildə müəyyənləşdirilməmişdir. Dilçilikdə "frazeoloji birləşmələr"ə verilən müxtəlif tərifləri nəzərdən keçirsək, bu sahədə fikir ayrılığına nəzər yetirsək, məsələnin daha mürəkkəb olduğunu görərik. S.Cəfərov idiomları, ibarələri, hikmətli sözləri, atalar sözlərini, zərb-məsəlləri frazeoloji birləşmələrə aid edir [48, 49, 166, 175].

Frazeoloji vahidlər (sabit birləşmələr) dildə hazır şəkildə daşlaşmış formada olur. Onlar dilin tarixi inkişafi prosesində yaranır və sabitləşir. Belə birləşmələri əmələ gətirən sözlər oz əvvəlki mənalarından az ya çox dərəcədə uzaqlaşır, onlarrn mənaları birləşmənin ümumi məna fonunda itir, hissedilməz olur və beləliklə, bu sözlər biriəşmənin leksik-semantik ünsürlərinə çevrilmiş olur. Səslər yığışaraq sözləri əmələ gətirdikləri və buradan da müəyyən anlayışların, məfhumların ifadəsi alındığı kimi, belə birləşmələrdə də sözlər ümumilikdə bir neçə məna, bir məfhum ifadə edir. Burada sözlər öz aktivliyini itirir, bir qədər də irəli getsək, demək olar ki, onlar birləşmələrin daxilində heç bir məfhum ifadə etməyən "mənasız" formalara çevrilir, halbuki həmin söz ayrılıqda müstəqil mənalara malik olur [36, 52].

Heydər Əliyev dilində səslənən frazeologizmlərin tədqiqində frazeologizmlərin nəzəri əsaslarının öyrənilməsindən yan keçə bilmərik. Bu nöqteyi-nəzərdən bir sıra nəzəri müddəalarla tanış olmağına dəyər. Ümumi dilçilik ədəbiyyatında

frazeoloji vahidlərin müxtəlif meyarlar, prinsiplər əsasında bölgüsünə rast gəlinir. Frazeoloji araşdırmalarla məşğul olan tədqiqatçılar frazeologizmləri müxtəlif şəkildə təsnif etmişlər. Frazeoloji vahidlərin təsnifatında ən çox istifadə olunan meyarları aşağıdakı kimi ümumiləşdirmək olar:

I. Frazeoloji vahidlərin komponentlərinin semantikasına, məna əsasına görə bölgüsü.

II. Frazeoloji vahidlərin leksik tərkibinə əsaslanan bölgüsü.

III. Frazeoloji vahidlərin strukturuna görə bölgüsü.

IV. Frazeoloji vahidlərin üzvlərinin (komponentlərinin) sayına görə bölgüsü.

V. Frazeoloji vahidlərin əsas sözün qrammatik səciyyəsinə görə bölgüsü.

VI. Frazeoloji vahidlərin komponentlərinin mənşəyinə görə bölgüsü.

VII. Frazeoloji vahidlərin üslubi-ekspressiv xüsusiyyətlərinə görə bölgüsü.

VIII. Frazeoloji vahidlərin tematik bölgüsü.

Yuxarıda sadalanan təsnif meyarlarından əlavə frazeloji birləşmələrin leksik-semantik meyara əsaslanan bölgüsü vardır. Bu bölgüdə frazeoloj vahidlər məna cəhətdən ekvivalent olduğu semantik qruplara və ya kateqoriyalara uyğun gəlir: zaman bildirən frazeologizmlər, məkan bildirən frazeologizmlər. Dünyadakı bütün canlı və cansız obyektlər məkan-zaman göstəricilərinə malikdir. Məkan və zaman maddi obyektlərin əlaqələrini ifadə edən formalardır. Onlar ümumi və obyektiv xarakter daşıyır. Bu o deməkdir ki, dünyada məkan və zamandan kənarda heç nə mövcud deyildir. Məkan və zaman hər cür varlığın əsas formalarıdır [197].

Dünyanın dərkinin, qavranılmasının dildə ifadə edilməsində dilin frazeoloji tərkibinin xüsusu rolu vardır. Xalqların tarixi inkişafı, onların əmək fəaliyyəti, insanlar arasın-

dakı ictimai münasibətləri, məişəti, adətləri, ənənələri, özlərinə məxsus orijinal həyat şəraitləri dilin ifadəli vasitələrinin xüsusiyyətlərində iz buraxır. Buna görə də, frazeoloji birləşmələr mədəni informasiyanın daşıyıcıları kimi nəzərdən kecirilərək təhlil olunur. Məkanın və obyektlərin subyektiv dərk edilməsi müxtəlif xalqlarda müxtəlif cürdür, buna baxmayaraq, bəzi oxşar cəhətlər var. Etnos kimi meşə və dağlarda təşəkkül tapmış xalqlar üçün dünya nisbətən qapalı məkan kimi görünür, çöllərdə yaşamış və yaşayan xalqlar üçün məkanın sərhədi yoxdur, o sonsuz kimi görünür. Bu da bir çox hallarda xalqların nümayəndələrinin davranışını əks etdirən anlayışlarla müəyyən edilir [97, 197].

Azərbaycan ədəbiyyatında məkan olaraq elə dünyanın özü mühüm yer alır. Bu ədəbiyyatda dünyanın faniliyi də var, dünyaya sevgi də. Heydər Əliyev üçün Azərbaycan dünyanın bir hissəsi olaraq mövcuddur, dünyadan ayrı olmaq təsəvvür olunmur. Məkan bildirən frazeologizmlər, emosionallığı, ekspressivliyi, obrazlı şəkildə işlənməsilə həqiqi mənada işlənərək həmin mənaları ifadə edən leksik vahidlərdən fərqlənirlər. Ona görə də Azərbaycanın üzləşdiyi problemləri "dünyaya səs qaldırmaq – dünyaya bəyan etmək mənasında işlənən frazeologizm ilə dilə gətirir: "1990-ci ildə bu faciə baş verən kimi, mən yanvar ayının 21-də Moskvada öz etirazımı bildirdim, *öz səsimi dünyaya qaldırdım* və o vaxtdan da mən Azərbaycan xalqına edilmiş bu təcavüzü xalqımızın həyatında ən dəhşətli bir səhifə hesab edirəm" [XIXc.s.50].

Başqa bir nitq məqamında dünyanı (məkanı) soma (göz) ilə birləşdirərək "dünyanın gözü" frazeologizmi ilə Azərbaycan həqiqətlərini görmək istəməyən dünyanı qınağa çəkərək möhtəşəm nitq effekti yaradır: "Bu qədər haqsızlıq bütün *dünyanın gözü* qarşısında baş verir" [XLc.s.17].

Dünyəvi lider səviyyəli dövlət başçısının işlətdiyi frazeologizmlər arasında "dünya", "meydan", "dağ" kimi məkan

anlayışları xüsusi yer alır: "Orada Cəbrayıl rayonunun dağ kəndindən olan bir gənc – adı yadımda deyil, Moskva Universitetinin humanitar fakültələrindən birinin 4-cü kursunun əlaçı tələbəsi idi, – rus dilində çıxış edəndə ürəyim dağa döndü" [Ic.s.172]. "Sizi bu gün belə mühitdə, bu gözəl şəraitdə görəndə, bir el sözü var, – ürəyim dağa dönür" [Vc.s.240].

"Meydana çıxmaq", "meydan sulamaq", "meydan açılmaq" kimi məkan bildirən frazeologizmlər fəaliyyət göstərmək üçün məkansız keçinməyin mümkünsüzlüyünə işarədir: "Sağlam, təmiz, pak bazar iqtisadiyyatı yolu ilə gedən iş adamlarına Azərbaycanda geniş yer veriləcəkdir, xarici şirkətlərə, sərmayəçilərə geniş *meydan açılacaqdır*" [VIIIc.s.206].

Azərbaycan dilinin frazeoloji birləşmələrinin bir qismi məkan məzmununu, anlayışını ifadə edir. Məkan, yer anlayışı ifadə edən frazeoloji birləşmələr məkan bildirən frazeoloji birləşmələr adlanır. Məkan semantikalı frazeoloji vahidlər baş vermiş hal, hərəkət və hadisənin, o cümlədən müəyyən əşya və ya obyektin yerini xarakterizə edir [52, 97].

"Yaxud, açıq danışaq, "Çapayev" filmi o vaxtlar bütün *dünyanı gəzdi,* bizim kimi gənclərə nə qədər böyük təsir buraxdı" [Vc.s.185]. "Mən Yusifi doğmuş, *dünyaya gətirmiş,* bəsləmiş, böyütmüş, onu tərbiyə etmiş Xavər xanımı təbrik edirəm" [Vc.s.197]. "Bu qədər haqsızlıq bütün *dünyanın gözü* qarşısında baş verir" [XLc.s.17]. "İndi bizim nazirliklərdəki bürokratlar – təkcə bürokrat deyil, bəlkə onlara hələ başqa ad da vermək lazımdır – bəzi nazirlər keçmişdəki kimi, indi də elə bilirlər ki, Naxçıvan üçün bir iş edəndə, nə bilim, *dünyanı yaradırlar*" [XLIIc.s.26]. "İndi bir tərəfdən yaxşı oldu ki, *dünya dəyişdi*, hər şey açıldı, biz harada nəyin olub-olmadığını bildik" [VIIIc.s.334].

Həyatı boyu vaxtla, zamanla mücadilə edən, vaxtın darlığı ilə barışmayan tarixi şəxsiyyət Heydər Əliyevin də vaxtla, zamanla bağlı işlətdiyi çoxsaylı frazeologizmlər

mövcuddur: "Vaxtı çatmaq" – Hadisə və proseslərin yetişməsi. "Çoxdan *vaxtı çatmış* açıq, prinsipial və kəskin söhbət getdi" [XIIIc.s.251]. "Sizin vaxtınızı, görüş iştirakçılarının *vaxtını almaq* istəmirəm" [XIIIc.s.7]. "Bu danışıqlar, bu dartışmalar xeyli *vaxt apardı*" [XXXVIc.s.271].

Nəticə etibarilə söyləmək olar ki, məkan bildirən frazeoloji birləşmələr zəngin semantik xüsusiyyətlərə malikdir və onların tədqiqi dilin frazeoloji layının semantik özəlliklərinin üzə çıxarılmasında mühüm rol oynaya bilər [97].

Naxçıvan dialektinin materialları əsasında Nuray Əliyevanın "Atalar sözləri frazeoloji birləşmələrin bir növü kimi" məqaləsində deyilir: "Naxçıvan dialektində işlənən frazeoloji vahidlər çox zəngin və rəngarəng üslubi imkanlara malikdir. Buradakı yüksək milli koloritə malik sabit birləşmələr, dərin mənalı atalar sözləri, müdrik məsəllər, gözəl ibarələr Azərbaycan dilinin, o cümlədən dialekt və şivələrimizin son dərəcə zəngin bədii və obrazlı fondunu təşkil edir. Nitqdə bunların hər biri bu və ya başqa şəkildə müəyyən üslubi vəzifə daşıyır. Eyni zamanda belə ifadələrdə çox yüksək obrazlılıq və emosionallıq da vardır. Elə buna görə də nitqdə məharətlə işlənən frazeoloji vahidlər çox hallarda danışığı daha ifadəli edir" [70, 300, 301]. Heydər Əliyevin uşaqlıq və gənclik illərinin Naxçıvanda keçməsi, nitqin və təbii ki, şəxsiyyətin formalaşdığı dövrün həmin əraziyə təsadüf etməsi maraqdoğuran məsələdir.

S.Cəfərov [48, 49] yazır: frazeologiya az öyrənildiyindən onun əsas tədqiq obyektini təşkil edən söz birləşmələri özün də vahid konkret termin hələ yaradılmamışdır. Odur ki, bu birləşmələr hələ də frazeoloji vahidlər, frazeoloji birləşmələr, tərkib hissələrinə bölünməyən söz birləşmələri, dəyişməz söz birləşmələri, idiomatik ifadələr, leksik söz birləşmələri, idiomlar, frazemlər və s. kimi çoxlu terminlər vasitəsilə adlandırılır.

Ümumiyyətlə, dilçilikdə cümlə səviyyəli frazeoloji vahidlərin mövcudluğu bir qədər mübahisəlidir. Lakin bütün bu

mübahisələrə baxmayaraq bütün türk dillərində cümlə tipli frazeoloji vahidlər mövcuddur və istər ədəbi, istərsə də canlı danışıq dilində belə frazeoloji vahidlərdən geniş şəkildə istifadə edilir ki, bu vahidlərin böyük əksəriyyətini də atalar sözləri təşkil edir. Bu baxımdan dilimizdə olan frazeoloji birləşmələrin bir növü də atalar sözü və zərbi-məsəllərdir. "Atalar sözü müdrikliyin, xalqın zəka və düşüncəsinin, xalqın həyati təcrübələrinin nəticələri, onun həyat fəlsəfəsinin xülasəsi olan qısa və dolğun, yığcam və mənalı aforistik ifadələrdir". Bu baxəmdan xalq təfəkkürünün daşıyıcısı kimi Heydər Əliyev xarakterinin açılmasında onun nitqlərində işlənən atalar sözləri, zərb məsəllərin tədqiqata cəlbi maraqdoğurandır. Qədim Göytürk abidələrində atalar sözləri sab/sav termini ilə adlandırılmışdır. Sonralar bu söz məsəl/makal şəklində işlənmişdir [70].

Xalq dilində işlənən frazeoloji vahidlər möhkəm milli xüsusiyyətə malik olur. Bu vahidləri təşkil edən sözlər kortəbii işlənmir. Onların arxasında ifadənin mənsub olduğu xalqın, dil daşıyıcılarının mifik dünyagörüşü, mənsub olduğu xalqın dini inancları, folkloru dayanır. Buna görə də onların əksəriyyəti başqa dillərə eynilə tərcümə edilmir [70].

Dildə ilk dəfə sözlərin nominativ mənaları yaranmışdır. Bu nominativ mənalı sözlərdən sərbəst birləşmələr əmələ gəlmişdir. Sonralar sözlər məcazi mənalar kəsb etmiş və məcazi mənalı sözlərdən isə frazeoloji vahidlər yaranmışdır. Frazeoloji vahidlər öz inkişafını davam etdirərək dilin müəyyən mərhələsində mürəkkab sözə çevrilir [70].

Hər hansı bir dilə mükəmməl yiyələnməyin əsas amili o dilin frazeologiyasını dərindən bilməkdir. Frazeologiya dildə ən çətin mənimsənilən laydır. Dildəki frazeoloji vahidlər dilin daşıyıcısı olan xalqın tarixi, adət-ənənəsi, psixologiyası və düşüncə tərzinin ifadəçisi olduğundan hər hansı xalqın dilindəki frazeoloji vahidlərin linqvistik araşdırılması, nəticə-

də, həmin xalqın tarix və etnoqrafiyasının, həyat və yaşayış tərzinin öyrənilməsinə gəlirib çıxarır.

Atalar sözü – xalqın yaratdığı və əsrlərdən bəri özünə həyat düsturu etdiyi hikmətli və möcuzəli sözlərdir. Mövzu muxtəlifliyi ilə yanaşı bitmiş fikir, ümumiləşdirmə və nəticə atalar sözlərinə xas olan cəhətlərdir. Atalar sözləri xalqın həyatda sınanmış, müdrik və nəsihətli fikirlərindən ibarət olur və böyük əxlaqi-tərbiyəvi əhəmiyyət daşıyır. Əsas xüsusiyyəti həcmcə kiçikliyi, lakin mənaca hikmətli və nəsihətli olmasıdır [48, 49, 53, 126, 127, 300, 301]. Məhz bu atalar sözləri və zərb – məsəlləri yerində işlətməklə təmsil etdiyi Azərbaycan xalqının, Azərbaycan dilinin təəssübkeşinə çevrilir.

Araşdırmalar göstərir ki, atalar sözləri ən inkişaf etmiş mədəniyyətlərdə belə mövqeyini ən yüksək məqamda saxlayır.

Atalar sözlərinin tədqiqatı göstərir ki, onlar xalq arasında müəyyən tətbiqə malikdirlər. Folkloru öyrənən alimlər araşdırmışlar ki, onlardan uşaqların fikirləşməsi və həyatda yaşayıb mübarizə aparmaq təcrübələrini öyrənməsi üçün geniş istifadə edilmişdir, intellektin və mədəni səviyyənin yüksəlişilərində, ruhi xəstəlikdə, mədəni mövzularda, fərqli əqli proseslərdə, atalar sözləri cəmiyyətdə sosial işçilərin, müəllimlərin, məruzəçilərin strategiyalarına daxil edilmişdir və hətta siyasətçilər, işğalçılar, antipodlar, kriminal dünya atalar sözlərinə müraciət edirlər. “Nasistlər, işğalçılar, siyasətçilər tərəfindən təbliğat aləti kimi atalar sözlərinin qabaqcadan düşünülmüş formalarından istifadə edilmişdir” [167].

Zərbi-məsələ çevirilmiş məşhur stereotiplər, zərbi-məsələ çevirilmiş ifadələr və onların müqayisəsi avropa atalar sözləri ilə müqayisəli şəkildə araşdırılmışdır Taylorun bu kitabı indi klassik atalar sözü tədqiqat əsəri kimi hal-hazırda bu sahə üzrə bütün folklorşünaslann stolüstü kitabıdır. Müasir folklorşünaslıq elminin inkişafı üçün yeni fikirlər və atalar sözləri ilə

bağlı yeni axtarışların aktuallığı diqqət mərkəzində saxlanır [167].

Atalar sözllərindən spikerlər məqsədlərin müxtəlifliyi üçün istifadə edirlər. Bəzən onlardan nəyi isə yumşaq deməyin yolu kimi istifadə edilir [130, 167]. Eyni zamanda müzakirələr zamanı atalar sözü daha çox ideyanın dəyərini artırmaq üçün istifadə edilir, öz münasibət və vəziyyətini dəstəkləmək üçün əcdadların ənənəsini müzakirəyə cəlb edir. Atalar sözləri həmçinin danışıq və müzakirələri daha canlı və müdrik etmək üçün istifadə edilə bilir. Dünyanın bir– çox hissələrində, atalar sözlərinin istifadəsi yaxşı natiq olmağın nişanəsidir.

Dilçilərin, frazeoloqların, hətta sadə insanların belə maraqlandığı sahələrdən biri frazeologiya hesab olunur. Dilçilər ötən əsrin ikinci yarısından frazeologiyaya daha çox maraq göstərmişdir. Azərbaycan dilçilərindən N.Ç.Vəliyeva, Ə.H.Hacıyeva, Ə.Ə.Orucov və s. [86, 172, 173, 202] frazeologiya ilə əlaqədar geniş tədqiqat işləri vardır. Frazeologiyadan bəhs edərkən Ə.Orucov [173] yazır: "Frazeologiya anlayışı olduqca genişdir; buraya yalnız mənası komponentlərinin mənasından asılı olmayan parçalanmaz leksik birləşmələr deyil, başqa sabit birləşmələr: atalar sözləri, məsəllər, aforizmlər, qanadlı sözlər, peşə ifadələri və s. də daxildir" [119].

Frazeoloji birləşmələrdən danışanda əsas məsələ atalar sözləri, zərb-məsəllər, idiomlar, idiomatik birləşmələr, sabit və sərbəst söz birləşmələrinin frazeologiyaya aid olması məsələsini araşdırmaqdan ibarətdir. Tədqiqat üçün həm birdilli, həm də ikidilli frazeoloji lüğətləri nəzərdən keçirsək görərik ki, həmin lüğətlərdə frazeoloji vahidlərlə yanaşı atalar sözləri və zərbi-məsəllər də yazılır, eyni zamanda sabit və sərbəst söz birləşmələrini də həmin lüğətlərdə müşahidə edə bilərik [119].

*Frazeoloji vahid* adlanan konstruksiyalar empirik baxımdan nitq axınında çox asanlıqla müəyyən olunur, seçilir və

diqqəti cəlb edir. Nitqin adresatı, həqiqi frazeoloji vahidlə rastlaşanda, müəyyən dərəcədə şoka məruz qalır. Bu şok deyimin yüksək kommunikativ effekti ilə bağlıdır. Xarici dildə isə həmin şokanlaşılmazlıqla bağlıdır. Deyimi təşkil edən işarələr bəllidir, lakin leksik kompleksin mənası qaranlıq qalır. Belə hallarda biz başa düşürük ki, bütövün mənası onu təşkil edənişarələrin cəminə bərabər deyil. Burada iki hal mümkündür. Birinci halda bütövü təşkil edən leksik işarələrin etimoloji mənaları həmin bütövün qlobal mənasını işıqlandırır, bu iki semantik quruluş arasında əlaqə mövcuddur, deməli, qlobal mənanın motivasiyası var. İkinci halda isə bütövün mənası onu təşkil edən leksik işarələrin mənası ilə heç cürə əlaqələnmir. Deməli, bu cür komplekslər sırf şərti işarə səciyyəsinə malikdir. Əslində bu iki hal təbii dillərə xas olan dərin onomasioloji prosesin əksidir. İşarələr yarananda onlar müəyyən dərəcədə motivasiyaya malik olurlar, işləndikcə isə daxili forma pozulur, etimoloji məna unudulur. Elə ona görə dili bəzən məcazlar qəbiristanlığı adlandırırlar.

Eynilə də frazeoloji vahid adlandırdığımız sintaqmlar işarənin (söz birləşməsi də işarədir) qeyri-mütənasibliyinə əsaslanaraq yaranır. Əslində *frazeologizasiya* yaxud *frazeolojiləşmə* adlandırğımız hadisə bütövlükdə dil kodunun asimmetrik səciyyəsi ilə əhatə olunur.

Frazeoloji birlışmələr, o cümlədən onlarda əxz olunan atalar sözləri, idiomlar, idiomatik birləşmələr xalqın həyatı və məişəti, əmək fəaliyyəti, tarixi ilə sıx bağlı olduğundan onlara istənilən diskursda, xüsusilə də siyasi diskursda geniş şəkildə rast gəlmək olar. Bu nümunələr xalqın təxəyyülünü, təfəkkürünü, üzləşdiyi problemləri və s. aydın şəkildə əks etdirə bilər. Siyasi diskursda natiqin danışığında əks olunan implisit, yaxud eksplisit fikir hətta ictimai bərabərsizliyi, siniflər arasındakı fərqliliyi, sinif fərqliliyini, xalqın aclıq, yaxud toxluq məsələsini əks edə bilər. Məsələn, 1981-1989-cu illər-

də Amerika Birləşmiş Ştatlarının prezidenti olmuş Ronald Uilson Reyqan siyasi diskursunu [314] araşdırarkən rast gəldiyimiz frazeoloji birləşmələri araşdıraq. R.Reyqamn seçkiqabağı kampaniyası zamanı televizorda çıxışı zamanı yayımlanan danışığından qısaldılmış kiçik hissəni təqdim edək:

R.Reyqanın danışığında istifadə etdiyi frazeoloji vahidləri: frazeoloji feil, idiom və s. olmaqla seçək:

– bir işi etməyə qərar vermək; qətiyyətli addım atmaq; məs. düzgün zamanı seçmək.

– pis hissi olmaq; məs. arada münaqişə olmaq.

– məs. uzun yol keçmək; vaxtı ötürmək

– çətinlik; məc. eniş-yoxuş.

– məs. soyuq müharibə. Fikir verdiyimiz kimi kiçik bir parçada danışanın nitqində işlətdiyi frazeoloji birləşmələr dinləyiciyə onun təsvir etdiyi vəziyyətin bütün ağırlığını, ciddiliyini, ölkənin və xalqın keçdiyi yolu təsəvvüründə canlandırmağına səbəb olur deyə bilərik. Eyni zamanda natiqin siyasi diskursunda frazeoloji birləşmələrə üstünlük verməsi onun danışığının səmimi və içdən olmasma zəmin yaradır ki, bu da seçici üçün, yaxud dinləyən üçün, onun düzgün qərar verməsi üçün vacib amil hesab oluna bilər [119, 312].

Heydər Əliyevin 15 iyun 1993-cü ildəki çıxışının araşdırılması zamanı bir sıra frazeologizmlər liderin xarakterini açır:

– əlimdən gələni etmək;

– bu düzgün yoldur, doğru yoldur, bu yolla bizim respublika daha qətiyyətlə getməlidir;

– kiçik hissiyyatı kənara qoymaq, xırda dedi-qodunu kənara qoymaq;

– qisasçılıq hissiyyatına qapılmamaq;

Biz burada frazeoloji vahidlərin siyasi diskursda, xüsusilə Heydər Əliyevin dilində işlənməsini analiz etmək qərarına gəldik. Heydər Əliyevin nitqindən götürülmüş nümunələrdə frazeologizmlər xalqın milli mentaliteti, natiqin ölkənin gələ-

cəyi, bu günü haqqında təsəvvür yaratmağa xidmət edir. Eləcə də siyasi diskursda frazeologizmlər natiqin səmimiyyətini, qətiyyətini dinləyicilərinə birbaşa yönəldə bilir.

Tədqiqatımızda Heydər Əliyevin dilində səslənən atalar sözlərini, zərb-məsəlləri kənarda saxlamaq frazeologiyanın tamlığını pozmuş olardı. Qəbul etmək olar ki, bütün fənlərdə ixtisaslaşmalar çoxsaylı şaxələr yaradır. Məsələn, tibb sahəsindəki ixtisaslaşmalar bir tərəfdən müsbət qəbul olunursa, orqanizmə bütöv və tam kimi yanaşmaq baxımdan bu zaman problemlər yaşanır. Məhz bu problemlərin olmamasını arzu etdiyimiz üçün idiomları da, sabit söz birləşmələrini də bir tam halında həm fəsillərdə, həm də frazeoloji lüğətdə təqdim etmək qərarına gəldik.

Dilçilik elmində frazeologizmlərin araşdırılması qədim tarixə malikdir. Amma frazeologizmlərin tədqiqinə çoxsaylı tədqiqat işlərinin həsr edilməsinə baxmayaraq bır sıra problemlər, məsələn, “frazeologiya” anlayışının şərhi, frazeologizmlərin növləri və keyfiyyət xarakteristikası kimi məsələlər hələ də öz həllini tapmamışdır. Linqvistik mənbələrdə frazeologizmləri tez-tez “dilin canı", “yaddaşı“ və “xalq təfəkkürünün xəzinəsi” adlandırırlar [190].

Müəllifə görə, frazeoloji ifadələrdə sözlər özlərinin ilkin lüğəvi mənalarını itirirlər və vahid bölünməz anlayış ifadə edirlər [231, 232].

“Sözlər və frazeologizmlər danışıq aktına hazır şəkildə daxil edilirlər” müddəasının oxşar tənqidini A.B.Kunin də tənqid edir. Müəllifə görə, frazeologizm sözlə eyniyyət təşkil etmir və ona tam ekvivalent deyil. O özlüyündə daha mürəkkəb növ leksik vahidi təmsil edir, çünki frazeoloji vahidlə ifadə olunan məna tutumu bir sözlə deyil, iki və daha artıq sözün birləşməsilə ifadə olunur” [270].

Frazeologizmlər komponentlərinin semantik bütövlüyü baxımından təsnifatı V.V.Vinoqradovun xidmətidir [243].

Məlumdur ki, frazeologizmlər sözlərdən, sərbəst söz birləşmələrindən yaranır və məcazi mənada işlədilir. Tədricən məcazlıq unudulur, silinir və birləşmə sabitləşir. Frazeologizmlərin komponentlərinin nominativ mənalarının silinmə dərəcəsindən asılı olaraq onlarda məcazi məna qüvvətlənir. V.V.Vinoqradov onları üç qrupa bölür: frazeoloji qovuşmalar, frazeoloji uyuşmalar və frazeoloji birləşmələr [243]. Əlavə edək ki, frazeologizmlərin bu cür bölgüsü A.Axundovun [20] da yaradıcılığına xasdır. Lakin o, sadalanan üç növə dördüncünü də əlavə edir: frazeoloji qovuşmalar, frazeoloji uyuşmalar, frazeoloji birləşmələr və nəhayət, frazeoloji ifadələr. O da frazeoloji vahidlərin üç növünü fərqləndirir [228, 250, 252, 291].

Frazeoloji birləşmələr sabit birləşmələrdir ki, onların tərkibinə sərbəst və frazeoloji baxımdan bağlı sözlər daxil olur. Bu cür birləşmələrdə istinad sözü nisbətən müstəqil olur. Belə ki, həmin söz mənsubiyyət şəkilçilərinə görə dəyişməklə bərabər, bu sözlə onun arasına müxtəlif sözlər da daxil ola bilir [38, 49, 104, 172, 307]. Frazeoloji qovuşma və uyuşmalardan fərqli olaraq, frazeoloji birləşmələr semantik baxımdan bölünə bilməsiylə səciyyələnirlər. Frazeoloji birləşmələrin səciyyəvi əlamətləri belədir: komponentlərdən birinin variativliyinin mümkünlüyü, məsələn, “a bosom friend” – (ürək dostu), “a bosom buddy” (ürək sirdaşı), əsas sözün sinonimik əvəzlənməsi, məsələn, “a pitched battle” (ölüm-dirim savaşı), “a fierce battle” (şiddətli döyüş), təyinlərin əlavə edilə bilməsi, məsələn, “he frowned his thick eyebrows” (o qalın qara qaşlarını çatdı), 4. komponentlərin yerlərini dəyişə bilməsi, məsələn, “a Sisyfean labor” (boş yerə sərf edilmiş əmək, bihudə əmək) – “a labor of Sisyphus” (düşünməmiş iş görən adamın əməyi) və s. [242, 269, 280].

İnsan düşüncəsi dil bazasında inkişaf edərək nitqdə əks olunur. Nitq, bəlli olduğu kimi, həm nitq fəaliyyəti, həm də

nitqin formalaşması ekspressiv cəhətdən müxtəlif çalarlarda olan mətndir ki, bu da dilin ekspressiv funksiyasının təsirinin nəticəsidir. Deməli, dilin ekspressiv funksiyası danışanın emosional durumunu, onun göstərilən predmetlərə və gerçəkliyə subyektiv münasibətini ifadə etmək qabiliyyətidir [136].

İntensivlik də ilk növbədə ekspressivlik kateqoriyası ilə əlaqəlidir. Ekspressivlik ümumi dil kateqoriyası kimi dilin bütün sahələrini əhatə edir və onun ifadə vasitələrinin imkanları hədsizdir. Çağdaş linqvistikada ekspressivlik mətnin quruluşunun, nitq fəaliyyəti subyekti kimi şəxsin dilinin, onun danışığı, dialoq nitqinin praqmatik tərəflərinin, danışanın və dinləyənin qarşılıqlı münasibətlərinin, nitq ifadəliliyinin gücləndirilməsinin keyfiyyəti kimi anlaşılır [274]. Elə bu baxımdan Heydər Əliyev dühasının auditoriyalarla qarşılıqlı münasibətinin öyrənilməsi siyasi diskurs problemlərinə aydınlıq gətirəcək.

Nitqdə gücləndirməni, genişləndirməni intensivliklə ekspressivliyin əlaqəsi formalaşdırır. Hər ikisi birləşərək dil vahidini semantik cəhətdən şiddətləndirir. Canlı nitqdə ekspressivlik prosadik vasitələrlə – intonasiya ilə, onun tərkib hissələrilə – ritmlə, templə, tonla, pauza, melodika ilə gerçəkləşir [209, 211].

Deyimlər intensivliklə yanaşı ekspressiv özəlliklərə malikdir. Ekspressiv frazeologiyada deyimlərin həmin xüsusiyyətləri nəzərdən keçirilir [202, 203, 252, 253].

Araşdırmamız göstərir ki, dilin deyim səviyyəsində həm intensivlik, həm də ekspressivlik mövcuddur. Deyim səviyyəsində intensivlik və ekspressivlik onların quruluşunda baş verən dəyişmələrlə, yeniliklərlə də bağlıdır. Dəyişmələr əsasən belədir: 1) deyimlərin komponentlərinin birinin öz sinonimi ilə əvəzlənməsi nəticəsində intensivlik və ekspressivlik əmələ gəlir: *könül vermək-ürək vermək; gözə dəymək-gözə çarpmaq;* 2) deyimlərdə köməkçi komponentlərin formalaş-

ması yolu ilə intensivlik və ekspressivlik halları baş verir: *bir ayağı burda, bir ayağı gorda; dağdan səs çıxdı, daşdan səs çıxdı, ...səs çıxmadı*; *bərk ayaqda-elə bərk ayaqda* 3) deyimlərin quruluşunda baş verən istisnalar onların intensivliyini və ekspressivliyini yüksəldir: *alt dodağı yer süpürür, üst dodağı göy; bir dizinə vurur, bir başına;* 4) deyimlərin ilk komponentinə yeni sözün əlavəsi ilə intensivlik və ekspressivlik durumu yaranır: *ələ keçmiş-əldən-ələ keçmiş, dağa salmaq-dağa-daşa salmaq;* 5) deyimlərin ortasına söz əlavə etməklə intensivlik və ekspressivlik yaranır: *üzünə demək – üzünə dik demək-üzünə şax demək; gözləri çıxmaq – gözləri çanağından çıxmaq.*

Mərdlik, səxavət, qonaqpərvərlik anlamında olan "qapısı açıq olmaq" frazeologizmi Heydər Əliyev dilində "qapısı həmişə açıq olmaq" şəklində səslənməklə bu səxavətin, əliaçıqlığın dərəcəsini dəfələrlə yüksəldir: "Doğrudan da belədir, *qapısı həmişə açıq* idi və gələn adam da orada mütləq yemək yeməli, çay içməli idi" [XLIIIc.s.70]. Maestro Niyazinin ailəsi haqqında danışmaqla həm də tarixi şəxsiyyətlər bir daha xalqa tanıdılır.

Frazeologizmin ilk komponentinə yeni söz əlavə edir: bilavasitə danışıqlar aparmaq mənasında *Baş-başa danışmaq* – "Ona görə də, biz dünyanın hər bir ölkəsinə gəlib, dövlət başçısı ilə *baş-başa danışıb* öz sözümüzü deyirik, fikrimizi ifadə edə bilirik və ölkəmizin mənafelərini qoruya bilirik" [XXIXc.s.92]

"Siz artıq *fırtınalardan çıxmısınız*. Məsələn, adamı atırsan dəryaya ki, görüm nəyə qadirdir. Görürsən ki, o *fırtınalı dənizdən çıxır*. Siz artıq bu *fırtınalara tab gətirib sahilə çıxmısınız,* bərkimisiniz, ayaq üstə möhkəm dayanırsınız. Bundan sonra da beləcə fəaliyyət göstərəcəksiniz, mən buna tamamilə əminəm" [IIc.s.527].

Elə bu mətndə "fırtınalara tab gətirib sahilə çıxmaq" və "ayaq üstə möhkəm dayanmaq" frazeoloji sinonimlərini işlədir.

*Ağrı-acısını* çəkmək – fəsadları çəkmək; ağırlaşmaları yaşamaq; "Biz bu zərbələrin *ağrı-acısını çəkirik*" [XIIc.s.327].

Ağrısını çəkmək – poblemlər yaşamaq; "Onun da *ağrısını* mən sonra *çəkdim*" [XLc.s.305].

Heydər Əliyevin dilində frazeologizmlər bir sıra hallarda sinonimləşir. Məs: qəddimizi əyməmək, başımızı aşağı dikməmək.

Leksik və qrammatik mənaları özündə birləşdirən sözlər müəyyən nitq hissəsinə mənsub olaraq, dilin bütün qrammatik məna sistemini ifadə edir. Söz dilin müxtəlif səviyyələrində fonetik, qrammatik (morfoloji), leksik və s. aspektlərdə öyrənilir. Sözün məna və məzmunu semasiologiyada araşdırılır. O, leksikologiyanın əsas tədqiqat obyektidir. Sözün cümlədə yeri morfemə nisbətən sərbəstdir. Sözün nominativ (adlandırma), diferensiallaşdırma (fərqləndirmə), ekspressiv və ya emosional-ekspressiv, apelyativ (müraciət), işarəetmə, göstərmə funksiyaları var. Söz çoxfunksiyalılığına görə dilin ümumi strukturunda çox mühüm mövqeyə malikdir [83].

Sözlərin əsas və ya törəmə nominativ mənalarda birləşməsi yolu ilə yaranan söz birləşməsi sərbəst söz birləşməsi sayılır, çünki belə birləşmə nitq prosesində dilin qrammatik quruluşunun mövcud qaydaları əsasında tərtib edilir. Məsələn, su tökmək, kitab almaq, məktub yazmaq, su içmək, meyvə yemək, dərs öyrənmək, yük daşımaq. Buna görə də, sözlərin belə birləşməsi qrammatikanın, yəni sintaksisin tədqiqat obyektidir.

Fikrin ifadəsində nitqin bilavasitə tərkib hissəsini təşkil edən iki və ya daha çox tammənalı sözün tarixən birləşməsindən ibarət olub, komponentləri sintaktik və semantik cəhətdən parçalanmayan, quruluşca sərbəst söz birləşməsinə və ya cüm-

ləyə oxşayan, mənaca söz, söz birləşməsinə və ya cümləyə ekvivalent olan, dildə hazır şəkildə mövcud olub ənənəyə görə ya bir formada, ya da qrammatik cəhətdən dəyişdirilərək işlədilən konstruksiyalara frazeoloji vahid deyilir.

Frazeoloji vahidlərin fonetik tərkibi, leksik və qrammatik quruluşu, əmələgəlmə yolları, semantik və üslubi xüsusiyyətləri bir problemi kimi dilçiliyin tədqiq obyektidir.

Heç şübhəsiz, frazeoloji birləşmələrin struktur-semantik təşəkkülü sərbəst söz birləşmələrindən başlayır. Odur ki, sərbəst söz birləşmələrinə nəzər salmadan frazeoloji birləşmələrin struktur əlamətlərini müəyyənləşdirmək çətin olardı. Həm sərbəst, həm də sabit birləşmələr feili və qeyri-feili birləşmələr kimi iki növə ayrılır. Azərbaycan dilçiliyində bunlara ismi və ya qeyri-feili birləşmələr deyilir [83].

Bununla da frazeologiyanın dilçiliyinin xüsusi bölməsi kimi konturu və vəzifələri göstərilmişdir. Frazeoloji vahidlərdə milli xüsusiyyətlər güclü olur. Frazeologiya hər bir dilin daşıyıcısı olan xalqın dünyagörüşü, təsəvvürləri, ətraf mühitə münastbəti, etik-fəlsəfi baxışları, məişəti, təfəkkür tərzi və s. ilə bağlıdır. Onların bir qisminin (idiomların) başqa dillərə tərcümə oluna bilməməsi də əsasən bununla əlaqədardır. Bir sıra hallarda frazeoloji vahidlərin başqa dillərə tərcüməsi zamanı resipiyent dilin daşıyıcılarının yad ifadəni qavraması və özününküləşdirilməsi üçün müəyyən zaman keçidi tələb olunur. Bu cür millilik frazeoloji vahidlərin daxili modelləri ilə də səslənir. Ümumiyyətlə, dünya dillərində təşəkkül tapmış feli frazeologizmlərin sema bazası eyni olsa da, onların bu sema əsasında əmələ gətirdiyi fraza mənası daha geniş şəkildə özünü göstərir. Dilin lüğət tərkibi sözlərin leksik-semantik qrupları sistemindən ibarətdir. Leksikanın sistemliyi müxtəlif ekstralinqvistik amillərlə bağlıdır. Hər şeydən əvvəl, bu əşyalar, hadisələr arasında əlaqələr və bunları sistemləşdirən insan təfəkkürü ilə bağlıdır. Dilin leksik – semantik sisteminin təd-

qiqinin ən ümdə məsələlərindən biri lüğət tərkibinin leksik – semantik qruplara bölünməsidir.

Dilçilikdə frazeoloji vahidlərin sərhədlərinin müəyyənləşdirilməsində ümumi bir fikir yoxdur, çünki hələ də frazeologiyanın tədqiqat obyektinin dəqiq dairəsi müəyyənləşdirilməmişdir. Bu sahədə alimlərin tədqiqatlarını iki qrupa bölmək olar. Bir qrup alimlər frazeologiyanın sərhədlərini daraldır, digərləri isə frazeoloji vahidlərin sərhədlərini genişləndirərək atalar sözləri, zərb-məsəllər, tapmacalar, aforizimlər və mürəkkəb terminləri, bəzən ümumilikdə bütün sabit birləşmələri oraya daxil edirlər. Ən çox mübahisə doğuran amil atalar sözləri və zərb-məsəllərin frazeologiyaya daxil olub-olmamasıdır [15, 108].

Frazeoloji vahidləri üç qrupa ayıran H.Bayramov [38] yazır: “Birinci qrupa bir hissəsi ixtisara məruz qalmış, digər hissəsi isə frazeoloji vahidə çevrilərək dil vahidi kimi işlənən atalar sözləri və zərb-məsəllər daxildir. İkinci qrupa öyüd, nəsihət məzmunu daşıyan atalar sözləri və məsəllər aiddir. Üçüncü qrupa mübtədası buraxılmış yarımçıq cümlədən ibarət olan atalar sözləri və məsəllər daxildir [74, 132].

M.Mirzəliyeva [153] hesab edir ki, atalar sözlərivə məsəllər müəyyən frazeoloji vahidlərin əmələ gətirilməsinə xidmət etməmiş, əksinə, kiçik tərkibli frazeoloji birləşmə genişlənərək böyük həcmli frazeoloji vahidə çevrilmiş və dildə də elə bu formada qəlib şəklinə düşmüşdür.

Biz, frazeoloji vahidlərin sərhədləri kontekstindən çıxış edərək araşdırmalarımızın istiqamətini bir qədər dəyişəcəyik. Belə ki, məqsədimiz atalar sözü, zərb-məsəllər və hikmətli sözlərin frazeologiyanın zənginləşməsində nə kimi rol oynadığını araşdırmaqdır.

Atalar sözləri və məsəllər şifahi xalq ədəbiyyatının qədim janrlanndandır, xalq canlı danışıq dilinin ən qədim nümunələrindən hesab olunur. Atalar sözləri və məsəllərin tərkibi,

Azərbaycan dilində olduğu kimi, başqa dillərdə də əsasən daimidir, dəyişməzdir. Belə birləşmələrdə ümumiləşdirmə gücü böyük olur.

Atalar sözu və zərb-məsəllərin müxtəlif dil yarusları, müxtəlif qrammatik kateqoriyalar aspektində tədqiq edilməsi xalqların bir çox nəsillərinin mənəvi inkişafını, müasir estetik fikir və bədii yaradıcılıq imkanlarına malik olmasını təsdiq etmək baxımından misilsiz əhəmiyyətə malikdir. Atalar sözü və məsəllər xalqın həyat tərzini, adət-ənənəsini, fikrini, düşüncəsini obrazlı şəkildə ifadə edən bütöv sintaktik vahidlərdir. Onlar mənalarına və strukturlarına görə predikativ xarakterlidir, cümlənin struktur əlamətlərindən seçilmir, kommunikasiya vahidi kimi fəaliyyət göstərir. Atalar sözləri və zərb – məsəllər nə məzmununa, nə də funksiyasına görə frazeologizmlərin təbiətinə uyğun gəlir. Onlar struktur və məzmunca muxtariyyət təşkil edir [9], mənaca tam sabitləşmiş, məcazlaşmış, bitmiş fikir ifadə edir, bitkin intonasiyaya malikdir.

Beləliklə, məlum olur ki, atalar sözü və məsəllərin az bir qismi dilin frazeologiyasının zənginləşməsi mənbələrindən biri kimi çıxış edir. Bu zaman atalar sözü və məsəllər müəllifin nitqinin tam tərkib hissəsi olur. Bu əlamətə malik olanlar artıq dilin frazeoloji sisteminə daxil olub, onun zənginləşməsi mənbələrindən birinə çevrilir. Bu qisim atalar sözü və məsəllərin quruluşunda və məzmununda mütləq dəyişikliklər baş verir.

Atalar sözü və məsəllər dildə frazeoloji vahidlər kimi hazır şəkildə işlənir. Bu cəhət atalar sözü və məsəllərin frazeoloji vahidlərlə ortaqlı əlamətidir.

Atalar sözü və məsəllər bitmiş fikir ifadə edir, müxtəlif tipli cümlə quruluşuna malik olur. Atalar sözü və məsəllər dədə-babalarımızın keçmişdə çoxşaxəli fəaliyyətlərində əldə etdikləri təcrübənin yeni nəslə ötürülməsi üçün işlədilir, əsasən, nitqə daxil edilməyinə ehtiyac qalmır, bədii əsərlərdə

müəlliflər onlardan öz fikirləri ilə əlaqəli şəkildə istifadə edirlər [74, 87, 91].

*Ziyanın yarısından qayıtmaq* – səhvini başa düşmək, qanunu pozmağı dayandırmaq, axıradək cinayət etməmək, zərərin yarısından qayıtmaq; "Mən indi o sözləri həmin bu işlərə qoşulmuş adamlara deyirəm: *ziyanın yarısından qayıtmaq da qazancdır*, qayıdın!" [IIIc.s.302]. *Yorğanına görə qıçını uzatmaq* – imkanına görə hərəkət etmək; "İkinci tərəfdən də belə vəziyyətdə gərək – Azərbaycanda bir söz var – *yorğanına görə qıçını uzadasan*" [XXIVc.s.309]. Yaxşı qonşu pis qohumdan yaxşıdır – münasibət baxımından yaxşı qonşunun mövqeyinə işarə; "Bəzən bizim xalq arasında belə deyirlər: *yaxşı qonşu pis qohumdan yaxşıdır*" [XXIc.s.167]. Yaman günün ömrü az olmaq – çətin günlərin keçib getməsi inamında olmaq, dözümlü olmaq; "Əmin olun ki, *yaman günün ömrü az olur*" [Ic.s.483]. Yuxarıdakı məsəllərin xalqdan gəldiyini, xalq diplomatiyasından qaynaqlandığını bilən böyük natiq onları yerli-yerində işlədir. "Azərbaycanda bir söz var", "bizim xalq arasında belə deyirlər" ifadələri ilə frazeologiya ilə məşğul olanlara bundan yaxşı yol göstərməyi heç kəs bacarmaz.

Heydər Əliyev xarakterindəki xəlqilik, xalq ruhu məişətdə çox işlədilən bir sıra milli frazeologizmlərdə açılır. Dünya şöhrətli dirijor Niyazinin anadan olmasının 90 illiyinə həsr olunmuş yubiley gecəsindəki nitq bu sıradandır: "Məsələn, bir var, başqa yerdə yığışasan, bir də var, Niyazinin yaşadığı evdə, onun divarları arasında yığışasan. Bu tamamilə başqa bir əhval-ruhiyyədir. Onun o qədər də böyük mənzili yox idi, amma *qapısı həmişə açıq* idi. Gərək ki, burada Vasif Adgözəlov da Polad Bülbüloğlu da dedilər ki, onlar elə orada böyüyüblər. Doğrudan da belədir, *qapısı açıq* idi və gələn adam da orada mütləq yemək yeməli, çay içməli idi. Rəhmətlik Həcər xanımda səhərdən axşama kimi Niyazinin qonaqlarına qulluq etməli idi. Bax, Niyazi belə bir həyat keçirirdi. İstədiyi adam

onun evinə gedə bilərdi və gedirdi də. O heç vaxt heç kəsdən uzaqlaşmırdı.” [XLIIIc.s.70]

Frazeologiya problemi Azərbaycan dilçiliyində də tədqiqatçıların diqqətini cəlb etmişdir. Bu sahənin tədqiqində S.Cəfərovun, S.Murtuzayevin, A.Qurbanovun, M.Paşayevin, H.Bayramovun və s. zəhmətini qeyd etməyi vacib hesab edirik. Azərbaycan dilçiliyində S.Cəfərov, S.Murtuzayev, M.Adilov, Ə.Dəmirçizadə və bir çox başqaları frazeologiyanı “geniş” mənada qəbul edirlər.

S.Cəfərov atalar sözlərini, idiomatik ifadələri, zərb məsəlləri, hikmətli sözləri də buraya daxil edir. A.Qurbanov [126] da frazeologiyanı “geniş” mənada qəbul edərək, onun frazeoloji söz birləşməsi və frazeoloji ifadə və ibarələr şəklində öyrənilməsini təklif edir. O, yazır: “Frazeoloji vahidlərin sırasına atalar sözü, məsəllər, aforizmlər, həmçinin bəzi rəvayətlər, ifadələr, sitat və klişe adlanan ifadələr və s. daxildir.

M.Tağıyev [284] frazeologiyanın tədqiqat obyektinə “dar” mənada yanaşaraq, frazeologiyanı geniş mənada tutanlarla razılaşmır. O, yazır ki, müasir filologiyada elə vəziyyət yaranmışdır ki, bunun nəticəsində frazeologiya anlayışı hədsiz dərəcədə genişləndirilir, buraya sözlər, idiomlar və tərkibi terminlər, sabit sintaktik konstruksiyaların bütün növləri, atalar sözləri, məsəllər, hikmətli sözlər, çoxlu miqdarda şifahi və yazılı nitqdə yazılı sitatlar daxil edilir. Frazeologiyanın obyektindən bəhs edərək yazır: “Dilçiliyin sahələrindən biri olmaq etibarilə frazeologiyanın vəzifəsi yalnız dil struktutuna aid olan söz birləşmələrini tədqiq etməkdir [ 284].

Azərbaycan dilçiliyində H.Bayramov [38] frazeologiya anlayışını “dar” mənada göstərsə də atalar sözləri və zərbiməsəlləri frazeologiyanı zənginləşdirən mənbələrdən biri hesab etmiş və onları frazeoloji cümlə kimi araşdırmışdır. O, frazeoloji vahidə bu tərifi verir: “Fikrin ifadəsində nitqin bilavasitə tərkib hissəsini təşkil edən iki və daha çox tammənalı

sözün tarixən birləşməsindən ibarət olan, komponentləri sintaktik və semantik cəhətdən parçalanmayan, quruluşca sərbəst söz birləşməsinə və ya cümləyə oxşayan, mənaca isə söz birləşməsinə və cümləyə ekvivalent olan, dildə hazır şəkildə mövcud olub ənənəyə görə ya bir formada, ya da qrammatik cəhətdən dəyişdirilərək işlədilən konstruksiyalara frazeoloji vahid deyilir".

Atalar sözü və məsəllərin heç də hamısının komponentlərinin sırası sabit deyildir. Eləcə də bunlar leksik tərkibcə, obrazlığa və məcazi məna daşımasına görə də ikihəcmli əlamətə malikdir. Bütün bunlara baxmayaraq, atalar sözü və məsəllər şifahi xalq ədəbiyyatının tərkib hissəsi olduğundan, əsasən folklorşünaslığın tədqiqat obyektidir. Atalar sözü və məsəllər müəllifin nitqi ilə yanaşı işlədilir. Atalar sözü və məsəllər məhz ona görə yaranır və yayılır ki, geniş xalq kütləsi öz ünsiyyət əlaqəsində bunlardan istifadə etsin. Əgər qarşıda belə bir məqsəd olmasaydı, bunlar şifahi xalq yaradıcılığının bir qolu kimi yaşamaz, aradan çıxardı. Məhz buna görə də, atalar sözü və məsəllər müəllifin nitqi ilə yanaşı işlədilərək məzmunca onunla ümumi planda əlaqələndirilir. Müəllif bunları daha inandırıcı, əsaslandırıcı, istinaedici mənbə kimi öz nitqinə daxil edir [7, 38]. Heydər Əliyevin dilində də məsəllər siyasi fikrin yekunu kimi səslənir. "Yumurtadan çıxmamış cücə" – tam təcrübəsiz; siyasətdə naşı olmaq frazeologizmində olduğu kimi: "Azərbaycanda bir söz var, – "*hələ yumurtasından çıxmamış bir cücə kimi*" bəyanatlar verirlər ki, "Azərbaycan unitar dövlətdir, burada muxtariyyət ola bilməz, bu muxtariyyəti ləğv etmək lazımdır" [XXIIc.s.244].

Frazeologiya xalqın yumorunu, onun mənəvi idealını və ictimai təcrübəsini saflaşdıraraq müxtəlif dövrlərin izlərini əks etdirir. Frazeologiya həm danışıq dilinin, həm də ədəbi dilin funksional üslublarına xas olan saysız ifadə və birləşmələrini

özündə birləşdirir. Dilin inkişaf səviyyəsi bir qayda olaraq, həm də frazeologiyanın zənginlik dərəcəsini müəyyənləşdirir.

Frazeologiyanın əsasını atalar sözləri, məsəllər, professional ifadələr, aforizmlər, məcazlar, obrazlı ifadələr təşkil edir.

Frazeologizm kimi atalar sözləri və məsəllər özlərinin sabit xarakteri ilə fərqlənir. Uzaq keçmişdə yaranmış atalar sözləri, əksər hallarda qədim dövrdə daşıdıqları mənada işlənirlər. Dildən-dilə, nəsildən-nəsilə keçə-keçə onlar sözlərdəki sərbəst əlaqəni itirmiş, qeyri-sərbəst, bölünməz olmuş, uzun müddət dildə özlərinin semantik xüsusiyyətlərini saxlayaraq qalmışlar [74].

Atalar sözləri və məsəllərin bir qrupu, aforizmlər, qanadlı sözlər və sitatlar frazeoloji ibarələr sinfinə daxil edilir. Bu vahidlərin əsas əlamətdar xüsusiyyəti onların cümlə şəklində qurulması, hansısa başqa bir cümlənin deyil, bütövlükdə mətnin və ya mətn parçasının daxilində obrazlılığı və emosionallıq çalarını artırmaq üçün işlədilməsi ilə bağlıdır.

Atalar sözləri şifahi olaraq nəsildən-nəsilə keçərək, hələ yazı meydana gəlməmişdən belə xalq müdrikliyinin göstəricisi olmuşlar. Bundan başqa ingilis monastırları çox böyük maraqla latın və yunan yazıçılarının əsərlərini toplayıb öyrənirdirlər və xarici mənşəli atalar sözü və məsəllər ingilis dilinə tərcümə edilərək, milli əsərlərin çap olunduğu kitabların səhifələrində meydana çıxırdı [74].

Atalar sözlərindən saysız idiomlar, frazeoloji birləşmələr əmələ gəlimişdir və müasir dövrdə onlar atalar sözlərindən kənarda işlədilmir. Eyni zamanda, bu fakt həm də atalar sözlərinin dilin frazeoloji fondunun zənginləşməsində mühüm rol oynadığını sübut edir. Atalar sözləri bir tərəfdən frazeologiyanın bir qolu olaraq, onun tədqiqat obyektinə daxil olur, digər tərəfdən isə bir çox sabit söz birləşmələri atalar sözləri tərkibindən ayrılaraq sərbəst işlənilib dilin frazeoloji tərkibini zənginləşdirir. Sonralar atalar sözlərinin işlədilməsinin yüksək

cəmiyyətdə pis tərbiyənin əlaməti hesab edilməsi ilə əlaqədar, onlara maraq azalmış və atalar sözləri yaxşı tərbiyə olunmuş və təhsil almış adamların nitqində öz yerini tapmamışdır.

Misallardan görünür ki, bəzi atalar sözləri bir qrup adamlar üçün həqiqi ola bildiyi halda, digər qrup üçün tam qəbul edilməzdir. Beləkilə, atalar sözündə əks olunan həqiqilik əxlaqi nöqteyi-nəzərdən adamlar tərəfindən müxtəlif cür qəbul edilə bilər. Deməli, atalar sözlərində olunan əxlaq, öyüd-nəsihət nisbidir. Eyni bir atalar sözü bir dövr üçün həqiqi olduğu halda, başqa bir dövr üçün köhnəlmiş ola bilər.

Bir çox atalar sözlərini nəzərdən keçirərək bu mövqeyin düzgünlüyünə əmin olmaq mümkündür. Hər bir atalar sözü bəşəriyyətin təcrübəsinin yekunu, nəticəsidir. Atalar sözü bəşəriyyətə qədim dövrlərdən məlum olan xəbərləri çatdıraraq öyrədir. Özündə hər hansı bir nəsihət əks etdirməyən atalar sözünü təsəvvür etmək çətindir. Atalar sözü bütün hallarda yalnız nəsihət xarakterli olanda deyil, həm də ümumi həqiqiliyi əks etdirəndə nə isə öyrədir. Atalar sözləri və məsəllərin yaranması, yayılması və işlənməsi prosesi bu gün də davam edir. Bir sıra alim, yazıçı, politoloq və müdrik insanlara məxsus cümlələr, ifadələr indi də atalar sözlərinə çevrilərək xalq arasında işlənməkdədir [4, 29, 30, 56, 74, 75].

Məlumdur ki, bədii əsərin müəllifi müəyyən sosial mühiti, bu mühitdə yaşayanları, onların adət-ənənələrini, həyat tərzini nəzərə alır. Bədii əsərdəki personajlar müəyyən leksik vahidlərdən, ifadələrdən, o cümlədən də frazeoloji vahidlərdən istifadə etməkdə də bir-birindən seçilirlər. Frazeoloji vahidlər, idiomatik ifadələr bədii əsərlərdə çox işlənir. Bədii əsərlərin dili elmi dildən, məişət dilindən fərqlənir. Bu, əsərin emosional bədii təsiri ilə əlaqədardır. Ona görə də bədii əsərdəki frazeologizmlər linqvokulturoloji baxımdan da xüsusi əhəmiyyət daşıyır. Frazeologizmlərin milli-mədəni konnotasiyası, onların aid olduqları xalqın mentaliteti ilə bağlılığı və

beləliklə mədəni işarələr rolunu oynaması məlumdur. Frazeologizmlər milli dil və milli-mədəni mənzərəni yaratmaq vasitəsidir. Frazeoloji vahidlərin semantikasında milli-mədəni özünəməxsusluq vardır [18]. Düşünsək ki, Heydər Əliyevin təküslubluğa sığmayan çıxışları özlüyündə bir elmi, bədii əsərləri xatırladır o zaman frazeologizmlərin tədqiqi öz yerini tapar.

Frazeologizmlərin etnokulturoloji və praqmatik xüsusiyyətlərinin açılması onların başqa dillərin frazeoloji vahidləri ilə müqayisəsini tələb edir. Frazeologizmlərin linqvokultroloji aspektlərinin tədqiqi prosesində onların müxtəlif semantik tiplərini ayırmaq mümkün olur: xalqın adət-ənənələri, antroponimləri, folkloru, mifologiyası, tarixi, ədəbiyyatı ilə və s. bağlı olanlar Əlbəttə, qeyd edilənlər linqvokultroloji və praqmatik səciyyəli bütün frazeologizmləri əhatə etmir. Tədqiqat prosesində başqa tiplər də aşkara çıxa bilər.

Xalqın məişəti, adət-ənənəsi, həyat tərzi, mentaliteti, tarixi, mədəniyyəti, incəsənəti və s. ilə bağlı olan frazeologizmlər frazeoloji sistemin ayrıca bir qatını təşkil edir. Onların spesifik xüsusiyyətlərinin başqa dildə verilməsi çox çətindir. Ona görə də tədqiqat prosesində müəyyən müqayisə və paralellərin aparılması vacibdir [18].

Frazeologizmlərin semantik xüsusiyyətləri diqqəti cəlb edən mürəkkəb dilçilik məsələlərindən biridir. Mürəkkəblik frazeoloji məna ilə leksik mənanın fərqlənməsi və fərqlənmə səbəblərindən doğur.

Frazeologizmlərdə onu təşkil edən komponentlər bir-biri ilə müxtəlif semantik münasibətlərdə olur. Komponentlərin sayı artdıqca semantik münasibətlər dairəsi genişlənir. “Frazeologizmləşmə prosesinin nəticəsində sərbəst söz birləşmələrinin komponentləri öz mənalarını itirir və birləşərək bütöv bir mənanın meydana çıxmasına xidmət edir. Bununla da, yeni keyfiyyətli bir dil vahidi yaranmış olur” [18, 153].

Frazeoloji vahidlərin semantikası komponentlərin semantikası ilə müəyyən bağlılığa malikdir. Lakin bu semantik bağlılıq üzdə deyil, daha dərində gizlənmişdir. Bütövün hissələri, yəni komponentlər öz aralarında çox bağlılığa malikdir və bu, o dərəcədə möhkəmdir ki, hətta komponentlərin sabit mövqedə durmasına imkan yaradır. Komponentlərin sayının artması bütövün mənasına bəzən təsir göstərir, bəzən isə bu təsir olmur. Əslində idiomun ifadə etdiyi məna onun komponentlərinin sayından asılı deyildir. Lakin eyni vahidin genişləndirilməsi, ona yeni komponentin əlavə edilməsi mənanın əlavə çalarının yaranmasına səbəb olur [18]. *Oxu daşa dəymək* – niyyətin həyata keçirilə bilməmək, məqsədinə nail olmamaq, niyyəti, cəhdi baş tutmamaq, uğursuzluqla nəticələnmək, ciddi maneəyə rast gəlmək; ~ oxu boşa çıxmaq, aşı daş çıxmaq, külüngü daşa dəymək mənasında səslənən frazeologizm buna parlaq misaldır: "Mənə qarşı iki dəfə qəsd etdilər, iki dəfə məni öldürmək istədilər. Amma *oxları daşa dəydi*, niyyətləri baş tutmadı" [Ic.s.59].

Bununla belə, adresat komponentin həm ümumi, həm də xüsusi mənaları əsasında məntiqi mülahizələr aparmaqla bütövün mənasını aydınlaşdıra bilər. Kommunikativ aktda beş komponent iştirak edir: adresant, adresat, kontakt, referent, kod. İdiomların hər biri bir nitq aktıdır və adresant mənası ona məlum olan idiomu komponentlərin qəbul olunmuş struktur vahidi kimi adresata ötürür. Adresat nitq aktını komponentlərin məna toplusu və ya komponentlərin mənasından asılı olmayan bütöv kimi qəbul etməyə hazır olmalıdır. Əgər adresat mətndə və ya şifahi nitqdə sözləri başa düşdüyü halda ötürülən mənanı qavramırsa, bu hal idiomatik ifadənin işlənməsi ilə bağlı olur.

Frazeologizmlərin semantikası mürəkkəb xüsusiyyətlərə malikdir. Hər bir frazeoloji vahidin semantik mürəkkəblik dərəcəsinin təyini xüsusi yanaşma və təhlil tələb edir. Onların

mənası minimal semantika daşıyan komponentlərin mənalarının zəminində təyin olunur. Lakin bu o demək deyildir ki, idiomun semantik quruluşu elementləri bir-biri ilə sıx qarşılıqlı əlaqədə və qarşılıqlı asılılıqda olan mikrosistem kimi təsəvvür etmək olmaz. İdiomların semantik özümlüyü semlərin birləşmə xüsusiyyətlərindən asılıdır. İdiomun mənası onun komponentlərinin mənalarının mexaniki cəmi kimi təzahür etmir. Bu məna daha arxa planda qalan minimal məna komponentlərinin, semlərin özünəməxsus məcmusudur.

İnsan xarakterinin onun əxlaq və davranışı, həyat tərzi milli adət-ənənələrlə bağlıdır. İnsana aid bu xüsusiyyətlərin verbal ifadəsində müxtəlif dillərin daşıyıcıları müxtəlif söz və ifadələrdən istifadə edirlər. Belə bir cəhət frazeologizmlərdə də özünü göstərir. İnsan xarakteri mənfi və müsbət cəhətlərə malik olur. Ona görə də insan xarakterinin mənfi və müsbət cəhətlərini ifadə edən frazeologizmləri yarımqrup kimi bir-birindən ayırmaq mümkündür [18, 253].

Satqınlıq, zülmkarlıq, məddahlıq, kobudluq, arsızlıq, qeybətçilik, ikiüzlülük, yaltaqlıq, biganəlik, xəsislik, yalançılıq və s. kimi keyfiyyətlər insan xarakterinin mənfi cəhətlərini təşkil edir. İstər Azərbaycan, istərsə də ingilis dilinin idiomatikasında insan xarakterinin mənfi cəhətlərin ifadə edən xeyli sayda frazeologizm vardır.

Tarixi həqiqətləri görməyən, tarıxinə, keçmişinə xor baxan, fəaliyyətsiz, laqeyd, etinasız, vəzifəsini yerinə yetirməyən, ölüm hadisələrinə görə ittiham olunan, ağır cinayətdə iştirak edən mənfi xarakterlər “tarixə kor baxmaq”, “göz yummaq”, “əli qana batmaq” kimi frazeologizmlərlə açılır: “Bunu nə pozmaq olar, nə də unutmaq olar. Bunu etmək istəyənlər tarixinə kor baxan, tarixinə düşmən çıxan adamlardır” [IIc.s.544].“Lakin mən onlara dedim ki, burada yüz minlərlə insanın hüquqları tapdanmışdır, siz isə buna göz yumursunuz” [XXXVc.s.218]. “...Onları dəstəkləyən adamların əli Azər-

baycan xalqının oğullarının həlak olması ilə əlaqədar qana batıb” [Ic.s.108].

İdiomatik sistemin mənfi mənaya doğru meyli, ümumi semantik assimmetriyası adamların mənfi hadisələrə emosional və nitq reaksiyasının nəticəsində baş verir. Kəskin mənfi emosional vəziyyətdə hadisəyə münasibət bildirərkən hazır sabit söz kompleksindən daha çox istifadə edilir [18, 243].

Frazeologizmləri semantik qruplarda birləşdirərkən onların ifadə etdiyi bütöv məna əsas götürülür. İnsanın əclaflıq, satqınlıq, rəzillik kimi mənfi xarakterik xüsusiyyətini bildirən frazeologizmlərinə aid aşağıdakı nümunələr göstərmək mümkündür: İkiüzlülük, riyakarlıq bildirən frazeologizmlər qrupu; Qəddarlıq, rəhmsizlik bildirən frazeologizmlər qrupu; Naqqallıq, zəvzəklik bildirən frazeologizmlər yarımqrupu; Tənbəllik, iş görməyə həvəs göstərməmək bildirən frazeologizmlər qrupu. Heydər Əliyevin dilində ən çox qanunsuzluqla, ölkənin mənafeyinin tapdalanması, biganəliklə bağlı frazeologizmlər yer alır: *meydan sulamaq* – özünü hökmran kimi aparmaq, ağalıq etmək, istədiyini etmək, mənəm-mənəmlik etmək; ortalığa çıxmaq; ortalığı qarışdırmaq; diqqət mərkəzinə düşmək; ~ at oynatmaq, qılınc oynatmaq; “Rəhim Qazıyev, İsgəndər Həmidov, Hümbətov kimiləri, başqaları meydana çıxıb, *meydan sulayıblar*, vəzifə tutublar, ağalıq ediblər, hakimiyyətdə olublar. Ona görə ki, bizim ziyalılarımız, hörmətlə adamlarımız mövqesiz olublar, çəkiniblər, gizləniblər, özlərini qoruyublar, xalqa qayğı göstərməyiblər, qorxublar” [IVc.s.192].

Dildə insan xarakterinin mənfi cəhətlərini ifadə edən frazeologizmlər olduğu kimi, xarakterin müsbət tərəflərini bildirənlər da vardır. Kişilik, qətiyyətlilik, cəsurluq, əməksevərlik, müstəqillik, xeyirxahlıq, xarakter bütövlüyü, sədaqətlilik, dözümlülük, əliaçıqlıq, təmkinlilik və s. İnsan xarakterinin müsbət cəhətlərini ifadə edir [18, 276]. Əməksevərlik məqamlarında *özünü işə qurban etmək* – işə həddindən çox

can yandırmaq; işi həyatı hesab etmək; "Haqqına demək lazımdır ki, mən həmişə *özümü işə qurban etmişəm*" [XXXc.s.93],

İnsan xarakterinin neytral cəhətləri də frazeologizmlərdə ifadəsini tapır. *Papağını qabağına qoyub fikirləşmək* – situasiyanı analiz etmək; öz qüvvəsini qiymətləndirmək, yaxşı-yaxşı düşünmək, hərtərəfli düşünmək, götür-qoy etmək; "Amma bunun üçün indi siyasət aləminə çıxan, siyasətlə məşğul olmaq istəyən adamlar və hakimiyyət iddiasında olan adamlar gərək – Azərbaycanda bir söz var, – papağını qoysun qabağına və dərindən fikirləşsin: sən bu suya girə bilərsən, ya girə bilməzsən?" [XVc.s.179]

İnsanın zahiri görkəmi, onun davranışı və s. haqqında fikir formalaşdıran idiomlar çoxdur və onlar müxtəlif tematik semantik qruplarda yer ala bilir. Onu da qeyd edək ki, idiomatik bildirən sözlər çox işləkdir. Frazeologiyada somatik frazeoloji birləşmələr ayrıca bir qrup təşkil edir. İngilis dili frazeologizmlərini bədən üzvlərinə görə qruplaşdırmaq mümkündür. Təhlil göstərir ki, frazeologizmlərin tərkibində 40-a qədər bədən üzvü adını ayırmaq mümkündür. Qeyd olunanlar və başqa bədən üzvlərinin adlarının iştirak etdiyi frazeologizmlər müəyyən toplu təşkil edir. Belə idiomlar müstəqil nitq vahidi kimi işlənir. Birləşmə şəklində olan frazeologizmlər müstəqil dil vahidi kimi digər sözlərlə semantik-qrammatik əlaqələrdə olur. İdiomlar semantik tam kimi çıxış edir. Frazeologizmlərin komponentləri bir-birilə əlaqələnir, qaynayıb qarışır. Komponentlər öz müstəqilliyini itirir, məcazi məna alır, sabit məna bütövlüyü, daxili forma, sabitlik idiomlara xas olan əsas xüsusiyyətlərdir və bunlar frazeologizmlərin semantik xüsusiyyətləri ilə bağlıdır [18, 166, 175, 200, 218, 279].

Xalq deyimlərinin gözəl bilicisi kimi Heydər Əliyev yeri gəldikcə bu tip frazeologizmlərdən müvəffəqiyyətlə istifadə edir. "Hər ağızdan bir avaz gəlmək" deyimi heç də həmişə

müsbət mənada səslənmir: "Əvvəllər *hər ağızdan bir avaz gəlirdi*, müxtəlif fikirlər, müxtəlif baxışlar vardı, bəzən onlar qeyri-məqbul olurdu, hərə öz mövqeyinin üstün olduğunu sübut etmək istəyirdi" [XVIIc.s.17].

Frazeologizmlər Heydər Əliyev şəxsiyyətinin bəzi tərəflərini açmaqda mühüm vasitəyə çevrilir. Məsələn: "işdən sıxılmaq", "ilham almaq" kimi məişət frazeologizmləri sadə insanların həyatını yaşayan siyasi lider portretini yaratmağa imkan verir: "Əziz dostlar, bu gün əgər sadə sözlə desəm, kefim çox yaxşıdır. Bilirsiniz, prezidentin işi çətindir, ağırdır. Bəzən olur əsəbləşirəm, bəzən *iş məni sıxır*. Amma bu gün burada çox yaxşı əhval-ruhiyyədəyəm, sizdən *ilham alıram*. Bu insanları, sizi görürəm. Azərbaycanın nə qədər gözəl insanları var. Elə bütün nəsillər-gənclər, yaşlılar, qızlar, oğlanlar, qadınlar, kişilər gözəldir. Nə qədər gözəl millətimiz var. Vallah, bu millətə mənsub olmaq böyük bir xoşbəxtlikdir. Bu millətin dərdini çəkmək dərd deyil, xoşbəxtlikdir."

Bəzən loru leksikaya məxsus frazeologizmlər ardıcıl şəkildə auditoriyalara ayaq açır, bu frazeologizmlər heyranlıqla qarşılanır. "Başlı-başına buraxmaq", "orda-burda gizlənmək", "altdan-altdan iş aparmaq" kimi loru frazeologizmlər geniş siyasi məqsədləri açıqlamaqda kömək edir: "Belə ağır vəziyyətdə xalqı başlı-başına buraxıb Bakını tərk etdilər, orada-burada gizlənməyə başladılar. Beş ildir ki, qarış-qarış, addımbaaddım, Azərbaycanda ictimai-siyasi vəziyəti normallaşdırırıq, sabitləşdiririk. Artıq son üç ildir ki, vəziyyət sabitdir, rahatdır. Onlar isə orada-burada gizlənirlər, *altdan-altdan iş aparırlar*" [XVIIc.s.317]. Nitqində əl və ayaqla ölçülə bilən uzunluq vahidləri ilə ictimai-siyasi vəziyyətin stabilləşməsini qeyd edərək ekspressivlik yaradır.

"Göz qırpımı" loru leksika ilə, "siması dəyişmək" kitab leksikalı kimi frazeologizmlər yanaşı işlədilir. Burada da frazeologizmlər arasındakı məntiqi ardıcıllıq özünü göstərir.

Qısa zaman ərzində ("bir göz qırpımı") ölkənin həyatındakı müsbət dəyişikliklər ("simasını dəyişmək") bu iki frazeologizmin dilə gətirilməsi ilə xalqa çatdırılır: "Bilirsiniz, tarixi nöqteyi-nəzərdən 70-80 il göz qırpımı kimi bir şeydir. Bu, kiçik bir zamandır. Amma görün, bu illərdə nə qədər böyük işlər görülübdür. Azərbaycanın siması dəyişibdir. Ötən dövrdə Azərbaycanda iqtisadiyyat, mədəniyyət, həyatın bütün sahələrində, elm sahəsində əldə olunmuş nailiyyətlərin başında duran, onun əsasını təşkil edən, kökü olan məktəbdir, təhsildir, müəllimdir" [XVIIc.s.347-348].

Sadə, ümumişlək, belə demək mümkünsə bir qədər də loru leksika sırasında frazeologizmlər Heydər Əliyev şəxsiyyətindəki xəlqiliyi bütün varlığı ilə kütlələrə bəyan edir: "Bizim keçmişimizi, tariximizi bu gün ləkələmək istəyən, Azərbaycanın həyatı haqqında ədalətsiz fikirlər söyləyən adamların da hamısı o dövrdə təhsil alıbdır. Bəli, Azərbaycanın o dövrdəki məktəblərində, universitetlərində təhsil alıblar. Müftə, pulsuz təhsil alıblar, Azərbaycan Respublikasının imkanlarından istifadə edib təhsil alıblar. Bir xalq məsəli var: "*Adam su içdiyi quyuya tüpürməz*" Biz hamımız o quyulardan su içmişik və ora tüpürməyə heç kəsin haqqı yoxdur" [XVIIc.s.349].

Təkamüldə kəskin dəyişiklik kimi qiymətləndirilən "sıçrayıb keçmək" frazeologizmi gələcəyə ümidlə baxan nikbin ovqatlı lider surətinin yaranmasında iştirak edir: "Yaxud, ümumi daxili məhsul 9 faiz az artıbdır. Almaniya nümayəndə heyətinin başçısı mənə dedi ki, Azərbaycanda gedən müsbət dəyişiklikləri məmnunluqla qarşılayırıq. Bu, hər gün, yavaş-yavaş baş verir, – iqtisadiyyatda sıçrayışlar ola bilməz" [XVIIc.s.247].

"Dünyanın dövranı uzundur" deyimini 1987-ci ildə işlədən Heydər Əliyev 1993-cü ildə müstəqil Azərbaycan Respublikasının demokratik yolla xalqın iradəsi ilə seçilən

prezidenti oldu. Siyasi Bürodan uzaqlaşdırılacağını bilən siyasi lider üçün belə bir proqnoz vermək sanki ağlasığmazdır: " Dedim ki, bilirsiniz nə var, *dünyanın dövranı uzundur*. Bəlkə siz hesab edirsiniz ki, Heydər Əliyev artıq ya öləcək, yaxud da işləməyəcək, ona görə belə *üz göstərirsiniz*. Amma bilin, sizə haram olacaqdır. Bilin, mən sizi 10 il, 14 il yetişdirmişəm, bəsləmişəm, xırda işlərdən böyük vəzifələrə gətirmişəm. Bəs sizin insanlığınız haradadır? Demək, siz mənim yanıma gəlməkdən qorxursunuz? Yaxud da o qədər mənəviyyatsız adamlarsınız ki, xəstəni də ziyarət etmək istəmirsiniz" [XXc.s.342-343]. Bu sətirlərin müəllifinin ilahi bir fəhmə malik olduğu açıq-aydın görünür.

Heydər Əliyev ölkə daxilində və dünyada baş verən hadisələrə ayıq baxışı ilə seçilən liderdir. Məhz "qulağa gəlib çatmaq" frazeologizmi ilə o hər şeydən xəbərdar olduğunu, müstəqilliyə mane olan hər bir şeylə mübarizə aparacağını bəyan edir: "Xatirimdədir, 1994-cü ildə cənab Paolo Pərviz mənə şikayət etdi ki, burada iş görmək üçün Azərbaycanın bir hökumət orqanında bunlardan rüşvət istəyirlər. Bu da həqiqət idi. Mən həmin yüksək vəzifəli şəxsi dərhal işdən azad etdim və bir daha göstəriş verdim ki, "Həyat" şirkətinin işlərinə burada maneçilik törədilməsin. Ancaq bilirəm, bundan sonra da asan olmayıbdır. O maneçilik törədən adamlar bəzən elə yerdə maneçilik edirlər ki, indi hər dəfə gəlib mübarizə aparmayacaqlar ki! Mənim *qulağıma gəlib çatır.* Bir də burada çox köhnə binalar var idi, onları köçürmək lazım idi, başqa işlər görmək lazım idi. Müqavimət göstərənlər çox idi" [XXIc.s.183].

"Xatirimdədir" modal sözü ilə auditoriyanı keçmişə apararaq, "dərhal işdən azad etdim" sərt ifadə ilə iqtisadiyyatımızın inkişafına əngəl olan qüvvələrə xəbərdarlıq edir, heç bir şeyin "mənim qulağıma gəlib çatır" ifadəsi ilə nəzərdən qaçmadığını xatırladır. Heydər Əliyev şəxsiyyətinin böyük-

lüyü çıxış məqamlarında bir daha məlum olur. 6 avqust 1999-cu ildə, Bakıda Mustafa Hacıqasımov adına Azərbaycan mamalıq və ginekologiya mərkəzinin açılışı mərasimindəki nitqdə Ulu Öndərin səhiyyə sahəsinə dərindən bələdliyi üzə çıxır. Bu yaxınlıq, bu dərindən bələdlik bir sıra şəxsiyyətlərlə yaxınlıqdan irəli gəlir. Görkəmli səhiyyə təşkilatçısı, siyasi xadim professor Əziz Əliyev, akademik Zərifə Əliyeva, professor Tamerlan Əliyev, akademik Cəmil Əliyev, Birinci vitse-prezident Mehriban Əliyeva, eləcə də SSRİ zamanında səhiyyənin onun kurasiyasında olması bu qəbildəndir. Səhiyyənin sosial sahə olduğunu vurğulayan böyük natiq "qat-qat çətin olmaq" frazeologizmi ilə bu sahədə özəlləşdirmənin sovet şinelindən çıxmış adamlarla aparmağın həm çətin, həm də zəruri olduğunu dilə gətirir: "Təbiidir, səhiyyə sosial sahədir. Bir dövlət olaraq, hökumət olaraq biz xalqımızın, millətimizin, vətəndaşlarımızın sosial tələblərini təmin etməliyik... Ona görə ki, səhiyyədə özəl sektoru yaratmaq, sahibkarlığı yaratmaq bəlkə də ticarətdən, yaxud da kənd təsərrüfatından, sənayedən və iqtisadiyyatın başqa sahələrindən qat-qat çətindir. Ancaq bu laızmdır. Bu vacibdir" [XXIc.s.162].

Heydər Əliyev görkəmli siyasi dövlət xadimi olmaqla yanaşı birinci növbədə peşəkar hərbiçidir. Milli Təhlükəsizlik sahəsində general rütbəsinədək yüksəlmiş peşəkar kadrdır. Bəlkə də buna görə Heydər Əliyevin çıxışlarında orduyla bağlı, əsgərlə bağlı xüsusi fikirləri mövcuddur. "Əsgər olmaq" əmrlərə tabe olmaq, komandirlərin tapşırıqlarına sözsüz əməl etmək deməkdir. Həyatda əsgər olmaq hər bir vətəndaşdan dövlət quruculuğu yolunda "əsgər olmaq" tələbidir: "Ancaq eyni zamanda bizim iqtidar nümayəndələri, partiyamızın üzvləri, xüsusən partiyada yüksək vəzifədə olanlar gərək fəal olsunlar. Amma mən belə görürəm ki, bəziləri deputat olub, vəzifə alıbdır, durub kənarda. Nə mübarizəyə qoşulub, nə müxalifətə cavab verib, nə onların yalanını, böhtanını ifşa

edib, amma bəzən də onların *dəyirmanına su tökür*. Belələri də var. Ona görə də hesab edirəm ki, hər bir partiya üzvü Azərbaycanın dövlət siyasətinin, Azərbaycan prezidentinin siyasətinin həyata keçirilməsində, müdafiə olunmasında, onun kütlə arasında, vətəndaşlar arasında düzgün təbliğ edilməsində mübariz insan, mübariz əsgər olmalıdır, kənarda durmamalıdır" [XXIc.s.327].

Bir sıra frazeologizmlərdə Heydər Əliyev xarakterindəki qətiyyətlə nikbinliyin sintezinin şahidi oluruq. "Ötüb keçmək" bu tip frazeologizmlərdən biridir. Feili frazeologizm olan bu ifadə feilin hər üç zamanında – "ötüb keçdik", "ötüb keçirik" və "ötüb keçəcəyik" – qətiyyətə, öz qüvvəsinə inama işarədir. Bu frazeologizmi eşidən auditoriya qarşısında bütün müqavimətləri qıran dövlət başçısını görür: "Bu yol bizim üçün heç də asan olmayıbdır. Biz çox çətinliklərlə rastlaşmışıq. Bizə ayrı-ayrı ölkələr tərəfindən təzyiqlər olubdur. Bizim daxilimizdə çox çətinliklər olubdur. İqtisadiyyat bir neçə il geriyə gedibdir, dağılıbdır, tənəzzül edibdir. Ancaq məmnuniyyətlə deyə bilərəm ki, biz bunların hamısını ötüb keçmişik. Artıq Azərbaycanın dövlət müstəqilliyi möhkəmdir, biz bu müstəqilliyi qoruyub saxlayırıq və saxlayacağıq" [XXIc.s.52].

Uzağa getməyək Ulu Öndərin 22 iyul 1999-cu ildə Fransa Senatının Prezidenti Kristian Pouseleni və onun başçılıq etdiyi nümayəndə heyəti ilə görüşündəki söhbətdə biz onu reallığa söykənən, "müharibənin sonu yoxdur", "sonda ölkələr sülhə gəlməlidir" müddəalarının müəllifi olan filosof-lider kimi görürük. Bu gün hamımızın qibtə ilə baxdığımız Avropa birliyi timsalında "Qafqaz evi" ideyasının gerçəkləşməsinə ciddi mane olan erməni siyasətçilərinə yönələn "bir-birinə calamaq" frazeologizmi əyani sübutdur. Avropadakı "alqışlanan", "təqdirəlayiq" halları Heydər Əliyev sanki qonşu Ermənistana tuşlayır, ünvanlayır. Bu frazeologizmlə iqtisadi inteqrasiyanı calaqla əvəz edərək yaddaqalan nitq nümunəsi

yaradır: “Bu çox sevindirici haldır ki, cəmi 50 il bundan öncə bir-biri ilə müharibə aparan Fransa və Almaniya, yaxud Almaniya və Hollandiya, yaxud da başqa ölkələr indi o qədər yaxınlaşıblar, o qədər birləşiblər ki, öz iqtisadiyyatlarını da bir-birinə calayıblar, öz valyutalarını da birləşdirirlər. Bu, həqiqətən çox təqdirəlayiq haldır. Biz bunu alqışlayırıq” [XXIc.s.54].

Dialektik qanunlar auditoriyalara sadə xalq dilində, təkzibolunmaz dəlillərlə, dialektik kateqoriyaların izahı ilə yön alır. 1 iyul 1999-cu ildə Cenevrə Demokratiya Quruculuğu İnstitutunun “media dəstəyi layihəsi” çərçivəsində Bakıda keçirdiyi konfransda iştirak edən Gürcüstan və Ermənistan jurnalistləri ilə görüşdəki söhbət bu baxımdan yaddaqalandır. Görüşün sonuna yaxın həyatın bütün sahələrində sıçrayış dialektik kateqoriyanın rolunu yada salır. Təkamülə, tədrici inkişafa gedən yolu auditoriya üçün açıqlayır: “Hesab etmək olmaz ki, bəli, Sovetlər İttifaqı süquta uğradı, biz müstəqillik qazanmışıq, indi biz bir sistemdən başqasına, özü də yüksək inkişaf səviyyəsinə malik olan sistemə *sıçrayıb keçmişik*” [XXc.s.421]. Təkcə yuxarıdakı cümlələr və orada işlənmiş “süquta uğramaq”, “sıcrayıb keçmək” frazeologizmləri Heydər Əliyevin timsalında dialektik qanunlara öz baxışlarını ortaya qoyan lider görünür.

Azərbaycanın dövlət rəmzləri, bu rəmzlərə lider sevgisi Heydər Əliyevin dilindədir: “Sonrakı dövrdə burada cəsarətli addımlar atıldı. Bəli, 90-cı il noyabrın 17-də biz burada, Naxçıvan Muxtar Respublikası Ali Sovetinin sessiyasında, mənim sədrlik etdiyim sessiyada ilk dəfə 1918-ci ildə Azərbaycan Xalq Cümhuriyyəti tərəfindən qəbul olunmuş Azərbaycanın milli bayrağını qaldırdıq. Yəni biz bunu küçə və meydanda qaldırmadıq, – orada bu bayraq qaldırıldı.. Hələ kommunist partiyası da var idi, sovet hakimiyyəti də. Qərar qəbul etdik ki, Naxçıvan Muxtar Respublikasının adından “sovet sosialist”

sözləri çıxarılmalıdır. Çıxartdıq və qərar qəbul etdik ki, Naxçıvanın milli bayrağı qəbul olunmalıdır – milli bayraq 1918-ci ildə Xalq Cümhuriyyəti tərəfindən qəbul edilmiş üçrəngli bayraqdır. Bu bayrağı sessiyanın salonuna gətirdik, *başımızın üstünə vurduq*" [XIIc.s.205]. Hələ sovet dövründə milli, üçrəngli bayrağı "başımız üstə vuran", "cəsarətli addımlar atan" qətiyyətli lider siması göz önünə gəlir. "Bəli" təsdiq ədatı məhz 1990-cı il noyabrın 17-də bu addımın Heydər Əliyev tərəfindən həyata keçirildiyini təsdiq edir.

Ölkələrin bir-biri ilə mehriban qonşuluq şəraitində yaşamalı olduğunu bəyan edən dövlət başçısının 7 avqust 1999-cu ildə İran İslam Respublikasının bir qrup dövlət adamları ilə görüşdəki fikirləri tədqiqat nöqteyi-nəzərdən maraqlıdır. Xalq arasında işlədilən "yaxşı qonşu pis qohumdan yaxşıdır" məsəlini görüş iştirakçılarının nəzərinə çatdırır. Qonşuluqla bağlı "xatirimdədir" modal sözü ilə məişət üslublu cümlələrlə görüş iştirakçılarında "qonşuluq" təəssüratı yaradır. Sonda "qonşu ölkə bizim üçün, şübhəsiz ki, başqa ölkələrdən vacibdir" ifadəsi ilə bütün qonşu dövlətlərə, xalqlara mesaj verir: "Ancaq Allaha şükürlər olsun ki, sərhədlər açıldı, Azərbaycan öz milli azadlığına, müstəqilliyinə çatdı, nail oldu. İndi Azərbaycan sərbəst, müstəqil dövlətdir və müstəqil dövlət kimi bütün ölkələrlə öz əlaqələrini qurur. Ancaq yenə də deyirəm, qonşu insan üçün həmişə qonşudur. Bəzən bizim xalq arasında belə deyirlər: yaxşı qonşu pis qohumdan yaxşıdır. Bəzən də deyirlər ki, bəlkə də qohum qohumdan çox uzaqdadır, qonşu isə divarın o tərəfindədir. Xatirimdədir, gənc vaxtlarımda Naxçıvanda yaşayanda orada qonşular arasında divar var idi, bəzən onu götürürdülər ki, heç divar da olmasın. Ona görə qonşu ölkə bizim üçün şühhəsiz ki, başqa ölkələrdən vacibdir" [XXIc.s.167].

Hər vaxt dilində "mənəviyyat" anlayışı, konsepti olan Heydər Əliyev yüksək əxlaqi keyfiyyətlərin daşıyıcısı

olmaqla, həm də bu keyfiyyətləri dövlət strukturlarında çalışanlardan daim tələb edirdi: “Vaxtilə belə bir məşhur kəlam var idi ki, *soyuq baş, hərarətli ürək, təmiz əllər* olmalıdır. Bu kəlamın müəllifinin kim olub-olmamasından asılı olmayaraq müdrik sözlərdir. Mən arzu edərdim ki, bizim hüquq-mühafizə orqanlarında işləyən adamların həqiqətən yanan hərarətli ürəyi olsun, düşünən başı olsun və təmiz əlləri olsun. Bir daha deyirəm, mənəvi saflıq mənəvi paklıq ən əsas tələblərdən biridir, vətənə xalqa sədaqət və mənəvisaflıq, bunlar bizim müvəffəqiyyətimizin əsasıdır” [XVc.s.126].

“Xalqı birləşdirmək”, “xalqı parçalamamaq” kimi frazeologizmlər “Heydər-xalq”, “Xalq-Heydər” anlamının dərkində mühümdür. Xalqı parçalanmaqdan qorumaq, real şəkildə onu birləşdirmək hər liderə nəsib olmur. XIX əsrin əvvəlində baş verən separatizm meyllərinin özünü göstərdiyi XX əsrin 90-cı illərində Heydər Əliyev şəxsiyyətinin rolu şəksizdir. Heydər Əliyev xalqı birləşdirmək gücündə olan liderdir: “İstədim, Naxçıvanda xalqı həqiqətən birləşdirim ki, parçalanmasın. Çünki onlar xalqı artıq parçalayırdılar. Onlar guya Azərbaycanın bütün dərdinə qalanlar idi, amma yox. Onlar illərlə can qoymuş, Naxçıvanı yaratmış, inkişaf etdirmiş, insanları pisikdirmişdilər, sıxışdırmışdılar. Mən o vaxt xalqımızı birləşdirmək istəyirdim. Çünki, o ağır günlərdə xalq birləşməli idi” [XXIIc.s.276]. “Həqiqətən” modal sözü lider səmimiyyətinə bir daha bariz misaldır. “Bir-birinə qovuşmaq”, “əbədiyyətə qədər qovuşmaq” kimi frazeologizmlər Heydər Əliyev xarakterindəki böyük türkçülükdən xəbər verir [114]. Dünyəvi dövlət qurmaq yolunu seçən lider türk dünyasının birliyindən də yan keçmir. Türkçülük ideyası çıxışların əsas qayəsini təşkil edirdi: “Bəli, biz dəfələrlə deyirik: “Biz bir millət, iki dövlətik”. Bu, bizim dostluğumuzun, qardaşlığımızın mənasını, məzmununu təşkil edir. Bu dostluq, qardaşlıq türk xalqı, Anadolu türkləri ilə Azərbaycan xalqı, Azərbaycan türkləri

arasında əsrlərdən əsrlərə gələn dostluq, qardaşlıqdır. Azərbaycanda sovet hakimiyyəti qurulandan sonra biz 70 il bir-birindən ayrı düşmüşdük. Amma bu 70 il bizi bir-birimizdən qəlbən ayırmamışdır. Azərbaycan öz dövlət müstəqilliyini elan edən kimi, müstəqil dövlət olaraq dünyaya bəyanat verən kimi, sərhədlər açılan kimi Türkiyə və Azərbaycan bir daha bir-birinə qovuşdu və əbədiyyətə qədər qovuşdu" [XXIIc.s.241].

Yuxarıda "bir-birinə qovuşmaq" Türkiyə ilə yaxınlıq, Anadolu türkləri ilə əlaqələr açılırsa, "dərin köklərlə bağlı olmaq" frazeologizmi isə İranla İranda yaşayan, İran dövlətinin bütün strukturlarında çalışan Azərbaycan türkləri ilə əlaqəni nəzərdə tutur: "İran bizim yaxın qonşumuzdur. Biz çox *dərin köklərlə bir-birimizə bağlıyıq* və bu gün də biz İranın inkişaf etməsinin, İran hökumətinin qarşısında qoyduğu bütün məqsədlərin həyata keçirilməsinin tərəfdarıyıq" [XXVIIc.s.201-202].

Bir sıra frazeologizmlərdə Heydər Əliyev şəxsiyyətinin mənəvi tərəfləri özünü açıq-aydın göstərir. Onun 25 iyun 2000-ci ildə xalq yazıçısı Elçinin "Ah, Paris... Paris..." ikihissəli komediyasına tamaşa etdikdən sonra aktyorlarla görüşdən sonrakı söhbətdə "mal-dövlət dalınca getmək" frazeologizmi Heydər Əliyev şəxsiyyətinin mənəvi xarakterini açır: "Amma mən bu gün belə anladım ki, Elçinin məqsədi ondan ibarət olubdur ki, ölkənin bu ağır vaxtında, çətin vaxtında xalqın hamısının birləşib millət haqqında, torpaq haqqında düşünməsinin əvəzinə, bəziləri yenə də mal-dövlət dalınca gedir və bu, mənəvi əxlaqsızlıqdır. Yəni əsərdə mənəviyyat məsələsinə toxunulur" [XXVIIIc.s.314].

Elə bu söhbətdəcə növbəti dəfə "gəldi-gedər şeylər" frazeologizmini auditoriyaya yönəldir. "İnsanı yüksəldən, insanı insan edən..." şeyin nə olduğunu auditoriyaya bəyan edir: "Siz bilirsiniz ki, mən əvvəllər – 70-ci illərdə də Azər-

baycanın rəhbərliyində olanda həmişə fəaliyyətimin əsas hissəsi bundan ibarət olmuşdur ki, xalqımızda yüksək mənəviyyat bərqərar olsun. Çünki insan üçün mənəviyyatdan yüksək heç bir şey olmaz: *nə* mal, *nə* dövlət, *nə* pul, *nə* villa, *nə* milyonlar – heç bir şey olmaz. Bunlar hamısı dünyada gəldi-gedər şeylərdir. İnsanı yüksəldən, insanı insan edən, adamı adam edən və insanı vətəndaş edən onun mənəviyyatıdır" [XXVIIIc.s.314]. "Nə...nə" inkarlıq bağlayıcılarının ekspressivliyi əsasında insanı yüksəldən şeyin məhz mənəviyyat olduğu aydın olur.

"Ürəyə yatmaq" frazeologizmi ilə Heydər Əliyevin timsalında böyük esteti görürük. Bu estetik hisslər, xüsusən incəsənət ustalarının çıxışlarından sonrakı söhbətlərdə üzə çıxır. 30 iyun 2000-ci ildə Azərbaycanda Rusiya mədəniyyəti günlərinin təntənəli bağlanışı gecəsində Moskva şəhəri incəsənət ustalarının konsertindən sonrakı söhbət buna parlaq misaldır: "Məsələ onda deyil ki, hər ifaçını alqışlayırdılar, həm də nümayiş etdirdiyimiz rəqslərdən cuşa gəlirdi. Deməli, bütün bunlar ürəyə yatırdı. Bu birincisi. İkincisi isə, nəinki ürəyə yatırdı, hətta riqqətə gətirirdi, buna görə də tamaşaçılar eşidən kimi, hiss edən kimi, görən kimi *cuşa gəlirlər, ürəkləri yerindən oynayır* və sizinlə birlikdə oxuyur, sizinlə birlikdə alqışlayır və hətta, məncə, sizinlə birlikdə atılıb-düşürdülər" [XXVIIIc.s.388-389]. Bu kiçik mətndə iki yerdə təkrarlanan "ürəyə yatmaq", "cuşa gəlmək", "ürəyi yerindən oynamaq" kimi frazeologizmlər estetik dünyagörüşümüzün formalaşmasında Heydər Əliyev nitqlərinin əvəzolunmaz xarakterini açır.

"Adını batırmaq" frazeologizmi Heydər Əliyevin Azərbaycan xalqının, vətəndaşının şərəfini qoruyan, onu əziz tutan bir lider olduğunu göstərir. Bu frazeologizmin ardınca "gözdən salmaq" frazeologizmi Heydər Əliyevin şərəf adamı olduğunu sübut edir: "Təbiidir, biz həmin sistem, həmin ideologiya çərçivəsində yaşayırdıq. Mən iki-üç dəfə Azər-

baycandan böyük milis briqadaları göndərmişdim ki, Moskvanın bazarlarında azərbaycanlıarı tutsunlar, onlar möhtəkirlər kimi, azərbaycanlıların adını batırmasınlar" [XXVIIIc.s.257].

"Biz həmin sistem, həmin ideologiya çərçivəsində yaşayırdıq" deyən lider növbəti nitq məqamında bu gün ticarətlə məşğul olanlar haqda ritorik sualla (Nə üçün hesab etməliyik ki, onlar bizi gözdən salan insanlardır? Yox!) müraciət edərək, "yox" inkar ədatı ilə də cavab verir: "Ticarət isə hər yerdə ticarətdir. Biri supermarketdə alver edir, digəri dükanda, üçüncüsü bazarda hər yerdə alver edirlər. Əgər bazar olmasa, həyat da olmaz. Onlar məhz ən çalışqan insanlardır. Moskvada – mən orada neçə illər yaşamışam – qışda, iyirmi dərəcə şaxtada, bazarda piştaxtanın arxasında bir neçə saat ayaq üstə dayanıb nə isə satmaq çox ağır zəhmətdir. Nə üçün hesab etməliyik ki, onlar bizi *gözdən salan insanlardır*? Yox!" [XXVIIIc.s.258].

3 iyun 2000-ci ildə Bakının Xətai rayonunda "Azərneft yağ" istehsalat birliyinin işçiləri üçün tikilmiş yeni yaşayış binalarının istifadəyə verilməsi münasibətilə keçirilən mərasimdəki nitqində auditoriyaya ünvanladığı "nəfəs almağın mümkünsüzlüyü" frazeologizmi ilə "Qaraşəhərin" problemlərini dilə gətirir, Azərbaycan insanının sağlamlığını özünün bir nömrəli vəzifəsi hesab edir. Bu çıxışla gələcəkdə monoqrafiyanın III cildində işıqlandırıldığı kimi ekoloji etikanın formalaşmasının əsasını qoyur: "Çünki neft tullantıları kükürd və başqa kimyəvi maddələr buranın havasını o qədər gərginləşdirmişdi ki, bu yerdə nəfəs almaq mümkün deyildi...

İnanın, mən nə qədər sevinirəm, nə qədər xoşbəxtəm ki, o vaxtdan 25 il keçəndən sonra mən o zaman qurduğum işlərin bəhrəsini görürəm. Bu, doğrudan da çox sevindirici bir hadisədir. Buna görə də mən bu gün sizinlə görüşümdən ikiqat, üçqat sevinirəm. Çünki gəlib buranı, bu binaları görürəm və düşünürəm ki, bütün bunlar mənim gördüyüm *işlərin bəhrə-*

*sidir*. Bu hər bir insan üçün ən böyük xoşbəxtlikdir" [XXVIIIc.s.7]. Böyük mənada bağbanı olduğu Azərbaycanda əməyinin nəticəsini – "bəhrəsini görmək" frazeologizmi ilə bəyan edir.

Xalqın yolunda, dövlət və dövlətçiliyin yolunda can qoymaq hər liderin bəxtinə də düşmür, hər liderdə də belə fədakarlıq olmur. 26 sentyabr 2000-ci ildə ABŞ-ın Klivlend şəhərindən ANS yayım və media şirkətinin əməkdaşı Mirşahin Ağayevə verilən telefon müsahibəsi buna parlaq sübutdur: "Bilirsiniz ki, keçən ilin aprelində mən burada cərrahiyyə əməliyyatı keçirmişdim. Mən həkimlərlə danışdım, onlar dedilər ki, birgünlük buraya gəlsəniz pis olmaz, sizi müayinə edərik. Ancaq iş bundadır ki, buraya gələndə mənə həm bərk soyuq dəymişdi, həm də qrip idim. Haqqına demək lazımdır ki, mən həmişə özümü *işə qurban etmişəm*" [XXXc.s.93]. "Özümü işə qurban etmişəm" frazeologizmi əlavə şərhə, əlavə izaha ehtiyac qoymur. Öz şəxsi həyatının təlatümlü dövrlərində belə xalqının mənafeyini öndə saxlayan lider "rahat olmaq" frazeologizmi ilə bunu bəyan edir: "Mənim dediyim bu sözləri də, mümkün hesab edirsənsə, televiziya ilə ver, qoy camaat rahat olsun. Bəziləri isə başa düşsün ki, insan ağılla hərəkət etməlidir" [XXXc.s.95].

Prezident sarayında 15 avqust 2000-ci ildə Türkiyə Cümhuriyyətinin qaziləri ilə görüşdəki söhbətində "nəfəsim gedib gələnəcən" frazeologizminin işlənməsi Heydər Əliyevin xaraktercə ən böyük türkçü olduğunu auditoriyaya bəyan edir. Bu frazeologizmin müəllifinin məhz Heydər Əliyev olduğu bəri başdan məlum olur: "Bu fürsətdən istifadə edərək, bütün türk xalqına, qardaş türk xalqına Azərbaycan xalqının sevgi və məhəbbətini bir daha bəyan edirəm. Bizim dostluğumuz, qardaşlığımız əbədidir, sarsılmazdır. Bu ifadələri mən neçə illərdir işlədirəm, nə qədər ki, *nəfəsim gedib-gəlir*, işlədəcəyəm. Bizim əbədiyyətə qədər davam edəcək bu dostluğumuz, qar-

daşlığımız həm Türkiyənin, həm də Azərbaycanın inkişafını və bizim birliyimizi təmin edəcəkdir" [XXIXc.s.326].

XX əsrdə baş verən erməni vandalizmləri Azərbaycanda köçkün, qaçqın ədəbiyyatı yaratdı. Bu ədəbiyyatın yüzlərlə yolçusu peyda oldu. Onlardan birinin Bəhmən Vətənoğlunun [42] söz haqqındakı fikirləri bu mötəbər monoqrafiyada özünə yer aldı:

*İlhamın gəlməsə alma qələmi,*
*Havayı zəhmətə salma qələmi.*
*İlhamla yazılan əsər gərəkdir,*
*Əsərdə kəsərli kəsər gərəkdir.*

Heydər Əliyev xaraktercə kəsərli söz sahibidir. Heydər Əliyevin "əsərləri onun çıxışlarıdır" desək yanılmarıq. Bu kəsərli ifadələr sətiraltı yox, bütün ciddiliyi ilə açıqca səslənir. Məhz ona görə də Heydər Əliyev şəxsiyyəti qəbul olunur. "Literaturnaya qazeta"nın xüsusi müxbirləri ilə olan söhbətdəki bəzi fraqmentləri yada salaraq və sonda "qara yaxmaq lazım deyildir" qətiyyətli kəsərli ifadəni – frazeologizmi işlətməsini göstərərək yuxarıdakı fikirləri təsdiq etmiş oluruq: "Başlıcası – Ermənistan-Azərbaycan münaqişəsini həll etmək lazımdır. Qalan hər şeyi tarixin öhdəsinə buraxaq. Açar Rusiyanın əlindədir. Heç yerdə – *nə* Amerikada, *nə* Fransada, *nə də* ATƏT-də deyildir. Ancaq Rusiyadadır" [XXIXc.s.304]. "Nə ...nə də" inkarlıq bağlayıcıları ilə prinsipial, kəsərli mövqe bildirmək hər bir siyasi natiqə müyəssər olmur. Elə həmin çıxışın "qara yaxmaq" frazeologizmi ilə sonuclanması bir daha yuxarıdakı fikirlərə bəraət qazandırır: "Əlbəttə, Azərbaycan Rusiyaya dost dövlət olacaqdır. Yeri gəlmişkən, burada mənə təzyiq göstərməyə çalışırlar: nə üçün Rusiyanın əslində bütün telekanalları translyasiya edilir? Bizdə rus dilində çoxlu qəzet çıxır, rus teatrı işləyir, Rusiya ifaçılarının mün-

təzəm surətdə konsertləri olur. Lap bu yaxınlarda Moskva günləri keçirildi, Moskva hökuməti sədrinin müavini L.Şvetsova gəlmişdi. Biz onunla əslində bütün tədbirlərdə olduq. Bir deyin hansı respublikada bundan çox edilir? Amma bütün bunları görmək, qiymətləndirmək lazımdır. Bəzi kütləvi informasiya vasitələrində edildiyi kimi, Azərbaycana *qara yaxmaq* lazım deyildir" [XXIXc.s.310]. "Qara yaxmaq" lazım deyil frazeologizmi kəsərli məntiqə söykənən nitqin sonluğu kimi Heydər Əliyevə qətiyyətli dövlət başçısı imici qazandırır, Heydər Əliyevin xarakterindəki qətiyyətit frazeologizmlərdə açılır. Heydər Əliyev incə, kövrək qəlb sahibi olmaqla yanaşı ədalətlidir. 12 sentyabr 2002-ci ildə Gəncə şəhəri icra hakimiyyətində keçirilən müşavirədəki çıxışın bir hissəsində bu münasibətlər daha aydın özünü büruzə verir: "Mən düşünürdüm, bunu deyim, deməyim. Kiminsə *ürəyinə dəyəcək*, kimsə, əlbəttə ki, narahatçılıq keçirəndə yaxşıdırmı? Kim günahkardır, o da narahatlıq keçirsin. Mən onsuz da narahatam. Narahatam ki, mənim iştirak etdiyim tədbirə insanları üç saat əvvəl dəvət ediblər. Bu çox pis haldır. Mən bütün hakimiyyət orqanlarından tələb edirəm ki, bu ənənədən əl çəkin. İnsanlara daha da hörmətlə yanaşın, insanları hansısa bir tədbirə dəvət edirsinizsə, elə edin ki, onlar əziyyət çəkməsinlər. Mən bunu sizdən xahiş edirəm. Görüşümüzün sonunda mən sizə bir az acı sözlər dedim. Ancaq bunsuz olmur. Bu acı sözlərin hamısı hər bir Azərbaycan vətəndaşını yaxşı etmək məqsədi daşıyır. Mən ancaq buna görə özümə belə əziyyət verir, bu acı sözləri deyirəm" [XLIc.s.133-134]. Nitqlərində əsasən feili frazeologizmlər çox işlənsə də "acı söz" kimi ismi frazeologizmlər də yeri gəldikcə öz istifadəsini tapır. Başqa bir məqamda "ürəyinə dəymək", "incimək"lə əvəzlənir.

Şəxsiyyətin xarakterinin açılması kompleks psixoloji məsələdir ki, biz bu fəsildə bir nitq vahidi kimi frazeologizmlərin bu prosesdə əvəzolunmaz mövqeyinə aydınlıq gətirməyə

çalışdıq. Bu fəslin başa çatdırılması gələcəkdə ümidvarıq ki, tarixi baxımdan şəxsiyyətlərin xarakterlərinə nüfuz etmək imkanı verəcək.

Beləliklə:

– bu fəsil Heydər Əliyevin xalq frazeologiyasına dərindən bələdliyini üzə çıxarır;

– frazeologizmlər Heydər Əliyevin xarakterindəki milliliyi, xəlqiliyi, qətiyyəti, səmimiyyəti və s. açıqlayır;

– frazeologizm siyasi liderin ümumbəşəri düşüncə sahibi olduğunu bir daha auditoriyalara bəyan edir;

– frazeologizmlər Heydər Əliyevin timsalında zaman və məkan kontekstində ümumfəlsəfi dəyərləri üzə çıxarır;

– Bir sıra frazeologizmlərdə Heydər Əliyev xarakterindəki qətiyyətlə nikbinliyin sintezinin şahidi oluruq;

– Tarixi həqiqətləri görməyən, tarıxinə, keçmişinə xor baxan, fəaliyyətsiz, laqeyd, etinasız, vəzifəsini yerinə yetirməyən, ölüm hadisələrinə görə ittiham olunan, ağır cinayətdə iştirak edən mənfi xarakterlər "tarixə kor baxmaq", "göz yummaq", "əli qana batmaq" kimi frazeologizmlərlə açılır:

– Heydər Əliyev dühasının auditoriyalarla qarşılıqlı münasibətinin öyrənilməsi siyasi diskurs problemlərinə aydınlıq gətirəcək;

– Həyatı boyu vaxtla, zamanla mücadilə edən, vaxtın darlığı ilə barışmayan tarixi şəxsiyyət Heydər Əliyevin də vaxtla, zamanla bağlı işlətdiyi çoxsaylı frazeologizmlər mövcuddur.

# II FƏSİL
# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ FRAZEOLOGİZMLƏRİN MƏTNDƏ YERİ

Təsadüfi deyildir ki, dilin xalq fizionomiyasını, varlıq və zəka zənginliyini özündə əks etdirən frazeologizmləri öyrənən frazeologiya dilçilik elminin bir şöbəsi olan leksikologiyanın xüsusi bir bölməsinə çevrilmişdir.

Linqvistika elminin müasir durumu tələb edir ki, dil vahidləri müxtəlif səviyyələrdə hərtərəfli və dərindən öyrənilsin. Bir dil vahidi kimi dilin milli-mədəni spesifikasını əks etdirən frazeoloji sistem də dünya dillərində müxtəlif səviyyələrdə tədqiq edilmişdir. Bir dilin materialları üzrə öyrənilmiş frazeoloji materiallar indi bir neçə dilin tutuşdurulması, müqayisəsi, qarşılaşdırılması aspektində tədqiqini gözləyir. Belə bir tədqiqat frazeoloji tədqiqatları genişləndirir, onun müasir mərhələsini inkişaf etdirir [47, 99, 109].

Ümumi dilçilikdə frazeoloji vahidlərin mahiyyəti, onları səciyyələndirən amillər, frazeoloji sinonimlərdən fərqləndirən meyarlar barədə mübahisələr davam etməkdədir [5, 158, 178]. Frazeologiyada mübahisə doğuran ən kəskin problemlərdən biri də hikmətli sözlər, atalar sözləri və qanadlı sözlər problemidir ki, bunların frazeologizmlər ücün sabitliyin kateqorial olub-olmamasıdır. Bu vahidlərdə sabitliyin olması inkaredilməzdir. Lakin sabitlikdən əlavə, onların varlığını şərtləndirən yeganə xüsusiyyət deyildir. Frazeologizmlərin əsas əlamətlərindən biri məcazlaşmadır ki, bu ifadələr məcazlaşma ilə təşəkkül tapır. Bu da qanunauyğun prosesdir. Hikmətli sözlər, atalar sözləri, qanadlı sözlər də məhz məcaziliklə möhkəmlənən dilçilik sahəsidir [6, 151] ki, siyasi natiqlikdə bu elementlərin öyrənilməsi tədqiqat obyekti olmamışdır.

Eyni mənanı ifadə etmək üçün frazeoloji vahidin müəyyən dəyişikliyə uğrayaraq eyni mənanı ifadə etməsi əsasında

yaranan birləşmələrə frazeoloji variantlar deyilir. Leksik variantlarda sözlərin biri və ya ikisi fərqli səciyyə daşıyır, qalan komponentlər isə ortaq olur [19, 63, 134,179].

"Göz üstə saxlamaq" – "Əgər biz bunları göz üstə saxlamasaq, belə insanları cəmiyyət – bizim 8 milyonluq əhalimiz var – göz üstə saxlamasa, mədəniyyətimizi inkişaf etdirə bilmərik" [XLIIIc.s.210].

"Göz bəbəyi kimi qoruyub saxlamaq" – "Sizi əmin edirəm ki, biz Azərbaycanın dövlət müstəqilliyini göz bəbəyimiz kimi qoruyub saxlayacaq və onu heç vaxt əldən verməyəcəyik" [IXc.s.292].

Leksik-qrammatik variantlarda feili frazeoloji birləşmənin komponentləri həm leksik, həm də qrammatik cəhətdən fərqlidir. Eyni leksik vahidlərdən düzələn, eyni mənaya malik olan, lakin isim komponentinin qrammatik forması ilə fərqlənən variantlara qrammatik variantlar deyilir. "Göz qabağında olmaq" – "Ola bilər, başqa sahələrə nisbətən ictimaiyyət bu nöqsanları daha da tez görür, hiss edir, çünki sizin işiniz *göz qabağındadır*" [Vc.s.340]. "Gözümün qarşısında olmaq" – "Həyatımın bəzi hissələrini bəlkə də indi xatırlaya bilmirəm, amma müəllimlərimi heç vaxt unutmamışam, hər bir müəllimim bu dəqiqə də *gözümün qarşısındadır*" [XXIXc.s.413]. Qarışıq tipli variantlar. Bəzən feli frazeoloji variantlarda leksik, qrammatik və s. variantlar qarışıq şəkildə təzahür edir [22,153, 201].

Frazeoloji vahid sərbəst söz birləşməsinin modelləri üzrə törəyir. Konkret söz birləşməsi və ya cümlə onun mənbəyidir. Frazeoloji vahidlər üçün səciyyəvi olan xüsusiyyətlər bir sıra tədqiqatçılar tərəfindən göstərilmişdir: məcazilik, məna bütövlüyü, sabitlik, başqa dilə hərfən tərcümə edilməmək, sözə ekvivalentlik, obrazlılıq, emosional boya və s. [91, 113, 143, 150, 155].

Belə hallarda həmin frazemin ikinci komponenti kimi çıxış edən feil öz müstəqil, semantik mənasından uzaqlaşır, köməkçi feil funksiyasını qazanır və müxtəlif semantikalı feili frazeoloji vahidlərin yaranmasında əsas vasitəyə çevrilir. Qeyd etmək lazımdır ki, bu tip feili frazemlər müasir Azərbaycan dilində də inkişaf etmişdir və bu "vurmaq", "atmaq", "tutmaq", "vermək", "düşmək", "basmaq" və s. feillərlə adların yanaşması ilə düzələn sabit birləşmə səciyyəli mürəkkəb fellərə daxildir" [81, 156, 187, 188].

Quruluş etibarilə mürəkkəb feil olan həmin feillərin əksəriyyətinin "eyni zamanda frazeoloji vahid olması" da elmi ədəbiyyatda vurğulanır. Heydər Əliyev dilində də bu tip mürəkkəb feili frazeologizmlərə tez-tez təsadüf edilir. Bu sıraya "göstərmək", "gəlmək", "döymək" və s. feillərin yaratdığı frazeologizmlər aid ola bilər: "*Dünyaya göstərmək* – beynəlxalq mətbuata açıqlanmaq; "Çünki onlar qorxurlar, bilirlər ki, əgər seçkilərə getsələr, nəyə qadir olduqlarını, yəni sosial bazalarının nədən ibarət olduğunu bütün *dünyaya göstərəcəklər*" [XVIIIc.s.12]. *Düz yola gəlmək* – qanuna tabe olmaq; "Onun rəhbərliyi altında olan polislərin hər birinə müraciət edirəm: *düz yola gəlin*, ayılın, hələ gec deyildir" [IIc.s.342]. *Döşünə döymək* – lovğalanmaq, təkəbbürlülük etmək, öyünmək; ~ sinəsinə döymək, döşünə vurmaq, mənəm-mənəm demək; "Ona görə də indi kiminsə *döşünə döyməsi* mənasızdır" [IIc.s.95].

Maraqı hal kimi bu məqamda Nəsiminin dilində işlənmiş feili frazeoloji vahidlərlə müqayisə uğurlu olar. Bu bir daha Azərbaycan dil tarixində ənənələrin irsiliyinə sübutdur. Müəlliflərin [17, 81, 156] Nəsimi yaradıcılığına etdiyi seçmələrdən bəzilərini monoqrafiyada verməyi məsləhət bildik: " *qanına susamaq, əl yumaq* (əl çəkmək), *çiçəgi açılmaq*, (gülmək, sevinmək), *daş olmaq* (ölmək), *baş eyləmək, baş çıxarmaq* (yara olmaq, yara çıxarmaq), *əl vermək* (münasib olmaq,

uyğun olmaq), *hilal olmaq* (arıqlamaq), *al eyləmək* (məkr qurmaq, hiylə qurmaq), *diri tutmaq* (saymaq, hörmət etmək), *su olmaq* (ərimək), *aşını bişirmək* (mübtəla etmək, düçar etmək), *mərifət satmaq* (özünü abırlı kimi göstərmək), *güzar etmək* (getmək, gəlmək), *qanını tökmək* (öldürmək), *qəmdə yanmaq*, *narə yaxmaq,* (yanıb – yaxılmaq), *can vermək* (sevmək, istəmək), *qulaq urmaq* (dinləmək), *daşra buraxmaq* (faş etmək), *canda saxlamaq* (gizləmək), *nəsihət qılmaq, abad qılmaq,* (qurmaq), *söhbət tutmaq*, (danışmaq)*, tuş olmaq, büryan eyləmək* (yandırmaq), *təsrif qılmaq, ocağa atmaq*, (yandırmaq), *peyman tutmaq*, (əhd-peyman etmək), *əhd qılmaq, viran eyləmək, yəğma eyləmək, (gəlmək), yəğma qılmaq* (dağıtmaq), *heyran olmaq* (vurulmaq, ürəkdən sevmək), *aşiq olmaq, azad olmaq, şad olmaq, sayru olmaq, ad etmək* (ad çıxarmaq) və s. və i.a.

Bu tip feili frazemlərin xəbəri təsdiq feilin müxtəlif zamanlarında (aspekdə) işlənə bilir.

Nəsiminin dilində elə feili frazeoloji vahidlər vardır ki, onlar yalnız felin inkar müzarə (qeyri-qəti) gələcək zamanın inkar formasında işlənir. Elə bu tip frazeologizmlər Heydər Əliyev dilində aşağıdakı şəkildə səslənir. Məs:

*Düzələsi adam olmamaq* – “Amma baxıb görəndə ki, yox, bunlar *düzələsi adam deyil*, yaxud sadəcə, bacarıqsız adamdır, bacarığı bundan yuxarıya qalxa bilməz, – şübhəsiz ki, belə adamları dəyişirik” [XXIc.s.94].

*Əlini ağdan qaraya vurmamaq* – “Ən dəhşətlisi bu idi ki, adamlar daha əlini ağdan qaraya vurmur, işləmirdilər” [XIIc.s.158].

Xalq deyimləri şəklində frazeologizmlərin mətnlə münasibəti Heydər Əliyevin nitqlərində öyrənilməyə layiqdir. Təkcə “Qara günün ömrü az olar” idiomunu araşdırmaq məqsədəuyğun olardı. “Qara gün” Heydər Əliyevin dilində “faciəli” anlamındadır ki, “qara gün”ə qədər baş verən faciələr

ardıcıllıqla sadalanır. Sonda idiomla bu faciələrə yekun vurulur. 14 dekabr 1997-ci ildə Bakıda, Teleteatrda “Uşaqların beynəlxalq televiziya və radio günü münasibətilə “uşaqlar dünyanın sevincidir” devizi altında keçirilən şənlikdəki çıxışında “qara gün” auditoriyaya açıqlanır: “Uşaqlarımızın bir qismi yerindən-yurdundan didərgin düşmüşdür. İndi onlar qaçqın, köçkün ailələrində yaşayırlar. Bu, bizim xalqımızın faciəsidir. Xalqımıza qarşı 1988-ci ildən qonşu Ermənistan tərəfindən edilən təcavüz nəticəsində və keçmiş illərdə baş vermiş bəzi səbəblərə görə respublikamızın ərazisinin 20 faizi Ermənistan tərəfindən edilən təcavüz nəticəsində bir milyondan artıq vətəndaşımız yerindən-yurdundan didərgin düşübdür. Onların da demək olar ki, əksəriyyəti uşaqlardır, gənclərdir, köçkün, qaçqın vəziyyətində yaşayırlar. Çoxları isə çadırlarda yaşayır. Yenə deyirəm, bu, bizim xalqımızın faciəsidir” [XIIIc.s.393].

Bu fikirlərin ardınca “ancaq” ziddiyyət bağlayıcısı ilə faciədən nikbinliklə çıxmağın yolunu göstərir: “Ancaq mən dəfələrlə demişəm və bu gün də deyirəm – xalqımız dərdə dözümlü xalqdır və bu dərdə də dözür, inanır ki, *qara günün ömrü az olar*.” Bu frazeologizmin arxasınca gələcəyə tuşlanan, qəti gələcək zamanda səslənən nikbin bir nitq işə düşür: “Xalqımız bu faciədən xilas olacaq, işğal edilmiş torpaqlar işğaldan azad olunacaq, yerindən-yurdundan zorla çıxarılmış insanlar öz evinə, obasına qayıdacaqlar. Uşaqlar yaşayacaq, böyüyəcək, öz yerlərini, yurdlarını yenə də gözəlləşdirəcək, quracaq, yaradacaqlar” [XIIIc. s. 393].

Mətnin sonluğu “əmin edirəm ki”, “inanıram ki” nikbinlik ifadələri ilə qurtarır: “Onları, məhz uşaqları *əmin edirəm ki*, biz onları bu vəziyyətdən çıxaracağıq. Mən *inanıram ki*, bizim xalqımız – böyük qəhrəmanlar yetişdirmiş xalqımız, böyük alimlər yetişdirmiş xalqımız, böyük insanlar yetişdirmiş xalqımız məhz o çadırlarda yaşayan uşaqlardan da qəhrə-

manlar yetişdirəcəkdir, alimlər yetişdirəcəkdir, böyük fikir sahibləri yetişdirəcəkdir və onlar gələcəkdə öz xalqına böyük xidmətlər edəcəklər" [XIIIc.s.394].

Feil komponenti qeyri-müəyyən gələcək zamanın inkar forması ilə ifadə edilmiş frazeoloji vahidlər əsasən iki komponentli olur bir qismi isə çox komponentlidir: *yəni heçə dəyməz, pula dəyməz,* eləcə də *çöpə dəyməz,* frazemlər ilə yanaşı *ayağının tozuna dəyməz, gülü xarına dəyməz* və. s. kimi semantik baxımdan bir məna ifadə edir [81, 156].

"Türk dillərinin frazeologiyasının dəfələrlə həm diaxron, həm də sinxron planda tədqiqat obyektinə çevrilməsinə, bu sahədə yeni fikirlərin əmələ gəlməsi, sanballı monoqrafiyaların yaranması üçün səbəb olmasına baxmayaraq, hələ də bir çox məsələlər mübahisəli qalmış, bu günə kimi həllini tapa bilməmişdir" [156]. Mübahisəli məsələlərdən biri də müxtəlifsistemli dillərdə frazeoloji vahidlərin ekvivalentlik və adekvatlığıdır [114].

Sabit birləşmələrin məna tamlığı onların əsas fərqləndirici əlamətidir. "Nitqə hazır daxil olmağın əlaməti müvafiq birləşmənin məna tamlığıdır. Məna tamlığı ya mənanın idiomatikliyi və ya terminliyi ilə səciyyələnir" [133, 290].

Ekvivalentlik, hər şeydən əvvəl, frazeoloji vahiddəki komponentlərin eyniliyindən irəli gəlir. Ona görə də komponentlərin müqayisəsi diqqət mərkəzinə çəkilir.

Çoxmənalilik frazeologizmlərdə mürəkkəb qarşılıqlı təsirin nəticəsidir. Onlar dilin leksik vahidləri kimi şoxmənalı ola bilir və bu cəhət komponentlərin mənası ilə bağlıdır. A.B.Kunin göstərir ki, frazeoloji vahidlərin tərkib hissələrini mənalandırma birbaşa getmir. Nəticədə çoxmənalı frazeoloji vahidlər yaranır. Bununla belə, sözlərdə çoxmənalılıq geniş, frazeologizmlərdə isə az yayılmışdır [95, 121, 147, 169, 266].

Sözlərlə müqayisədə frazeoloji vahidlərin çoxmənalılığında əhəmiyyətli fərq vardır. Çoxmənalı frazeoloji vahidlə

çoxmənalı söz arasında əsaslı fərqləri üzə çıxaran, frazeologizmlərin çoxmənalılığını müəyyən edən amillər kifayət qədər öyrənilməmişdir [225, 283, 284].

Polisemiya frazeoloji vahidlərə xas xüsusiyyətdir. Azərbaycan dilində "başına vurmaq" sabit söz birləşməsi başqa bir mənada da işlənir. N.Seyidəliyev bu frazeologizmin "başa çaxmaq, etdiyi yaxşılığı üzünə demək, minnət qoymaq, töhmət etmək" mənasını qeyd etmişdir. "Bir ay süfrənin qırıq-quruğundan yemişik, onu niyə dilinə gətirib başımıza vurursan" [62, 121, 181].

Frazeoloji vahidlərin komponentlərinin semantik bütövlük dərəcəsi yüksəldikcə onlarin çoxmənalılıq imkanları azalır. Əksinə, komponentlər arasındakı semantik əlaqələr zəif olduqca onların çoxmənalılığı mümkündür [72, 121].

Aşağıdakı ekvivalentlik dərəcələrini göstərmək mümkündür: 1) struktur-semantik ekvivalentlik; 2) semantik ekvivalentlik; 3) struktur psevdoekvivalentlik [121, 249].

Ekvivalentlik somatizmlərdə daha yüksək səviyyədədir. Frazeoloji ekvivalentlik qohum dillərdə özünü daha yüksək səviyyədə göstərir. Dillərin eynisistemliyi struktur ekvivalentliyə zəmin yaradır. Struktur eyniliyi həm də frazeologizmi təşkil edən komponentlərin üst-üstə düşməsinə yardımçı olur. Həm strukturca, həm də komponentlərin eyniliyi ilə səciyyələnən frazeologizmlərin adekvatlığı və ekvivalentliyi yüksək ehtimallıdır [76,77, 121, 226].

Sərbəst söz birləşmələrinin vahid lüğəti mənası olmadığı halda frazeologizmlərin lüğəvi mənası vardır. Frazeoloji birləşmələrin ifadə etdiyi mənalar bütöv haldadır. Frazeoloji birləşmələr sabit birləşmələrdir, yəni belə birləşmələrdə sözlərin sırası dəyişməzdir, buna görə də onlar qrammatik cəhətdən ayrı-ayrılıqda təhlil olunmur [31, 117, 217].

Frazeologiyanın məqsədi frazeoloji vahidlərin (frazemlərin) dildə mövqeyini müəyyənləşdirmək, onların müvafiq

prinsiplərə əsasən təsnifini vermək, üslubi xüsusiyyətlərini aydınlaşdırmaq, əmələgəlmə və inkişaf etmə yollarını aşkar etməkdən ibarətdir [122].

Ş.Balli [238] frazeoloji vahidlərin əlamətini müəyyənləşdirməkdə birləşmənin həm zahiri, həm də daxili cəhətinə nəzər yetirməyi mühüm şərt hesab edirdi.

O, sabit birləşmələri öz əsərində leksik-semantik və üslubi-məna cəhətdən şərh etmişdir. Dilçilik tarixində sabit birləşməyə bu şəkildə yanaşmaq tamamilə yeni idi. Məlumdur ki, dil tarixi, ictimai hadisədir. Belə ki, hər bir konkret dilin frazeoloji vahidləri də zəruri ehtiyac nəticəsində tədricən formalaşaraq zənginləşmə prosesi keçirib bir sistem halına düşür. Frazeologiya da iki planda (diaxronik və sinxronik) tədqiq edilir.

Diaxronik planda dilin frazeologiyasının tarixən formalaşması və müasir dövrə doğru semantik və struktur cəhətdən inkişafı öyrənilir. Sinxronik planda isə dilin frazeologiyasının müasir vəziyyətinin semantik və struktur təsviri verilir.

Dilçilikdə frazeologiyanın tədqiqat obyektindən bəhs edən müəllifləri iki qrupa bölürlər.

1) Ümumiyyətlə hər hansı bir dildə hazır şəkildə olan söz birləşmələrinin hamısını frazeologizm hesab edənlər.

2) Dildə hazır şəkildə olan söz birləşmələrinin hamısını deyil, onlardan nitq və ya dil vahidlərinə ekvivalent olub, komponentləri məna və quruluşca parçalanmayan qismini frazeologizm adlandırırlar. Dilçilikdə bunlardan birincisi "geniş mənada frazeologiya", ikincisi "dar mənada frazeologiya" adlandırılır.

Ferdinand de Sössür [283] dildəki sabit ifadələri sərbəst söz birləşmələrindən belə fərqləndirir: "Biz hər şeydən əvvəl, külli miqdarda ifadələrə rast gəlirik ki, bunları dilə aid etmək lazımdır. Bunlar dildə elə hazır nitq parçalarıdır ki, adətən, daxilindəki ayrı-ayrı mənalara malik olan sözləri dəyişmək

mümkün olduğu halda bu məqbul sayılmır. Bunların ənənəyə görə daşıdığı məna, komponentlərinin bütövlükdəki mənasından və sintaktik quruluşundan asılıdır. Belə ifadələr düzəldilmir, bunlardan dildə hazır şəkildə istifadə edilir”.

Qeyd etmək lazımdır ki, Ş.Balli “frazeoloji bitişmə” adı ilə nəzərdə tutduğu semantik qrupdan olan frazeoloji vahidlərin xarici cəhətinin xüsusiyyətindən bəhs edərkən bunlarda üç əlamətin olduğunu göstərir:

1) Sözlərin ayrı yazılması

2) Onların müəyyən sabit sırada olması və komponentlər arasına başqa sözün daxil edilə bilməməsi

3) Komponentlərdən heç birinin başqa sözlə əvəz oluna bilməməsi

Dilçilik fənlərində sistemində frazeologiya, bəzən özünə heç yer tapa bilmir, lakin əksər hallarda frazeologiya, lakin əksər hallarda frazeologiyanı leksikologiyaya aid edirlər.

Dildə invariantlılığın və mikrosabitliyin aşağıdakı növləri vardır:

1) İşlənmənin sabitliyi, yəni frazeologiyanın individual törəmə deyil, bir dil vahidi olması

2) Struktur – semantik sabitlik, frazeoloji vahid ikidən az olmayan sözlərdən ibarətdir və tipoloji mənaya malik deyil, yəni struktur-semantik modelə görə analoji frazeoloji vahidlərin yaradılması üçün nümunə ola bilməz [32, 173, 233, 288].

Dilçiliyin başqa sahələrinə nisbətən frazeologiyanın bir sıra sahələri haqqında tədqiqatlar azlıq təşkil edir. Frazeologizmlər hər hansı bir xalqın ictimai-mədəni informasiyasının daşıyıcısıdır ki, mənsub olduğu xalqın tarixi, mədəniyyəti, adət-ənənələri, məişət və s. ilə bağlıdır. Frazeologizmlər sabit leksik tərkib, qrammatik quruluş və aid olduğu dili təmsil edən semantikası ilə əksər hallarda məcazi-obrazlı vasitələrdir [78, 123]. Frazeoloji vahidlərdə xalqın daxili aləmi, ruhu, psixologiyası və milli özünəməxsusluğu mütləq mənada öz

əksini tapır. Məs: *Altına qoymaq* – heç kəsə verməmək; xalqın xeyrinə sərf etməmək; " Pulları yığır, aparır altına qoyur" [XXXVc.s.43]. Bax bu Heydər Əliyev dilində işlənən "altına qoymaq" frazeologizmi ilə İslam inancına malik Azərbaycan xalqının dini-psixoloji durumu açıqlanır. Eləcə də bu xalqın çətin vəziyyətlərdə xeyirxahlıq hissi dilə gətirilir: böyük natiqin dilində "qardaş boğazından kəsib qardaşına vermək" frazeologizmi kimi.

Dildə olan frazeologizmlər predikativ və qeyri-predikativ səciyyəli olmaqla struktur baxımdan aşağıdakı formalarda mənsub olduğu dillərdə təzahür edir:

1) Söz birləşməsi formasında

2) Qrammatik cəhətdən bitkin cümlə formasında

Məlumdur ki, Q.Kazımova görə [115] leksik vahidlər kimi, frazeologizmlərdə cümlənin konkret nominativ məzmunlu söz cümlənin hansı üzvü olursa, həmin sözə müvafiq gələn, yaxud da o sözün işləndiyi cümlə üzvü vəzifəsində çıxış edir.

İsmi frazeoloji birləşmələrə I, II, III növ təyini söz birləşmələri şəklində rast gəlmək olar.

I növ təyini söz birləşmələri: a) isim+isim hər ikisi adlıq halda olanlar b) mürəkkəb adlar c) feili sifət+isim "odlara yanan Zeynəb", "Süleymana qalmayan dünya" ç) sifət+isim "xəbərçi Xəccə" *Sehrli çubuq* – "Heydər Əliyev *sehrli çubuq* deyil, Heydər Əliyev insandır" [XXIVc.s.64]. *Yumurtadan çıxmamış cücə* – tam təcrübəsiz; siyasətdə naşı olmaq; "Azərbaycanda bir söz var, – "hələ yumurtasından çıxmamış bir cücə kimi" bəyənatlar verirlər ki, "Azərbaycan unitar dövlətdir, burada muxtariyyət ola bilməz, bu muxtariyyəti ləğv etmək lazımdır" [XXIIc.s.244]. Burada "yumurtadan çıxmamış" – feili sifət, "cücə" isə isim kimi birləşərək Heydər Əliyev dilində yüksək ekspressivlik yaradır.

II növ təyini söz birləşməsi kimi: a) sadə isim+isim mənsubiyyət şəkilçisi: "Allah bəndəsi Nuhəyyamı" b) mürəkkəb Cəfər qoşunu II növ təyini söz birləşmələri+qoşma Quba alması kimi. Yönlük halda Peyğəmbər eşqinə *Quldur yuvası* – cinayətkarların toplaşdığı idarə, müəssisə; "Nazirlər Kabineti artıq cinayətkarlar yuvasına, *quldurlar yuvasına* dönmüşdü" [IIc.s.385].

III növ təyini söz birləşmələri+ isim şəklində olanlar a) sadə: – Allahın bəlası b) mürəkkəb: Çingiz xanın nəvəsi, Teymurun fili kimi mürəkkəb söz birləşməsi+ qoşma. Bu tip frazeologizmlərə Heydər Əliyev dilində az təsadüf etsə də nitqin ekspressivliyini artırmaq baxımından mühüm olanlarını qeyd edə bilərik: *Palıd ağacının təməli* – davamlı bünövrə qoymaq; uzunömürlü, saf bir bünövrə qoymaq; "Biz böyük bir ağacın – *palıd ağacının təməlini* qoymuşuq" [XXIXc.s.158]

Feili frazeologizmlər ilə müstəqil mənalı sözlər arasındakı əlaqələrə nəzər yetirdikdə məlum olur ki, frazeologizmlər cümlənin xəbəri vəzifəsində durub mübtəda ilə əlaqəyə girir [219].

H.Bayramov frazeologizmlərin quruluşu barədə yazır: "Baş sözü ismin hansı halında idarə edilməsinə, başqa sözlə desək, komponentlər arasındakı sintaktik əlaqənin səciyyəsinə görə feili frazeologizmlərin bir neçə növü var. Azərbaycan dilində feili frazeologizmlərdə feilin növ kateqoriyası öz ifadəsini tapır. Lakin feili frazeologizmlərin feilin növ şəkilçilərini qəbul etmək baxımından imkanları müstəqil feillərə nisbətən daha məhduddur. "Ağız açmaq" ifadəsinin komponenti olan "açmaq" feili məlum, məchul, icbar növlərində işlənə bildiyi halda feili frazeologizm olan "ağız açmaq" yalnız məlum növdə işlənir. Azərbaycan dilində feili frazeologizmin leksik mənası və qrammatik kateqoriyaya aidliyi onun semantikasının məzmun və formasının vəhdətini təşkil edir"[125].

Məhz buna görə də dildə işlədilən frazeoloji tərkiblərlə leksik tərkiblər arasında ümumi cəhətlər çoxdur, çünki frazeoloji birləşmələr də sözlər kimi insanın fəaliyyəti ilə bağlı olan xüsusiyyətləri ifadə edirlər.

Frazeoloji birləşmələrin ifadə etdiyi mənalar bütöv haldadır. Frazeoloji birləşmələr sabit birləşmələrdir, yəni belə birləşmələrdə sözlərin sırası dəyişməzdir, buna görə də onlar qrammatik cəhətdən ayrı-ayrılıqda təhlil olunmur [95].

Frazeologiyanın məqsədi frazeoloji vahidlərin (frazemlərin) dildə mövqeyini müəyyənləşdirmək, onların müvafiq prinsiplərə əsasən təsnifini vermək, üslubi xüsusiyyətlərini aydınlaşdırmaq, əmələgəlmə və inkişaf etmə yollarını aşkar etməkdən ibarətdir [95, 244].

Məlumdur ki, dil tarixi, ictimai hadisədir. Bu dilin başqa sahələri kimi, onun frazeologiyasına da aiddir, belə ki, hər bir konkret dilin frazeoloji vahidləri də zəruri ehtiyac nəticəsində tədricən formalaşaraq zənginləşmə prosesi keçirib bir sistem halına düşür. Bununla əlaqədar olaraq hər bir konkret dilin frazeologiyası da iki planda (diaxronik və sinxronik) tədqiq edilir. Diaxronik planda dilin frazeologiyasının tarixən formalaşması və müasir dövrə doğru semantik və struktur cəhətdən inkişafı öyrənilir. Sinxronik planda isə dilin frazeologiyasının müasir vəziyyətinin semantik və struktur təsviri verilir [38, 95].

Dilçilikdə frazeologiyanın tədqiqat obyektindən bəhs edən müəllifləri iki qrupa bölürlər: 1) ümumiyyətlə hər hansı bir dildə hazır şəkildə olan söz birləşmələrinin hamısını frazeologiya hesab edənlər; [95, 283].

Frazeoloji vahidin sabitliyin ona məxsus olan müxtəlif növ invariantlığa əsaslanır, yəni normativ dəyişiklər baş verdikdə onun elementlərinin dəyişilməsinə – sabit qalmasına. Dildə invariantlılığın və mikrosabitliyin aşağıdakı növləri vardır:

1. İşlənmənin sabitliyi, yəni frazeologizmin individual törəmə deyil, bir dil vahidi olması faktı;

2. Struktur – semantik sabitlik, frazeoloji vahid iki dənədən az olmayan sözlərdən ibarətdir və tipoloji mənaya malik deyil, yəni struktur-sematik modelə görə analoji frazeoloji vahidlərin yaradılması üçün nümunə ola bilməz;

3. Semantik sabitlik;

4. Leksik sabitlik, yəni komponentlərin əvəz oluna bilinməməsi və yaxud, komponentlərin yalnız frazeoloji variantlılıq və struktur sinonimiya çərçivəsində, semantik və leksik invariantlılıq saxlamaqla normativ şəkildə əvəz olunması;

5. Sintaktik sabitlilik, yəni yalnız variantlılıq çərçivəsində frazeoloji vahidlərin komponentlərinin nizamının dəyişə bilməsi, qrammatik inversiya, məsələn, felin məchul növdə işlənməsi, stilistik (üslubi) inversiya[95, 283].

Potensial söz sərbəst leksik mənaya malik deyil, ona görə ki, onun məna strukturu yoxdur və o, sadəcə olaraq, frazeologizmin məna strukturunun bir elementidir. Biz frazeoloji vahidin və mürəkkəb sözün komponentlərini ayırırıq.

Bununla belə, bu nəticəyə gəlmək olar ki, frazeoloji vahid tam (bütöv) dərk edildikdə potensial sözlərin, qismən dərk edildikdə isə potensial real sözlərin uzlaşmasıdır [38, 95, 130, 167].

Ümumi sözlər kimi, bütövlükdə bir məna ifadə edən frazeologizmlər hər bir dilin lüğət tərkibinin zənginləşməsində, artımında böyük rol oynayır. Məhz bu cəhət frazeologiya ilə leksikanın sex əlaqəsini göstərir. V.O.Belinskiyə görə frazeologizmlər "dilin xalq fizionomiyası, onun orijinal vasitəsi, varlıq və zəka zənginliyidir." Bunlarda xalqın ağıl və birliyi, sevinci və kədəri, məhəbbəti və nifrəti, gülüşü və göz yaşı, düzlüyü və əyriliyi, zəhmətkeşliyi və tənbəlliyi, mübarizəsi əks olunmuşdur.

Dilçilikdə frazeologiya termini üç mənada işlənir

1. Dilin frazeologizmlərinin müasir vəziyyətini və tarixi inkişaf yollarını öyrənən dilçilik bölməsi.

2. Hər bir dildə frazeoloji vahidlərin məcmusu.

3. Müəyyən ictimai qrupa, ayrı-ayrı söz sənətkarlarına və ya ədəbi-bədii cərəyana məxsus xüsusi sazişləmə üsullarının məcmusu.

Tarixi-ictimai hadisə kimi qəbul edilən dildə frazeologizmlər də ehtiyac nəticəsində tədricən formalaşaraq zənginləşmə prosesi keçirib sistem halına düşmüşdür.

Frazeologiya hər bir konkret dildə 2 planda tədqiq edilir.

1. Diaxronik

2. Sinxronik

Prof. Hüseyn Bayramov Bulaxovskidən sitat gətirərək belə qeyd edir. “Bulaxovski frazeologiyaya hazır şəkildə işlədilən sitat materialı kimi baxaraq, ümumiyyətlə fikir mübadiləsi zamanı istifadə edilən sabit söz birləşmələrinin hamısını frazeologiyanın tədqiqat obyekti hesab edib, ona belə tərif vermişdir: “Frazeologiya, adətən dildə məna cəhətdən parçalanmayan, lakin işlək sitat materialı kimi möhkəmlənən atalar sözü, məsəllər, yazarların “qanadlı sözlər” şəklinə düşmüş ifadələr və s. və buna görə də müəyyən bütövlük təşkil edən söz birləşmələridir. Rus dilçiliyində olduğu kimi, Azərbaycan dilçiliyində də frazeologiyadan bəhs edən tədqiqatçıların bir qismi onu geniş, digərləri isə dar mənada nəzərdə tutur. Məsələn, Hüseyn Bayramov atalar sözü, məsəllər, idiomatik ifadələri konkret şəkildə qeyd etdiyi kimi, konkret olmayan ifadələri də daxil edərək onu, geniş formada tədqiq etmişdir. Bəzi tədqiqatçılar isə bunları daxil etməyərək dar mənada tədqiq etmişlər [33, 34, 74, 210, 232]

Frazeologiya barədə Azərbaycan dilçilərindən Adil Babayevin də öz fikir və mülahizələri var. Ona görə sabit söz birləşmələrində birləşmənin komponentləri öz əvvəlki leksik mənasını qoruyub saxlayır. Frazeoloji birləşmədə isə kompo-

nentlər, əksinə olaraq öz leksik mənalarını itirir [38, 96, 174, 273].

Bəzi tədqiqatçılar, daha çox rus dilçiləri frazeoloji vahidləri tədqiq edərkən, atalar sözlərini heç də frazeoloji vahid kimi qələmə almamışlar. Bir çox tədqiqatçılar da frazeologiyanı dar mənada götürərək, sabit birləşmələrin az bir qisminin frazeologiya xüsusiyyəti kəsb etməklə dilin xüsusi frazeologiyasına daxil olduğunu bildirirlər [33, 34, 74, 210, 232].

Həqiqi mənalı sözlərin qarşılığı olub onu məcazi məna ilə bildirən sabit söz birləşmələrinə idiom deyilir. Komponentlərin leksik mənasından asılı olmayaraq, söz birləşməsini təşkil edən sözlərin hamısı birlikdə bir məna ifadə etsin, quruluşca və mənaca parçalanmasın. Y.Yusifovanın fikrinə görə istər idiomlar olsun, istər digər frazeologizmləri daha dəqiq başa düşmək üçün atalar sözü və məsəllər hamısı heç də struktur və funksiyaca eyni deyildir. Bu xüsusiyyətlərə görə onlar 2 hissiyə ayrılır: 1. Nominativ funksiyalı atalar sözləri 2. Kommunikativ funksiyalı atalar sözləri [33, 34, 74, 210, 232].

Frazeoloji vahidlərin Heydər Əliyevin nitqində tez-tez işlənməsi siyasi lider dilində bu məsələlərə yenidən baxmaq imkanı verdi. Heydər Əliyevin dilində işlədilən atalar sözləri, zərb-məsəllər bütöv bir mətnə uyğun gəlir ki, bu tip birləşmələri frazeologizmlərdən ayırmaq yarımçıqlıq yarada bilər. Heydər Əliyevin "boğazından kəsmək", "özündən kəsmək" frazeologizmlərdən öncə "xalq arasında deyildiyi kimi" ifadəsini işlətməklə frazeologizmin xalq ruhunu əks etdirməsini ön planda saxlayır. Bu gün də frazeologizmlərin tərifindəki mühüm xüsusiyyəti "frazeologizmlər xalqın milli ruhunu, milli mentalitetini əks etdirmək baxımından mühüm dil vahididir" müddəasını ortaya qoyur: "Çünki hər ata, hər ana xalq arasında deyildiyi kimi, *boğazından kəsib uşaqlarına yedirdir*, özündən kəsib uşaqları geyindirir. Amma indi bizdə belədir ki, çox hallarda heç kəsmək də lazım deyildir. Özü də yeyir,

özü də geyinir, uşaqlarını da yedirdir, geyindirir. Düzdür, hamısı belə deyil, bizim qaçqın düşərgələrində, çadırlarda yaşayan ailələrimiz də var, uşaqlarımız da var. Güman edirəm, onlar da, hamısı olmasa da, çoxu bu gün televiziya ilə bu verilişə baxırlar, görürlər. Biz də onları buradan görürük. Onları unutmamışıq, heç vaxt da unutmayacağıq" [XLIIIc.s.99].

Prof. C.Cəfərova görə "atributiv" termini ingilis sözü olub, feil kimi "aydınlaşdırmaq", isim kimi "əlamət" mənasını bildirir. Deməli, atributivlik geniş anlayışdır və o, özündə təyin funksiyasında işlənə bilən, əlamət məzmunlu bütün dil faktlarını əhatə edir. Əslində məntiqi termin olan atributiv daha çox sintaktik kateqoriyalar ilə – təyin və zərfliklərlə səsləşərək nisbətən geniş anlayış ifadə edir. Belə ki, o həm əşyaya, həm də hərəkətə xas xüsusiyyətdir.

Məlumdur ki, frazeoloji birləşmələrin çoxu feilə, az bir hissəsi isə başqa nitq hissələrinə ekvivalentdir. Az bir qismininisə daxilində feil olsa da, qeyri-feili məna daşıyır: "*Səsi gur gəlmək* – haqq işimizi müdafiə etmək, dünyaya bəyan etmək, kütləvi informasiya vasitələrində açıqca bəyan etmək; "Ancaq Azərbaycan xalqı yaxşı bilir ki, bütün bu illərdə Azərbaycanı müdafiə etmək üçün Türkiyənin *səsi çox gur gəlib*" [Ic.s.360].

Qeyri-feili frazeologizmlərdə olduğu kimi bir qrup feili frazeoloji birləşmələrdə komponentlərindən birini sifətlər təşkil edir: ağ günə çıxmaq;

Tərkibində əlamət məzmunlu (sifət) söz olan və bütövlükdə əlamət bildirən frazeoloji vahidlər. Belə birləşmələrin əsasən ikinci tərəfi sifətlərlə ifadə olunur. Onların əksəriyyəti, qeyri-feili frazeoloji birləşmələrdir ki, müasir dildə bir çoxu mürəkkəb sifət və zərfləşməyə doğru inkişaf etməkdədir. Ağızdan boş, dili uzun, alnı açıq, dili acı, ürəyi yumşaq, sözü bütöv N.Rəhimzadə bəzi idiomatik ifadələrin sifət kimi işləndiyini və belə ifadələrdəki obrazın həmin varlığı bütövlükdə

verə bildiyini göstərir. Müəllif nümunə kimi "ağıldan naqis", "ağıldan kasıb", "çənədən pərgar", "qədəmi yüngül" və s.

Müəllif bu tipli idiomatik ifadələri də iki yerə bölür. a)İsimlə sifətin birləşməsindən düzələn idiomatik ifadələr "dağdan ağır", "ağıldan kasıb", "vəzndə yüngül". b) İsimlə feili sifətin birləşməsindən düzələn idiomatik ifadələr: xeyrə-şərə yaramaz, ayağı yer tutan, boşqab dibi yalayan...

Qeyri-feili birləşmə, idiomatik ifadə sabit söz birləşməsi və s. adlandırılmağından asılı olmayaraq, dil faktları göstərir ki, Azərbaycan dilində kifayət qədər bütövlükdə əlamət məzmunu bildirən və təyin vəzifəsində çıxış edə bilən frazeoloji vahidlər vardır. Bu cür birləşmələri öyrənərkən təkcə forma deyil, eyni zamanda semantikanın da əhəmiyyətini nəzərə almaq lazımdır. Beləliklə, atributivlik anlayışı geniş anlayış olub, təyin ola bilən bütün dil faktlarını əhatə edir.

Frazeologizmlərə siyasi diskurslarda geniş şəkildə rast gəlmək olur ki, bu baxımdan Heydər Əliyevin nitqlərinin tədqiqi mühüm əhəmiyyət kəsb edir. Belə ki, bu tip nümunələrdə ictimai-siyasi vəziyyət, tarixi dövr natiqin danışığında əks olunan implist (gizli) və explist (aydın) fikirlərdə üzə çıxır. Sovetlər Birliyinin dağılması ilə əlaqədar Heydər Əliyevin Türkiyənin TQRT telekanalının "üz-üzə" proqramına verdiyi müsahibədə jurnalistin sualına verilən cavabda "qapılar açılmaq", "buxova çevrilmək" kimi frazeologizmlərin ekspressiv çalarlar qazandırmaq baxımından işlənməsi göz qabağındadır: "Bilirsiniz, bu quruluş dünyadakı bütün quruluşlardan fərqli idi. Ya gərək bütün dünya sovet sisteminə keçəydi, ya da gərək sovet sistemi dağılaydı. Artıq sovet sistemi özünün bütün proqramlarını yerinə yetirə bilmirdi, qərb isə getdikcə güclənirdi. Qərbdə iqtisadiyyat çox gücləndi, yüksəldi, Stalin dövründə Sovetlər Birliyi qapalı cəmiyyət idi, yəni dünya ilə heç bir əlaqəsi yox idi. İnsanlar xaricdə – Almaniyada, Fransada nələr baş verdiyini bilmirdilər. Elə

bilirdilər ki, həyat elə budur, bundan artıq həyat yoxdur. Stalin öləndən sonra *qapılar müəyyən qədər açıld*ı, insanlar xaricə getdilər-gəldilər, iqtisadi əlaqələr genişləndi. Get-gedə insanlar gördülər ki, Qərbdəki həyat bizdəkindən firavandır. Qərbdə hürriyət var, burada o qədər yoxdur, iqtisadiyyat Qərbdə daha yaxşıdır. Bu fərq isə get-gedə çoxalır. 20, 30, 40-cı illərdə insanları mübarizəyə qaldıran, səfərbər edən sovet quruluşu artıq *buxova çevrildi*, işləmədi. Ona görə də sistem yavaş-yavaş *çökməyə başladı*" [VIIIc.s.45-40]. Böyük natiq bu mətndə işlətdiyi "qapalı cəmiyyət", "qapılar açmaq" antonim frazeologizmlərlə siyasi quruluşların antaqonistliyini təqdim edə bilir. Sosialist iqtisadi modelinin artıq işlək olmaması "buxova çevrilmək" frazeologizmi ilə auditoriyaya çatdırılır, "qapalı"lıq, "buxova çevrilmək" sonda bu quruluşun "çökmə"sinə gətirib çıxarma auditoriyanın yaddaşına həkk olunur.

Heydər Əliyev frazeologizmlərdən istifadə etdikcə onların izahını bir pedaqoji ustalıqla auditoriyaya çatdırır. Digər tərəfdən bir dilçi alim kimi bu frazeologizmlər haqqında öz dəyərli fikirlərini auditoriyaya yönəldir: "Mən sizi anlayıram. Çünki, siz on il mənimlə bərabər olan insanlarsınız. Bu on ildə bizim nə qədər ağır, nə qədər çətin yol keçməyimizi və xalqımızı bu günə gətirib çıxarmağımızı başqalarına nisbətən daha da yaxşı görürsünüz. Siz bu prosesin iştirakçısısınız, siz mənimlə bir yerdəsiniz. Ona görə mənim hər addımımı görürsünüz. Hər addımımı deyəndə, bəlkə bir az düz olmaz, hər *addımı görmək* çətindir. *Bu məcazi mənada deyilən bir sözdür*. Siz mənimlə bir yerdəsiniz, mənim yaxın silahdaşlarımsınız" [XLIIIc.s.14]. Təkcə, böyük natiqin burada işlətdiyi "bu, məcazi mənada deyilən bir sözdür" ifadəsi frazeologizmin tərifindəki məcazlaşmadan xəbər verir.

"Amma" ziddiyyət bağlayıcısı ilə vəziyyətin hər yerdə pis olmadığını, "düzdür" təsdiq modalı ilə vəziyyətin hər yerdə yaxşı olmadığını səmimiyyətin gücünə arxalanan ifadələrlə

dilə gətirir. Nikbinliyə yüklənən, qəti gələcək zamanda işlənən "unutmayacağıq" ifadəsi ilə auditoriyanı işıqlı gələcəyə hazırlayır.

Frazeologizmləri auditoriya üçün başqa bir frazeologizm ilə izah etmək yenə də Heydər Əliyev dühasına xasdır. Məsələn, "öz üzərinə götürmək" frazeologizmi işin əsas hissəsini, məsuliyyəti bölmək anlamındadırsa, "ağırlığı bizdən uzaqlaşdırıb" frazeologizmi ilə onun izahını verir: "Azərbaycan Milli Olimpiya Komitəsi, onun prezidenti İlham Əliyev bu sahədə çox geniş fəaliyyət göstərir. Biz bunu edirik və edəcəyik. Bu sahəni İlham Əliyev *öz üzərinə götürüb*, *ağırlığı* bizdən *uzaqlaşdırıbdır*" [XLIIIc.s.102].

Mətnin sonunda səslənən frazeologizmlər əksər vaxtlarda Heydər Əliyevin dilində yaddaqalan sonluq yaratmağa xidmət edir. "Respublika" sarayında 20 dekabr 2002-ci ildə Azərbaycan musiqi mədəniyyətinin görkəmli nümayəndələri – Fidan və Xuraman Qasımovaların yaradıcılığının 25 illiyinə həsr olunmuş təntənəli mərasimdəki nitq öncə bu sənətkarların Azərbaycan mədəniyyətində tutduqları mövqedən başlayır: "25 il ərzində Fidan xanım və Xuraman xanım Azərbaycan musiqi sənətinin, opera musiqisinin, klassik musiqi sənətinin tarixinə böyük, gözəl qızıl səhifələr yazmışdır" [XLIIIc.s.204].

Nitqin növbəti mərhələsində böyük natiq "ən" və "bax" qüvvətləndirici ədatları işə salaraq nitqə bir ekspressivlik gətirir: "Beləliklə, bizim zəngin mədəniyyətimizin *ən* dəyərli inciləri var. Bu incilər çox deyil və çox olsa, onlar heç vaxt qiymətli olmaz. *Bax*, onlardan ən dəyərliləri Fidan xanımdır, Xuraman xanımdır" [XLIIIc. s. 208].

Bu xanımların qiymətini verməkdə, necə deyərlər tərifə qənaət etməyən Heydər Əliyev bu dəfə "əgər" şərt bağlayıcısı, feilin şərt şəkli, eləcə də "nə ...nə də" inkarlıq bağlayıcılarının köməyi ilə möhtəşəm bir nitq nümunəsi, sənətə rəhbər qiyməti

etalonu yaradır: "Keçmişdə bizdə dünyada ən qiymətli şeyi qızılla müqayisə edirdilər. Əgər keçmiş qanun-qayda ilə müqayisə etsək, onlar 999 əyarlı qızıldır. Əgər almaz, brilyant və digər qiymətli daş-qaşlar ilə ölçsək, mənə belə gəlir ki, bunlara bərabər nə almaz tapmaq olar, nə brilyant, nə də başqa qiymətli daş-qaş tapmaq olar. Bunlar onlardan da qiymətlidirlər" [XLIIIc.s.209].

Mədəniyyət və incəsənət xadimlərinin əksəriyyət təşkil etdiyi saraydakı yarıməişət, yarıpublisistik nitqə fəlsəfi çalarlı filosof nitqi, estet nitqi qoşulur. Məhz qadın sənətkarlara yönələn, "gözəllik" konsepti ətrafında qurulan nitq auditoriyanı öz cazibəsinə, öz sehrinə salır: "Allah bunlara həm gözəl səs verib, həm də çox zahiri gözəllik veribdir. Hamısı gözəldir. Bunlar hamısı birlikdə harmoniya təşkil edir və bu harmoniya da *bax*, bizim bu iki gözəl müğənnimizdir, gözəl mahnı oxuyanlarımızdır" [XLIIIc.s.209]. Çıxışın somatik frazeologizmlə – "barmaqla saymaq"la yekunlaşması çıxışı yaddaşlara həkk edir. "Bax onlardan ən dəyərliləri Fidan xanımdır, Xuraman xanımdır" ifadəsi "onları barmaqla saymaq olar" ifadəsi ilə müqayisədə zəif görünür. Məhz bu frazeologizm yaddaşlara əbədi həkk olunaraq Heydər Əliyev nitqinin xəlqiliyini, uzunömürlülüyünü təmin edir. Mədəniyyət xadimlərinə dövlət qayğısı ilə bağlı çıxışlar, nitqlər əksərən dövlət xadimlərinin nitqində publisistik üslubda, standart cümlələrlə bəyan edilir. O cümlədən, bu tip çıxışlar Heydər Əliyev nitqindən də yan keçmir: "Ümumiyyətlə, mədəniyyət xadimlərinə xüsusi diqqət göstərilməlidir. Həqiqətən, onlarla hesablaşmaq lazımdır... Bunu deyərək, mən, ümumiyyətlə, istedadı olan hər bir gəncə, hər bir insana xüsusi münasibət göstərilməsini istəyirəm. Çünki bu istedadlardan bizim gələcəyimizin mədəniyyət xadimləri yaranacaqdır və burada Fidan xanım və Xuraman xanım nümunədirlər" [XLIIIc.s.211].

Bu diqqət, bu qayğı sonda “göz üstə saxlamaq” frazeologizminin köməyi ilə yüksək semantik yük daşımaqla yaddaşlara hoparaq nitqin möhürbəndinə çevrilir: “Yenə də deyirəm, onları (istedadlı mədəniyyət xadimləri – red.) barmaqla saymaq olar. Əgər biz bunları *göz üstə saxlamasaq*, belə insanları cəmiyyət – bizim 8 milyonluq əhalimiz var – *göz üstə saxlamasa*, mədəniyyətimizi inkişaf etdirə bilmərik” [XLIIIc.s.210].

Heydər Əliyevin dilində bəzən loru leksikada işlənən frazeologizmlərə rast gəlirsə, həmin frazeologizmlərə auditoriya qarşısında izah verilir. Auditoriyanı çaşqınlıqdan çıxararaq yüksək etik dəyərləri ortaya qoyur. Məsələn, “çıxdaş olmaq” frazeologiyası insana bilavasitə aid olmayan frazeologizmdir. Lakin xalq dilində, loru dildə bu gün də keyfiyyət və kəmiyyət fərqlərinə görə insanlar seçilirlər ki, bu da xalq arasında çıxdaş olmaqdır: “Güman edirəm, ötən illərdə sərhəd xidmətində də müəyyən qədər keyfiyyət dəyişikliyi əmələ gəlibdir. Yəni *loru dildə desək, bir az çıxdaş olubdur.* Kim bu sənəti sevir, kim bu sənətə yararlıdır – yəqin onlar indi sizdə daha çox yer tuturlar. Kimsə, sadəcə, hərbi xidmət edib özünü dolandırmaq istəyirsə, belə adamlar sərhəd xidmətində lazım deyillər” [XLIVc.s.8].

Bəzən frazeologizmlər mətnin başında özünə yer almaqla izahı sonda audititoriyaya açıqlanır. Burada “göydən tökülmək” frazeologizmi mətni açmağa xidmət edir. Sərhəd qoşunları əməkdaşlarının toplaşdığı auditoriyaya xalqa verilən maaşların, təqaüdlərin, müavinətlərin kökündə iqtisadiyyatın durduğunu izah edir. Elə bu frazeologizm bir ömür boyu auditoriya iştirakçılarının şüuruna hopur: “Elə bilirsiniz o pullar *göydən tökülür*?! Sizin aldığınız məvaciblər, sizin maddi-texniki təminatınız – bunların hamısı üçün, xalqımızı yaşatmaq üçün, xalqın rifah halını yüksəltmək üçün biz gecə-gündüz çalışırıq və bunun da əsası iqtisadiyyatdır. İqtisadiy-

yatda mal dövriyyəsi birinci yerdə durur. Bunun düzgün aparılması sizdən, sərhədçilərdən də aslıdır. Əgər siz şəxsi mənafeyinizi dövlət mənafeyindən üstün tutsanız qaçaqmalçı sizin cibinizə pul doldurub dövlətə zərbə vurarsa, onda sizin özünüzə zərbə dəyəcəkdir” [XLIVc.s.12]. Yuxarıdakı mətndə həm də iqtisadi etikanın təməl prinsipləri özünə yer alır.

Yazıçı və şairlərin yaratdıqları frazeologizmlərdən də yeri gəldikcə Heydər Əliyev istifadə edir və bu zaman sitat gətirdiyi şəxsləri auditoriyaya tanıdır: “Sən yazıçısan, bilirsən ki, rəhmətlik Nazim Hikmətin bir sözü vardır. Azərbaycanda onu dəfələrlə deyirdilər, ancaq bu gün yerinə düşür, yenə deyim: Sən yanmasan, mən yanmasam, o yanmasa, bəs kim yanacaq? Bəs sənin yanmağın haradadır? ” [IIc.s.387].

Frazeologizmlər Heydər Əliyevin əsrarəngiz, cazibədar nitqlərində ekspressivlik yaratmaq baxımından ciddi dil vahidinə çevrilir. Bu dil vahidi böyük natiq tərəfindən daim, yeri gəldikcə izah olunur ki, bu da Ulu Öndərin nitqlərindəki pedaqoji ustalığı sübuta yetirir: “Siz artıq *fırtınalardan çıxmısınız*. Məsələn, adamı atırsan dəryaya ki, görüm nəyə qadirdir. Görürsən ki, o fırtınalı dənizdən çıxır. Siz artıq bu fırtınalara tab gətirib sahilə çıxmısınız, bərkimisiniz, *ayaq üstə möhkəm dayanırsınız*. Bundan sonra da beləcə fəaliyyət göstərəcəksiniz, mən buna tamamilə əminəm” [IIc.s.527].

H. Bayramov feili frazeoloji birləşməni belə izah edir: Feili frazeologizmlər iş, hal və xəbər vəzifəsində işlədilir. Bunları təşkil edən sözlər sabit birləşmələrin ümumi mənasının formalaşmasında əsas rol oynayır. Buna görə də belə birləşmələrin daxilindəki feili frazeologizmlərin çoxu cümlədə müəyyən obyekt tələb edir.

Feili frazeoloji birləşmələrin əsas komponenti müxtəlif qrammatik formalarda bütün paradiqmatik formaları müxtəlif feillərə uyğunlaşaraq birləşmə yaradır. Azərbaycan dilində feili frazeologizmlərin tərkibindəki birinci komponentin də-

yişməsi ilə II komponent dəyişməz qalır. Bu onunla əlaqələndirilir ki, feili frazeologizmlər I komponentinin paradiqmatik formaları birləşmədaxili əlaqələri ifadə etmir [105]. Bu paradiqmatik formalar cümlədaxili sərbəst mənalı üzvlərlə də əlaqələri özündə ehtiva etmir. Əks təqdirdə bu frazeologizmlərin sabitliyinin pozulmasına səbəb olardı. Bu isə feili frazeologizmlər leksik mənasının bölünməzliyini inkar edərdi. Bu paradiqmatik formalar feili frazeologizmlərin yalnız bir komponentinə aid olsalar da, frazeologizmin mətndaxili və cümlədaxili bütün əlaqələrini ifadə edə bilir. Azərbaycan dilində elə frazeologizmlər, vardır ki, onların komponentləri dəyişmir, yəni bu sabit birləşmələrin paradiqmatik formaları mövcud deyildir. Məs: "arxivə vermək", "aslan ürəyi yeyib" və s. kimi feili frazeologizmlərin paradiqmatik formaları mövcud deyildir. Bu feili frazeologizmlərin hər bir komponenti yalnız birləşmədaxili vahid sabit mənasını saxlayır.

Cümlədaxili məna əlaqələrinin və funksionallığın ifadəsi üçün bəzi feili frazeologizmlərin paradiqmatik formalara ehtiyacı vardır. Feili frazeologizmlərin komponenti nitq axınında sərbəst mənalı sözlərlə həmişə əlaqəyə girə bilmir. Frazeoloji bağlı mənası olmayan sözlər isə cümlənin bütün üzvləri ilə daima leksik-semantik əlaqədə funksionallaşır. Məs:

1. Çəki daşları üstündə göstərilən rəqəmdən daha ağır gəlirdi – adi söz birləşməsi

2. Sahibin sözləri nədənsə qardaşına çox ağır gəlirdi. Feili frazeologizm

Feili frazeologizmlərin prototipləri olan adi söz birləşmələrində sözlər arasındakı əlaqə və münasibətlər transformasiya zamanı itir. Frazeologizm bir vəhdət kimi sözü əvəz edərək, cümlədə eyni funksiyanı daşıya bilir.

Azərbaycan dilində feili frazeologizmlərin komponentləri sərbəst mənalı sözlərdən onunla fərqlənir ki, onların müstəqil leksik mənası yoxdur. Bundan əlavə feili frazeologizmlərin

komponentləri genetik baxımdan mənşə etibarilə bağlı olduqları sözdən sabit birləşmə daxilində həm də hal və kəmiyyət kateqoriyalarına olan mənsubiyyətləri ilə fərqlənirlər.

Komponent tərkibi feili frazeologizmlərin daimi əlamətidir.

Beləliklə: – daimi əlaməti leksik mənası olan, lakin müstəqil mənalı sözlərdən deyil, qeyri-müstəqil komponentlərdən ibarət olan, müstəqil sözün dəyişməz əlamətləri olan sərbəst leksik mənanı, qrammatik formaları itirmiş olan sabit söz birləşmələri feili frazeologizmlərdir [110].

Mətnin başa düşülməsi yeni mətn modellərinin hazırlanmasını tələb edir, onun da ayrılmaz hissəsi konkret kontekst modeldir. Kontekst modelləri mətnə təkcə sosial ölçü vermir, həm də mətnin təhlili nəticəsində qurulmuş kontekst modellərinə epizodik və kommunikativ ölçü kimi xidmət edir.

Mətnin başa düşülməsi əslində olduqca mürəkkəbdir. Qeyri-adi görünən odur ki, insanlar, eyni zamanda nə qədər çox məsələ həll edə bilir, onlar nə qədər çox şeyi izləməlidir, əlaqəli mətnin başa düşülməsi prosesində məhdudiyyəti necə gözləməlidirlər. Xüsusi səylər göstərmədən avtomatik olaraq mətni anlamaq üçün aşağıdakılar yerinə yetirilməlidir [6, 7, 8].

Beləliklə, bu və ya digər hadisənin nə dərəcədə yaxşı yadda saxlanılması xeyli dərəcədə kodlamanın xarakterindən asılıdır: hadisələrin semantik cəhətdən dərs edilmiş kodlanması və onların inkişaf etmiş və asan əldə edilə bilən strukturlarda saxlanılması onların yadda saxlanılmasının yüksək səviyyəsini təmin edir. Bu zaman obrazlılıq həlledici rol oynayır. Daha sonra biz göstərəcəyik ki, əlaqəli, bağlı mətnin başa düşülməsi tamamilə, təbii olaraq, informasiyanın yaddaşda kodlanması üçün əlverişli şərtlər yaradır [93].

Belə ki, mətn, anlayan şəxsə əvvəlki müəyyən təcrübəni yada salır, sonra isə bu təcrübə digər situasiyanın modelinin yaradılması üçün istifadə edilir. Adətən bunun üçün təcrü-

bənin köhnə strukturunu hər hansı tərzdə transformasiya etmək tələb edilir və bununla əlaqədar olaraq Karbonell müxtəlif operatorları nəzərdən keçirir ki, bunları mövcud olan struktur tədricən, "vasitə-məqsəd" təhlilinə əsaslanan yeni struktura çevirmək üçün istifadə etmək olar [310].

Bu tərzdə qurulmuş kontekst modeli mətnin interpretasiyası üçün əsas təşkil edir. O, mətndə impilist olaraq və ya olması nəzərdə tutulan mövcud olan biliklər daxil olmaqla bütün məlumatı əhatə edir.

İngilis dilinin frazeologizmlərinin əsas mənbəyini Bibliya, bədii ədəbiyyat, mifik rəvayətlər və əfsanələr təşkil edir. Qədim dövrlərdən indiyədək Bibliya insanlar tərəfindən ən çox oxunan kitab olmuşdur. İngilis dili Bibliyadan götürülmüş frazeologizmlərlə o qədər zəngindir ki, onları saymaq qeyri-mümkündür. Bibliyadan götürülmüş frazeologizmlər bibliezimlər adlandırılır [109,192]. Müasir qloballaşma dövründə dünya xalqları ictimai həyatın bütün sahələrində: elm, mədəniyyət, iqtisadiyyat, siyasət, ədəbiyyat, incəsənət və s. bir-biri ilə qarşılıqlı və sıx əlaqədədirlər. Bu dillərin yaxınlaşması və bir dildən digərinə frazeoloji birləşmənin keçməsi üçün zəmin yaradır.

Bir dildən başqa bir dilə keçən, müxtəlif xalqların bir-biri ilə sax əlaqəsi, əmək fəaliyyəti, elm və incəsənətin inkişafı nəticəsində əmələ gələn frazeologizmlər beynəlxalq frazeologizmlər adlanır. İngilis dili frazeologizmlərinin əksəriyyəti Qədim Roma və Yunan ədəbiyyatlarından götürülmüşdür [83,192]. Heydər Əliyevin dilində İslam inanclarına söykənən çoxlu ifadələr var ki, bu da Azərbaycan dili frazeologizmlərinin əksəriyyətinin mühüm qaynaqlanma yerini göstərir.

Mürəkkəb cümlələrdə obrazlı – emosional ifadələr ya komponentlər, yəni baş və ya budaq cümlə halında, ya da bütöv tabeli mürəkkəb cümlə halında olur. Özbək dilçisi Ə.Rəfiyev bu tip konstruksiyadan danışarkən göstərir ki, fra-

zeologizm mürəkkəb cümlə daxilində komponentlərin biri kimi, yəni cümlə kimi çıxış edir [67, 276]. *Ağrı-acı çəkmək* – məhrumiyyətlərə dözmək, itkilərlə qarşılaşmaq; "Biz sadəcə, buna dözməliyik, bu dövrün əzab-əziyyətini, *ağrı-acısını çəkməliyik* ki, gələcəyimiz daha gözəl, parlaq olsun" [XIIIc.s.82]

Heydər Əliyevin çıxışlarında səslənən bir qisim frazeologizmlər mürəkkəb cümlənin işlənməsindəki ekspressivliyi gücləndirməklə nitqin kütlələrə təsir gücünü dəfələrlə artırmış olur: *Baha başa gəlmək* – çox ağır nəticələr vermək, nəticəsi ağır olmaq; ~ baha oturmaq, xərc aparmaq; "Buna görə də o vaxt Sovetlər İttifaqı rəhbərliyinin, o cümlədən SSRİ-nin o zamankı rəhbəri şəxsən Qorbaçovun buraxdığı səhv Azərbaycana da, Ermənistana da, bütün Qafqaza da, – məgər təkcə Qafqazamı? – çox *baha başa gəldi*" [XXc.s.37].

*Balıq özünü suda hiss etdiyi kimi* – rahat hiss etmək, öz evindəki kimi hiss etmək; "Mən görürəm ki, siz özünüzü bu auditoriyada *balıq özünü suda hiss etdiyi kimi* hiss edirsiniz" [IXc.s.210].

Müasir Azərbaycan dilində budaq cümləsi frazeologizm olan tabeli mürəkkəb cümlələr daha çox diqqəti cəlb edir. Azərbaycan dilinin frazeologiya lüğətlərində həm sadə, həm də mürəkkəb quruluşlu frazeologizmlərə aid çoxlu sayda nümunələr vardır [67, 276, 289].

Frazeoloji vahid fikri açıq şəkildə yox, dolayı, daha çox məcazi məzmunla ifadə edir. Bu zaman isə onun real məzmuna malik digər cümlələrin əhatəsində onlarla məzmun münasibətində olması əsas şərtdir. Əks halda cümlənin ifadə etdiyi məzmun havadan aslı qalmış olar və işlədilmə məqsədi başa düşülməz. Ona görə də hətta mürəkkəb cümlə şəklində olan frazeologizmlərin özləri də daha böyük mətnin bir parçası kimi çıxış edir [58, 67]

Çünki frazeoloji tabeli mürəkkəb cümlə özündən əvvəlki və ya sonrakı cümlələrinə məzmunu əhatəsində öz informa-

siyasını reallaşdırır, əks halda frazeoloji tabeli mürəkkəb cümlənin nə məqsədlə işlədildiyi və hansı informasiya yükünü daşıdığı məlum olmazdı. Məsələn: Qızım, sən artıq bu evin bir üzvüsən, su ki girdi qaba, oldu içməli.

Müəlliflər [58, 67] qeyd edir ki, tabeli mürəkkəb cümlə strukturunda olan frazeologizmlərin ümumi məzmunu məcazi xarakterə malikdir, lakin buradakı komponentlərin məcazilik dərəcəsi, real fakta münasibəti eyni deyil. Bəzi frazeologizmlər var ki, onların komponentlərindən birinin reallığa uyğunluğu bu və ya digər dərəcədə özünü göstərir. Məsələn: Qonşu qonşu olsa, kor qız ərə gedər. Atalar sözündə birinci komponentin məzmununda reallıq daha çox özünü göstərir, yəni burada qonşudan söhbət getməsi bir reallıqdır. Düzdür, bu atalar sözü başqa münasibətlə də, yəni insanlar arasındakı münasibətin başqa məzmunlarında da işlədilə bilir, lakin qonşuluqda da istifadə edilə bilməsi onun real məzmunun hələ də müəyyən qədər saxlandığını göstərir. Qrammatik cəhətdən şərt budaq cümləli tabeli mürəkkəb cümlə kimi formalaşan bu konstruksiya artıq dəyişməz vahid kimi dilimizdə yer tutmuşdur. *Ağa qara demək* – yalan söyləmək; “Onlar ağa qara deyirlər, qaraya da ağ deyirlər” [XXVIIc.s.78].

Morfoloji-sintaktik əlamətlərə görə Azərbaycan dilçiliyində frazeoloji birləşmələr iki böyük qrupa bölünür. 1. Feili frazeoloji birləşmələr 2. Qeyri-feili frazeoloji birləşmələr. Feili frazeoloji birləşmələrin komponentləri arasındakı sintaktik əlaqənin səciyyəsinə və baş sözün ismin hansı halında idarə edilməsinə görə bu birləşmələr bir neçə növə ayrılır [37, 107, 163, 181, 184, 185]

Birinci tərəfin, yəni baş sözün ifadə vasitəsinə və formasına görə feili frazeoloji birləşmələri belə struktur tiplərinə bölmək olar:

1. Adlıq halda yəni, şəkilçisiz işlənən baş söz + feil formasında olanlar. Belə feili frazeoloji birləşmələr hal-vəziyyət,

insanlara aid konkret və mücərrəd mənalı iş bildirən isimlərə aid edilir; gün görmək; fikir eləmək; ***İz qoymaq*** – ölkənin həyatında yaddaqalan işlər görmək; “Keçən görüşlərimizdə mən sizə bildirmişdim ki, Azərbaycanda yəhudilər əsrlər boyu, bəlkə minilliklər boyu yaşayıblar, çox dəyərli *izlər qoyublar*” [XXXc.s.22-23]. ***Qara yaxmaq*** – real gerçəkliyi deməmək; olmayanı demək; həqiqəti gizlətmək; “Ayrı-ayrı müxalifət qüvvələr bu vəziyyəti tənqid edirlər, yaxud da ki, buna *qara yaxmaq* istəyirlər” [Vc.s.310].

2. Baş sözü yönlük halda

Belə feili fraeoloji birləşmələrin birinci tərəfi ismin yönlük halında olur: tora düşmək; bağrına basmaq; gözə dəymək

3. Baş sözü təsirlik halda olan isim+feili formasında olanlar

Belə feili frazeologizmlər ancaq cümlənin mübtədası ilə sintaktik əlaqədə olur və heç bir obyekt tələb etmir.

4. Baş sözü yerlik halda olan isim +feil formasında olanlar.

Bu feili frazeologizmlərin birinci tərəfi yerlik hal şəkilçisi qəbul edib ikinci komponentlə, yəni feillə sintaktik əlaqədə olurlar; ayaq-da yatmaq; baş-da oturmaq.

5. Baş sözü çıxışlıq halda olan isim+feil formasında olanlar.

Belə feili frazeologizmin baş komponenti ismin çıxışlıq halında olub ikinci komponenti cümlənin ancaq mübtədası ilə sintaktik əlaqədə olur və obyekt tələb edir.

6. Baş sözü yönlük halda mənsubiyyət şəkilçili söz və ya III növ təyini söz birləşməsi+feil formasında olanlar. Belə feili frazeologizmlər həm sadə, yəni iki sözdən, həm də mürəkkəb struktura malik olurlar və obyekt tələb edirlər: ayağına yazmaq; boynuna qoymaq;

7. Baş sözü təsirlik halda mənsubiyyət şəkilçili söz və ya III növ təyini söz birləşməsi+feil formasında olanlar. Belə fei-

li frazeologizmlərin birinci tərəfi mənsubiyyət şəkilçisi qəbul edərək təklikdə işlənir, yəni ikinci bir əlavə sözün işlənməsinə ehtiyac qalmır: ağzını aramaq; canını boğazına yığmaq;

8. Baş sözü çıxışlıq halda mənsubiyyət şəkilçili söz və ya III növ təyini söz birləşməsi+feil. Bu qəbildən olan frazeologizmlər cümlə daxilində həm tam, həm də birinci tərəfi ixtisar edilmiş şəkildə də işlənə bilir və həmişə obyekt tələb edir: boğazından kəsmək; dalından dəymək; sözündən çıxmaq; “İşdən yapışmaq” – işi sevmək, işə can yandırmaq; “İdmançılar İlham Əliyevi özlərinə başçı, prezident seçəndən sonra o elə böyük həvəslə, elə böyük ruh yüksəkliyi ilə, elə məhəbbətlə bu *işdən yapışıbdır* ki, onu bundan heç cür ayırmaq mümkün deyildir” [XLIIc.s.260].

9. Öz sözü (ismin bir neçə halında)+feil formasında olanlar. Azərbaycan dilində bu tip feili frazeologizmlərin komponentləri dəyişmir, əlavə üzv tələb etmir. Belə birləşmələrdə ifadə edilən fikir, sözü gedən şəxsin özünə aid olur, I tərəf ismin yönlük, təsirlik, çıxışlıq hallarına aid olur.

“Hakimiyyəti ələ keçirmək” – qeyri-qanuni yolla hakimiyyəti zəbt etmək; “Bunlardan istifadə edən xarici və daxili qüvvələr Azərbaycanda hakimiyyəti ələ *keçirmək* cəhdləri göstərirdilər” [XVc.s.400]. “Hakimiyyəti yıxmaq” – hakimiyyəti devirmək, məğlub etmək; “Xalq Cəbhəsi də öz hərbi dəstələrini oradan çıxarıb Azərbaycanın bu meydanlarına Prezident sarayının, parlamentin, Ali Sovetin önünə gətirib ki, bəli, burada mübarizə aparsınlar, *hakimiyyəti yıxsınlar*” [VIc.s.245].

M.Hüseynzadənin [104] qənaətinə görə, “İdiomlar ümumxalq xarekteri daşıyır. Onların əsl yaradıcısı xalqdır. Buna görə də həm danışıq, həm də ədəbi dilimizdə çox geniş yayılmış olan idiomatik ifadələr xalqımızın məişəti ilə, tarixi həyat təcrübələri ilə bağlı olduğu üçün onların çoxu adi həyat tərzinin inikası kimi yaranmışdır” [99]. Müəllif daha sonra

idiomatik ifadələrin mənbəyi kimi peşə və sənəti, köhnə əqidələri və mövhumi etiqadları göstərmişdir [104,151]. Bilirsiniz, Vilayət Quliyev nə deyib – mən bilmirəm. Azərbaycanda bir məsəl var: "*Özünə umac ova bilməyən, başqasına əriştə kəsmək istəyir.* Bilirsiniz bunun mənası nədir? Bizim özümüzün, bir milyondan çox azərbaycanlının hüquqları tapdalanıbdır. Azərbaycan ərazi bütövlüyünün pozulması ilə əlaqədar bu dəqiqə dünyada ən ağır vəziyyətdə olan bir ölkədir.

Biz bu problemlərimizi həll etməliyik. Yoxsa sən istəyirsən burada Flippinin, yaxud da İndoneziyanın məsələsini həll edəsən. Bəzi adamlar populist fikir söyləyərək deyirlər ki, İranda azərbaycanlıların hüquqları tapdalanıbdır. Bunlar kənarda qalıb, başlayıblar ki, orada azərbaycanlıların hüquqları tapdalanıbdır. İranda bizdən sayca bir neçə dəfə çox azərbaycanlı var və orada azərbaycanlılar dövlətdə, parlamentdə, hökumətdə təmsil olunublar. Özləri bilirlər ki, onların hüquqları tapdalanıb, yaxud tapdalanmayıbdır və necə bilirlər, o cür də hərəkət etməlidirlər. Biz başqa ölkənin işinə qarışmamalıyıq. Biz İranın daxili *işinə qarışmamalıyıq*. Biz İranla dostluq, əməkdaşlıq münasibətləri yaratmalıyıq.

Lazımı qədər *təfəkkürü olmayan* bəzi adamlar öz şəxsi populist niyyətlərinə görə bu işdə Azərbaycana *zərbə vururlar*. Sən də bu sualı verməklə onu göstərirsən. Gəl sən də, mən də, hamımız yığışaq, müstəqil Azərbaycanda olan azərbaycanlıların hüquqlarını qoruyaq və ölkəmizi bu ağır vəziyyətdən çıxaraq. Yoxsa, öz ölkən ağır vəziyyətdədir, düşmüsən ki, Təbrizdə nə var, nə bilim, Ərdəbildə nə var. Bu onların öz işidir."

Nitqin ekspressivliyini artırmaq baxımından, özündən əvvəlki fikri qüvvətləndirmək baxımından frazeologizmlər Heydər Əliyev dilində kəsərli nitq vahididir. Məs: "tar-mar olunmaq" frazeologizmindən öncə iki yerdə dağıdılmaq ifa-

dəsini işlədir. "Dağıdılmaq" ifadəsində bəlkə də "bərpa olunmaq", yenidən qurulmaq imkanı gizlənirsə, artıq "tar-mar olunmaq" ifadəsi ilə bu dağıdılmanın qeyri-insani, vəhşicəsinə, barbarcasına törədildiyini Minsk qrupunun həmsədrlərinə çatdırır: "Xüsusən Füzuli rayonunun ərazisini vertolyotdan çox diqqətlə seyr etmişlər, nə qədər böyük dağıntılar olduğunu görmüşdülər. Onlar keçən dəfə Ağdamın, o gözəl diyarın dağıldığını, hər şeyin tar-mar olunduğunu görmüşdülər və bu barədə öz təəssüratlarını çox dərin hisslərlə bizə söyləyirdilər" [XXXVc.s.231].

*Xüsusi frazeoloji vahidlər* həm Azərbaycan, həm də ingilis dilində mövcuddur və frazeoloji fondu zənginləşdirən mənbələrdən biridir. Hər hansı bir ədibin yaratdığı ifadəli və məcazi bir deyim illər keçdikcə özünə dilin frazeoloji qatında yer alır və dildə yaşamaq haqqı qazanır. Belə "yaşama" həmin frazeoloji vahidlərin ifadə etdikləri hadisə və ya hərəkəti nə dərəcədə uğurlu əks etdirmələri, eyni zamanda da həmin ifadələri yaradan ədibin məşhurluğu ilə, həyatda tutduğu mövqe ilə bağlıdır. Belə ki, ingilis dilində "Şekspirə qədər də mövcud olan bəzi frazeoloji vahidlər yalnız Şekspirdən sonra məşhurluq qazana bilmişdir [4, 104, 151, 299].

Heydər Əliyevin çıxışlarında işlətdiyi frazeologizmlər bu gün ümumişlək vəziyyətdə diplomatların, tarixçilərin dilindədir: "Xalqın tarixini yaddaşlarda saxlamaq; "Yox. Ona görə ki, bütün bunlar *tarixə həkk olsun*" [IIc.s.89]. "Amma olan həqiqətləri də unutmaq, qaralamaq olmaz. Yenə də deyirəm, tarixi qaralamaq olmaz" [VIIc.s.23]. Elə *"*tutmamış qatıq*"* frazeologizmi də bu qəbildəndir: "Müstəqil Azərbaycan Respublikası hələ *tutmamış qatıqdır*. O gərək bərkisin, möhkəmlənsin" [Ic.s.113]

Eləcə də frazeoloji vahidlər dildə mövcuddur və danışanlar, yeri gəldikcə, onlardan istifadə edirlər. Lakin sabit söz birləşməsinin və frazeoloji vahidin kəskin fərqi var. Bu fərq

isə ondan ibarətdir ki, frazeoloji vahid sözlərdən ibarət deyil, onun daxilində artıq söz yoxdur. Frazeoloji vahidin komponentləri yalnız etimoloji cəhətdən müvafiq sözlərlə bağlıdır. Məsələn, *qara sudan qaymaq tutmaq* frazeoloji vahidi heç də Azərbaycan dilində işlənən *qara*, su, *qaymaq* və *tutmaq* sözlərindən ibarət deyil. Elə olsaydı, onda elə ifadənin mənası sözlərin mənası ilə ölçülərdi [23, 173, 181]. Frazeoloji vahidlərdən fərqli olaraq, istənilən sabit söz birləşməsi məhz sözlərdən ibarətdir. Sərbəst söz birləşmələrindən isə sabit söz birləşməsini fərqləndirən dil vahidi olmasıdır, hazır forma və məzmuna malik olmasıdır. Sərbəst söz birləşməsi nitqdə yaranırsa, sabit söz birləşməsi nitqdə yaranmır, dildə mövcuddur, nitqdə işlənir.

A.Qurbanov [23] “Müasir Azərbaycan ədəbi dili” kitabında yazır: “Dildə olan bütün sabit söz birləşmələrinin, bölünməz ifadə və ibarələrin məcmuyuna frazeologiya deyilir. Demək, bu və ya digər bir dilin firazeologiyası dedikdə həmin dilin frazeoloji vahidlərinin cəmi nəzərdə tutulur” [3]. Fikrimizcə, bu iki cümlədə də ziddiyyət müşahidə olunur. Sabit söz birləşmələri frazeologiyadırsa, deməli, frazeologiya dedikdə də sabit söz birləşmələri nəzərdə tutulmalıdır. Necə olur ki, “*sabit söz birləşmələrinini,* bölünməz ifadə və ibarələrin *məcmuyuna frazeologiya deyilir*”, lakin “dilin *frazeologiyası dedikdə* həmin dilin *frazeoloji vahidlərinin cəmi* nəzərdə tutulur”? Göründüyü kimi, müəllif *sabit söz birləşməsi* termini ilə *frazeoloji vahid* termini fərqləndirmir.

Frazeoloji vahidlər öz möhkəm milli xüsusiyyətlərinə baxmayaraq, çox gözəl tərcümə oluna bilir. Möhkəm milli xüsusiyyət yalnız frazeoiogizmin daxili forması ilə bağlıdır. Bəli, daxili forma tərcümə olunmur və oluna da bilməz. Lakin daxili formanın müstəqilliyi və toxunulmazlığı özünü leksik səviyyədə də bürüzə verir. Problem eynidir. Tərcüməyə gələn

mənadır, mənanın əsasını təşkil edən obraz tərcümə olunmur [23, 181].

O ki qaldı frazeoloji vahidlərə, onların əsas sistem xüsusiyyəti bundan ibarətdir ki, bunlar ikinci dərəcəli nominasiya vahididirlər. Bu məqam frazeologjya nəzəriyyəsində mühüm yer tutur, ikinci dərəcəli nominasiya vahidi olaraq, frazeoİojı vahid bütövlükdə (ayrı-ayrı hissələri yox) məcazlaşır. Məhz ona görə frazeoloji semantika bölünməzdir.

Beləliklə, frazeoloji vahid və sabit söz birləşməsi tamamilə ayrı-ayrı, fərqli dil vahidləridir. Düzdür, dilçilikdə bir ənənə də mövcuddur ki, "sabit söz birləşməsi" məfhumu "frazeoloji vahid" məfhumundan daha geniş bir məfhum sayılır və buna görə də "frazeoloji vahid" məfhumu "sabit söz birləşməsi" anlayışı ilə əhatə olunur. Qeyd etdiyimiz kimi, bü yanlış bir təsəvvürdür, çünki frazeoloji vahid söz birləşməsi, leksik vahidlərin birləşməsi deyil [181].

Beləliklə, komponentlərin mənaları söz biriəşməsinin ümumi mənasında heç bir rol oynamır, komponentlər söz birləşməsinin tərkibində dəyişmədən saxlanır və ifadə yaddaşdan hazır vəziyyətdə təqlid edilir. Həmin bu tədqiq edilən söz birləşmələri həmişə sabit bir tərkibdə qalır, məcazi mənada işlədilir, özünəməxsus bir dil vahidi kimi formalaşaraq, frazeologiyanın obyekti-frazeoioji vahid (frazeologizm) adlanır [135].

Frazeoloji vahidin yaranma səbəblərinə,onun mahiyyətinə aydınlıq gətirmək üçün söz və söz birləşmələrinin xüsusiyyətlərini təhlil etmək lazım gəlir.

Söz birləşməsi sözdən, ilk əvvəl, onunla fərqlənir ki, söz əşya, hadisə, proses və əlamətin adını çəkir, söz birləşməsi isə, həm əşya, həm də onun əlamətini, həm də əşyalar arasında olan münasibətləri bildirir. İstər sadə, istərsə də mürəkkəb söz öz semantik bitmişliyi ilə fərqlənirlər və bir məfhum ifadə edirlər. Sözün dəyişmə xarakteri onun formalaşma xarakteri

ilə bağlıdır. Formalaşma bütün sözlərə hətta dəyişməyən zərfə də şamil edilir yəni sözün kökünün başqa morfemlərdən fərqlənmə dərəcəsi sıfra bərabər olsa belə forma göstəricisi kimi saxlanılır.

Tərkibində eyni komponentlər daxil edildiyi vəziyyətdə belə, bəzi ifadələr gah sərbəst söz birləşməsi, gah da bütövlükdə vahid bir semantikada leksik məna verən sabit söz birləşmələri kimi işlədilir.

Frazeoloji vahidin tərkibində qalaraq, söz tam donmuş halda olur və ancaq frazeoloji vahidin komponenti kimi saxlanılır, öz həqiqi mənasını itirir. Belə sözlər frazeoloji vahidlərin bazasını təşkil edir.

Fəqət elə frazeoloji vahidlər var ki, onlar monolit şəkildə tam sabit və bölünməz,bəzən də onların komponentlərinin leksik mənası müasir dildə anlaşılmaz olur və yalnız frazeoloji vahidin tərkibində işlədilir. Bu qrup frazeoloji vahidləri akademik V.Vinoqradov [243] frazeoloji qovuşma adlandırmışdır. *Siirüşquluya dəm vermək* "qaçmaq" mənasında; *cilov gəmirmək* "əsəbləşmək" mənasında; *matı-qutu qurumaq* "heyrətlənmək" mənasında; *dünyasını dəyişmək* "ölmək" mənasında və s.

Frazeoloji qovuşmanın xüsusiyyəti ondan ibarətdir ki, ilkin mənada əlaqə hal-hazırda dərk edilmir. Bəzən, yalnız xüsusi tədqiqatlar onun ilkin mənasını aydınlaşdırır və frazeoloji əlaqəsini təyin edir. Məsələn, *cilov gəmirmək* ifadəsində mənanın tamdəyişdirilib, başqa cür dərk etmə nəticəsində "əsəbləşmək" mənasında işlədilməsi aydınlaşır.

Frazeoloji vahidin ikinci növü – frazeoloji birlik kateqoriyasıdır. Onun komponentlərindən əmələ gələn bütöv mənanın əlaqəsi komponentlərin mənaları ilə sərtləşmiş olur. Frazeoloji birliyin də mənası bölünməzdir. Onun ümumi mənası leksik komponentlərin üzərinə axıdılır və bu axından əsaslandırılmış şəkildə yeni məna – frazeoloji məna meydana çıxır.

Bu qrup sabit söz birləşmələrini ayırd etmək üçünxüsusi diqqət tələb olunur. Ona görə ki, bu qəbildən olan ifadələr eyni tərkibdə həmfrazeoloji vahid kimi, həm də sərbəst söz birləşməsi kimi çıxış edə bilərlər. Məsələn, göz yummaq həm müstəqil mənada, həm də frazeoloji mənada "fikir verməmək" kimi işlədilə bilər. Bu cür söz birləşmələri dilimizdə çoxdur [102, 135, 139, 243].

Frazeoloji uyuşmaların tərkibində sərbəst mənada işlədilən sözlər də ola bilər. *Yorğa getmək* ifadəsi iki sözdən ibarətdir. Bunlar *getmək,* mənaca sərbəstdir, təkcə *yorğa* sözü ilə deyil, başqa sözlərlə də birləşmə təşkil edə bilər. *Yorğa* sözünə gəldikdə isə o elə bil ki. *getmək* sözünə təhkim olunub və yalnız onunla işlədilə bilər. Frazeoloji uyuşmalara daha başqa misallar gətirmək olar: cəhənnəm əzabı; burnunu sallamaq; qəfləti ölüm; ağıl dəryası; dişləri qıcırtmaq və s. Frazeoloji uyuşmanın, demək olar ki, sərbəst söz birləşməsi kimi omonim olmur. Frazeoloji uyuşmaların xüsusiyyəti onun tərkibinə daxil olan frazeoloji asılı sözlərin sinonimik variantlarla əvəz edilməsindədir. (*burnunu sallamaq – qaşqabağını sallamaq; zülmət qaranlıq – bərk qaranlıq* s. [135].

Frazeologiyanm obyektini təyin etmək üçün V.V.Vinoqradovun təsnifinə N.M.Şanski 4-cü kateqoriyanı – *frazeoloji ifadələr*kateqoriyasını əlavə etmişdir [135, 291]. Bu tipdən olan frazeoloji vahidlərin tərkibindəki sözləri nəinki qeyri-sabit, hətta başdan-başa sərbəst mənada olurlar: *qurddan qorxan – meşəyə getmək; topdan satış pərakəndə satış; tələsən-təndirə düşər; huşunu başına yığmaq* vəs.

Frazeoloji ifadələrin frazeoloji uyuşmalardan fərqi onun tərkibində frazeoloji asılı sözlərin olmamasındadır.Onların komponentləri sinonimik variantlara əvəz edilə bilməz. Frazeoloji ifadələrin tərkibində olan sözlərin bir-biri ilə əlaqələri sərbəst söz birləşmələrindən fərqlənmir.Onların sərbəst söz

birləşmələrindən fərqi yaddaşdan hazır vəziyyətdə təqlid olunmasındadır.

Frazeoloji ifadələr arasında nominativ və kommunikativ xarakterli olanlar vardır. Nominativ xarakterli frazeoloji ifadələr cümlənin müəyyən bir hissəsi olaraq sözə bərabər mənada nominativ funksiyada (ad funksiyasında) çıxış edirlər: *əmək fəaliyyəti, bayram ərəfəsində; ali təhsil müəssisəsi* və s. Kommunikativ xarakterli frazeoloji ifadələr isə, cümləyə bərabər predikativ söz birləşmələrindən ibarət olur və bütöv bir fikir (mülahizə) ifadə edirlər: *İt də qurdun tayıdır; zəhmətsiz bar olmaz; insan ölümə məhkumdur* və s.

Müxtəlif xarakterli semantik bütövlüyə malik frazeoloji vahidlərin hüdudunu təyin etmək məqsədilə frazeologiya dilçilik elmində geniş miqyasda və dar çərçivədə qəbul edilmişdir. Bu aspektdə xüsusi araşdırmaların aparılması maraqlı və vacib məsələdir, bir tədqiqat obyekti kimi həmin məqalənin qarşısında qoyduğu məqsəddən kənardadır və öz tədqiqatçısını gözləyir [135].

Frazeoloji birikmə tərkibindəki sözlərin müstəqil mənalarını tamamilə itirməsi nəticəsində əmələ gələn sabit söz birləşməsini frazeloji birikmələr deyilir. Dilçilikdə bu tip sabit söz birləşmələr idiomlar da adlandırılır. Bu söz birləşməsinin əsas əlaməti onların semantik cəhətdən bütövlüyüdür. Dildə xüsusi səciyyə daşıyan bu birləşmlər onun frazelogiyasının əsasını təşkil edir [138]. Frazeloji birikmələr onları təşkil edən komponentlərinin məcazi mənaları əsasında əmələ gəlir. Bu cür birləşmələrin bədiilik xüsusiyyətləri yalnız tarixi-nöqteyi nəzərdən açıqlanır

Ona görə də frazeologizmlərdə motivləşən və qeyri-motivləşən xüsusiyyətlərin olduğunu bilmək, bu və ya digər dildə danışanın, yaxud onu öyrənənin ümumi təhsil səviyyəsi, intellektual səviyyəsinin nə dərəcədə olduğundan çox asılıdır [13].

Yuxarıda verdiyim misallar bir daha təsdiqləyir ki, frazeologizmlərin öyrənilməsində motivləşən və qeyri motivləşən xüsusiyyətlərinin nəzərə alınması təxmini və subyektiv mülahizələrdir. Lakin bütün bu deyilənlərlə bərabər, qeyd etmək lazımdır ki, frazeologizmlərin mənasının kontekstlə bağlı olması və ya olmaması onların motivləşən və qeyri-motivləşən olması ilə müəyyən edilir. Məlum olduğu kimi, kontekst ifadəsinin özü, latın dilinə məxsus olub "sıx birləşmə", əlaqə mənasında işlənən sözdür. Burada söhbət frazeologizmlərin mətn və ya cümlə daxilindəki əlaqəsindən gedir. Frazeologizmlər mətnə emosionallıq və ekspressivlik gətirir, onlara əyanilik və həyatilik verir [13].

Frazeologizmlər cümlə ilə kontekstlə əlaqədar işlənir, məhz onunla bağlı olur və onlardan istifadə olunması mükəmməl dil bacarığına malik olmağı tələb edir [13].

Yuxarıda verdiyimiz misallardan bir daha aydın olur ki, belə frazeologizmlər bəzi misallarda formaca bir-biri ilə oxşar olsalar da məna cəhətdən bir-birindən fərqli olur [13]. Məhz Heydər Əliyev nitqlərində frazeologizmlər mətndən kənarda tədqiq olunmur.

Frazeologizmlər, qeyd etdiyimiz kimi, digər söz birləşmələrindən özlərinin yığcam olmaları, lakonikliyi ilə də fərqlənir. Bəzən bir idiom və ya atalar sözləri ilə tam bir situasiyanı əhatə etmək olar. Məsələn, "revenon a nos moutons" – "əsas məsələyə keçək" frazeoloji birləşməsi yuxarıda qeyd olunduğu kimi F.Rablerin "Qarqantua və Pantaqruel" əsərindən götürülmüş ifadələr. Belə ifadələr əlbəttə bir çox hallarda bədii əsərlərdə mətnlə əlaqədar işlənir, onlarda həm bədiilik, həm də ekspressivlik və ifadəliliyi artırır [13].

Frazeoloji vahid bir güzgü olub dil sistemində xalqın fikir və düşüncələrini, onun adət və ənənələrini, məişətini, mədəniyyətini, həyat tərzini özündə əks etdirir [96].

Dilçilikdə frazeologiya adı altında qruplaşmış belə sabit söz birləşmələri öz aktuallığını, zənginliyini və eyni zamanda mürəkkəbliyi ilə bir çox dilçilərin tədqiqat obyektinə çevrilmiş və hal-hazırda da dilçi alimlərin tədqiqat obyekti olaraq nəzəri dilçilikdən kənarda qalmamışdır [96].

Frazeologizmlər tarixən sərbəst birləşmə modelləri əsasında, sərbəst birləşmələrin tərəflərinin məcazиləşməsi, qaynayıb-qovuşması, bir məfhumun ifadəçisinə çevrilməsi əsasında formalaşmış olur. Frazeoloji birləşmələr məcaziləşmə mərhələsi keçdikdən sonra dilin lüğət tərkibinə daxil olur, ayrı-ayrı sözlərlə yanaşı, lüğət tərkibindən götürülüb cümləyə daxil edilir. Leksikləşmiş olduğundan cümlənin sadə bir üzvü kimi çıxış edir.

Frazeologizmlərin ən mühüm xüsusiyyətləri ekspressivlik, metaforiklik və emosionallıqdır. Ekspressivlik – əlamətin yüksək keyfiyyətdə ifadəsidir.

Metaforiklilik, çoxmənalılıq frazeoloji birləşmələrin yüksək obrazlılığı deməkdir. Emosionallıq danışan şəxsin hisslərinin ifadə dərəcəsi ilə bağlıdır və bu xüsusiyyət frazeologizmlərdə daha qabarıq olur. Bütün bu cəhətlərə görə frazeologizmlər adi sözlərdən yüksəkdə durur və bədiilik vasitəsi kimi dildə böyük rol oynayır.

Frazeoloji birləşmələr dilin mənəvi-əxlaqi dəyərlərini, düşüncələrini və onları yaradan xalqın adətlərini qoruyub saxlayır. Çox vaxt bu birləşmələr fikrin düzgün çatdırılmasında həlledici rol oynayır [33, 34, 174, 275].

Frazeologizmlər hərtərəfli linqvistikaya aid olsa da onun hər bir dildə ifadə olunma formaları müxtəlifdir. Bu da frazeologizmlərin dilçiliyin bir sahəsi olmaq etibarı ilə fonem, morfem, sözlərlə müqayisədə daha çətin leksik-qrammatik, xüsusilə məna strukturuna malik olması ilə izah olunur. Frazeologiyada ekstralinqvistik və etnolinqvistik amillər daha üstünlük təşkil edir. məhz bu amillər frazeologizmlərin

inkişafında və formalaşmasında mühüm rol oynayır və onlara milli xarakter verir [38, 96, 273].

Heydər Əliyev dilində frazeologizmlər mətnin ümumi mənasının yekunlaşdırıcı sözü kimi çıxış edir. Məsələn Heydər Əliyevin 28 aprel 2000-ci ildə Almaniya Federativ Respublikası Bundestaqının xarici əlaqələr komissiyasının sədri Hans-Ulrix Reozenin başçılıq etdiyi nümayəndə heyəti ilə görüşdəki söhbətində işlətdiyi "haraya gəlmək" frazeologizminə qədər bütöv bir mətni bu frazeologizmə uyğunlaşdırır. Frazeologizm mətnin məzmununa uyğun gəlir.

"Miloşeviç Kosovoda etnik təmizləmə aparırdı. Siz, yəni Avropa ölkələri onun əleyhinə qalxdınız. Amerika Birləşmiş Ştatları da bu işə qoşuldu. Amma məsələni sülh yolu ilə həll edə bilmədiniz, misli görünməmiş bir hərbi aksiya keçirdiniz. Biz sizin bu hərəkətinizi dəstəklədik. Mən düz bir il bundan əvvəl Vaşinqtonda NATO-nun 50 illik yubileyi mərasimində çıxış edərkən bunu rəsmi olaraq bəyan etdim. Çünki o cür vəhşicəsinə həyata keçirilən etnik təmizləmənin qarşısını siz ala bilmədiniz, güc tətbiq etdiniz...Lakin Ermənistan və onlarla bağlı olan Dağlıq Qarabağ erməniləri 1989-cu ildən başlayaraq Azərbaycana qarşı təcavüz ediblər. Dağlıq Qarabağdan bütün azərbaycanlıları çıxarıb, etnik təmizləmə aparıblar, ondan sonra müharibəni genişləndiriblər...1994-cü ildə müharibəni saxlayandan sonra biz bu münaqişəni sülh yolu ilə həll etmək istəyirik, amma bizim harayımıza gələn yoxdur [XXVIIc.s.20].

"Burada da insan hüquqları həddindən artıq pozulubdur. Bəs niyə Avropa ölkələri, siz bu məsələyə münasibət göstərmirsiniz?

Sonda: Hans-Ulrix Keoze: – Mən bilmirəm, jurnalistlərin yanında hər şeyi açıq demək mümkündürmü?

Heydər Əliyev: Yaxşı, jurnalistləri buraxıram."

1. Problemin incəliklərinə qədər qarşı tərəfə şifahi şəkildə, canlı şəkildə çatdırılması;

2. Ritorik fiqurlardan, fikrin təsdiqi üçün ilk baxışda quru görünən rəqəmləri qarşı tərəfdə inam yaratmaq;

3. Müqayisə aparıb, sonda "harayımıza gələn yoxdur" frazeologizmin köməyi ilə dünya siyasətindəki ikili standarta etirazını bildirmək;

Bilirsiniz, Vilayət Quliyev nə deyib – mən bilmirəm. Azərbaycanda bir məsəl var: "Özünə umac ova bilməyən, başqasına əriştə kəsmək istəyir. Bilirsiniz bunun mənası nədir? Bizim özümüzün, bir milyondan çox azərbaycanlının hüquqları tapdalanıbdır. Azərbaycan ərazi bütövlüyünün pozulması ilə əlaqədar bu dəqiqə dünyada ən ağır vəziyyətdə olan bir ölkədir.

Heydər Əliyevin dilində bir sıra frazeologizmlər öz ilkin formada işlənmələrinə uyğun olaraq auditoriyalarda işlənir. "məsuliyyətə cəlb olunmaq", "hüquq-mühafizə orqanları tərəfindən saxlanılmaq", "zərərsizləşdirmək" ifadələrinin "yaxalamaq" frazeologizmi ilə əvəzlənməsi ilk baxışda loru leksikanı xatırlatsa da zaman və məkan, cinayətkarların düşüncə tərzi, o dövr üçün auditoriyanın diqqətini cəlb etmək baxımından 6 sentyabr 2002-ci ildə MDB üzvü olan ölkələrin Daxili İşlər Nazirləri Şurasının Bakıda keçirilən 23-cü iclasının iştirakçıları, ilə görüşdəki çıxış yaddaqalandır. Həmin çıxışda birinci cümlə auditoriyaya yönəlirsə: "Biz Rusiya, Ukrayna, Gürcüstan, Qazaxıstan, Özbəkistan və bir çox digər dövlətlərin daxili işlər orqanlarından – mən indi onların hamısının adını çəkə bilmirəm – olan həmkarlarımızın köməyi ilə ilə bir çox gizlənmiş cinayətkarı yaxalaya bilmişik" [XLIc.s.13].

Frazeologizmlərin mətnin sonluğuna düşməsi heç də təsadüfi deyildir. Müsahibələrinin birində Azərbaycanın düşdüyü bu ağır vəziyyətə dünyanın biganəliyinə "ürək ağrısı" ilə cavab verir. Auditoriya atributivləşmiş isim+isim frazeoloji

birləşməsini siyasi lider dilindən eşidərək hadisələrin dərinliyinə baş vura bilir: "Ona görə də bu gün, açığını deyim, şübhə etməyə başlayıram, görəsən, doğrudanmı bütün kiçik və böyük dövlətlər, bütün beynəlxalq təşkilatlar beynəlxalq hüququn sarsılmazlığı, hər bir dövlətin beynəlxalq aləmdə tanınmış çərçivəsində suverenliyinin, ərazi bütövlüyünün və sərhədlərinin toxunulmazlığı mövqeyində möhkəm dayanır? Bax, vəziyyət belədir. Mən bir daha bu barədə *ürək ağrısı* ilə danışıram" [XLc.s.59].

Heydər Əliyevin nitqində auditoriyanın yaddaşında həkk olunmaq baxımından, lazımi dövlət orqanlarını səfərbər etmək baxımından təkrarlardan geniş istifadə olunur. Belə təkrarlar frazeologizmlərdən də yan keçmir. Məsələn, Dövlət Yol Polisinin işiylə bağlı bir neçə məqamda "canını qurtarmaq" frazeologizmini təkrarlayır. "Sənədini qurdalayır-qurdalayır, o qədər qurdalayır ki, bu adam boğaza yığılıb, canını qurtarmaq üçün ona müəyyən qədər pul verir" [XLc.s.95].

"Əgər bununla onun canı qurtarmış olsa, bəlkə də buna dözmək olar" [XLc.s.95]. "Usubov mənə deyir ki, 300 nəfər DYP işçisini ixtisar etdik. Dedim,yaxşı. Axı mənim də ordan-burdan tanışlarım var. Oradan xəbərlər gəlir ki, vallah, sizə dua edirlər, nə yaxşı bizim canımız DYP işçilərindən qurtardı" [XLc.s.96].

Professsor İ.Kazımova [108] görə frazeoloji vahidlərin müəyyən qismi ta qədimlərdən – müstəqil ümumxalq türk dillərinin formalaşmağa başladığı dövrlərdən mövcud olmuş, sonralar ümumxalq, daha sonralar isə milli dil səciyyəsi daşıyan bu dillərin frazeologiyası tərkibində işlənərək indiyə qədər gəlib çıxmışdır. F.Hüseynovun [238] qeyd etdiyi kimi, "müasir dilin frazeologiyası öz kökləri ilə tarixin yazıyaqədərki dövrünə gedib çıxan uzun bir tarixi inkişafın məhsuludur."

Mətnin sonrakı cümləsində də "yaxalaya bilmək" işə düşür, fikir qüvvətlənir: "Bunu da bildirmək xoşdur ki, onları

nəinki yaxalaya bilmək, hətta qısa müdət ərzində müvafiq prosessual sənədlər hazırlayıb bizə, Azərbaycana təhvil vermək mümkün olmuşdur” [XLIc.s.13]. Növbəti nitq addımında “yaxalaya bilmək” öz izahını “məsuliyyətə cəlb etməklə” tapır: “Əlbəttə, bizim məqsədimiz heç də həmin adamları mütləq məsuliyyətə cəlb etmək deyildir, hərçənd onlar buna layiqdirlər, lakin məsələ həm də ondadır ki, gərək bu adamlar hər hansı bir respublikanın ərazisində gizlənməyin artıq mümkün olmadığını hiss etsinlər” [XLIc.s.13].

“Kiminsə başına bir iş gəlməsin” feilin arzu şəklində işlənən “başına iş gəlmək” frazeologizminin izahı mətn vasitəsilə mümkün olduğu kimi, Heydər Əliyevin insanların həyatı üçün daşıdığı məsuliyyət hissini auditoriya anlayır. “Xatirimdədir, biz, bütün nümayəndə heyəti böyük bir bərə ilə Neft Daşlarına gedirdik. Nümayəndə heyətində minədək adam vardı. Mən axıra yaxın gəlib çıxdım, təbii ki, qonaqlardan kimlərin burada olduğu barədə mənə məlumat verdilər. Məni narahat edən bu idi ki, onlardan kiminsə başına bir iş gəlməsin. Mənə dedilər ki, siyahı üzrə Müslüm Maqomayevdən savayı qalan hamı bərədədir. Dedim: Bəs Müslüm hanı, onu tapın. Mən hətta bərəni təxminən yarım saat saxlatdırdım. Sonra gəlib mənə dedilər ki, Heydər Əliyeviç, bilirsinizmi, gözləmək lazım deyil, çünki Tamara Sinyavskaya da yoxdur, nümayəndə heyətində o da vardı. Ona görə də güman ki, onlar olmayacaqlar. Düşündüm, yaxşı, qoy onlar qalsınlar. Onların dostluğu da, bax, o günlərdə başlamışdır” [XLIc.s.21].

Frazeoloji birləşmə əksər nitq təsadüflərində bütöv bir fikrin yekunu kimi səslənir. Əvvəlcə situasiya ardıcıl olaraq auditoriyaya açıqlanır, son cümlədə isə mətnə frazeoloji birləşmə ilə yekun vurulur ki, bu da nitqin yadda qalmasını təmin edir: “1987-ci ildə mən Moskvada istefaya gedəndən sonra həyatımda çox ağır bir dövr başlandı. Bu dövrdə, məlumdur, mənim əleyhimə nə qədər böhtanlar, yalanlar yay-

mağa çalışdılar. Həm Moskvada, təəsüflər olsun ki, Azərbaycanın özündə də. Bu ağır dövrü mən yaşadım. Ancaq Naxçıvan əhalisi, xüsusilə nehrəmlilər o vaxt mənim *arxamda möhkəm dururdular*" [XXIIc.s.265].

Heydər Əliyevin dilində frazeologizmlərin işləndiyi cümlənin ardınca bir sıra hallarda həmin frazeologizmin antonimi gəlir. Dinləyici frazeologizmdə saxlanan dərin məna və məzmunu elə böyük natiqin öz dilindən də eşidir: "Bizim üçün ən əziz odur ki, siz Azərbaycana tam obyektiv gözlərlə baxırsınız. Bunu ona görə demək istəyirəm ki, təəssüflər olsun ki, hələ bizə qərəzli münasibət göstərənlər də vardır" [XXVIc.s.200].

Heydər Əliyevin dilində frazeologizmlər bütöv bir mətni şüurlara çatdırmaq yolunda yüksək semantik xüsusiyyətlər kəsb edir. Öncə situasiya izah olunur. Bu izahlı situasiya ortada frazeoloji birləşmə ilə əvəzlənir və yenidən mətn davam etdirilir. Frazeoloji birləşmə fikirlər arasında körpü rolu oynamaqla yanaşı, nitqi yaddaqalan edir: "Mən sizə, sizin simanızda yerini-yurdunu, elini-obasını itirmiş, indi ağır şəraitdə yaşayan bütün Azərbaycan vətəndaşlarına öz hörmət və ehtiramımı bildirirəm. Bildirmək istəyirəm ki, mən daim sizin dərdinizlə yaşayıram. Bu Azərbaycan xalqının böyük dərdidir, bu, mənim dərdimdir, hər bir vətənpərvər azərbaycanlının dərdidir, mən də bu dərdlə yaşayıram. Amma ağır günün də ömrü çox olmaz. Biz bu ağır günləri keçib gedəcəyik, gələcək xoşbəxt günlərə çatacağıq, respublikamızın ərazi bütövlüyünü təmin edəcəyik və torpaqlarımızın azad olunmasına nail olacağıq, hər bir vətəndaş öz yerinə-yurduna qayıdacaqdır" [IVc.s.130].

Monoqrafiyada çalışdıq ki, Heydər Əliyevin dilində səslənən frazeologizmlərin siyasi nöqteyi-nəzərdən izahını verə bilək. Məs: böyük işlər görmək – xalqın inkişafı yolunda mühüm, ciddi, yaddaqalan iş görmək. Heydər Əliyevin dilində

frazeoloji birləşmələr öz izahını burada tapır. Məs: üz döndərmək – xəyanət etmək, gözümçıxdıya salmaq – təqib etmək, izləmək, əhəmiyyətsiz məsələlərə görə danlamaq, dözülməz iş şəraiti yaratmaq. İzahedici nitq, pedaqoji nitq bütün məqamlarda Heydər Əliyev nitqini tərk etmir. Məs: başında dəlləklik etmək ifadəsinin ardınca "eksperiment aparmaq" ifadəsini izah məqsədi ilə işlədir [111, 155].

Evfemizmlərə aid elmi ədəbiyyatın təhlili və aparılan müşahidələr göstərir ki, hər hansı bir dilin lüğət tərkibində evfemizmlərlə yaranmış frazeoloji birləşmələr çoxluq təşkil edir. Onlar kobud, nalayiq, deyimi münasib sayılmayan hətta ayıb sayılan, nəzarətsiz hesab edilən və qadağan olunan söz və ifadələrin əvəzedicilərididir.

Bu sahədə Azərbaycan dilində tədqiqat aparılan dilçi alim Y.Kərimovun çox düzgün bölgüsünə nəzər salaq. Müəllif mürəkkəb və çoxşaxəli dil hadisəsi kimi evfemizmlərin tədqiqinin üç mühüm aspektinin vacibliyini xüsusi ilə vurğulayır: sosial-mənəvi və dini aspektli, psixi-evfemistik əvəzləmə ilə əlaqədar deyimlərin yumşaldılması aspekti və xüsusi linqvistik aspekt [117].

Müəllif aspektləri bölərkən evfemizmlərin həm sosial durumda, həm dini sahədə, həm də psixoloji vəziyyətdə geniş işləndiyini vurğulayır. Yuxarıda qeyd edilənləri təsdiq etmək üçün bir daha ölümlə bağlı frazeoloji evfemizmləri nəzərdən keçirək. Ölümlə əlaqədar olan evfemizmlər bütün dillərdə mövcuddur. Bu cür evfemizmlər həm şifahi nitqdə, həm də yazılı nitqdə geniş yayılmışdır və onların müxtəlif formalarına rast gəlmək mümkündür. Ölüm hadisəsi insanlara özü-özlüyündə mənfi təsir bağışlamaqla bərabər, bu hadisəni ifadə edən frazeoloji birləşmələr də mənfi təsirə malikdir[117].

Frazeologiyanın vəzifəsinə, hər şeydən əvvəl, realizasiyanın müəyyən sintaqmatik şərtləri ilə məşğul olan bu müxtəlif məhduduyyət mexanizmlərinin açılması və təsvir

edilməsi də daxildir. Bununla da frazeologiyada söz birləşmələrindən məhdudiyyətləri əvvəlcədən müəyyən edən amillər tədqiq edilməlidir. Bu planda frazeologiya dilçiliyin leksikologiyasını və semasiologiyasını tamamlayan elə bir şöbəsi kimi başa düşülür ki, orada söz özünün qeyri-sərbəst sintaqmatik əlaqələri baxımından öyrənilir [170].

Frazeoloji birləşmələr və yaxud frazeologizmlər sözə ekvivalent hesab edilir. Lakin bu fikrə etiraz edənlər də vardır. Məsələn, Y.F.Gepner frazeologizmin sözə ekvivalentliyi məsələsindən danışarkən yazır: "Frazeoloji tərkiblərin sözlə eyni qiymətdə olması tezisi, heç olmazsa, belə bir səbəbə görə qanundankənardır ki, eyni bir sözün köməyi ilə demək olduğumuz halda, iki sözün birləşməsinə müraciət etməyə ehtiyac yoxdur" [170].

Görkəmli alim öz fikrini əsaslandırmaq üçün yazırdı: "Qeyd etmək lazımdır ki, frazeologizmin sözə ekvivalent olduğunu etiraf etməyə bir də ona görə mühüm düzəlişə ehtiyacı vardır ki, bu, emosionallığın, ekspressivliyin frazeoloji tərkiblərin mühüm əlaməti olmasını inkar etməyə aparıb çıxarır" [20, 243].

"Frazeologiya" terminini dilçilik aspektində ilk dəfə Şarl Balli işlətmişdir. O, söz birləşmələrinin iki tipini qeyd edərək yazır ki, birləşmələrin birisi sözlərin sabit olmayan birləşməsidir, bunlar daimi olmur, nitq prosesində yaranır və ona görə də nitq vahidlərini təmsil edir. Birləşmələrin bəzisi frazeoloji tərkiblər yaradır. Bunlar dil sisteminə onun vahidləri kimi daxil olur.

Bu gün frazeologizm aşağıdakı kimi anlaşılır: "Fikrin ifadəsindən nitqin bilavasitə tərkib hissəsini təşkil edən iki və ya daha artıq sözlərin birləşməsindən ibarət olub, komponentləri sintaktik və semantik cəhətdən parçalanmayan, quruluşca sərbəst söz birləşmələrinə və ya cümləyə oxşayan, dildə hazır şəkildə mövcud olub ənənəyə görə ya bir formada, ya da

qrammatik cəhətdən dəyişdirilərək işlədilən konstruksiyalara frazeologizmlər deyilir.”

F.de Sössür dildəki sabit ifadələri sərbəst söz birləşmələrindən belə fərqləndirir: “Biz hər şeydən əvvəl, külli miqdarda ifadələrə rast gəlirik ki, bunları dilə aid etmək lazımdır. Bunlar dildə elə hazır nitq parçalarıdır ki, adətən, daxilindəki ayrı-ayrı mənalara malik olan sözləri dəyişmək mümkün olduğu halda, bu, məqbul sayılmır. Bunların ənənəyə görə daşıdığı məna, komponentlərinin bütövlükdəki mənasından və sintaktik quruluşundan asılıdır. Belə ifadələr düzəldilmir, bunlardan dildə hazır şəkildə istifadə edilir” [20, 243].

F.de Sössürün dediyi kimi “düzəldilə bilməyən xalqın dilində hazır şəkildə mövcud olan” frazeologizmlərin siyasi natiq dilində araşdırılma obyekti olmasına ədəbiyyatda rast gəlmir.

Əsas xüsusiyyəti obrazlı, emosional, yaddaqalan, ifadəli olmaq olan frazelogizmlərin Heydər Əliyevin rəsmi-publisistik üslublu çıxışlarında öyrənilməsi mühüm əhəmiyyət kəsb edir.

İstənilən xalqın dünyagörüşü, adət-ənənələri, həyat biçimi, yaşam fəlsəfəsi, habelə dini inancları və mədəniyyəti bu və ya digər şəkildə onun yaratmış olduğu frazeoloji vahidlərdə öz əksini tapır. Təsadüfi deyil ki, məhz, bundan çıxış edən bir çox tədqiqatçılar frazeoloji sistemi “dilin tərcümeyi-halı” statusunda nəzərdən keçirmişlər. Bu mənada demək olar ki, hər bir dilin frazeoloji sisteminin komponentar analizi həmin dilin daşıyıcılarının məişəti, yaşadığı coğrafi bölgə, həmin ərazinin flora və fauna şəraiti haqqında kifayət qədər dolğun material təqdim edir [179].

Heydər Əliyevin dilində işlənən frazeologizmlərin mənşəyi barədə düşünərkən xalqımızın dini, məişəti, yaşadığı ərazinin coğrafi mövqeyi, yaşadığı ictimai-siyasi hadisələr göz önünə gəlir. “Torpağa verilmək” frazeologizmi dinimizlə

(“Onlar keçmişdə elə orada *torpağa veriliblər*” [XXVIc.s.219]), “tutmamış qatıq” məişətimizlə, heyvandarlıqla (“Müstəqil Azərbaycan Respublikası hələ *tutmamış qatıqdır*. O gərək bərkisin, möhkəmlənsin” [Ic.s.113]), “tarixi qaralamaq” keçmişimzə hörmətlə (“Amma olan *həqiqətləri* də unutmaq, *qaralamaq* olmaz. Yenə də deyirəm, tarixi qaralamaq olmaz” [VIIc.s.23]), “uçuruma aparmaq, uçuruma doğru getmək” frazeologizmləri isə ərazimizin dağlarla əhatələndiyini işarə etməklə (“Xalqı bu bəladan qurtarmaq üçün istifadə etmək lazımdır, xalqı daha da *uçuruma aparmaq* üçün yox” [IIc.s.245]) bağlı yaranmış deyimlərdir ki, bütün bunlar siyasi səhnədə ictimai-siyasi lider dilində dünyaya bəyan edilir.

Frazeoloji intensifikator (Fİ) intensionallığın markeri (işarəsi) kimi. İntensional vəziyyəti ifadə etmək subyektin şüurunun dünyaya (aləmə) necə istiqamətlənməsi üsulunu (yolunu) göstərmək və yaxud başqa sözlə ətraf aləmin (dünyanın) necə təsəvvür olunmasının idrakıdır.

Üç əsas aspekt mövcuddur ki, onlara da şüur istiqamətlənə bilər və bu da öz növbəsində həmçinin intensional vəziyyəti, bu istiqaməti ifadə edən deməkdir [44].

Substantivləşmə termini latınca isim mənasmı verən *substantium* sözündən götürülmüşdür. Bu isə dilçilikdə digər nitq hissələrinin isim kateqoriyasına keçməsi, isimləşməsi deməkdir. Digər nitq hissələrinin isimləşməsi dedikdə, adətən mübtəda və tamamlıq vəzifəsində işlənən, lakin həmin üzvlərin əsas ifadə vasitəsi olmayan, başqa nitq hissələrində özünü göstərən yeni xüsusiyyətlər nəzərdə tutulur. Başqa nitq hissəsinə aid olan sözlər isim kateqoriyasına keçdikdə ismin xüsusiyyətlərini daşıyır, isim kimi hallanır, cəm şəkilçisi qəbul edir [50, 51].

Dilçilikdə substantivləşmə haqqında müxtəlif fikirlər mövcuddur. Bir qrup dilçilərin tədqiqatlarına əsasən sözlər

daimi və müvəqqəti substantivləşir. Xalq ifadələri, atalar sözləri, aforizmlər, məsəllərdə işlənən substantivləşmə daimi və ya sabit, mətn və situasiya ilə bağlı olan substantivləşmə isə müvəqqəti və ya keçici substantivləşmə adlanır [10, 106]. Digər dilçilər isə həmin fikirlə razılaşmayaraq qeyd edirlər ki substantivləşmə keçid prosesi olduğu üçün tam və müvəqqəti mövcud ola bilməz [56, 89]

M.Adilov və Ə.Cavadovun fikrincə, obyektiv dil hadisəsi olan substantivləşmə xalq ifadələrində, atalar sözlərində daimi xarakter daşıyır və daimi substantivləşmə hadisəsi daha çox obrazlı dildən doğur. Atalar sözləri və məsəllərdə müəyyən obrazlar əşyanın yerinə keçir və bir müddətdən sonra həmin mənada daha çox sabitləşir. Daimi substantivləşmiş sözlər dilin lüğət tərkibinə daxil olaraq orada özünü bir leksik vahid kimi göstərir və leksik yolla sözdüzəltmədən danışılarkən əsasən daimi substantivləşmiş sözlər nəzərdə tutulur [199, 219].

Dilçilər substantivləşmə hadisəsinin baş vermə səbəbini aşağıdakı kimi izah edirlər: a) dildə hər bir sözün başqa sözlə qaynayıb qarışması nəticəsində birləşmələrin adi və işlək olması; b) substantivləşən sözlərin daha çox insanların daxili və xarici əlamət və keyfiyyətlərini bildirməsi. Bütün bunlar həmin sözlərin ixtisar edilməsi ilə nəticələnir [4, 90].

Danışıq dilində olduğu kimi bədii əsərlərdə substantivləşmə hallarına tez-tez rast gəlinir. İnsanın əxlaq tərbiyəsində, fəal həyat mövqeyinin formalaşmasında böyük əhəmiyyət kəsb edən, öz yığcamlığı, düzlüyü, sərrastlığı, aydınlığı, emosionallığı, ahəngdarlığı və melodikliyi ilə seçilən, mənaca dərin, məzmunca geniş olan atalar sözləri və məsəllərdə də tez-tez ixtisar halları ilə qarşılaşmaq mümkündür. Nümunələrdən aydın olduğu kimi, atalar sözlərində işlədilən sifətlər əlamət, keyfiyyət bildirməklə yanaşı, həmin əlamət və keyfiyyəti bildirən şeylərin də məna yüklərini daşıyırlar. Məsələn *pis* sifəti mənfi xüsusiyyətlərə malik, verilən tələbləri təmin

etməyən, istənilən kimi olmayan, mənfi təsir bağışlayan [180]; *adil* ədalətli, düz iş görən [180]; *zalım* zülm edən, zülmkar, qəddar, mərhəmətsiz, insafsız [180] insan xüsusiyyətləri ilə yanaşı şəxs mənasını; *acı* dili-ağzı yandırıcı, fəlakətli, məşəq-qətli, əziyyətli kədərlə dolu [180]; *şirin* xoş tam verən, dadlı, ləzzətli, xoş, səfalı, zövqverici, ürəyəyatan, xoşagələn [180] mənaları ilə birgə, hal, hadisə, vəziyyət mənalarını; *ağ* və *qara* sifətləri isə rənglə bərabər ağ və qara rəngdə olan əşya-ları bildirir. Substantivləşmiş sifətlər ismin bütün halları üzrə dəyişə bilir.

Elə bu substantivləşmiş frazeologizmlərin Ulu Öndərin nitqində də siyasi situasiyalara uyğun seçilməsi maraq doğu-rur. Müstəqilliklə bağlı nailiyyətlərimizə sevinməyən, əsil həqiqəti xalqa düzgün izah etməyən (qara yaxmaq, qara yaylıq bağlamaq), müsbət olanı, yaxşı olanı görmək istəməyənləri (qara eynəklə görmək) substantivləşmiş frazeologizmlərlə auditoriyaya çatdırmaq Heydər Əliyev siyasi dühasına xasdır: "*Qara eynəklə görmək* – yaxşı olanı görməmək; "İkincisi, öz ölkəmizin daxilində elə adamlar var ki, onlar müxalifətdə ol-duqlarına görə Azərbaycanda baş verən hər şeyi *qara eynəklə görürlər* və hər bir şeyi də pis qiymətləndirirlər" [VIIIc.s.144]. *Qara yaxmaq* – kimisə yanliş olaraq günahlan-dırmaq, ünvanına yalanlar söyləmək, ləkələmək; ~ əsil həqi-qəti gizlətmək; böhtan atmaq, şər atmaq; "Bəzi kütləvi infor-masiya vasitələrində edildiyi kimi, Azərbaycana *qara yaxmaq* lazım deyildir" [XXIXc.s.310]. *Qara yaylıq bağlamaq* – yas saxlamaq; paxıllıqdan yas tutmaq; nailiyyətlərə sevinməmək; "İndi gedin o ağlayanlara, *qara yaylıq bağlayanlara*, sonra "yürüş edənlərə" deyin ki, onları İstanbul küçələrində gör-mədik. Onlar harada idilər? Gəlib burada nümayiş keçirmək istəyirdilər" [XXIIIc.s.183].

Böyük natiqin dilində substantivləşmiş sifətlərdən biri kimi "pis" sifəti "yol" isimi ilə birgə cəmiyyətdəki neqativliyi

əks etdirir: "Ayrı-ayrı adamlar bundan sui-istifadə etməyə, onları qızışdırıb *pis yollara salmağa* çalışırlar" [IIc.s.357]. "Çünki mən hər bir insanı *pis yoldan çəkindirmək* istəyirəm" [XXXIXc.s.128]. "Bəziləri rüşvətxorluqla məşğul olur, bəziləri başqa *pis yollara gedirlər*" [XXVIIIc.s.337]. "Ona görə də sonrakı dövrdə gəlib *pis yollara düşdülər*" [VIIc.s.482].

Çoxmənali frazeologizmlər dildə işlənmə əhatəsinə, rəngarəng məna çalarlarına görə frazeoloji vahidlər arasında özünəməxsus yer tutur. Çoxmənalı frazeologizmlərin dilin zənginləşməsində əlahiddə rolu vardır .

Leksik vahidlər arasında çoxmənalılıq artıq uzun illərdir bütün alimlər tərəfindən birmənalı şəkildə qəbul olunub. Çoxmənalılığın Azərbaycan dilində ilk tədqiqatçılarından olan S.Cəfərov yazır: "Hər hansı sözün ilk mənasından əmələ gələn yeni mənalar onun məna çalarlığı adlanır. Bir məfhumun müxtəlif məna çalarlığını ifadə edən sözlərə "çoxmənalı-polisemantik" sözlər deyilir [48, 49]. Sözlərin çoxmənalılığı türk dillərində hələ qədim dövrlərdən böyük rol oynamışdır. Çoxmənalılıq – frazeoloji birləşmənin komponentlərinin inkişaf edərək yeni əlavə mənalar qazanmasıdır. Bu yeni mənalar həmişə ilkin məna ilə bağlı olur.

Frazeologizmlərdə polisemiya hadisəsi bütün dünya dilçiləri tərəfindən birmənalı şəkildə qəbul olunmur. Ə.Hacıyeva bildirir ki, çoxmənalılıq, polisemiya hadisəsi leksika sahəsində qəbul olunmuş fakt sayılsa da frazeologiya sahəsində hələ də bəzi tədqiqatçılar tərəfindən qəbul olunmur [82]. Məhz buna görə də bu haqda dilçilikdə bir-birinə zidd fikirlər mövcuddur. A.İ.Yufimov, İ.R.Qepner, N.P.Roqova və Q.İ.Kramarenko kimi dilçilər frazeologizmlərin çoxmənalılığını qəbul etmirlər. Digər alimlər qrupu da var ki, onlar frazeoloji birləşmələrin çoxmənalılığını qəbul edirlər. V.V.Vinoqradov. İ.İ.Çemişeva, A.Y.Borodulina, V.R.Jukov, L.E.Binoviç, Azərbaycan dilçilərindən N.Rəhimzadə,

M.Mirzəliyeva, Ə.Hacıyeva, H.Bayramov, N.Seyidəliyev, S.Murtuzayev, H.Həsənov, Q.Kazımov, Q.Mahmudova frazeoloji vahidlərdə çoxmənalılığı qəbul edir və öz tədqiqat əsərlərində müasir Azərbaycan dilindəki çoxmənalı frazeoloji vahidləri istər müxtəlif sistemli dillərdəki çoxmənalılıqla, istərsə də türk dillərindəki frazeoloji çoxmənalılıqla müqayisəli şəkildə tədqiq etmişlər.

A.İ.Molotkov [273] frazeoloji çoxmənalılığın sözlərin çoxmənalılığından fərqlənmədiyini söyləyir.

Leksik vahidlərlə frazeoloji birləşmələrin çoxmənalılığı bir-birinə çox bənzəyir. Lakin onlar eyni deyildir. Frazeoloji birləşmənin tərkibində söz öz real mənasını itirir, başqa sözlə birlikdə ifadənin ümumi mənasına xidmət edir. Azərbaycan dilində çoxmənalı frazeoloji birləşmələrin əksəriyyəti 2, çox nadir hallarda isə 3 və daha artıq mənaya malik olur. Bütün frazeoloji birləşmələr çoxmənalılığa meyilli deyildir. Müasir Azərbaycan dilində onlann yalnız bir qismi çoxmənalıdır. Dilimizdə frazeoloji çoxmənalılıq bu yollarla yaranır: 1. Frazeoloji vahidin tərkibindəki komponentin çoxmənalılıq əldə etməsi nəticəsində 2. Frazeoloji birləşmənin öz mənasını məcaziləşdirilməsi nəticəsində.

Ə.Hacıyevanın [82] fikrincə, frazeoloji çoxmənalılıq bir çox alimlər tərəfindən öyrənilsə də "...çoxmənalı frazeoloji birləşmə ilə çoxmənalı söz arasında fərq frazeologizmlərin çoxmənalılığını müəyyən edən faktorlar, çoxmənalı frazeologizmlərin həqiqi mənalarını üzə çıxaran semantik və s. problemlər hələ də tədqiq edilməmişdir".

Məlumdur ki, frazeoloji birləşmələr xalqın təfəkkür və düşüncə tərzi, iqtisadi həyatı ilə bağlı olur. Xalqın təfəkkürü və düşüncə tərzi, məişəti və iqtisadi həyatı dəyişdikcə, həmin xalqın dilində işlənən söz və birləşmələrin də ilkin mənaları dəyişir, genişlənir, yeni-yeni çalarlar qazanır, fərqli mənalarda işlədilir və formalarını dəyişir [41]. Bu dəyişmə özünü

çoxmənalılıqda daha çox göstərir ki, 1990-cı illər Heydər Əliyev dilində yeni sözlər, yeni frazemlər, Sovetlər dövründə az qala yaddan çıxmaq dərəcəsinə çatan sözlər siyasi səhnəyə gətirilir. Məhz müstəqillik dövründə yeni siyasi-iqtisadi dövrə uyğun frazeologizmlərdə çoxmənalılıq yaranır.

"Sözlərin ayrı-ayrı mənalarına nisbətən frazeoloji vahidlərin məna quruluşu daha da diferensiallaşır. Şübhəsiz, frazeologizmlərin mürəkkəb məna və qrammatik quruluşu onun müxtəlif mənalarda işlədilməsinə təsir göstərir" [115]. H.Həsənov bildirir ki, frazeologizmlər xalis "mətn"i vasitələrlə – sintaktik birləşmə və sintaktik əlaqə ilə meydana çıxdığı üçün onların çoxmənalılığı çətin olur. Çünki frazeoloji vahidlərin mənaca rəngarəngliyi mənanın həcmcə və işlənmə genişliyinə əsaslanır. Bu da frazeologizmlərdə əlavə leksik-semantik variantların yaranmasına imkan vermir. Vahid məna və quruluşca dəyişir: ifadə həm həqiqi, həm də məcazi mənada işlədilir" [91].

"Frazeoloji vahidlərin çoxmənalılığı müəyyənləşdirilərkən bu meyar leksik vahidlərin çoxmənalılığı ilə əlaqələndirilir, yəni dildəki bir sıra sözlərin də çoxmənalılıq səciyyəsi kəsb etdiyi xatırladılır. Leksik vahidlərin çoxmənalılığı eyni leksik vahidə bir sıra mənaların toplanması nəticəsində yaranır".

Çoxmənalılıqla omonimliyin fərqli və oxşar cəhətləri ilə bağlı T.Əfəndiyevanın fikirləri daha qənaətbəxşdir. "Polisemiya bu və ya digər sözün müxtəlif mənalarının bir əsas məna ətrafında birləşməsi, omonomiya isəjıeç bir əlaqədə olmayan müxtəlif mənalı sözlər deməkdir".

M.Mirzəliyeva [153, 154] da frazeologizmlərdə polisemiya hadisəsinə nadir hallarda rast gəlindiyini söyləyir. Frazeoloji vahidlərin komponentlərinin semantik bütövlük dərəcəsi yüksəldikcə onların çoxmənalılıq kəsbetmə ehtimalı azalır. Hansı frazeoloji birləşmədə komponentlər arasındakı

semantik əlaqələr üzdədirsə, onlarda çoxmənalılıq üçün imkan daha geniş olur. Məsələn: baş əymək – 1) "hörmət etmək" mənasında; 2) "məğlub olmaq" mənasında, rol oynamaq – 1) "əhəmiyyətli olmaq"mənasında; 2) "təsir etmək" mənasında – O, həyatda rol oynayırdı; O mənim həyatımda müsbət rol oynadı.

Az da olsa polisemiya hadisəsi ulu öndərin də nitqlərində müxtəlif zaman kəsiklərində, fərqli auditoriyalarda yer alır: *"Məsələ qaldırmaq (1)* – məsələni müzakirəyə çıxarmaq; "O, əgər bu *məsələləri bir daha pozitiv mövqedən qaldırsa*, təbiidir ki, Konqresdə də fikir artıq dəyişir və dəyişəcəkdir" [XXVc.s.111]. *Məsələ qaldırmaq (2)* – problemi diqqətə çatdırmaq; "Demək istəyirəm ki, o vaxt, parlamentin sədri olarkən, prezidentin səlahiyyətlərini icra edərkən mən sentyabrda Moskvaya gəldim və *məsələ qaldırdım,* Boris Nikolayeviçlə, başqa insanlarla görüşdüm və bir aydan sonra biz MDB-nin tərkibinə daxil olduq" [XLIc.s.264].

Frazeoloji birləşmələrdəki çoxmənalılıq hadisəsinin qəbul edilib-edilməməsindən asılı olmayaraq müasir Azərbaycan dilində frazeologizmlərin çoxmənalılığı vardır. Bu hadisəni danmaq qeyri-mümkündür. Lakin frazeoloji çoxmənalılıq hadisəsi geniş şəkildə tədqiqata cəlb olunmayıb. Azərbaycan dilindəki frazeoloji çoxmənalılıqda öyrənilməmiş, tədqiq edilməmiş sahələr yetərli qədərdir.

Salayeva F.V. qeyd edir ki, aydın məsələdir ki, söhbət dil semantikasınm həqiqətdə olan münasibətlərindən gedirsə, ilk növbədə, leksik və frazeoloji vahidlər yada düşür. Məhz leksika milli şüurun konseptləşməsindən xəbər verir. Frazeoloji vahidlər isə, dilin ikinci dərəcəli nominasiya vahidləri olaraq, işarələrə ekspressiv münasibət bildirən vasitədir. Beləliklə də, frazeoloji vahidlər müasir dilçiliyin maraq mərkəzində yerləşir.

Frazeoloji vahidlər ikinci dərəcəli nominasiya vahidləri olaraq mədəniyyəti konsept şəklində təqdim edir. Yəni mədəniyyət leksika və frazeologiyada konseptləşir, lakin frazeologiyada mədəni faktlara ekspressiv münasibət bildirilir və buna görə də frazeoloji vahid kommunikativ effekt baxımından dilin daha güclü vasitəsidir [183]. Məhz buna görə də natiqlik sənətində frazeologizmlərsiz keçinmək mümkünsüzdür.

Beləliklə, müasir dil tədqiqatları məcazlara, frazeoloji vahidlərə, atalar sözləri və zərbi-məsəllərə xüsusi diqqət yetirir. İlk növbədə bu diqqət dil vahidlərinin əsasını təşkil edən obrazların konseptləşməsilə bağlıdır. Məsələn, Azərbaycan dilində və Azərbaycan xalqının milli təfəkküründə daşın konseptləşməsi iki koqnitiv əlamət üzərində qurulur: "bərk" və "hissetməzlik". Çox maraqlıdır ki, "Rusca–azərbaycanca lüğət"də rus dilində işlənən черствый, черстветь, черствость sözlərini və anlayışlarını Azərbaycan dilində izah etmək üçün tərtibçilər daşa dönmək, ürəyini daşa döndərmək, daşürəklik, daşürəkli sözlərinə müraciət edirlər. Deməli, artıq Azərbaycan təfəkküründə "daş" konseptləşmişdir. Frazeologiyada da bu konsept öz ifadəsini tapır. Məsələn, bağrı daşa dönmək frazeologizmində həmin konsept öz ifadəsini tapır.

Beləliklə də, "daş" konsepti Azərbaycan şüurunda çox mürəkkəb bir hadisə kimi çıxış edir. Kütləvi şüurda konseptləşmə bilavasitə leksik mənanın denotatı ilə bağlıdır. Təsadüfi deyil ki, denotat əşya haqqında tipik fikirdir. Yəni söhbət ayrı-ayrı insanların psixologiyasından yox, milli təfəkkürdən gedir.

Koqnitiv dilçilik dili və mədəniyyəti aktual bir korrelasiya kimi nəzərdən keçirir. İlkin tezisə görə mədəniyyət paralel olaraq dildə işarələnir. Mədəniyyəti, adətən, mənəvi və maddi mədəniyyətə bölürlər. Mənəvi mədəniyyət mətnlər formasında mövcuddur. Maddi mədəniyyətə gəldikdə, qeyd etmək lazımdır ki, kütləvi təfəkkür maddi mədəniyyət haqqında refleksiya formasında mövcud olan təsəvvürlərlə eyniləşdirilir. Məsələn:

Azərbaycan xalqının maddi mədəniyyət sərvətlərindən birini Qız qalası təşkil edir. Bu qala haqqında müxtəlif insanların müxtəlif təsəvvürləri var. Real qalanın obyektiv görünüşü və obyektiv tarixi var. Bununla bağlı emosiyalar mövcuddur və s. Lakin həm qalanın görünüşü yanlış ola bilər, həm də tarixi [183].

Kütləvi şüurda isə tipik təsəvvür var ki, bu da Azərbaycan xalqına mənsubdur. Əlbəttə, bu tipik təsəvvür qalanın xarici və daxili görünüşü ilə, Qız qalası ifadəsinin lüğəvi təyini ilə, hamıya bəlli olan ümumi tarixi məlumatlarla müəyyənləşir. Bu informasiya bütövlükdə Azərbaycan xalqının şüurunda və dilində konseptləşir, yəni lüğəvi təyin, ümumi anlayış, siqnifikat mədəni-tarixi informasiya ilə tamamlanır və konsept şəklində dil vahidlərinin emosional (obrazlı) əsasını təşkil edir. Nəticə etibarilə konseptual informasiya kütləvi şüurda təhtəlşüur formasında və səviyyəsində reallaşır. Həmin bu informasiya danışıq situasiyasında aktuallaşa da bilər, aktuallaşmaya da. Əlbəttə, daxili formanın və etimoloji mənanın aktuallaşması ifadənin ekspressiv gücünü artırır. Nəticə etibarilə deyimin kommunikativ effekti artır. Lakin etimoloji məna aktuallaşmaya da bilər. Bu zaman frazeoloji vahid adi işarə kimi çıxış edir və formal qəbul olunur.

Koqnitiv dilçilik frazeoloji materialı təsəvvürlərin konseptuallaşması baxımından öyrənir. Və bu baxımdan Azərbaycan dilinin frazeologiyası tədqiqat üçün geniş imkanlar açır.

Deyimin kommunikativ effekti Heydər Əliyev dilində frazeologizmlərin köməyi ilə artırılır.

Biz frazeoloji lüğətlərdə sözlərin mənasını oxucular üçün açıqlayırıq. Maraqlı olan odur ki, Heydər Əliyev dilində frazeologizmlərin semantik mənasını, leksik xüsusiyyətlərini görə bilirik. Məsələn, "şəhid olmaq" frazeologizmin lüğəvi mənası aşağıdakı 3 cümlədə öz əksini tapır: "Mən bu gün

qeyd etmək istəyirəm ki, o illərdə də, hələ bizim ordumuzun formalaşmadığı dövrdə də, hələ Ermənistanın təcavüzünün ilk illərində də Azərbaycanın ayrı-ayrı qüvvələri tərəfindən buraxılan səhvlərə, hakimiyyət mübarizəsinə baxmayaraq, Azərbaycanın gənc, qəhrəman övladları ancaq torpağı qorumaq üçün vuruşublar, döyüşüblər, həlak olublar, *şəhid olublar*. *Şəhid olmaq* hər bir insan üçün ən yüksək zirvəyə çatmaqdır. O qəhrəmanlar ki, o insanlar ki, vuruşlarda, döyüşlərdə *şəhid olublar*, canlarını qurban veriblər, onlar bizim ordumuz üçün, hər bir əsgər üçün örnək olmalıdır" [XXXVc.s.67].

Başqa bir nitq məqamında bütün cümlə tipli frazeologizmlərin daxili məzmunu, mənası Heydər Əliyev dilində açılır: "Azərbaycanda bir söz var: *gərək ayağını yorğanına görə uzadasan.* Dövlətimizin yorğanı indi nə boydadırsa, biz ayağımızı o yorğandan çıxara bilmərik. Mümkündür, çıxardarsan, amma heç bir mənfəət gətirməyəcək, səni də isitməyəcəkdir. Çünki yorğan, adətən, adamı isitməkdən ötrüdür" [XXXVc.s.87].

Heydər Əliyevin işlətdiyi frazeologizmlər özlüyündə deyərdik ki "loru" və kitab leksikasına uyğun olur. Belə ki, 3 iyul 2001-ci ildə, Prezident Sarayında Amerika Birləşmiş Ştatları ticarət palatası idarə heyətinin üzvləri ilə görüşdəki söhbətdə "arxa qapıdan girmək", "dal qapıdan girmək", "yaxşı ad çıxarmamaq", "göydən düşmək" kimi loru frazeologizmlərdən, məişət üslublu frazeologizmlərdən yerindəcə, ustalıqla istifadə edilir. Bu cür frazeologizmlərin dövlət rəhbəri dilində səslənməsi məsələyə rəhbərin incə təfərrüatlarına qədər bələdliyindən xəbər verir. Auditoriya – sahibkarlar və ticarətçilər auditoriyası qarşılarında iqtisadiyyatı incəliklərinə qədər bilən iqtisadçı alim təfəkkürlü natiqi görür. Və bu cür frazeologizmlərin işləndiyi nitq həm yaddaqalan, həm də səfərbəredici ruhda olur: "Onlar burada öz fəaliyyətlərini genişləndirmək istəyirdilər. Amma burada onlar *düz yolla*

getmirlər. Elə təkcə onlar deyil, bəzi başqa şirkətlər də. Gəlib burada ayrı-ayrı adamlarla əlaqəyə girirlər. O adamlar da gedib bizim başqa dövlət orqanları ilə xoşa gəlməyən əlaqəyə girirlər və iş qurmaq istəyirlər Azərbaycana *"arxa qapıda*"dan girmək lazım deyildir" [XXXVc.s.111].

Bu "loru" dildə səslənən frazeologizmlərin arxasında ciddi, səfərbəredici, düz yola, qanuni yola çağırış hiss olunur. İlk baxışda bəzən yumoristik çalarlı bu frazeologizmlər ciddi mətləblərdən xəbər verir: "Amma işin əsası bunda deyildi. "Makdonalds" burada bir nəfər yerli biznesmenlə əlaqəyə girib. Yenə də deyirəm, əsas qapıdan girmək əvəzinə "*dal qapı"dan girib*. O gedib həmin bu yeri alıbdır ki, onlar bu işi bir yerdə görəcəklər. Mən dedim ki, o biznesmeni tapın. O, Moskvaya qaçdı. Qorxurdu ki, mən onu həbs etdirəcəyəm" [XXXVc.s.112].

Ad çıxarmaq – tanınmaq; "yaxşı ad çıxarmamaq", "pis, mənfi ad çıxarmaq" kimi sinonim cərgələrdən istifadə edərək təkrarlardan qaçır: "Amma yenə də xarici şirkətlər gəlib Azərbaycanda o qədər də *yaxşı ad çıxarmayan* bəzi adamlarla birləşib auditor təşkilatları yaradırlar... Bir çox hallarda dediyim təşkilatlar Azərbaycanda *mənfi ad çıxarmış* adamlarla yaradılır. Bizim orqanlar belə adamlara müsbət münasibət göstərə bilməzlər.

Amerikanın hansısa bir şirkəti gəlib burada çox *pis ad çıxarmış* adamla bir iş görürsə, onda bizim cəmiyyətimiz də bunu başa düşməz ki, nə üçün belə adamla iş görür" [XXXVc.s.114].

"Dünyanın linqvorəng mənzərəsi"ni yaradan dil universallarından biri də rəng bildirən sifət əsaslı (koloristik) frazeologizmlərdir. Bu frazeologizmin əsas xüsusiyyəti onların bu və ya digər anlayışı ayrı-ayrı sözlərdən dəfələrlə təsirli və obrazlı əks etdirməsidir.

Müxtəlif sistemli dillərin birindən digərinə tərcümə eyni dil qrupuna daxil olan dillərin birindən digərinə tərcümədən daha çətindir, çünki eyni dil qrupuna daxil olan dillərin ortaq məxrəcləri daha çox olur [80].

Heydər Əliyev yerində qeyd edirdi ki, atalar sözlərini tərcümə etmək çətin olur. Məlumdur ki, frazeologizmlər milli xüsusiyyət daşıyır və onlarda hər bir xalqın özünəməxsus adət-ənənəsi, məişəti, dünyagörüşü, etik-fəlsəfi baxışları, təfəkkür tərzi və s. öz əksini tapır. Frazeoloji vahidlərin daha məqsədə uyğun tərcüməsi tam frazeoloji ekvivalentin seçilməsidir. Tərcümə dilində frazeoloji vahidin eyni mənanı daşıyan, həmin daxili formaya və üslubi rəngə yaxın olan variantı mövcud olur [80].

Ümumiyyətlə, koloristik frazeologizmlər üzərində aparılan müşahidələr göstərir ki, onların semantik bütövlük dərəcəsi mühüm rol oynayır. Frazeoloji vahidlərdəki spesifik milli kolorit və onların effektiv transformasiya imkanları ifadənin mənbəyi olan dilin obyektiv dilə nisbətində müəyyən edilir [80].

Bir qisim hallarda frazeologizmlərlə zəngin bir neçə cümlə ard-arda düzülərək nitqin semantik yükünü gücləndirir. "Ümumiyyətlə, bizim işlərimiz çətinliklərin aradan götürülməsi yolu ilə gedir. Bizim bu işlərimiz *hamar yol* ilə, yaxud tamamilə düz asfalt yol ilə getməyib. Eniş də, yoxuş da var, qarşımıza daş da, qaya da çıxır. Ancaq biz bunları *yarıb* keçirik. Güman edirəm ki, bu məsələdə olan maneələri də biz yarıb keçə biləcəyik" [Vc.s.74].

Naxçıvan Muxtar Respublikasının əhalisi ağır bir dövrdə məni Muxtar Respublikaya rəhbərlik etməyə dəvət etdi. Mən bir neçə gün müqavimət göstərdim, bundan imtina etdim. Ona görə yox ki, mən istəmirdim Naxçıvan əhalisinə, muxtar respublikaya xidmət edim. Ona görə ki, mən sadəcə, özümü yenidən dövlət *işinə bağlamaq* istəmirdim. Ancaq o vaxt

Naxçıvandakı ağır şərait məni məcbur etdi. Bəlkə də Allah naxçıvanlılara və Azərbaycanın qədim, müqəddəs torpağı olan Naxçıvana rəhm etmişdi ki, məni Naxçıvana getməyə məcbur etdi [XXIVc.s.45].

Azərbaycan prezidenti kimi, mənim borcum, vəzifəm və məqsədim ondan ibarətdir ki, Azərbaycanda həqiqi demokratik cəmiyyət yaransın. Yenə də Gündüz Tahirli burada dedi ki, bəziləri geri qayıtmaq istəyir. Azərbaycanda geriyə yol yoxdur. Yəni keçmiş quruluşa yol yoxdur, sosializmin, yaxud kommunizmin bərpasına yol yoxdur, totalitarizmə yol yoxdur. – bunların heç birisinə yol yoxdur. Biz irəliyə gedirik, demokratiya, plüralizm, mətbuat azadlığı yolu ilə gedirik və bu yolla da gedəcəyik. Bu, asan yol deyildir. Bu, *çətin* yoldur [XXIXc.s.257-258].

Əgər bir qisim situasiyalarda frazeologizm mətni tamamlamaq anlamında işlənirsə, bəzən də mətnin önündə özünə yer alır. Məs: “uzağa çəkilmək” frazeologizmində Heydər Əliyev onu sevən, onu müdafiə edənlərlə, öz mənafeyini düşünən “uzağa çəkilənləri” qarşılaşdırır: “Ona görə də Azərbaycan prezidenti və Yeni Azərbaycan Partiyasının sədri kimi mənim əsas gücüm, əsas mənbəyim xalqdır. 1987-ci ildə mən bütün işlərdən kənar olandan sonra vaxtilə mənimlə vəzifələrdə işləmiş insanlar *uzağa çəkildilər*. Bəzisi xəyanət etdi. Bəzisi sadəcə, özünü qorumaqla məşğul oldu, – mən onları anlayıram, bağışlayıram, yəni bağışlamışam, amma bunu yadımdan çıxarmıram. Ancaq insanların qəlbindən Heydər Əliyevi heç kəs çıxara bilmədi. Nə Qorbaçov hakimiyyəti, nə Vəzirov hakimiyyəti, nə Mütəllibov hakimiyyəti, nə Əbülfəz Elçibəy hakimiyyəti – heç birisi Heydər Əliyevi Azərbaycan xalqının qəlbindən çıxara bilmədi” [XXIVc.s.53].

Jurnalist: – Hesab edirik ki, bu anlaşmanın əleyhinə olanlar yeni güc toplayıb layihəyə qarşı bəzi fikirləri yaymağa çalışacaqlar. – Heydər Əliyev: “Bəli, bəli. Mətbuatda məqalə-

lər yazırlar, fikirlər söyləyirlər. Bəziləri elə fikir yaradırlar ki, bu, real deyil, bu işə görə, yəni boru xəttini tikə bilməyəcəklər. Bəziləri yenə də deyir ki, kəməri tikə bilməyəcəklər, ona görə ki, o qədər neft yoxdur. Şübhəsiz ki, bu fikirlər bütün məsələlərə mənfi təsir edir. Ancaq neft də var, boru xəttini də tikəcəyik. Amma bunu nə qədər tez başlasaq, bu işin qarşısını almaq istəyənlərin *ağzını* o qədər tez *yumacağıq*. Yummaq lazımdır" [XXIVc.s.158]. İndi beləəri gedib İstanbulda nümayiş keçirmək istəyir. Sən kimsən, səni tanıyan kimdir? Yaxud o birilərin hamısının səsi harada çıxıbdır? Altı ildir ki, biz dünyanın ən mötəbər kürsülərindən bu məsələlər haqqında fikir deyirik Azərbaycanın mənafelərini müdafiə edirik, konkret təkliflər veririk, lazımi qərarların qəbul edilməsinə nail oluruq. Bunları isə nə Biləcəridən o tərəfə tanıyanlar var, nə də bunlarda bir sabitlik var. Məhəbbət sabitliyi də yoxdur, dostluq sabitliyi də yoxdur. İndi belə adamlar düşüblər ortaya. Məsləhət görmürəm ki, onların təsiri altına düşəsiniz [XXIIIc.s.140].

Keçmişdə Sovetlər İttifaqının tərkibində olarkən Azərbaycan idmanı inkişaf edibdir, Azərbaycan idmançıları gözəl nəticələr göstəriblər. Ancaq bizim müstəqilliyimiz olmadığına görə, başqa sahələrdə olduğu kimi, idmanda da əldə edilən nailiyyətlər Ümumittifaq qazanında həzm olunubdur. Bəlkə bunlar da Azərbaycanda idmanın istənilən səviyyəyə qalxmasına maneçilik törədibdir. Ancaq indi respublikamızda, müstəqil Azərbaycan dövlətində idman özünə layiq yerini tutubdur [XXIXc.s.378].

Başqa bir nitq məqamında isə öncə frazeologizmlər gəlir, onun ardınca həmin frazeologizmin mənası auditoriya üçün açıqlanır. "Rahat nəfəs almağın" təfərrüatları bircə-bircə auditoriyanın diqqətinə çatdırılır. "Gəncə şəhərindən indi mənə məlumatlar gəlir, insanlar deyirlər ki, biz artıq *rahat nəfəs ala bilirik*. Bu qeyri-qanuni silah saxlayan, oğru, quldur,

cinayətkar adamlar insanlara terror edir, gəlib camaatın uşaqlarını oğurlayır, hətta evdən adamları oğurlayır, cürbəcür başqa cinayət edirdilər. Camaat müəyyən qədər rahatlandı. Deyə bilmərəm ki, tamam rahatlanıb, çünki içərimizdə belə cinayətkarlar hələ var. Siz heç güman etməyin ki, biz bununla qurtarmışıq. Yox, indi bu cinayətkarların bəzisi yaxalanıb, bəzisi qaçıb, bəzisi gizlənib. Ancaq bu gün bir şey məlumdur ki, Azərbaycan xalqı öz müstəqilliyinin keşiyindədir. Azərbaycan xalqı öz dövlətini dəstəkləyir, müdafiə edir və bu da xalqımızın əbədi müstəqilliyinin təminatıdır" [IIc.s.473].

22 sentyabrda 1994-cü ildə Heydər Əliyevin Milli televiziya və radio ilə çıxışında Milli Təhlükəsizlik Nazirliyinin təcridxanasından təşkil olunmuş şəkildə qaçırılanlara qarşı mübarizəyə "canlarını qurtara bilməyəcəkdir" frazeologizm ilə yekun vurulur: "Bu hadisə bizim üçün nə qədər ağır olsa da, mən istəyirəm ki, xalqımız bilsin. Heç kəs sınmamalıdır. Dediyim kimi, Azərbaycan xalqı, müstəqil respublikamız çox sınaqlardan çıxmışdır, bu sınaqdan da keçəcəkdir. Əminəm ki, bu təxribatı törədən qüvvələr öz payını alacaqlar. Onlar istədiklərinə nail ola bilməyəcəklər. Biz öz mövqeyimizdən dönməyəcəyik, Azərbaycanın müstəqilliyini qoruyub saxlayacağıq. Cinayətkarlar tapılacaq, cəzalandırılacaq və o qaçmış adamlar da Azərbaycan xalqının əlindən canlarını qurtara bilməyəcəklər." Nitq parçası "heç kəs" inkar əvəzliyinin üç yerdə təkrarı və "sarsılmamaq, sınmamaq, narahat olmamaq" sinonim cərgə ilə əminlik yaradılır. Sonra nitq "öz payını almaq" frazeologizmi ilə təxribatçı qüvvələrə yönəlir, necə deyərlər onların kürklərinə birə salır. Feilin qəti gələcək zamanında "dönməyəcəyik, saxlayacağıq" qətiyyətlilik ifadələri həm Azərbaycan xalqına, həm də cinayətkarlara anladılır.

Frazeologizmlərlə nitqdə emosionallıq yaratmağın bir yolu da bütöv mətn boyu həmən frazeologizmin təkrarlanmasıdır. Aşağıda verilən mətndə üç yerdə "səsini qaldırmaq"

frazeologizmi səslənir. İki yerdə bu frazeologizm ritorik sual tərkibində "səsini qaldırmaq" şəklində, bir yerdə isə inkarda "səsini qaldırmamaq" şəklində səslənir. Auditoriyanın yaddaşına mühüm dövlətçilik yolunda biganəliyin, süstlüyün nəyə gətirib çıxarmağı bu frazeologizmin təkrarı ilə həkk olunur: "Elçin Əfəndiyevi yazıçı, ziyalı necə deyərlər, hörmətli bir adam kimi dəvət elədim, bu vəzifəni ona təklif etdim. Yaxşı, Elçin Əfəndiyev, sənə nə olub ki, Surət kimi yaramaz adamın əlində əsir olmuşdun? Nə vaxt *səsini qaldırdın* ki, Surət burada qanunsuz işlər görür, bunları edir?

Yaxşı, ziyalı da, yaxud şair, yazıçı da *səsini qaldırmayanda* bəs nə olsun? Bəs belə adamlarla yalnız Heydər Əliyev mübarizə aparmalıdır, hamı ilə Heydər Əliyev döyüşməlidir? Belə şeymi olar? Sən yazıçısan, bilirsən ki, rəhmətlik Nazim Hikmətin bir sözü vardır. Azərbaycanda onu dəfələrlə deyirdilər, ancaq bu gün yerinə düşür, yenə deyim: sən yanmasan, mən yanmasam, o yanmasa, bəs kim yanacaq? Bəs sənin yanmağın haradadır? Bir ildən artıqdır ki, orada oturmusan, baş nazirin müavinisən. Görürəm ki, min dənə çirkin işlər görülür. Harada sən öz *səsini qaldırdın*, harada dedin ki, belə şey yaramaz?" [IIc.s.387].

Böyük natiqin dilində mətndə antonim frazeologizmlərə də az təsadüf olunmur. Təkcə "bel bağlamaq", söykənmək, etibarlı dost hesab etmək anlamında olan frazeologizm "arxa çevirmək" – frazeologizminin antonimi, antaqonistidir.

"Biz gələcəkdə də belə siyasi fəaliyyətə *bel bağlayacağıq*. Lakin siz bilirsiniz ki, vəziyyət bizdən daha konkret, daha qəti tədbirlər görməyi tələb edir" [Ic.s.216].

Başqa bir məqamda "arxa çevirmək" frazeologizminin işlənməsinin şahidi oluruq. "Mən ki, qayıtmışam, deməli, təcrübəm, zəkam, biliyim adamlara lazım olmuşdur. Deməli, dünya xali deyil, haqq və ədalət var. Axı, məni istefaya göndərməklə insafsızlıq etmişdilər. Sevdiyim, inandığım

adamların 95 faizi birdən-birə mənə *arxa çevirdi*. Çünki başqa adam gəlmişdi və fərdi maşınının, bağının əldən çıxmamasına, uşaqların yerbəyer edilməsinin və i.a. qayğısına qalmaq lazım idi. Onlar vicdanlarını bu şeylərə satdılar" [Ic.s.54].

Frazeologizmlərlə bağlı son illər aparılan ədəbiyyat araşdırmalarında türkdilli xalqların dilindəki frazeologizmlərə, onların mənşəyinə, müqayisəli öyrənilməsinə əhəmiyyət verildiyinin şahidi oluruq. Türkdilli xalqların işlətdiyi atalar sözlərinə, idiomlara, zərb-məsəllərə və s. münasibətdə Heydər Əliyev fikirlərini oxuyarkən təəccüb qarışıq heyranlığı gizlətmək mümkün deyil: "İndiyədək Türkiyənin Azərbaycan xalqına, müstəqil Azərbaycan Respublikasına etdiyi yardımlara görə mən bütün Türkiyə xalqına, Türkiyə Cumhuriyyətinə və Türkiyənin prezidenti hörmətli Süleyman Dəmirələ minnətdarlığımı, təşəkkürümü bildirirəm. Eyni zamanda, ümidvar olduğumu bildirmək istəyirəm ki, bundan sonrakı köməklər, yardımlar daha yüksək səviyyədə, daha da çox olacaqdır. Xalqlarımızın belə bir məsəli var: *uman yerdən küsərlər*. Yəni bir yerdən umursansa, oradan kömək gözləyirsən. Ummadığın yerdən isə kömək gözləməyin də əhəmiyyəti yoxdur. Biz bu hisslərlə, bu fikirlərlə sizin yanınıza gəlmişik və güman edirik ki, bizi düzgün başa düşəcəksiniz" [Ic.s.363]. "Xalqlarımızın belə bir məsəli var" ifadəsi isə Heydər Əliyev şəxsiyyətinin xaıq frazeologiyasına belə dərindən bələdliyindən xəbər verir. "Yəni" ifadəsi ilə məsələyə dilçi bir alim kimi öz izahını verir.

Qanad altında olmağın, başqasının himayəsində olmağın, hansı məntiqi nəticələrə gəlməsini özü demiş "analogiya", müqayisə yolu ilə anlatmağa çalışır, fəlsəfi bir müdrikliklə fikirlərini gənc nəslə çatdırır: "Ola bilər, bu analogiya sizə qəribə gəlsin, lakin təxminən belədir. Yenə də deyirəm, əgər prezident kimi mən sizi *qanadım altına alsaydım* sizə əlverişli şərait yaratsaydım, tapşırsaydım ki, sizə yaxşı bir bina da versinlər, o zaman sizin yaxşı işlərinizi də belə qələmə

verəcəkdilər ki, prezident kömək etdiyinə görə belədir, yoxsa, özləri belə bir şey deyillər. O vaxt belə fikir də yaranardı ki, Yeni Azərbaycan Partiyası bir şey deyildir" [IIc.s.526].

"Pis günün ömrü az olar" məsəlini Heydər Əliyev "qara günün ömrü az olar" şəklində auditoriyaya bəyan edir. Bu zaman "qara gün"ün antonimi kimi "ağ gün"dən də danışır: "Güman edirəm ki, qara günün ömrü az olacaq, xalqımız *ağ günlərə çıxacaq.* İnanıram ki, xalqımızda bu qüdrət, bu imkan, bu potensial var, sadəcə olaraq hamımız birləşib bunlardan istifadə etməliyik, bunları hərəkətə gətirməliyik" [Ic.s.101].

Hər bir dilin frazeologiya sisteminin inkişafı onun şair, yazıçı, siyasi liderlərinin nitqlərindəki frazeologizmlərin ümumişlək vəziyyətə keçməsi ilə zənginləşir. Heydər Əliyevin də dilində işlənən frazeologizmlər sırasında da "iqtidar-müxalifət mədəniyyəti yaratmaq" kimi çoxsaylı frazeologizmlər mövcuddur:

"Yeni Azərbaycan" partiyasının yaradılmasının 5-ci ildönümü münasibətilə keçirilən təntənəli yığıncaqdakı nitqdə "iqtidar-müxalifət mədəniyyəti yaratmaq" frazeologizmi yığıncaq iştirakçılarına, birbaşa translyasiya vasitəsilə milyonlar auditoriyasına bəyan edilir. Bu bəyanın ardınca həmin mədəniyyətin əsasları bircə-bircə açıqlanır. Yeni, müstəqil dövlət quruculuğu yolunda yeni bir ifadə özünə yer alır. Bu frazeologizmi eşidən həm iqtidar, həm müxalifət nümayəndələrini düşünməyə vadar edir: "Partiyalar dünya təcrübəsində mövcud olan partiya mədəniyyəti çərçivəsində, qanunlar çərçivəsində hərəkət etməlidirlər. Partiyaların bir çoxu müxalifətdə olan partiyalardır. Ancaq indi biz gərək iqtidar-müxalifət əlaqələrində də dünya təcrübəsini mənimsəyək və Azərbaycanda *iqtidar-müxalifət mədəniyyəti yaradaq*. Bəzən mən görürəm və qəzetlərdə də oxumaq olur ki, gərək iqtidar müxalifətlə hesablaşsın, müxalifətlə əlaqə saxlasın. Amma kim kiminlə əlaqə saxlamalıdır. Müxalifət iqtidarla əlaqə sax-

lamalıdır. Müxalifət düzgün hərəkət etməlidir, qanun çərçivəsində hərəkət etməlidir, iqtidara qarşı düşmənçilik nümayiş olmamalıdır. Müxalifət iqtidarı tənqid edə bilər, etməlidir, iqtidarın səhvlərini göstərməlidir, iqtidarın fikrindən fərqli olan öz fikrini bildirməlidir – bunlar təbii haldır... Müxalifətin normal fəaliyyət göstərməsi üçün bütün imkanlar yaradılıb, bundan sonra da yaradılacaqdır. Ancaq heç kəs bundan sui-istifadə etməməlidir” [XI IIc.s.282].

Heydər Əliyevin nitqində mətn üzrə antonim frazeologizmlərdən yerli-yerində istifadə olunur. Aqrar islahatlarla bağlı bir məqamda “ölçüb-biçmək” frazeologizmindən istifadə edirsə, “çünki məsələ çox ciddidir, mürəkkəbdir və bu məsələni həll etmək üçün gərək çox ölçüb-biçək”, başqa bir nitq məqamında “kor-koranə həyata keçirmək” frazeologizmindən uğurla yerindəcə yararlanır: “Respublikamızın təbii, iqlim xüsusiyyətlərinə, torpaqlarımızın imkanlarına münasib olaraq, eyni zamanda xalqımızın mentalitetinə, adət-ənənəsinə uyğun olaraq buna çalışmalıyıq. Əgər biz bunları nəzərə almasaq və hesablamasaq, onda bu islahatları kor-koranə həyata keçirəcəyik” [IIIc.s.62].

Yaxud “kor-koranə” frazeologizmi “götür-qoy etmək” frazeologizmi ilə antonimlik nisbətindədir: “Çox *götür-qoy etmişəm* və xeyli müddət bundan qabaq belə qərara gəlmişəm ki, bu orden bax, bizim şəxsiyyətlərimizə çatmalıdır” [IIc.s.387].

18 yanvar 1995-ci ildə “Qanlı Yanvar rəssamlıq sərgisinin açılışında 20 Yanvar faciəsinin xalqdan gizlədilməsini “ört-basdır etmək”, faciənin səbəbkarlarının müəyyən edilməsi və aşkarlanması məqsədilə “üstü açılmaq” frazeologizmini, bir sözlə antonim frazeologizmlərin işlənməsinin şahidi oluruq. “Ört-basdır etmək” frazeologizmi bir neçə dəfə təkrarlanaraq diqqəti faciənin gizlədilməsinə yönəldir: “Günahkarlar

kənarda qaldılar, öz şəxsi məqsədləri, mənafeləri üçün, xalqın tarixi faciəsini *ört-basdır etməyə çalışdılar*" [IIIc.s.122].

İkinci dəfə: "Mən belə hesab edirəm ki, bu səbəbə görə həmin hadisənin üstündən dörd il keçəndən sonra da onu *ört-basdır etməyə çalışmışlar*" [IIIc.s.124].

Çıxışının sonunda da bu frazeologizm iki yerdə təkrarlanır: "Təəssüf ki, o vaxt Azərbaycanı idarə edən, xalqın etimad göstərdiyi və xalqa xidmət etməli olan adamlar -əgər xalq etimad göstərməsəydi, onlar belə yüksək vəzifə tuta bilməzdilər get-gedə bu məsələni *ört-basdır etməyə çalışdılar*. Ona görə də bu məsələ dörd il lazımi səviyyədə müzakirə olunmadı, həqiqi geniş hüquqi-siyasi qiymət verilmədi. Günahkarlar kənarda qaldılar, öz şəxsi məqsədləri, mənafeləri üçün xalqın tarixi faciəsini *ört-basdır etməyə çalışdılar*" [IIIc.s.123].

Ört-basdır etməyin antonimi kimi "üstü açılmaq" frazeologizminin də öz yeri var: "Şübhəsiz ki, bunlar hamısı bəhanə idi. Çünki hərə bir tərəfdən qorxurdu. Hakimiyyətdə olanlar qorxurdular ki, onların günahlarının *üstü açılar*. Milli azadlıq uğrunda mübarizə aparanlar isə, təəssüf, nədənsə qorxurdular ki, onları xalqı ayağa qaldırmaqda, qırğına verməkdə günahlandıracaqlar" [IIIc.s.125].

Mətndə işlədilən frazeologizmlərə qədər auditoriya sanki bu deyimə hazırlanır. Dinləyici xalqın milli ruhunu, ovqatını əks etdirən frazeologizmi eşidənədək, necə deyərlər buna hazırlanır. Frazeologizm bu mətnin möhürbəndinə cevrilir, əbədi yaddaşlara hopur: "Qarşımıza çıxan çətinliklər çox olubdur. *Amma* ən böyüyü ondan ibarətdir ki, bilirsiniz, 1994-cü ilin oktyabrında və 1996-cı ilin martında Azərbaycan yenidən böyük təhlükə altında idi. *Çünki* dövlətimizə, müstəqilliyimizə qarşı dövlət çevrilişi cəhdi göstərilirdi. Həmin qüvvələr çox güclü, silahlı idi. *Amma* xalq buna imkan vermədi. Xalq dövlət çevrilişi cəhdinin qarşısını ala bildi. *Nə üçün? Çünki* dövlət ilə xalqın birliyi yaranmışdı. *Çünki* xalq

dövləti dəstəkləyirdi, apardığımız siyasəti bəyənirdi və ona görə də dövlətin, dövlətçiliyin müdafiəsində *sinəsini qabağa verdi*" [XXXc.s.213]. Öncə çətinliklər sadalanır, "ən" qüvvətləndirici ədatı ilə təhlükəli cəhdləri auditoriyaya açıqlayır. "Çünki" səbəb bağlayıcısını üç yerdə işlədərək bu cəhdlərin qarşısının alınmasını izah edir. Bu cəhdlərin qarşısının alınmasının "nə üçün" ritorik sualı və ona verilən cavablarla izah edir. Sonda "bəyənilən siyasətə" uyğun olaraq xalqın "sinəsini qabağa verməsini" nitqə gətirir.

Frazeologizmlər həmişə digər nitq ünsürləri ilə birgə səslənir, gah qətiyyət, gah səmimiyyət, gah da nikbinliklə. Məsələn: kütləvi informasiya vasitələri ilə keçirdiyi görüşdə (14 iyul 2001-ci il) Sovetlər dönəmində rəhbər işçilər üçün demaqoqların – göz dağı olanların varlığından danışır, "hesab etmirəm ki, işimizdə nöqsanlar, qüsurlar yoxdur, biz nə ediriksə, düz edirik" səmimi ifadələri işə salır. "Göz dağı olmağın" mahiyyətini, xüsusən də siyasi baxış bucağından onun mahiyyətini, semantik mənasını açıqlayır: "Şübhəsiz, elə hesab etmirəm ki, gördüyüm bütün işlər qüsursuzdur. Mən heç vaxt belə hesab etməmişəm və belə hesab etmirəm ki, işimizdə nöqsanlar, qüsurlar yoxdur, biz nə ediriksə, düz edirik. Elə buna görə də sovet vaxtı mən adamları həmişə tənqidə sövq edirdim. Xatirimdədir, Xruşov bir dəfə demişdi ki, hər kollektivdə, heç olmasa, bir nəfər demaqoq olmalıdır. Həmin demaqoq doğru danışsa da, doğru danışmasa da, həmin müəssisə rəhbərinin qarşısında göz dağı olacaqdır. Əgər o, nə isə bir əngəl çıxarsa, həmin demaqoq yenə də çıxış edəcəkdir. Həmin rəhbər belə düşünürdü. Mən isə, məsələn, burada Azərbaycana rəhbərlik etdiyim vaxtlarda həmişə istəmişəm ki, mətbuatımız, adamlarımız nöqsanlarımızı aşkara çıxartsınlar" [XXXVc.s.224].

Xəlqilik özünü burada da göstərir. Səməd Vurğunun "Vaqif" pyesində səslənən "göz dağı" frazeologizmi ilə paralellik yaranır:

*Aparın, aparın onu zindana*
*Göz dağı çəkdirin Azərbaycana!*

Heydər Əliyevin dilində inkarda işlənən frazeologizmlər prinsipial mövqe nümayiş etdirilən məqamlarda işlənir. Belə ki, Rusiya Federasiyasının və bir sıra başqa ölkələrin KİV rəhbərləri ilə görüşdəki söhbətdə (14 iyul 2001-ci il) Heydər Əliyev Qarabağ münaqişəsi ilə əlaqədar ATƏT-in bu sahədə fəaliyyətsizliyini açıqlayır. Dünya Birliyindən, ATƏT-dən ədalət istəyini bildirir. Sonda "əllərini ağdan qaraya vurmamaq" frazeologizmin köməyi ilə bütün bu fəaliyyətsizliyə qarşı kəskin mövqeyini nümayiş etdirir: "Biz heç bir şey istəmirik, biz haqq-ədalət istəyirik. Biz Dünya Birliyindən haqq-ədalət umuruq. Biz ATƏT-in Minsk qrupunun həmsədrlərindən və ümumiyyətlə, ATƏT-dən ədalət istəyirik. Bu yaxınlarda Portuqaliyanın Xarici İşlər naziri burada olmuşdur. Portuqaliya gələn ildən ATƏT-ə sədrlik edəcəkdir. Mən bu barədə ona danışdım. Dedim ki, yaxşı, siz 2002-ci ildə ATƏT sədri olacaqsınız. Mən ATƏT-in indiyədək neçə-neçə sədrini görmüşəm. Vaxtaşırı bir ölkə ATƏT-in sədri olur. İtaliya da, İsveçrə də olub, indi isə Ruminiyadır, bundan əvvəl də Polşa sədr olmuşdur. Onlar sədrlik edir, *əllərini ağdan qaraya vurmur*, xalq isə burada əziyyət çəkir" [XXXVc.s.217]. Mətndə "heç bir" inkar əvəzliyi ilə dönməz xarakter auditoriyaya açıqlanır. Sonra sədrlər bir-bir sadalanır, sonda isə xalqın əziyyət çəkməsi, beynəlxalq etik normaların pozulması leksik şəkildə dəyişikliyə uğrayan "əlini ağdan qaraya vurmamaq" inkarda işlənən frazeologizmlə nəticələnir.

Frazeologizmlər mətndə giriş və sonluqlar arasına düşərək ilk növbədə auditoriyanı səslənməyə hazırlayır. Frazeologizmi eşidən auditoriya səfərbər olunaraq çıxışın ardına maraqla qulaq asır.

"Dialoq Avrasiya" dərgisinin təqdimatında Novruz bayramı ilə bağlı mətn tədqiqata cəlb olunmuşdur. Ənənəvi olaraq mətnin başlanğıcında dinləyicilərə bu dərgidəki məqalə haqqında, eləcə də bu bayramın Sovetlər Birliyi zamanı statusu haqqında məlumat verilir, necə deyrlər, auditoriya dinləməyə hazırlanır: "Dərginin birinci nömrəsində bir neçə ölkə, bəzi adət-ənənələr haqqında məlumatlar vardır. Məni çox sevindirən Novruz bayramı haqqındakı məqalələr oldu. Nə üçün? Çünki Novruz Bayramı qədim zamanlardan Azərbaycan xalqının ən istəkli bayramı olmuşdur. Doğrudur, sovet hakimiyyəti vaxtında buna məhdudiyyət qoyulmuşdur. O mənada ki, bu, bir ictimai məna, xarakter daşıyan bayram kimi qeyd olunmuşdur" [XXVIIIc.s.118-119]. Bayramla bağlı öz sevinc hissini auditoriya ilə "nə üçün" ritorik sualı ilə "çünki" səbəb bağlayıcısı ilə bölüşür, "doğrudur" modalı ilə bu bayramın keçmişdəki mövqeyini aydınlaşdırır.

Sonrakı nitq mərhələsində Türkiyə prezidenti Süleyman Dəmirəlin dili ilə "bəs" sual ədatı ilə ritorik sual verərək Novruzun ümumtürk bayramı olduğunu nəzər-diqqətə çatdırır: "Novruz bayramı şənliklərini, buradakı kütləvi mərasimləri, hər bir azərbaycanlının bu bayramı nə qədər qiymətləndirdiyni görənlər mənim dostum, qardaşım Süleyman Dəmirələ bunların hamısını danışandan sonra o demişdi ki, *bəs* biz indiyə qədər niyə bu bayramı belə qeyd etmirik?" [XXVIIIc.s.119].

Artıq səmimiyyətə söykənən (açıq demək istəyirəm), xalqların iradəsinə güc etməyərək (təbiidir ki) "calamaq istəməmək" inkar frazeologizmini dilə gətirir: "Türkiyədə də Novruz bayramını qeyd etməyə başlamışlar. Amma hələ zəif qeyd edirlər. Mən bunu dostlarıma açıq demək istəyirəm.

Təbiidir ki, bununla heç kimə heç bir şeyi *calamaq istəmirəm*. Ancaq bu bizim bütün xalqlarımızın qədim bayramıdır" [XXVIIIc.s.119].

"Calamaq istəməmək" frazeologizmindən sonra "güman edirəm ki" modalı ilə bu bayramın gələcəkdə geniş vüsət tapacağına olan inamını bildirir və auditoriyanı da bu ovqata yükləyir: "Bütün ölkələrdə hamı biləcəkdir ki, Novruz bayramı nədir. Güman edirəm ki, həmin Novruz bayramını Azərbaycanda olduğu kimi qeyd edəcəklər. Məni bağışlayın, amma mən bu gün iftixar hissi ilə deyirəm ki, Novruz bayramı Azərbaycanda qeyd edilən kimi indiyədək heç bir yerdə keçirilməyibdir. Yəni bizim xalqımız bu adət-ənənəni saxlayıbdır" [XXVIIIc.s.120].

Araşdirmalar Heydər Əliyevin dilində bir sıra frazeologizmlərin, xüsusən "yol"la bağlı frazeologizmlərin daha çox yayıldığını göstərir.

"Yol" məfhumu, "yol" konsepti Heydər Əliyev dilində qanunçuluq, nizam-intizam, məsuliyyət hissi deməkdir. Qanunu pozanlara, qanunsuz əməllər törədənlərə "*pis yollara düşmək*" frazeologizmi yön alır: "Ona görə də sonrakı dövrdə gəlib pis yollara düşdülər" [VIIc.s.482].

Elə "pis yola düşən"ləri növbəti frazeologizm ilə Heydər Əliyev, necə deyərlər "yola gətirmək" istəyir. "Yola gətirmək" frazeologizmində sülhə, qanunlara əməl etməyə çağırış sədası duyulur: "Mənə ultimatum göndərdilər ki, Heydər Əliyev istefa verməlidir, yoxsa biz onu öldürəcəyik. Dedim ki, mən belə şeyləri çox görmüşəm və qorxmuram. Mən onlarla çox danışıqlar apardım, onları *yola gətirmək istədim*. Amma *yola gəlmədilər*" [IXc.s.318].

Məsələləri, problemləri həll etmək baxımından "*yoluna qoymaq*" frazeologizmi yarıməişət, yarıpublisistik üslubda işlədilir: "Andropov dedi ki, mən düzgün hərəkət etmişəm və

mənim əleyhimə çox da çıxmasınlar deyə, bu məsələni burada *yoluna qoymağa söz verdi*" [IXc.s.100].

"Pis yollara düşmək" frazeologizminin sinonimi kimi başqa bir məqamda "əyri yolla getmək" frazeologizmi dilə gətirilir. Bu frazeologizm "pis yola düşməkdən" bir qədər yumşaq və özünəməxsus şəkildə səslənir: "Adətən belə də olur. İnsan bir *əyri yola gedirsə*, o *əyri yoldan çəkinmək* çətin olur. Bəzən deyirlər ki, insan nəyə görə alkoqolik olur? Hər bir alkoqolik anadangəlmə belə olmur ki!" [XVc.s.17].

"Hamar yola çıxmaq" frazeologizminin sinonimi kimi "geniş yola çıxmaq" auditoriyaya ünvanlanır: "Ancaq bu gün iftixar hissi ilə demək olar ki, Azərbaycan xalqı uzun illər böyük, *ağır yol* keçərək öz milli azadlığını, dövlıt müstəqilliyini əldə etdiyi kimi Azərbaycanın təhlükəsizlik orqanları da artıq *geniş bir yola çıxmışlar"* [XVc.s.110].

"Yol üstündə olmaq" frazeologizmi Həcc ziyarətinə gedən zəvvarların bir qrupu ilə görüşdə dini üslubun tələblərinə uyğun sadə, səmimi cümlələrlə qəlblərə yol açır: "Mən sizinlə bir neçə saat söhbət etmək arzusundaydım. Güman edirəm ki, biz vaxt tapıb bunu edəcəyik. Ancaq siz indi *yol üstündəsiniz*, mənimlə sizdən sonra daha bir görüşüm vardır. Xoşbəxt adamlarsınız ki, Məkkə və Mədinəni ziyarət etmək sizə nəsib olubdur" [XVc.s.127].

"*Enişli-yoxuşlu yol* olmaq" frazeologizmini – Azərbaycan ədəbi-bədii ədəbiyyatında çox təsadüf etdiyimiz frazeologizmini Heydər Əliyev bazar iqtisadiyyatı ilə bağlı, sahibkarlıqla bağlı çıxışlarında, eləcə də müstəqilliklə bağlı mübarizədə tez-tez işlədir: "Mən bir də qeyd etmək istəyirəm ki, sahibkarlıq yolu Azərbaycanda, bütün keçmiş Sovetlər İttifaqında çox *enişli-yoxuşlu yoldur*" [VIIc.s.230].

Auditoriyalarda gələcəyə nikbinliklə, əminliklə baxmaq məqamlarında "hamar yola çıxmaq" frazeologizmi istifadə olunur. Qəti gələcək zamanda işlədilən "hamar yola çıxa-

cağıq" ifadəsi səfərbəredici ruh aşılıyır: "Əminəm ki, biz hamımız onu uğurla dəf edəcəyik və xalqımızın müstəqillyinin və gələcəyinin hamar yoluna çıxacağıq" [VIIc.s.450].

Həyatın müxtəlif sahələrində yeni istiqamətlərin təyini baxımından "yol açmaq" frazeologizmi dilə gətirilir: "Ancaq bu bir neçə qanunun qəbul olunması üçün yol açacaqdır" [VIIc.s.93].

Prinsipial mövqe tutmaq, düzgün istiqamət götürmək məqamlarında "*doğru* yol tutmaq" frazeologizmi auditoriyalara ayaq açır: "Ona görə də mən sizi təbrik edirəm, çünki sizin Böyük Millət Məclisində bəzi məsələlərdə tam birlik, yekdillik də ola bilir. Siz bunu qiymətləndirirsiniz, biz də kənardan buna diqqət yetiririk ki, siz *doğru yol tutdunuz* və bir nəfərin namizədliyi üzərində dayandınız" [XXVIIc.s.401].

Doğru və düzgün mövqedən yayınanları Heydər Əliyev bir qədər yumşaq formada tənqid etməyə üstünlük verir. Jurnalistlərlə müsahibəsində "yollarını bir az əyiblər" deməklə doğru mövqeyə qayıtmaq şansının qaldığını göstərir: "Amma çox təəssüf edirəm ki, qəzetlərimiz, o cümlədən jurnalistlərimiz – indi qəzetlərin əksəriyyəti, jurnalistlərin bir hissəsi müxalifət mövqeyindədir – *yollarını bir az əyiblər"* [XXVIIc.s.107].

Yolla bağlı frazeologizm digər bir somatik frazeologizmlə birgə səslənərək yüksək ekspressivlik yaradır. "*Əyri yoldan əl çəkmək*" mürəkkəb frazeologizmi kimi: "Salonda oturan, yaxud dəhlizdə, kənarda duran adamları bütün günü başa salmaq istəyirdik k, *əyri yoldan əl çəkin*" [XXIIc.s.274].

Müəyyən bir problemin həllinə çarə etmək anlarında "*yolunu tapmaq*" frazeologizmi xəlqiliyə söykənərək bu yolun nədən ibarət olmasını auditoriyaya anladır: "Azərbaycanın özünün dövlət vəsaiti, büdcəsi belə böyük istehsal müəssisələri, o cümlədən elektrik stansiyaları yaratmaq imkanına malik deyildir. Ancaq biz bunun da *yolunu tapmışıq***.** Bu yol

da ondan ibarətdir ki, biz dünyanın həm məşhur bankları, həm də böyük şirkətləri ilə başqa sahələrdə əməkdaşlıq etdiyimiz kimi, elektrik enerjisi sahəsində də çox sıx əməkdaşlıq edirik" [XXIc.s.279].

Elə "yolunu tapmaq" frazeologizmi ilə yanaşı "yol aramaq" da böyük natiqin dilində özünə yer tapır: "Azərbaycanı bu vəziyyətdən çıxarmağın *yollarını arayırıq*" [Ic.s.165].

Daha bir "yol"la bağlı frazeologizm – "sağlam yolla getmək"dir. Heydər Əliyev üçün sağlamlıq partiyalar üçün "demokratiyanı inkişaf etdirmək", "konstruktiv mövqedə olmaq", "müstəqilliyi inkişaf etdirmək", "sabitliyi qorumaq, saxlamaq"dır: "Azərbaycanda partiya çoxdur. Azərbaycan iqtidarı və Yeni Azərbaycan partiyası ilə əməkdaşlıq edən bir çox partiyalar vardır. Onlar sağlam fikirli partiyalardır. Güman edirəm ki, həmin partiyaların nümayəndələri qurultayımızda iştirak edirlər. Bu partiyalar həqiqətən *sağlam yolla* gedən partiyalardır" [XXIVc.s.52].

İqtisadi məsələlərin inkişaf tempi ilə əlaqədar məsələlərdə "geriliyə yol vermək" frazeologizmi özünə yer alır: "Əgər hazırda biz iqtisadiyyatımızın bir qismini hələ özəlləşdirə bilməmişiksə, bu ona görə deyil ki, biz bu məsələdə hansısa bir *geriliyə yol veririk* – yox, bu iş planla gedir və planla da gedəcəkdir" [XXVIIc.s.36].

"Pis yola salmaq" frazeologizmi bir qrup insanların digərlərini qanunları pozmağa təhrik etmələri kimi başa düşülür: "Bu gün bizə məlumatlar gəlir ki, 8-ci kilometrdəki həmin bazaya – Xüsusi Təyinatlı Polis Dəstəsinin yerləşdiyi bazaya çoxlu kənar adamlar gəlirlər, orada qızışdırıcı danışıqlar aparırlar. Ayrı-ayrı adamlar bundan sui-istifadə etməyə, onları qızışdırıb *pis yollara salmağa* çalışırlar. Ona görə də bunların hamısını müşahidə edərək mən tez danışıqlar aparıb, bu məsələnin qurtarmasına çalışıram" [IIc.s.357].

Bəzən "yol"la bağlı bir neçə frazeologizm ardıcıl işlənərək qanunlara riayət olunmasını ardıcıl şəkildə tələb kimi ortaya qoyur: "Ona görə də, onlara bir daha *sülh yolu, doğru yol* göstərirəm, məsləhət verir və tələb edirəm ki, yaranmış bu ağır vəziyyətdə özlərinin vətənpərvərliyini, vətəndaşlığını başa düşsünlər. Əgər onlar, doğrudan da, müstəqil Azərbaycanın dövlətçiliyinə sadiqdirlərsə, müstəqil Azərbaycan uğrunda çalışmaq istəyirlərsə, *düz yola gəlsinlər*" [IIc.s.358].

Burada "başa düşsünlər", "düz yola gəlsinlər" ifadələri ilə feilin əmr şəklində auditoriyalara dövlətçiliklə bağlı qətiyyətlilik aşılayır.

Başqa bir "yolunu azmaq" frazeologizmi qanunu pozanlara münasibətdə bir qədər yumşaq şəkildə səslənərək ağsaqqal öyüdü kimi səslənir: "Amma elə adamlar var ki, ola bilər, *yolunu azıblar*, yanılıblar, yaxud təsadüfən gəlib cinayətkarların təsiri altına düşüblər" [IIIc.s.325].

"Yol"la bağlı frazeologizmlər arasında qanunların pozulmasına, cinayət törədilməsinə şərait yaradılması mənasında "yol vermək", qanun pozuntularının qarşısını almaq anlamında isə "yol verməmək" kimi inkarda işlədilən frazeologizmlər də mövcuddur: "*Axı* bütün bunlar Rusiya rəhbərliyinə çox gözəl məlum idi. Onlar nə üçün tədbirlər görmədilər, nə üçün vəziyyətin bu yerə gəlib çatmasına yol verdilər" [XXIIc.s.32]. Əks mənalı "yol verməmək" də böyük natiqin dilində az yer tutmur: "Lakin biz buna yol verməyəcəyik" [XXIIc.s.37].

Heydər Əliyevin nitqində frazeologizmlərin tədqiqi təbii ki, cümlə daxilində mümkün deyildir. Bu baxımdan frazeologizmlərin işləndiyi bütöv çıxışlar tədqiqat obyektinə çevrilir. Çıxışlarda səslənən frazeologizmlərə zaman və məkan baxımından diqqət yetirmək tələb olunur.

Azərbaycan Milli Təhlükəsizlik Nazirliyinin əməkdaşlarının bir qrupu ilə görüşdəki nitqdə işlənən frazeoloji birləşmələr bütöv mətnin – çıxışın məzmununa uyğun gəlir. 28

mart 1998-ci ildə Respublika Sarayındakı bu nitqdə çətinliklər, bu çətinliklərdən şərəflə çıxan xalq və onun milli təhlükəsizlik orqanları çıxışın ön hissəsində yer alır: "Ancaq bu gün iftixar hissi ilə demək olar ki, Azərbaycan xalqı uzun illər böyük, *ağır yol keçərək* öz milli azadlığını, dövlət müstəqilliyini əldə etdiyi kimi, Azərbaycanın təhlükəsizlik orqanları da artıq geniş bir yola çıxmışlar" [XVc.s.110]. "Yol" anlayışı Heydər Əliyevin dilində burada zaman kəsiyi (ağır yol) və məkan (geniş yol) mənasında işlədilir.

Heydər Əliyevin nitqində auditoriyanın yaddaşında həkk olunmaq baxımından, lazımi dövlət orqanlarını səfərbər etmək baxımından təkrarlardan istifadə monoqrafiyanın II hissəsində öz əksini tapmışdır. Belə təkrarlar frazeologizmlərdən də yan keçmir. Məsələn, Dövlət Yol Polisinin işiylə bağlı bir neçə məqamda böyük natiq "canını qurtarmaq" frazeologizmini təkrarlayır: "Sənədini qurdalayır-qurdalayır, o qədər qurdalayır ki, bu adam boğaza yığılıb, *canını qurtarmaq* üçün ona müəyyən qədər pul verir" [XLc.s.95]. "Əgər bununla onun *canı qurtarmış olsa*, bəlkə də buna dözmək olar" [XLc.s.95]. "Usubov mənə deyir ki, 300 nəfər DYP işçisini ixtisar etdik. Dedim, yaxşı. Axı mənim də ordan-burdan tanışlarım var. Oradan xəbərlər gəlir ki, vallah, sizə dua edirlər, nə yaxşı bizim *canımız* DYP işçilərindən *qurtardı*" [XLc.s.96].

Heydər Əliyevin dilində işlənən frazeologizmlərin mətndən kənar izahı çətindir. Məhz ona görə də böyük natiq özü frazeologizmləri mətndə izah şəklində verir. Məsələn: "qabağa qaçmaq" frazeologizmindən öncə tələsməməyi, ehtiyatlı olmağı, populizmə yol vermək təhlükəsini anladır. "Ancaq mən hələ bu gün də bütün ehtiyatların müəyyən edildiyinə əmin deyiləm. Bizim neftçilər kimi, onlar da həmişə ehtiyatlılıq göstərir, minimumdan danışırlar. Görünür, onlar düzgün edirlər, çünki *qabağa qaçmaq* lazım deyil, minimumdan danışmaq gərəkdir, bundan artıq olanlar isə yenə bizə

qalacaqdır. Bir baxın "Şahdəniz" yatağının işlənməsi, nəticə əldə olunması, qəti rəqəmlərin və qazın ixrac marşrutunun müəyyənləşdirilməsi, sazişin hazırlanması və imzalanması işləri neçə illərdir – 1996-cı ildən 2001-ci ilədək davam edir" [XXXVIc.s.212].

Nitqin milyonların şüuruna yönəlməsində Heydər Əliyev dühası həmişəki kimi auditoriyanı səfərbər edir. Bəzən elə frazeologizmlər işlənir ki, o neologizm təsiri bağışlayır. Sonda isə məlum olur ki, bu neologizm yox, Heydər Əliyev sözüdür. Məs. "Çəhrayı eynəkdən baxmaq" – bu heç də çox işlənən frazeologizm deyil. Amma mətndə bu frazeologizmə diqqət etdikdə çox şey məlum olur: "Mən ümidvaram ki, biz qarşıdakı günlərdə də nəzərdə tutulmuş tədbirləri həyata keçirəcəyik, 19 oktyabr bayramını hamımız yüksək əhvali-ruhiyyədə qeyd edəcəyik və irəliyə gedəcəyik. Biz bu bayram ərəfəsindəyik. Ümumiyyətlə, bu onilliyi qeyd edərkən heç də hər şeyə *çəhrayı eynəkdən baxmamalıyıq*. Həqiqət həqiqət kimi olmalıdır. Bu gün burada nailiyyətlərdən danışdılar. Amma nöqsanlar da çoxdur. Mən də replikalarımda bu barədə dedim. Bir də deyirəm, çatışmazlıqlar da çoxdur, qüsurlar da az deyil, bəzilərində həddindən artıq çoxdur. Bizim ən əsas vəzifəmiz xalqın həyat tərzini – mən bütün xalqı nəzərdə tuturam – rifah halını yaxşılaşdırmaqdır, bu sahədə hələ qarşımızda çox böyük vəzifələr var. Heç vaxt düşünməməliyik ki, biz hər şeyi etmişik" [XXXVIc.s.227]. Bu frazeoloji birləşmə ətrafında səmimiyyət ("çatışmazlıqlar da çoxdur", "qüsurlar da az deyil"), nikbinlik ("mən ümidvaram ki,"), qətiyyət ("heç vaxt düşünməməliyik") harmonik şəkildə çulğalaşır.

Bir sıra hallarda frazeologizmlər Heydər Əliyevin dilində özünəməxus çalarlar qazanır. Məsələn, "kənarda hürmək" frazeoloji birləşməyə öz əlavəsini edir ki, bu zaman sabit birləşmənin tərəfləri arasına sözlər daxil olur. Bu sözlər frazeologizmin təsir gücünə heç bir maneçilik törətmir

[XXXVc.s.29]. *İt hürər, karvan keçər* – Yəni itin hürməyi karvanın keçməsinə mane ola bilməz. Olsa-olsa karvandakıların psixoloji cəhətdən rahatlığını poza bilər; "Ancaq indi kənarda bir az hürənlər var" cümləsindəki "kənarda hürmək" frazeologizmi mətndə, sonluqda elə işlənir ki, qarşı tərəfdə narahatlığa əsas vermir: "Yəni bu barədə Amerika Birləşmiş Ştatlarının dövləti ilə bizim aramızda heç bir fikir ayrılığı yoxdur. Ancaq siz bilirsiniz ki, *maneçilik göstərənlər* də var. Mən bunu ona görə demirəm ki, maneçilik göstərənlər bir şeyə nail ola bilərlər. Yox, heç bir şeyə nail ola bilməzlər. Ancaq görürsünüz, çalışırlar. Amma bizim narahatçılığımız yoxdur və heç kəs də bizə mane ola bilməz. Ancaq indi *kənarda bir az hürənlər* var" [XXVc.s.29].

Frazeoloji vahidlər atributivlik baxımından böyük natiqin çıxışlarında tədqiqi bu sahəyə diqqət yetirilməsini gündəmə gətirir. Müəlliflər bu tip frazeologizmləri iki böyük qrupa bölünür [205, 260].

Komponentlərindən biri sifətlə ifadə olunan, lakin özü bu bütövlükdə əlamət bildirməyən frazeologizmlər. Bu qrupa həm feili, həm də qeyri-feili frazeologizmlər daxildir. H. Bayramov [37] qeyri-feili frazeologizmləri aşağıdakı kimi qruplaşdırır:

Sifət + isim modeli əsasında yarananlar; İsim + isim modeli əsasında; İsim + sifət modeli əsasında; İsim + zərf modeli əsasında tərkibində say olanlar; Sifət + isim –ağ gün, ağ yalan H.Bayramov [37] qeyri-feili frazeoloji birləşmələrin bir tipi kimi də qrup təşkil etməyən qeyri-feili frazeologizm ayırır. ***Ağır sahə*** – iqtisadiyyatda, təsərrüfatda pozulma; idarə etmədə çətinlik yaranma; "Dedim ki, get ora, ağır sahədir, burada oğurluq olub, qanunsuzluqlar var" [IIc.s.386]. Burada sifət kimi "ağır", isim kimi "sahə" uzlaşaraq həyatda ümumişlək bir frazeologizm yaradır.

Frazeologizmlərin mətnin sonluğuna düşməsi heç də təsadüfi deyildir. Müsahibələrinin birində Azərbaycanın düşdüyü bu ağır vəziyyətə dünyanın biganəliyinə "ürək ağrısı" ilə cavab verir. Auditoriya atributivləşmiş isim+isim frazeoloji birləşməsini siyasi lider dilindən eşidərək hadisələrin dərinliyinə baş vura bilir: "Ona görə də bu gün, açığını deyim, şübhə etməyə başlayıram, görəsən, doğrudanmı bütün kiçik və böyük dövlətlər, bütün beynəlxalq təşkilatlar beynəlxalq hüququn sarsılmazlığı, hər bir dövlətin beynəlxalq aləmdə tanınmış çərçivəsində suverenliyinin, ərazi bütövlüyünün və sərhədlərinin toxunulmazlığı mövqeyində möhkəm dayanır? Bax, vəziyyət belədir. Mən bir daha bu barədə *ürək ağrısı ilə danışıram*" [XLc.s.59].

XX əsrin 90-cı illərində Təhlükəsizlik Nazirliyində baş verən nöqsanları, çatışmazlıqları sadalayaraq əmin olduğunu bildirir ki, "belə səhvlər, cinayətlər, xəyanətlər... bir də baş verməyəcəkdir". "Bir də baş verməyəcək" frazeologizmi ilə belə hallardan həm nəticə çıxarılacağı inamı, həm də təkrarlanmamaq əminliyi ortaya qoyulur: "Əmin olduğumu bildirmək istəyirəm ki, keçən illərin bütün hadisələrindən lazımi nəticələr çıxaracaqdır. Buraxılan səhvlər, cinayətlər, xəyanətlər artıq bu gün sabitləşmiş Azərbaycn dövlətinin milli təhlükəsizlik təşkilatında bir də *baş verməyəcəkdir*. Mən buna inanıram və bu gün bu inamla da sizi qəbul edirəm" [XVc.s.113].

Heydər Əliyevin dilində bəzən frazeologizmlərin leksik ardıcıllığında dəyişmələr görünür. Bu dəyişmələri auditoriya eyni mənada qarşılayır: "Gedin onlara baxın, müdafiə edin, onların haqqında düşünün. Elə üç nəfər adamı dilinizə almısınız. Elə bil ki, nə bilim, bunlar sizin üçün Allahdır, peyğəmbərdir, nədir. Axı bir var, qeyri-hökumət təşkilatı, bir də var siz. Siz qeyri-hökumət təşkilatısınız? – Yaxşı, niyə o

qeyri-hökumət təşkilatlarının sözlərini *almısınız dilinizə* və fırlayırsınız, fırlayırsınız, fırlayırsınız" [XXXVIIc.s.216].

Frazeologizmlərin semantik vahid olması elə böyük natiqin dilində öz əksini tapır: Məsələn, "özünü öldürmək" frazeologizmini əsasən də xalq dilində çox təsadüf olunan bu frazeologizmi elm adamları qarşısında (Azərbaycan Dövlət İqtisad Universitetinin 70 illik yubileyinə həsr olunmuş təntənəli mərasimdəki çıxışda) dilə gətirir. "Mən bunu məcazi mənada deyirəm" deməklə dilin dərin qatlarına bələdliyini nitqində səsləndirməklə frazeologizmlərə öz izahını – Heydər Əliyev süzgəcindən gələn izahını verir: "Bilirsiniz, indi zaman keçib, bəzi şeyləri demək olar. Mən Rəşid Behbudovu Sosialist Əməyi Qəhrəmanı adı verilməsinə təqdim edəndə dedilər ki, SSRİ-də bu janrdan olan heç bir artist belə ad almayıbdır. Mən dedim, ola bilər, almayıb, amma Rəşid Behbudov onların hamısından üstündür. Demək, o, almalıdır. Dedilər ki, yox, siz niyə elə düşünürsüz Rusiyada da çox böyüklər var. Dedim, var, onlara verin, mən sizə mane olmuram. Ancaq Rəşid Behbudov almalıdır. İndi bunu da deyim ki, birinci dəfə keçmədi. Bir ildən sonra yenə də məsələni qaldırdım və buna nail oldum. Əgər bir dəfə alınmadısa, alınmadı, Rəşid Behbudovdan ötrü *özümü* gedib orada *öldürməliydim*?! Amma etdim, *özümü öldürdüm* – yəni məcazi mənada deyirəm – ancaq nail oldum" [XXXIXc.s.101].

Beləliklə, Heydər Əliyevin nitqində səslənən frazeologizmlərin mətndə yerini aşağıdakı kimi təqdim etmək mümkündür:

– Əgər bir qisim situasiyalarda frazeologizmlər mətni tamamlamaq anlamında işlənirsə, bəzən də mətnin önündə özünə yer alır;

– Frazeologizmlər təkrarlanmaqla mətnin auditoriyalarda ekspressivliyini, yaddaşlara həkk olunmasını sürətləndirir;

– Eyni frazeologizmlər mətndə həm təsdiqdə, həm də inkarda az işlənmir;

– Prinsipial mövqe nümayiş etdirilən məqamlarda inkarda işlənən frazeologizmlər daha çox işlənir;

– Mətndə antonim frazeologizmlər yerli-yerində işlənir;

– Müstəqillik yolunu seçən ümummilli liderin dilində “yol”la bağlı frazeologizmlərə çox təsadüf edilir;

– Mətndə işlədilən frazeologizmlərə qədər auditoriya sanki bu deyimə hazırlanır. Dinləyici xalqın milli ruhunu, ovqatını əks etdirən frazeologizmi eşidənədək, necə deyərlər buna hazırlanır. Frazeologizm bu mətnin möhürbəndinə cevrilir, əbədi yaddaşlara hopur;

– Heydər Əliyevin dilində işlənən frazeologizmlərin mətndən kənar izahı çətindir. Məhz ona görə də böyük natiq özü frazeologizmləri mətndə izah şəklində verir;

Frazeologizmlər həmişə digər nitq ünsürləri ilə birgə səslənir, gah qətiyyət, gah səmimiyyət, gah da nikbinliklə;

Heydər Əliyevin dilində frazeologizmlərlə nitqdə emosionallıq yaratmağın bir yolu da bütöv mətn boyu həmən frazeologizmin təkrarlanmasıdır;

Az da olsa frazeologizmlərdə polisemiya hadisəsi ulu öndərin də nitqlərində müxtəlif zaman kəsiklərində, fərqli auditoriyalarda yer alır;

Elə bu substantivləşmiş frazeologizmlərin Ulu Öndərin nitqində də siyasi situasiyalara uyğun seçilməsi maraq doğurur;

Heydər Əliyevin dilində işlənən frazeologizmlərin mənşəyi barədə düşünərkən xalqımızın dini, məişəti, yaşadığı ərazinin coğrafi mövqeyi, yaşadığı ictimai-siyasi hadisələr araşdırma obyektinə çevrilir;

Heydər Əliyev dilində frazeologizmlər mətnin ümumi mənasının yekunlaşdırıcı sözü kimi çıxış edir.

Heydər Əliyevin çıxışlarında səslənən bir qisim frazeologizmlər mürəkkəb cümlənin işlənməsindəki ekspressivliyi gücləndirməklə nitqin kütlələrə təsir gücünü dəfələrlə artırmış olur;

Yazıçı və şairlərin yaratdıqları frazeologizmlərdən də yeri gəldikcə Heydər Əliyev istifadə edir və bu zaman sitat gətirdiyi şəxsləri auditoriyaya tanıdır;

Quruluş etibarilə mürəkkəb feil olan həmin feillərin əksəriyyətinin "eyni zamanda frazeoloji vahid olması" da elmi ədəbiyyatda vurğulanır. Heydər Əliyev dilində də bu tip mürəkkəb feili frazeologizmlərə tez-tez təsadüf edilir. Bu sıraya "göstərmək", "gəlmək", "döymək" və s. feillərin yaratdığı frazeologizmlər aid ola bilər;

Heydər Əliyevin dilində bəzən loru leksikada işlənən frazeologizmlərə rast gəlirsə, həmin frazeologizmlərə auditoriya qarşısında izah verilir. Auditoriyanı çaşqınlıqdan çıxararaq yüksək etik dəyərləri ortaya qoyur. Məsələn, "çıxdaş olmaq" frazeologiyası kimi;

Frazeologizmləri auditoriya üçün başqa bir frazeologizm ilə izah etmək yenə də Heydər Əliyev dühasına xasdır.

# III FƏSİL
# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ FRAZEOLOGİZMLƏRİN DİGƏR NİTQ VAHİDLƏRİ İLƏ BİRGƏ EKSPRESSİVLİK YARATMASI

Məlum olmuşdur ki, ictimai-siyasi hadisələrin gərgin olduğu dövrlərdə Heydər Əliyevin nitqində ədatların, modal sözlərin, eləcə də frazeologizmlərin işlənməsinin çoxluğu, zənginliyi üzə çıxır. Bu bir daha ölkə həyatının çətin məqamlarında xalqla lider birgəliyindən, vəhdətindən xəbər verir. Xalqın milli ruhunu əks etdirən frazeologizmlər isə digər nitq vahidləri ilə harmoniya yaradaraq nitqi zənginləşdirir, yaddaqalan edir: "Mən bir daha xəbərdarlıq edirəm: *qoy* heç kəs güman etməsin ki, belə əməllər *gözdən qaçacaq*, yaxud onları görən yoxdur, bunlara görə cəza verilməyəcəkdir. *Xeyr*. Belə şey *olmayacaqdır*. Mən bir prezident kimi Azərbaycan Respublikasının bu ali dövlət vəzifəsini öz üzərimə götürərkən xalqa söz vermişəm, mən öz *sözümün üstündə durmuşam* və axıra qədər *duracağam*, son damla qanımadək, son nəfəsimədək *sözümdən dönməyəcəyəm*. *Heç kəs* də iradəmi *qıra bilməyəcək*" [IIc.s.109]. Söz və cümlənin mənasını qüvvətləndirdiyi üçün işlədilən köməkçi nitq hissəsi olan ədat [215, 309] böyük natiqin çıxışlarında xüsusi əhəmiyyət kəsb edir.

Heydər Əliyev nitqinin üslubi-morfoloji xüsusiyyətləri araşdırılmış, araşdırmalar içərisində ədatlar monoqrafiyanın II hissəsində tədqiqat obyekti olmuşdur [215, 230]. Yuxarıdakı mətndə "qoy" əmr, "xeyr" inkar ədatları, "heç kəs" inkar əvəzliyi və bir neçə yerdə feilin qəti gələcək zamanda işlənməsi "gözdən qaçmaq" və "sözün üstündə durmaq", "sözdən dönməmək" frazeologizmlərini əhatəsinə alaraq qətiyyətli və prinsipial, ciddi mövqe nümayiş etdirən nitq nümunəsi yaradır.

Dil inkişafda olan bir məfhum. Dillər də inkişaf edir, təzələnir, yeni sözlərlə zənginləşir, arxaikləşir, zamansa ələyini işə salaraq ələyir, xalqın ruhuna doğma olanını saxlayır. Və bu dilin inkişafı nitq prosesində öz əksini tapır. Natiqlər sanki yeni sözlər gətirir, sonra bu yeni sözlər özünə möhkəm yer ala bilir. Məsələn, bir qədər kinayəli, bir qədər yumoristik, bir qədər də səmimi, əsasən də diplomatik xarakterdə olan "oyundankənar vəziyyətdə qalmaq" frazeologizmləri bu sıradandır: "Mən vaxtilə hətta anlaya bilmədim ki, necə Şimal-Cənub layihəsi ola bilər ki, Azərbaycan burada iştirak edə bilməsin. Mən bir dəfə demişəm, bir də təkrar edirəm: Bu layihə haqqında biz ilk dəfə Rusiyanın Yollar nazirliyindən eşitdik, buraya gəlmişdi, o bizə məlumat verdi. Sonra mən araşdırdım, bir az da narazı oldum ki, Azərbaycanı "oyundankənar" vəziyyətdə qoyublar. Amma coğrafiya belədir ki, Azərbaycan "oyundankənar" vəziyyətdə qala bilməz. Hər şeyi dəyişdirmək olar, amma coğrafiyanı dəyişdirmək mümkün deyildir. Ona görə də mən sizə bir də bəyan edirəm ki, bu layihəni dəstəkləyirik və bu sahədə əməkdaşlıq etməyə hazırıq. *Güman edirəm ki*, məhz Azərbaycanın burada iştirakı layihənin daha da real, daha da səmərəli olmasını təmin edəcəkdir" [XXXVIIc.s.123].

Yuxarıdakı frazeologizmlərin köməyi ilə siyasi natiq dilində layihəni imzalayan dövlətlərin Azərbaycan haqqındakı mövqeləri tənqid olunur. "Bir az da narazı oldum ki" ifadəsi bir miqdar sayının sözyaratmada ekspressivliyinə əsaslanaraq dövlətlərarası münasibətdə "bir az"ın heç də az olmadığı həqiqətini ortaya qoyur. "Güman edirəm ki" modalı ilə gümana yer qoymayan siyasi natiq "məhz" dəqiqləşdirici ədatın köməyi ilə məsələyə aydınlıq gətirir. "Amma" ziddiyyət bağlayıcısını iki yerdə təkrar işlədərək Azərbaycanın coğrafi mövqeyini anladır. "Mən" müəyyən şəxs əvəzliyini bir neçə dəfə işlətməklə ölkənin taleyüklü məsələlərində, Azərbaycanı

"oyundankənar" vəziyyətlərə salmaq istəyi olan məqamlarda prinsipial, "mən" mövqeyini, mənlik prinsipini ortaya qoyur.

Böyük natiqin dilində sərt mövqe bildirən, inkarda işlənən frazeologizmlər yadda qalmağı ilə seçilir. Bu yaddaqalma digər nitq hissələrinin ekspressivlik yaratması ilə müşayiət olunur: "Avropa Şurasında və ATƏT-də insan hüquqlarının müdafiəsinə böyük diqqət yetirilir. Mən bununla razıyam. Lakin mən onlara dedim ki, burada yüz minlərlə insanın hüquqları tapdanmışdır, siz isə buna *göz yumursunuz*. Azərbaycanda hər hansı bir şəxs törətdiyi cinayət üstündə həbs edildikdə, o, məsələni elə qələmə verir ki, hansısa siyasi və ya qeyri-hökumət təşkilatına mənsubdur, siz də bizə qarşı iddialar irəli sürüb soruşursunuz ki, insan hüquqları nə üçün pozulur. Gəlin insan hüquqlarına hər yerdə riayət edək. Yoxsa, siz bir halda bir nəfərin hüquqlarını ciddi cəhdlə müdafiə edir, başqa bir halda isə bir çox insanların – bir nəfərin, iki nəfərin, yüz nəfərin yox, yüz minlərlə insanın hüquqlarının pozulmasına biganəsiniz.

*Bax*, bizim vəziyyətimiz belədir. Mən bugünkü həyatımızdan danışmaq istəmirəm, ona görə ki, siz özünüz görürsünüz. Azərbaycanda bütün müsbət hallarla yanaşı, başlıcası budur ki, biz respublikada ictimai-siyasi vəziyyəti sabitləşdirə bilmişik, müstəqilliyimizin onuncu ildönümünü, *bax*, belə qarşılayırıq" [XXXVc.s.218].

Eyni bir frazeologizm mətndə ardıcıl səslənərək ekspressivlik çalarlarını dəfələrlə yüksəldir: "Nə vaxt səsini qaldırdın ki, Surət burada qanunsuz işlər görür, bunları edir? Yaxşı, ziyalı da, yaxud şair, yazıçı da səsini qaldırmayanda *bəs* nə olsun? *Bəs* belə adamlarla yalnız Heydər Əliyev mübarizə aparmalıdır, hamı ilə Heydər Əliyev döyüşməlidir? Belə *şeymi* olar? Sən yazıçısan, bilirsən ki, rəhmətlik Nazim Hikmətin bir sözü vardır. Azərbaycanda onu dəfələrlə deyirdilər, ancaq bu gün yerinə düşür, yenə deyim: sən yanmasan,

mən yanmasam, o yanmasa, *bəs* kim yanacaq? *Bəs* sənin yanmağın haradadır? Görürsən ki, min dənə çirkin işlər görülür. Harada sən öz *səsini qaldırdın*, harada dedin ki, belə şey yaramaz?" "Səsini qaldırmaq" frazeologizmi həcmcə kiçik semantik tutumu böyük olan mətndə üç yerdə işlədilir. "Bəs" sual ədatı dörd yerdə təkrarlanır. Ədatlarla frazeologizmlərin harmoniyası qətiyyət dolu, yaddaqalan bir nitq nümunəsi yaradır. Maraqlı olan odur ki, frazeologizmlər bu mətndə sual cümlələrinin içərisində işlənməklə özünəməxsus üslubi xüsusiyyət kəsb edir. "Bax" qüvvətləndirici ədatını iki yerdə işlədərək "göz yummaq" frazeologizmini şüurlara daha dərindən yönəldir. Feilin "gəlin", "riayət edək" əmr şəklindəki ifadələri fəaliyyət göstərməyən, "göz yuman" sədrləri hərəkətə gətirməyə yönəlir.

İntensional dərk etmə, Rinaldiyə diqtə edir ki, o nitq aktında dəhşətlərin, məhrumiyyətlərin intensional vəziyyətini nəzərdə tutulduğu kimi verbalizasiya etsin. Bu nitq aktlarına özündə seçilmiş çalarlıqlar və rənglərə aşağıda göstərdiyimiz propozisiyaları aid etmək olar.

"This war is terrible" – Bu müharibə dəhşətlidir, qorxuludur, müdhişdir. "It is killing me" – Bu məni öldürür-məhv edir. "This is a terrible war" – Bu dəhşətli müharibədir. Bu qorxunc müharibədir. "I feel like hell" – Mən özümü cəhənnəmdə hiss edirəm. Bütün xalqların təfəkkür eyniliyi baxımından başa düşmək olur ki, nitq aktında ağır və dəhşətli vəziyyətin təsvirində bir oxşarlıq var. Aşağıdakı mətndə Heydər Əliyevin dilində "adam dəhşətə gəlir" ifadəsinə qədər modal söz kimi "təəssüf ki" işlədilir, sonra bu təəssüf və dəhşət ritorik sualların vasitəsilə izah olunur, "uçuruma aparmaq", "dərin quyuya salmaq" frazeologizmləri ilə təsdiq (bəli) və inkar (yox) ədatları ilə əlaqədə sərt mövqe bildirilir. Ən maraqlısı isə odur ki, həmin frazeologizmlər sinonimləşmiş şəkildə auditoriyaya çatdırılır: "Təəssüf ki, indi, Azərbaycanın

bu ağır və çətin dövründə bizim bax, bu yolla getməyimizə mane olan qüvvələr də, bu işləri pozmağa can atan qüvvələr də var. Eşidəndə ki, bəziləri müharibənin qurtarmasını istəmir, bəziləri də onun davam etməsini istəyirlər, *adam dəhşətə gəlir.* Eşidirsən, bilirsən, duyursan ki, bəziləri respublikada yaranmış bu sabit ictimai-siyasi vəziyyəti pozmaq istəyir. *Nə üçün? Nəyə görə?* Yalnız və yalnız öz şəxsi məqsədlərini, öz çirkin niyyətlərini həyata keçirmək üçün. *Bəli*, aramızda belələri də var. Biz insanlara azadlıq vermişik. Azərbaycan Respublikasının ərazisində söz azadlığı, bir sözlə bütün azadlıqlar bərqərar edilmişdir. Amma bu azadlıqlardan yalnız və yalnız xalqın mənafeyi naminə istifadə olunmalıdır xalqı daha *dərin quyuya salmaq* üçün *yox*. Xalqı bu bəladan qurtarmaq üçün istifadə etmək lazımdır, xalqı daha da *uçuruma aparmaq* üçün yox. Buna görə də mən belə qüvvələrə öz sözümü qəti şəkildə deyirəm və bildirirəm ki, Azərbaycanın daxili ictimai-siyasi sabitliyini pozanlara, Azərbaycan dövlətçiliyinə xəyanət edənlərə qarşı biz amansız olacağıq. Azərbaycan Konstitusiyası, qanunları, dövlətçiliyi qorunacaqdır, Azərbaycan xalqının, hər bir Azərbaycan vətəndaşının təhlükəsizliyi təmin ediləcəkdir. Biz bunları pozmağa can atanlara qətiyyən *yol verməyəcəyik*. Buna hamınız əmin ola bilərsiniz."

1994-cü il 14 noyabrda "qaçqınlar haqqında qanunvericilik, insan hüquqları və miqrasiya məsələlərinə dair Bakıda keçirilən beynəlxalq konfrans"dakı çıxışın sonluğu frazeologizmlərin ritorik suallarla müştərək rast gəlməsi ilə yekunlaşır. Ənənəvi olaraq müqayisədən ustalıqla istifadə edən Heydər Əliyev söz deməkdən məhrum olma ilə "dədə-baba qəbirlərindən məhrum olma" ilə başlayan ritorik sual auditoriyaya yönəlir: "Bugünkü konfransda yəqin müqayisə etmək mümkün olardı ki, əgər bir adamı *sözdən məhrum edirlərsə* və ya o, müəyyən məhdudiyyətlərə məruz qalırsa, onun hüquqları pozulur: ancaq bir milyon insan-azərbaycanlı öz yerindən,

yurdundan qovulmuşdur, evini, əmlakını itirmişdir, dədə-babalarının qəbirlərindən məhrum olmuşdur, əsrlər boyu yaşadığı yerlərdən məhrum olmuşdur. Bəs bu, insan hüquqlarının kütləvi surətdə, dəhşətli şəkildə pozulması deyilmi?” [IIc.s.509].

Heydər Əliyev nitqində frazeologizmlər leksik – qrammatik dəyişikliklə müşayiət olunur ki, bu dəyişiklik frazeologizmin təsir gücünü dəfələrlə artırır: “Yəni kimsə, haradasa günah edibsə, kiminsə suçu, səhvi varsa, biz onun *üstünü* heç vaxt *örtmürük* və örtməyəcəyik” [XIVc.s.285]. “Heç vaxt” inkar əvəzliyinin köməyi ilə “üstünü örtmək” frazeologizmi xüsusi bir effekt, ekspressivlik qazanır.

Heydər Əliyev frazeologizmləri işlədərkən onun izahını auditoriya üçün açıqlayır. Məs: üz döndərməyin əsil mənasının “xəyanət etmək” olduğu, yedəyinə almağın isə “öhdəsinə almaq” olduğu kimi: “Yüksək vəzifələrə irəli çəkdiyim, təyin etdiyim, inandığım adamlar mən istefa verdikdən sonra birdən məndən *üz döndərdilər*, mənə xəyanət etdilər” [Ic.s.47]. “Qərbi Almaniya çox böyük iqtisadi nailiyyətlər əldə edib və Almaniya Şərqi Almaniyanı *öz yedəyinə*, öhdəsinə alıbdır” [VIIc.s.27].

BMT tribunasında haqsızlığa qarşı dünyanın mübarizə apardığını dilə gətirir, bu mübarizənin ayrı-ayrı detallarını diqqətə çatdırır, “şahidi olmuşuq” ifadəsi ilə auditoriyanı öz tərəfinə çəkir, auditoriya ilə həmfikir olduğunu gündəmə gətirir: “Biz ayrı-ayrı ölkələrdə ayrı-ayrı şəxslərin, fərdlərin insan hüquqlarının pozulmasının digər ölkələrdə böyük siyasi xadimlər tərəfindən, yaxud da ölkələrin parlamentlərində və ya yüksək beynəlxalq təşkilatlarda pislənməsinin və bu hüquqların qorunması üçün lazımi tədbirlər görülməsinin şahidi olmuşuq” [IIc.s.509].

Növbəti nitq mərhələsində böyük natiq “həyəcan təbili vurmaq”, “hay-küy qaldırmaq” frazeologizminin sinonimi

kimi "müzakirə olunmaq"la fikrini yekunlaşdırır. "Nə üçün"lə konfransa ünvanlanan ritorik suallar səfərbərliyi gücləndirməklə yaddaqalan bir nitq nümunəsi yaradır: "Belə olan halda bir milyon vətəndaşın – azərbaycanlının hüquqlarının kütləvi surətdə pozulması haqqında nə üçün *hay-küy qalxmır*, nə ücün bu parlamentlərdə müzakirə olunmur beynəlxalq təşkilatlar nə üçün bu barədə öz cəsarətli fikirlərini bildirmirlər? Bunu anlamaq mümkün deyildir" [IIc.s.509].

Xalqın milli ruhunu əks etdirən frazeologizmlərin sıx rast gəldiyi mətnlər Heydər Əliyevin milli dövlətçiliyin möhkəmləndirilməsi yolundakı çıxışlarında daha tez-tez səslənir. İctimai-siyasi dövrlərin gərgin çağlarında həm ədatlar, həm modal sözlər, həm də frazeologizmlər çox işlənir. O cümlədən 11 avqust 1994-cü ildə ölkəmizin başının üstünü qara buludların aldığı bir dövrdə "Prezident sarayında respublika iqtisadiyyatının vəziyyətinə həsr olunmuş geniş müşavirə"dəki yekun nitqdə separatçı qüvvələrlə bağlı (mətn-çıxışda) çıxışın müəyyən bir hissəsində "iki stul üstündə oturmaq", "qulaqların açıb eşitmək", "əl qaldırmaq", "düz yola gəlmək", "döngəni o tərəfə dönmək" kimi ardıcıl səslənən frazelogizmlər nitqi səfərbəredici, ayıldıcı, qətiyyətli və yaddaqalan edir.

Heydər Əliyev frazeologizmləri özü izah edir. Burada necə deyərlər, pedaqoji ustalıq öz yerini alır. Məsələn: "İki stul üstündə oturmaq" – həm o tərəfdə, həm də bu tərəfdə deməklə ikili mövqedə olmaq, mövqeyini müəyyən edə bilməmək anlamlarını gündəmə gətirir: "Bəzi qruplar son vaxtlar yenə də şayiələr yayırlar. Moskvanın bəzi qəzetlərində son vaxtlar Azərbaycana qarşı böhtan, təbliğat xarakteri daşıyan məqalələr dərc olunur. Bəzən bunları respublikamızda yaşayan adamlar təşkil edir və bunun üçün ciddi səy göstərirlər. Ona görə də bu gün mən bu böyük müşavirədə bildirmək istəyirəm ki, belə hərəkətlər, belə cəhdlər heç vaxt heç kəsə uğur gətirə bilməz. Respublikada ictimai-siyasi sabitliyi pozmağa

çalışan adamlara qarşı amansız olacağıq. Hüquq-mühafizə orqanları, yerli hakimiyyət orqanları bu işlərlə məşğul olmalı və məsuliyyət daşımalıdırlar." "Bizim sıralarımızda bəzi adamlar var ki, iki stul üzərinə oturmaq istəyir – həm o tərəfdə, həm də bu tərəfdə. Bunlarla da qurtarmaq lazımdır." "Bəzi", "bəzən" sözlərini, ifadələrini işlətməklə diplomatik, incə nitq həyata keçirilir. Bu diplomatik nitq tədbirlilik və ehtiyatlılığa söykənir. "Moskvanın bəzi qəzetlərində", "bəzən bunları respublikamızda yaşayan adamlar təşkil edir" və "bəzi adamlar var ki, iki stul üzərində oturmaq istəyir" frazelogizmi ilə həmin bəzi adamlara xəbərdarlıq edilir. Bu frazeologizmə qədər qəti gələcək zamanda işlədilən "amansız olacağıq", "ciddi məşğul olmalı və məsuliyyət daşımalıdırlar" feilin lazım şəklində qətiyyətli ifadələri frazeologizmə qədər auditoriyaya yol açır.

"Bunlarla da qurtarmaq lazımdır" ifadəsi sərt təpki xarakteri daşıyır ki, bu bir daha ölkə həyatının ciddi dönəmləri üçün məqbul sayılır. İki stul üzərində oturanlara növbəti bir frazeologizmlə – "qulaqlarını açıb eşitmək"lə dərs verilir. "İki stul üzərində oturmaq" frazeologizmi "döngəni o tərəfə dönəndə başqa bir siyasətə əl qaldırmaq"frazeologizmi ilə gücləndirilir. Həmin şəxslər növbəti dəfə böyük siyasətçinin qəti gələcək zamanda səsləndirdiyi "biz bu yoldan çəkinməyəcəyik","biz bunlardan dönməyəcəyik", eləcə də feilin əmr şəklində işlədilən "düz yola gəlsinlər" frazeoloji ifadə ilə mətnə yekun vurulur: "Bilirsiniz ki, Azərbaycan Respublikasının artıq həm daxili, həm də xarici siyasəti aydındır. Mən dəfələrlə bunu elan etmişəm. Biz bu yoldan çəkinməyəcəyik, dönməyəcəyik. Çünki respublikanın daxilində aparılan siyasət-demokratiya, sərbəstlik, insan hüquqlarına hörmət, azadlıq, siyasi plüralizm-bunların hamısı Azərbaycanda hüquqi cəmiyyət yaradılmasına yönəldilmiş prinsiplərdir. Biz bunlardan dönməyəcəyik. Ona görə də mən bir daha deyirəm ki,

bu yoldan çəkinməyəcək və dönməyəcəyik. Əgər kimsə bizim bu açıq, aydın yolumuza xələl gətirmək, respublikamızın daxilindəki ictimai-siyasi sabitliyi pozmaq, şayiələr yaymaq istəyirsə, yaxud kimsə bu gün bu siyasətə, sabah – döngəni o tərəfə dönəndə başqa bir siyasətə *əl qaldırırsa*, bizim sıralarımızda belə adamlar olmamalıdır. Onlar qulaqlarını açıb eşitsinlər: belələrini görürük, şəxsən mən də görürəm. Ancaq mən imkan verirəm ki, bu adamlar özləri özləri haqqında lazımi tədbirlər görsünlər, *düz yola gəlsinlər*. Əgər kim nəhayət, düz yola gəlməsə, onlar haqqında lazımi ölçülər götürüləcəkdir".

Hər bir dilin leksik sistemində külli miqdarda sözlər və funksiyaca tək-tək sözlərə uyğun olan, ayrıca formalaşan, müstəqil dil vahidləri olan frazeoloji vahidlər vardır. Frazeoloji vahidlər sahəsində görkəmli dilçi alimlər tədqiqatlar aparmışlar. Bu alimlərdən S.İ.Abakumov, A.A.Reformatski, A.B.Kunin, L.A.Bulaxoviski, Y.M.Volf, A.Arnold və digərləri frazeoloji vahidləri geniş tədqiq etmiş və onların digər dil vahidlləri ilə oxşar və fərqli əlamətlərini üzə çıxarmışlar [192, 257, 283, 311].

Frazeoloji vahidləri öyrənən sahə olan frazeologiya və sözlərin tədqiqat sahəsi olan leksikologiya arasında sıx əlaqə vardır.

Frazeologiya və leksikologiyanın əlaqəsi ilk növbədə ona əsaslandırılır ki, hər iki sahənin əsas materialı sözdür. Bu iki sahənin bir-birinə çox oxşar xüsusiyyətləri var. Bu oxşarlıq müxtəlif sahələrdə özünü göstərir: qrammatika sahəsində-frazeoloji vahid və söz morfoloji əlamətlərə mənsub olub, cümlə üzvü rolunda çıxış edə bilər, təyin və tamamlığa malik ola bilər; söz yaradıcılığı sahəsində – frazeoloji vahid və söz yeni sözlərin yaranması üçün baza rolunu oynaya bilər; onomasiologiya sahəsində – frazeoloji vahid və söz insanın müxtəlif

fəaliyyət növləri ilə əlaqədar olan obyektiv gerçəkliyin hadisələrini ifadə edə bilər [144, 192].

Nəhayət, frazeoloji vahidin sözlə ekvivalent olması nəzəriyyəsinin tərəfdarları bir vacib faktı da nəzərdən qaçırırlar. Bu fakt da iki dil vahidinin nitqdə müxtəlif funksional təyinata malik olması ilə əlaqədaradır. Frazeologizmlə sözün münasibətinin düzgün başa düşülməsi və təyin edilməsi onların strukturunun, semantikasının və funksional əlamətlərinin hərtərəfli müqaysəli analizi nəticəsində mümkündür [192].

Belə analiz göstərir ki, qeyd edilən əlamətlərə əsasən frazeoloji vahid heç vaxt bütövlükdə sözlə eyni olmur. Məhz buna görə də frazeoloji vahidin sözlə ekvivalent olmasından deyil, onunla əlaqəsinin olmasından danışmaq daha düzgün olardı. Tədqiqiatların da sübut etdiyi kimi, əlaqə nəzəriyyəsi frazeoloji vahidə özünəməxsus xüsusiyyətləri olan dil tərkibi kimi baxmağa imkan verir. Bütün bu deyilənlərdən belə bir qənaətə gəlmək olar ki, frazeologiya ilə leksikologiya arasında sıx əlaqələrin olmasını qəbul etsək də, onlar arasında prinsipial fərqlər də mövcuddur [196].

Neqativ frazeoloji birləşmələrin tədqiqi belə bir faktı da deməyə imkan veriri ki, müqayisə olunan hər iki dilin frazeoloji sistemini təşkil edən frazeoloji birləşmələrin 4:3 hissəsi təsdiq quruluşa malik olan feli frazeoloji birləşmələrdir. Bu təsdiq quruluşu feili frazeoloji birləşmələri necə inkar etmək olar? Və burada müəyyən bir qayda və ya prinsipə əməl olunmalıdırmı?

Azərbaycan dilinin materialında aparılan təhlil burada da belə verbal frazeoloji birləşmələrin olduğunu göstərir. Başqa sözlə desək, Azərbaycan dilində də inkar olunması mümkün olan təsdiq strukturlu bir qism feili frazeoloji birləşmələr vardır. Belə affirmativ verbal frazeologizmlərın inkar olunmasında – ma, – mə inkar şəkilçisi aparıcı mövqedə durur. Nümunələrə nəzər yetirək: ümidini kəsmək – ümidini kəsməmək;

aman vermək – aman verməmək; burnunu soxmaq – burnunu soxmamaq; göz yummaq – göz yummamaq; xəyanət etmək – xəyanət etməmək; kələk gəlmək – kələk gəlməmək və s.

Nümunələrdən görünür ki, bu təsdiq strukturlu feili frazeoloji birləşmələrin inkar olunması mümkündür [27]. Heydər Əliyevin də dilində inkarda işlənən frazeologizmlərə az təsadüf edilmir ki, bu da prinsipial mövqe tutan lider nitqi üçün xarakterikdir. “Mən hesab edirəm ki, həm Azərbaycan dövləti, həm də dünyanın bizimlə əməkdaşlıq edən böyük neft şirkətləri bu yolu *kor-koranə getməmişlər*” [XXVc.s.292]. “Beş-altı il bundan əvvəl vətəndaş *küçəyə çıxa bilmirdi*” [XXXIXc.s.353]. “O heç vaxt öz *milli köklərindən ayrılmamışdır*” [XXXVIc.s.281].

Azərbaycan dilinin frazeoloji inventarını struktur baxımdan təhlil edərkən burada da sayların affirmativ feili frazeoloji birləşmələrin komponent tərkibi kimi işləndiyini görmək mümkündür. Alman dilində olduğu kimi, belə verbal frazeologizmlər Azərbaycan dilində də sayca azdır. Azərbaycan dilində komponentlərindən biri say olan affirmativfeili frazeologizmlərin inkarından bəhs edərkən alman dilindən fərqli bir vəziyyət nəzərə çarpır. Azərbaycan dilində belə affirmativ feili frazeologizmlərin bəzilərini inkar etmək qeyri-mümkündür. Ona görə ki, onlar güclü idiomluq və sabitlik dərəcəsinə malik frazeologizmlərdir. Deyilənləri nümunələr üzərində nəzərdən keçirək: bir könüldən min könülə aşiq olmaq – bir könüldən min könülə aşiq olmamaq; dördnala çapmaq - dördnala çapmamaq; bir daş altdan bir daş üstdən qoymaq– bir daş altdan bir daş üstdən qoymamaq [25]. *Bir kökdən gəlmək* – eyni mənbədən qaynaqlanmaq; “Biz bir-birimizin mədəniyyətini, tarixi köklərini, adət-ənənələrini, milli-mənəvi dəyərlərini daha çox öyrənirik və onların nə qədər oxşar olduğunu, hamısının bir kökdən gəldiyini bir daha görürük” [XXXIIIc.s.295].

*Bir qədər səngimək* – azalmaq; tempin aşağı düşməsi; “Sonra Çeçenistanda hadisələr bir qədər səngidi və bu mövzu bir növ unuduldu, biz də arxayınlaşdıq” [XXIIIc.s.32].

*Bir qəlibə yerləşdirmək* – bir quruluşa uyğunlaşdırmaq; “Dünya belədir. İndi dünyada bütün ölkələri bir qəlibə yerləşdirmək olmaz” [XXVIIc.s.46].

Lakin bu hal heç də tərkibində say olan affirmativ feili frazeologizmlərin hamısına şamil edilə bilməz. Çünki komponentlərindən biri saydan ibarət olan bəzi affirmativ feili frazeologizmlərin inkarda işlənməsi mümkündür [27].

Tədqiqat zamanı müəyyən olmuşdur ki, bütün təsdiq strukturlu verbal frazeologizmlərin təsdiq-inkar transformasiyası mümkün deyildir. Ancaq müəyyən sintaktik və semantik şərtlər daxilində feili frazeoloji birləşmələri inkar etmək olar. Bu şərtlərdən ən mühümü inkarlaşma prosesinin frazeologizmin idiomluq və sabitlik dərəcəsindən asılılığıdır [27].

S.İ.Ojeqov elmə, texnikaya, incəsənətə və s. aid olan söz birləşməsi şəklindəki terminlərin ümumi dil terminologiyası sistemindən kənara çıxan, başqa sözlə əvəz olunan və ya daxilində müstəqil nominativ mənaya malik olmayan sözlər işlənən söz birləşmələrini frazeologiyanın tədqiqat obyekti hesab edir [81].

Kuninə [265] görə, frazeoloji vahidlər cümlədəki funksional xarakterinə görə 2 əsas qrupa bölünür:

1)nominativ vahidlər obyektləri, effektləri xüsusiyyətləri müəyyənləşdirir və fərlqi bir quruluşa malik ola bilir.

2) Nominativ-kommunikativ frazeoloji vahidlər cümlədə söz qüvvətləndirici funksiyasını həyata keçirir.

N.N.Amosova [232] “frazeoloji vahidlərin kontekstoloji öyrənilmə metodu”nun yaradıcısı sayılır. N.N.Amosovanın metodu aşağıdakı prinsiplərə əsaslanır: 1) Frazeoloji materialın öyrənilməsini sinxron planda aparmaq lazımdır; 2) maksimal dərəcədə obyektivliyə riayət etmək lazımdır; 3) təhlilin

istiqamətinin seçimi tədqiq olunan dilin spesifikasından irəli gəlməlidir; 4) frazeoloji vahidlər real nitq ifadəsi şəraitində öyrənilir; 5) tədqiqat hər bir dilin frazeologiyasının əsas nəzəri problemləri dairəsi ilə məhdudlaşır [38, 73, 91, 232, 265]. Biz də yuxarıdakı metodlarla Heydər Əliyevin real nitqləri əsasında öyrənməyə qərar verdik.

Hər bir elm sahəsində, hər bir problematik məsələnin araşdırılmasında olduğu kimi, frazeoloji əkslikliklərin də hərtərəfli və həqiqi şərhi üçün onların təsnif edilərək qruplaşdırılması böyük önəm kəsb edir. Təsnifat-bölgü araşdırmanın obyektini əhatə etmək, dəqiqləşdirmək və düzgün dərk etmək daha vacib şərtlərdəndir [152]. Azərbaycan dilində: bərkə-boşa düşmək-bərkdən-boşdan çıxmaq; ad almaq-ad batırmaq, üzü ağ olmaq – üzü qara olmaq; başı açılmaq-başı qarışçıq olmaq; özünə gəlmək – özündən getmək; ara süzəltmək-ara pozmaq; ağlı başına gəlmək-ağlı başından çıxmaq; kələfin ucunu itirmək – kələfin ucunu tapmaq; məsləhət almaq – məsləhət vermək, söz almaq – söz vermək və s. [152].

Heydər Əliyev nitqləri də antonimlərsiz keçinmir. Məhz bu antonimlər nitqə xüsusi müqayisə çalarları verir: “Ona görə ki, səhiyyədə özəl sektoru yaratmaq, sahibkarlığı yaratmaq bəlkə də ticarətdən, yaxud da kənd təsərrüfatından, sənayedən və iqtisadiyyatın başqa sahələrdən *qat-qat çətindir*” [XXIc.s.162]. “Ştatların ixtisarı nəzərdə tutulan yeni strukturu təklif edə bilməyiniz və təklif etdiyiniz struktur, şübhəsiz ki, əvvəllər olduğundan daha yaxşı işləyə bilər və başqalarının təklif etdiyindən *qat-qat yaxşıdır* – bu sevindirir” [XXIc.s.155]. Yuxarıdakı variantda sifətlərin antonimləri ilə ekspressivlik yaradılır. “Ayrı-ayrı adamlar bundan sui-istifadə etməyə, onları qızışdırıb *pis yollara salmağa* çalışırlar” [IIc.s.357]. “Çünki mən hər bir insanı *pis yoldan çəkindirmək* istəyirəm” [XXXIXc.s.128]. Elə buradaca ismin yönlük halı ilə çıxışlıq halların antonimliyini, əksliyini görmüş oluruq.

Metaforikləşmə bir tədqiqat obyekti kimi vüsət almasına XX əsrin sonlarında təşəkkül tapan yeni fənlərarası sahəyə – diskursiv təhlilə bocludur. Bu geniş, əhatəli təlim çərçivəsində diskursun konkret növləri, məsələn: KİV diskursu, siyasi diskurs, pedaqoji iqtisadi, tibbi diskurslar və s. araşdırılır. Amma vaicb bir məqam da vardır ki, tədqiqat obyekti olan diskursun bu növləri dildən xüsusi istifadəni tələb edir. Bu cür istifadə edilən diskurs, əslində, müəyyən mənada dil və üslub anlayışları ilə yaxınlaşmış olur[173].

Metaforikləşmə hadisəsi və bu hadisə nəticəsində baş verən proseslərə son dövrlərdə ritorika, üslubiyyat, ədəbiyyatşünaslıqdan daha çox nitqin müxtəlif aspektlərindən yanaşılır. Metaforikləşmə bizi əhatə edən aləmin, maddi və abstrakt predmetlərin, hadisələrin yalnız milli-mədəni müstəvidə dərki və ifadəsi üçün deyil, həm də universal obrazların yaradılmasında özünəməxsus rol oynayır. Bu baxımdan metaforikləşmə hadisəsinin nəticələri bir tərəfdən məntiq və fəlsəfə ilə, digər tərəfdən morfologiya, milli mədəniyyət, adət-ənənə ilə bağlanır, onların fövqündə izahını tapır [173].

“Söz birləşmələrinin formalaşmasında birləşmələrin hər iki komponenti rol oynayır, lakin söz birləşməsinin ümumi mənsubiyyəti, əsas xüsusiyyəti birləşmədəki tabe edən, mərkəzləşdirici sözlə müəyyənləşir. Bu cəhətdən söz birləşmələrini, adətən, üç qrupa ayırırlar:

1) ismi birləşmələr;
2) feili birləşmələr;
3) zərfi birləşmələr [220].

İsmi birləşmələrdə isimlər aparıcı rola malik olur. Birləşmənin birinci tərəfi hansı nitq hissəsi ilə ifadə olunursa olunsun, aparıcı ikinci tərəfdir. Belə birləşmələrdə ismin aparıcılıq xüsusiyyətlərindən, hakim mövqeyindən asılı olaraq ismi birləşmələr adlanır: daş ev, alma ağacı, gülən adam. Ismi söz birləşmələrinin başlıca əlaməti ondan ibarətdir ki, birləşmənin

ikinci tərəfi əsasən isimlə ifadə olunur [220]. Heydər Əliyev nitqlərində ən çox feili frazeoloji birləşmələr işlənir.

Nitqin cazibədarlığında hansı nitq vahidinin Heydər Əliyev nitqində – dilində əhəmiyyətli olmasını sübuta yetirməyin lüzumu yoxdur. Bu elə bir möhtəşəm nitq ki, vaxtında qeyd etdiyimiz kimi "Heydər Əliyev dilində köməkçi nitq hissələri üslubiyyat yaratmaq baxımından əsas nitq hissələri səviyyəsinə qalxır" [215].

"Xatirimdədir" modal sözü ilə ilə nitqinə başlayan böyük natiq keçmişə bir səyahət, ekskurs etməklə auditoriyanın o dövrü yaşayan hissəsini aktivləşdirərək nitq prosesinə qoşur. 30 yaşlı istedadlı gənc üçün "bəs" sual ədatı ilə – "Bəs Müslüm hanı, onu tapın" – dərin narahatlığın bildirir. "Qoy" ədatı ilə qaynar gəncliyin, insanı zirvələrə qanadlandıran gəncliyin əleyhinə getməyən ağsaqqal öyüdü verir: "yaxşı, qoy onlar qalsınlar." Ciddi şəxs – Respublikanın birinci katibi və gənclərin sevgisinə kömək göstərən bir şəxsin təzadı. İrəliyə baxmaq – gələcəyə baxmaq; gələcəyi görmək; "Müslüm, Allah eləsin, bütün bunların hamısı qorunub saxlansın, Allah eləsin, səndəki enerji daha da artsın, sən həmişə *irəliyə* daha çox *baxasan*" [XLIc.s.24].

"Bunların hamısı həm sizin üçün, yəni bizimlə dost olan Avropa ölkələri üçün, ABŞ üçün həqiqətən çox fayda gətirən işlərdir. Eyni zamanda bunlar Azərbaycanın iqtisadiyyatını inkişaf etdirmək üçün, ölkəmizin müstəqil dövlət kimi yaşaması üçün əsas şərtlərdən biridir. Ona görə indi bizə çox paxıllıq edənlər var. Ancaq iş təkcə paxıllıqla qurtarsaydı, mən narahat olmazdım. Kim paxıllıq edir, qoy etsin. Amma təkcə paxıllıq deyildir. Azərbaycanda bir söz vardır, "badalaq vurmaq" istəyənlər var. Bizə birbaşa təxribat etmək istəyənlər vardır. Ancaq biz artıq *ayaq üstə möhkəm durmuş* dövlətik. Biz indi əvvəlkindən daha çox irəlidəyik" [XXXIVc.s.51].

Bunlar təbiidir və biz konsorsiumu təşkil edəndə, sizinlə və başqa şirkətlərlə müqavilə bağlayanda bunu da nəzərə alırdıq. Amma gəlin haqq-hesabı düz aparaq. Düzü düz, əyrini əyri. Burada insanlar işləyiblər, maaş alıblar. 108 milyon dollar alıblar və öz maddi vəziyyətlərini yaxşılaşdırıblar. Başqa şeylər də olubdur. Yaxud bizim şirkətlərdə işləyiblər. Nəinki texnikadan istifadə ediblər, fiziki əməyindən istifadə ediblər və maaş alıblar, yaxud da haqq alıblar. Bu, təbii bir şeydir. Ona görə nağd, yəni Azərbaycanın təmiz gəliri 360 milyon dollar bonusdur, bir də 246 milyon dollar neftdən gələn gəlirdir. Cəmi 606 milyon dollar. Ona görə gəlin, hesabımızı həmişə düz aparaq. Mən heç də demirəm ki, siz bizi bu barədə aldatmaq istəyirsiniz. *Yox*, bizi aldatmaq da olmaz. Onu da bilməlisiniz ki, bu, çətin məsələdir. Sizin təcrübəniz çoxdur, amma bizim də başımız bir az işləyir. Bunlara, bu rəqəmlərə mən etiraz etmirəm. Amma bunların hansının nə olmasını düzgün yazmaq lazımdır. Neftçilər, mən düz deyirəm, yoxsa *yox*?".

Burada frazeologizmlər inkar əvəzlikləri və inkar ədatları ilə birləşərək prinsipial mövqenin ortaya qoyulmasına kömək edir. Bəzən ardıcıl şəkildə bir frazeologizm tez-tez təkrarlanır ki, həmin frazeologizm yaddaşlara hopur: "Bir xırda çətinlik görəndə öz canı haqqında düşünür, milləti haqqında yox, xalqı haqqında yox. Ancaq öz *canlarını qurtarmaq* üçün. Amma dövlətçilik haqqında düşünən adam həm adi vətəndaş, həm dövlət işində işləyən, xüsusən dövlətə başçılıq edən insanlar *heç vaxt öz canı haqqında* düşünməməlidir. Öz canı haqqında düşünən və xırda bir çətinlikdə ancaq qaçmaqla *canını qurtarmaq* istəyən insanlar – bunlar heç vaxt xalqın hörmətini, xalqın etimadını qazana bilməzlər" [XXXVIc.s.325]. "Can" somatik ifadəsini "heç vaxt"la birgə işlədən böyük natiq ciddi bir emosional çıxış ortaya qoyur.

Bu çıxış boyu bir sıra antietik frazeologizmlər – “burnunu dik tutmaq”, “qapıda saxlamaq”, “cızığından çıxmaq”, “quyruq bulamaq” – müsbət mənada işlənən “təvazökar aparmaq”, “alnıaçıq, üzüağ gəlmək” kimi frazeologizmlərlə yanaşı işlədilir, dialektik cəhətdən əksliklərin vəhdəti özünə yer alır.

Əksər təsadüflərdə frazeologizmlər ədatlarla harmoniyada verilir. Qüvvətləndirici ədatlar içərisində “axı”, “bax”, “ən” ədatları daha çox təsadüf olunur. Cəmşid Naxçıvanski adına hərbi liseyin 30 illiyinə həsr olunmuş yubiley mərasimindəki nitqdə (21 aprel 2003-cü il) hərbi liseyin yaradılması yolundakı çətinliklər, o dövrdə Moskvanı “sakitləşdirmək” baxımından söylənən “üstünü örtmək” frazeologizmi auditoriyanı öz cazibəsində saxlayır: “Ancaq bir il keçməmiş Moskvadan gəlib bizi yoxlamağa başladılar. Həm Müdafiə Nazirliyindən, həm də Maarif Nazirliyindən. Nəyi yoxlayırdılar? Deyirdilər siz qanunsuz məktəb yaratmısınız. Niyə qanunsuz yaratmışam? Onda mən bilirdim *axı* nə cür etmək lazımdır, bir az *üstünü örtmüşdüm ki*, bu orta məktəbdir. Amma bir az ixtisaslaşmış məktəbdir. Siz buna nə deyəcəksiniz? *Yaxşı,* əgər burada mən hərbi təhsili bir az artıq verirəmsə, bunun sizə maneçiliyi nədən ibarətdir?! Təbii ki, onlar bunun *kökünü görürdülər*, bilirdilər ki, demək, beləliklə, bizim gənclər gələcəkdə ali hərbi məktəblərə gedə biləcəklər. İki ildən sonra bir dəfə də yoxlamağa gəldilər. Daha sonra bir *də* gəldilər. Mən hər dəfə onların cavabını verdim və axırda da Moskvaya getdim, *ən* yüksək səviyyədə bunu müzakirə etdim. Beləliklə, mən məktəbi *bax*, bu bəlalardan xilas etdim” [XLIVc.s.275].

Bu kiçik mətndən göründüyü kimi “üstünü örtmək” frazeologizminin arxasındakı Azərbaycanda hərb sənətinin inkişafı fikrini digər nitq elementləri ilə birgə auditoriya üçün açıqlayır. Hərbçilər auditoriyası “axı”, “yaxşı”, “ən” qüvvətləndirici ədatlarının köməyi ilə nəyin üstünün örtüldüyünü

dərk edərək siyasi lider uzaqgörənliyinin şahidi olur. “Axı” qüvvətləndirici ədatı ilə ritorik sualı iki yerdə ardıcıl işlətməklə dərin təəssüf hissi yaradır. Rüşvətxorluğun polisə, polis orqanlarına, dövlətə vurduğu mənəvi ziyanı auditoriyaya “hörmətdən salmaq”, “nüfuzuna toxunmaq”, “dövləti ləkələmək” frazeologizmləri ilə açıqlayır. Rüşvətxorluqla bağlı dərin təəssüf hissi keçirən qətiyyətli dövlət başçısı “mən” şəxs əvəzliyi ilə məsuliyyəti təkbaşına boynuna götürərək Daxili İşlər Nazirliyini qətiyyətli nitqi ilə səfərbər edir, auditoriya rahat nəfəs alır. Heydər Əliyevi o dövrdə narahat edən suallar öz həllini bu gün ölkə Prezidentinin qətiyyətli və ardıcıl siyasətinin köməyi ilə tapır. “Jurnalist: Onlar (Gəncə əhalisi-red) dedilər ki, rüşvət halları vardır. Polis şəxsiyyət vəsiqəsini verərkən rüşvət alır” [XLIc.s.138]. Vaxtilə dövlətə ləkə gətirən bu tip sualların cavabı bu gün əməli işlə verilir.

Təsadüfi deyildir ki, bu gün İlham Əliyevin apardığı məqsədyönlü siyasət rüşvəti yaradan səbəbləri aradan götürməyə xidmət edir. Təkcə “Asan” xidmətdəki nailiyyətlər, dövlət qulluğuna qəbulla bağlı islahatlar və s. Elə Ulu Öndərin tələbə qəbulunun test üsulu ilə davam etdirilməsi və onun daha da təkmilləşdirilməsi ilə bağlı verdiyi sərəncamlar buna bariz nümunədir: “Axı niyə, niyə belə olsun? Biz nə qədər tədbirlər görürük, insanları tərbiyə edirik, nə qədər başa salırıq. Axı bu rüşvətdən niyə *əl çəkmirlər*? Mən inanıram ki, şikayətlərin bir qismi həqiqətə uyğundur. Təbii ki, şikayətlərdə subyektiv fikirlər də olur, hərə öz mənafeyindən şikayət edir. Ancaq, ümumiyyətlə, polisdən narazılıq çoxdur, rüşvətxorluq halları da var və bunu da əhali, xalq bilir. Bu daxili işlər orqanlarını, polis orqanlarını hörmətdən salır. Əlbəttə, bizim dövlətin də nüfuzuna toxunur və bəzən də onu ləkələyir. Bilin, bunlar məni çox incidir. Mən indi Daxili İşlər nazirinə tapşırıq verəcəyəm. Bu şikayətlərin hamısına mən baxacağam, özünüz tədbir görün” [XLIc.s.138].

"Cızığından çıxmaq" frazeologizmi ardıcıl ritorik suallarla, qüvvətləndirici ədatlarla (axı) bəzənərək auditoriya üçün yaddaqalan nitq nümunəsi yaradılır: "Biri gedir Bakıda avtomobil sürür. Polisə baxmır, filana baxmır. Saxlayırlar, bala, *niyə belə edirsən?* Mən naxçıvanlıyam. *Nə olsun ki,* naxçıvanlısan? Beləlləri sizə də, mənə də ləkə gətirirlər. Başa *düşürsünüz*? İnsan heç vaxt cızığından çıxmamalıdır. Ancaq mənim çoxillik təcrübəm nəyi *göstərir*? Vəzifə alan adamlar var, bir azdan sonra görürsən ki, vəzifə onları xarab edir. İndi qalmısan məəttəl, bunu çıxarasan, *axı* qoymusan ki, bu adam işləsin. Çıxartmayasan, buna necə dözəsən" [XXXIXc.s.127].

Heydər Əliyev xarakterindəki qətiyyət müəyyən nitq məqamlarında bir sıra frazeologizmlərlə auditoriyaya açıqlanır. 28 sentyabr 2002-ci ildə Prezident Sarayında ATƏT-in Minsk qrupunun həmsədrləri və onları müşayiət edən nümayəndə heyəti ilə görüşdə "həqiqəti sübut etmək", "əsəbləri cilovlamaq", "əhvali-ruhiyyəni çatdırmaq" kimi frazeologizmlərin köməyi ilə Dünya birliyi ölkələrini, dünyəvi missiya yerinə yetirən təşkilatları sərt şəkildə qınağa çəkir. "Axı" qüvvətləndirici ədatı ilə fikrini qüvvətləndirir (Axı siravi vətəndaş bunu başa düşmür). Və sonda – "bir qədər həyəcanlı danışdığım üçün üzr istəyirəm" deməklə incə diplomatiya işlədir: "Bilirsiniz, bizi incidən təkcə ərazimizin işğal olunması, yüz minlərlə azərbaycanlının var-yoxunu itirərək öz ərazilərində köçkünə çevrilməsi deyil, həm də odur ki, biz həqiqəti sübut edə bilmirik. Ümidlərini itirən insanlar deyəndə ki, bu dünyada həqiqət yoxdur, mən onları *başa düşürəm*, hərçənd, özüm belə hesab etmirəm. İndiki halda, mən sizə cəmiyyətimizin əhval-ruhiyyəsini çatdırıram. Prezident kimi, mən bu məsələləri sıravi Azərbaycan vətəndaşından daha yaxşı *başa düşürəm*. *Başa düşürəm ki*, burada çoxlu çətinliklər var, bir çox müxtəlif səbəblər ola bilər. Mən bunları *başa düşə bilərəm*. Axı sıravi vətəndaş bunu *başa düşmür*. Bir qədər həyəcanlı

danışdığım üçün üzr istəyirəm, mən öz *əsəblərimi cilovlamağı* bacaran adamam, lakin indiki halda bunu edə bilmərəm, buna görə də sizinlə belə həyəcanlı tonda danışıram. Odur ki, mən istəyirəm biz daha çox əməli işlərdən danışaq" [XLIc.s.362]. Sıravi vətəndaşın "bu dünyada həqiqət yoxdur" fikrini səsləndirəndən sonra "başa düşmək" frazeologizmini 5 yerdə leksik dəyişikliklərlə işlətməklə: "Başa düşürəm", "daha yaxşı başa düşürəm", "başa düşə bilərəm", "başa düşmür", "başa düşürəm ki", "üzr istəyirəm" deməklə əsəblərini cilovlayaraq gözəl bir diplomatik nitq nümunəsi yaradır. Elə buradaca frazeologizmlərin gözəl, səlis, nitq nümunələri yaratmaqdakı rollarını görürük.

Frazeologizmlərin şüurlara yönəlməsi yolunda, yaddaqalan olması baxımından nitqdə ritorik suallara xüsusi diqqət yetirilir: "Ancaq burada tamamilə doğru deyildi ki, baş nazir gündə üç dəfə müşavirə yığanda, orda boş-boş sözlər danışanda, axmaq işlərlə məşğul olarkən onun yanında oturan müavinlər ya *ağızlarına su alırdılar*, ya da ki, "baş üstə, baş üstə" deyirdilər" [IIc.s.385].

Bu bir böyük cümlədə nitq feili ilə bağlı "boş-boş sözlər danışmaq" və somatik frazeologizm "ağıza su almaq" işlədilir. Artıq adresatlar məlumdur: boş-boş danışanlaq və ağızlarına su alanlar. Növbəti ritorik suallar gələcəkdə məmurları ciddi fəaliyyətə (boş-boş sözlər danışmamağa) və dövlətçilik nöqteyi-nəzərindən mövqelərini (ağıza su almamağa) açıqlmağa çağırır. Böyük natiq aşağıdakı ritorik sualdan xüsusi bir ekspressivlik yaradır: "Məgər siz bu işləri görmürdünüzmü? O cümlədən, məgər nazirlər bu işləri, bu biabırçılıqları görmürdülərmi? Hesab edirsiniz ki, bütün bunlar belə davam edəcək və axırda da belə olacaq? Axırı gəlib çıxdı bu vəziyyətə: cəmiyyəti qarışdırdılar. Bu adamların işi nəyə lazımdır?" [IIc.s.385].

Görkəmli alim və ictimai xadim, akademik Ziya Bünyadovla vidalaşma mərasimindəki nitq "qanı yerdə qalmamaq" frazeologizmi ilə yekunlaşır. Bu frazeologizmin səslənməsinə qədər qurulan nitq möhtəşəmliyi ilə seçilən nitqlərdəndir: "Görünür ki, Azərbaycanın dövlət müstəqilliyini qoruyub saxlamaq, Azərbaycanı müstəqil bir dövlət kimi yaşatmaq, Azərbaycanda həqiqi demokratik, hüquqi dövlət qurmaq, Azərbaycan xalqını bu ağır vəziyyətdən çıxarmaq, Azərbaycanın ərazi bütövlüyünü bərpa etmək, işğal olunmuş torpaqları azad etmək, yerindən-yurdundan didərgin düşmüş vətəndaşlarımızı öz el-obasına qaytarmaq yolu hələ çətin yoldur, ağır yoldur. Amma biz bu yol ilə gedəcəyik, biz mübarizə aparırıq, aparacağıq və heç kəs iradəmizi sındıra bilməyəcəkdir, heç kəs bizi sarsıda bilməyəcəkdir. Qoy, o terroru təşkil edən qüvvələr bilsinlər ki, bu cinayət açılacaq, cinayətkarlar mühakimə ediləcəklər.

Ziya Bünyadov mübarizəmizin ön cərgəsində duran şəxsiyyətlərdən biri idi. Ziya Bünyadov bu mübarizənin qurbanı oldu. Ziya Bünyadov bu mübarizədə şəhid oldu. Lakin gələcəkdə itkilərimiz olsa da biz *yolumuzdan dönməyəcəyik*. Hər bir belə hadisə, əksinə, bizi daha da səfərbər edəcək, sayıq edəcək və daha mübariz edəcəkdir. Bu gün mən bütün terrorçu qüvvələrə və onların arxasında duran cürbəcür siyasi qruplara, başqa qüvvələrə xəbərdarlıq edirəm – *qoy bilsinlər* ki, onlar bu yolla heç nəyə nail ola bilməyəcəklər. *Qoy bilsinlər* ki, onlar məğlub olublar və məğlub olacaqlar. *Qoy bilsinlər* ki, Ziya Bünyadovun *qanı yerdə qalmayacaqdır*" [VIIIc.s.459].

Yuxarıdakı bu kiçik mətndə böyük azərbaycanlı 5 yerdə "Azərbaycan" məfhumunu təkrar edir. Bir daha Azərbaycan, onun müstəqilliyi, gələcəyi auditoriyaya açıqlanır.

Qəti gələcək zamanda dilə gətirilən "biz yolumuzdan dönməyəcəyik", "daha mübariz edəcəkdir", "xəbərdar edi-

rəm", "heç nəyə nail ola bilməyəcəklər" qətiyyətli ifadələrlə xalq auditoriyası səfərbər olunur. "Qoy" qüvvətləndirici ədatını üç yerdə feilin əmr şəklində "bilsinlər ki" ifadəsi ilə işlədərək ciddi bir lider nitqi yaradır.

"Qanı yerdə qalmamaq" frazeologizmi Heydər Əliyev dilində leksik dəyişikliyə uğrayaraq qəti gələcək zamanda inkarda işlənərək prinsipial mövqe nümayiş etdirir.

Monoqrafiyanın bu fəslində frazeologizmlərin Heydər Əliyevin dilində digər nitq hissələri ilə, eləcə də nitq elementləri ilə hansı harmoniyada olmasına diqqət yetirdik. Nitqin gedişində auditoriya bir-birindən maraqlı, səfərbəredici cazibədar nitq məqamlarının ardıcıllığına düşür və necə deyərlər, nəfəsini içinə çəkərək bu nitqi axıradək dinləməyə və yadda saxlamağa çalışır və nail olur.

Təzəpir məscidində 1995-ci ildə dindarlarla olan görüşdəki bir nitq parçasını tədqiqata cəlb etdik: "Gəlin açıq danışaq, Azərbaycan xalqı qəhrəman xalqdır, cəsur xalqdır. Azərbaycan xalqı aciz xalq deyil ki, erməni işğalçıları gəlib bizim torpaqlarımızı zəbt edə bilsinlər. Mən heç də razı ola bilmərəm belə hesab edək ki, xalqımız zəif olubdur, onlar isə güclü. *Yox*! Biz özümüzü *içimizdən yemişik, içəridən parçalamışıq*. Bununla da daxili düşmənlərimiz erməni işğalçılarına kömək edib, yardım edib və xalqımıza onlardan da çox düşmənçilik ediblər.

Allaha şükürlər olsun ki, son iki ildir sizin gözünüzün qabağında apardığımız siyasət və tədbirlər nəticəsində biz daxilimizdə olan təxribatçı qüvvələri bir-bir ifşa edirik, sıradan çıxarırıq və cəmiyyətimiz, ölkəmiz belələrindən təmizlənir. Ancaq biz bu təmizliyi nə qədər aparırıq, xarici düşmənlərimiz, ayrı-ayrı ölkələrdə Azərbaycanın müstəqilliyinin əleyhinə olan adamlar satqınlıqdan, xəyanətkarlıqdan o qədər istifadə edərək ölkəmizi yenə də *diz üstə çökdürməyə* çalışırlar. Onlar müstəqilliyimizi boğmağa, əldən almağa çalışırlar,

bizi yenə də müstəmləkə, qul etmək istəyirlər. *Yox*! Mən bu gün sizə deyirəm, bu Allah evində and içirəm ki, biz bundan sonra heç vaxt müstəqiliyimizi əldən verməyəcəyik! Hər biz Azərbaycanlı bunu *anlamalı*, *bilməlidir*. Biz bir daha müstəmləkə ola bilmərik. Biz azad olmuşuq, Azərbaycan xalqı azad yaşamalıdır. Ancaq ölkəmizin daxilində olan ayrı-ayrı xəyanətkarlar, satqınlar öz şəxsi mənafelərini xalqın mənafeyindən, ənənələrimizdən üstün tutaraq yenə də müstəqilliyimizi dağıtmaq istəyirlər. Biz buna *yol verməyəcəyik*! Son iki ildə gedən proseslər gözümüzün qabağındadır, görürsünüz ki, biz bunun qarşısını alırıq və bundan sonra da alacağıq" [IVc.s.198].

Mətnə diqqət yetirdikdə məlum olur ki, "diz üstə çökdürmək" frazeologizmi mətndə dominant yeri tutur. Nitqdə əsas hədəf müstəmləkə əsarətinə bir daha düşməmək, müstəqilliyimizi qoruyub saxlamaqdır.

Bu mərkəzi fiqur rolu oynayan frazeologizmə qədər böyük natiqin dilində "açıq danışmaq", "içdən yemək", "sıradan çıxarmaq" frazeologizmlərinə zəmin yaradır. "Diz üstə çökdürmək" frazeologizmdən sonra gələn frazeologizmlər – "əldən almaq", "əldən verməmək", "yol verməmək" – bu frazeologizmi sanki müdafiə rolunda, qüvvətləndirici rolda çıxış edirlər. Nitqin auditoriyalara olan təsir gücünün artırılmasında mühüm olan nitq elementi – səmimiyyət dindarlar auditoriyasını cazibəsinə salır. "Gəlin açıq danışaq", "bu Allah evində and içirəm ki" ifadələri xalqın öz liderinə olan inamını birə on qat artırır. Sinonim cərgələr isə bu nitqin ekspressivliyini gücləndirir. Bu cərgələrə misal olaraq "sıradan çıxarmaq, təmizləmək", "satqınlıq, xəyanətkarlıq", "boğmaq, əldən almaq", "müstəmləkə, qul", "qəhrəman, cəsur", "anlamaq, bilmək" göstərmək olar.

Məlum olur ki, "bizi yenə də müstəmləkə, qul etmək istəyirlər" cümləsində qul və müstəmləkə sinonim cərgəsi növbəti

dəfə “bir daha müstəmləkə ola bilmərik”, “bir daha qul ola bilmərik” söz birləşmələrini “bir daha” qüvvətləndirici ədatı ilə sinonimləşdirir, ekspressivliyi təkrarın köməyi ilə gücləndirir. Müstəqillik yolundakı prinsipial mövqe iki dəfə “yox” inkar ədatı ilə özünə yer alaraq “diz üstə çökdürməyin” mümkün olmayacağı anlamını bildirir.

Heydər Əliyevin dilində frazeologizmlər digər nitq vahidləri ilə harmoniyada öz ekspressivliyini artırmış olur. Bir qisim hallarda böyük natiq frazeologizmlərin izahında qüvvətləndirici və dəqiqləşdirici ədatlardan müvəffəqiyyətlə istifadə edir. Auditoriyanı frazeologizmin bütün incəlikləri ilə yaxından tanış edir, bu barədə əlavə şərhə, izaha ehtiyac qalmır: “Çünki heç vaxt *bir yerdə dayanıb durmaq* olmaz, *axı* indi dünya çox dinamik inkişaf edir, regionumuzda müxtəlif proseslər gedir, ona görə də biz bütün çağırışlara cavab verməliyik və bu baxımdan biz həmişə Gürcüstanla birlikdə olmuşuq, eləcə də Gürcüstan Azərbaycanla birlikdə olmuşdur” [XXXVc.s.358].

Heydər Əliyev dilində ən çox səslənən “Allaha şükürlər olsun ki” modal sözü ilə müstəqillik yolunda şükranlığını dilə gətirir. Dindarlar auditoriyasının fəthində bu modal söz xüsusi əhəmiyyət daşıyır. Qətiyyətli nitq sahibi Heydər Əliyevin dilində qəti gələcək zamanda işlədilən “biz buna yol verməyəcəyik”, “biz bunun qarşısını alırıq və bundan sonra da alacağıq”, eləcə də feilin lazım şəklində işlənən “anlamalı, bilməlidirlər, “azad yaşamalıdır” ifadələri müstəqilliyimizin qorunması yolunda söylənilən nitqin ecazkar olması səbəbləridir.

Frazeologizmlər Heydər Əliyev dilində digər nitq elementləri ilə harmoniyada olduğundan dinləyicilər tərəfindən maraqla qarşılanır, yaddaqalan olur. Qeyd etdiyimiz kimi frazeologizmlər Heydər Əliyev çıxışlarının baş verdiyi məkan və zaman anlayışlarından ayrı deyildir. Nitqdə qətiyyətli, kəsərli,

səfərbəredici ifadələr gərgin ictimai-siyasi dövrlərə uyğun gəlir. Hər bir frazeologizm ya özündən sonra mətni açır, ya da mətnin məzmununa uyğun sonluğa – möhürbəndə çevrilir.

Hakimiyyətə qayıdışının bir ili tamam olmadığı ölkəxarici və ölkədaxili gərgin ictimai-siyasi bir dövrdəki (11 avqust 1994-cü il) çıxışın "Prezident sarayında respublika iqtisadiyyatının vəziyyətinə həsr olunmuş geniş müşavirədə" giriş sözündə səslənmiş frazeologizmlərin üzərində dayanmağı məqbul hesab etdik ki, "iki stul üzərində oturmaq" frazeologizmi bu qəbildəndir.

Çıxışın ahənginə uyğun feilin lazım şəklində "möhkəm olmalıdır", "fəaliyyət göstərməlidir" ifadələri ilə auditoriyaya müraciət olunur: "İndiki şəraitlə cəmiyyətimiz daha da möhkəm olmalıdır. Mən hesab edirəm ki, görülən tədbirlər məhz bu məqsədi daşıyır və hamı bu istiqamətdə fəaliyyət göstərməlidir" [IIc.s.122].

Cəmiyyəti fəallığa çağıran lider-natiq sonrakı mərhələdə "iki stul üzərində oturan"ları xalqa tanıtmaq üçün situasiyanı bütünlüklə aydınlaşdırır: "Bəzi qruplar son vaxtlar yenə də şayiələr yayırlar. Moskvanın bəzi qəzetlərində son vaxtlar Azərbaycana qarşı böhtan, təbliğat xarakteri daşıyan məqalələr dərc olunur. Bəzən bunları respublikamızda yaşayan adamlar təşkil edir və bunun üçün ciddi səy göstərirlər. Ona görə də bu gün mən bu böyük müşavirədə bildirmək istəyirəm ki, belə hərəkətlər, belə cəhdlər *heç vaxt*, *heç kəsə* uğur gətirə bilməz. Respublikada ictimai-siyasi sabitliyi pozmağa çalışan adamlara qarşı amansız olacağıq. Hüquq-mühafizə orqanları, yerli hakimiyyət orqanları bu işlərlə *ciddi məşğul olmalı* və *məsuliyyət daşımalıdırlar*. Bizim sıralarımızda bəzi adamlar var ki, *iki stul üzərində oturmaq* istəyir – həm o tərəfdə, həm də bu tərəfdə. Bunlarla da qurtarmaq lazımdır" [IIc.s.122].

Sabitliyi pozanlara qarşı mübarizədə işlənən "amansız olacağıq" qəti gələcək zamanda işlədilən ifadə, eləcə də "ciddi

məşğul olmalı” və “məsuliyyət daşımalıdırlar” feilin lazım şəklində səslənən ifadələr məsələnin ciddiyyətini auditoriyaya çatdırır. “Bəzi adamlar var ki” ifadəsini eşidən müşavirə iştirakçıları növbəti fikri tutmağa çalışır və “həm”, “həm də” bağlayıcıları ilə qurulan “həm o tərəfdə, həm də bu tərəfdə” ifadəsi ilə izahı verilən “iki stul üzərində oturmaq” frazeologizminin açıqlanması yaddaqalan bir ifadəyə çevrilir. “Bunlarla da qurtarmaq lazımdır” ifadəsini eşidən ikili mövqe tutanlar özlərini yığışdırırlar.

Bu frazeologizmin ardınca tutulan yol açıqlanır, ikili mövqe sahiblərinə “qulaqlarını açıb eşitsinlər” frazeologizmi tuşlanır.

Ölkənin gələcək inkişaf istiqaməti baxımından “yol”la bağlı frazeologizmlər sıralanır. Bu tip frazeologizmlərə inkarda işlədilən “yoldan çəkinməmək”, “yoldan dönməmək”, “aydın yol”, “düz yola gəlmək”, “düz yola gəlməmək” aid edilə bilər: “Bilirsiniz ki, Azərbaycan Respublikasının həm daxili, həm də xarici siyasəti aydındır. Mən dəfələrlə bunu elan etmişəm. Biz bu yoldan *çəkinməyəcək*, *dönməyəcəyik*. *Çünki* respublikanın daxilində aparılan siyasət – demokratiya, sərbəstlik, insan hüquqlarına hörmət, azadlıq, siyasi plüralizm – bunların hamısı Azərbaycanda hüquqi cəmiyyət yaradılmasına yönəldilmiş prinsiplərdir. Biz bunlardan *dönməyəcəyik*. Xarici siyasətimiz də məlumdur – bütün ölkələrlə bərabərhüquqlu, qarşılıqlı surətdə faydalı əlaqələr qurmaq və onları inkişaf etdirmək. Bu sahədə də lazımi işlər görülür və müəyyən nəticələr əldə olunub” [IIc.s.122]. Tutduğu yoldan çəkinməyən, dönməyən lider, prinsiplərdən də dönmür, çəkinmir. “Çünki” səbəb bağlayıcısı ilə aparılan siyasətin düzgünlüyünü sübut edir, düzgün siyasətə qarşı gedənlər isə “biz bu yoldan çəkinməyəcəyik, dönməyəcəyik” qətiyyətli ifadə ilə xəbərdar edilir.

Öz prinsipial mövqeyini bəyan edən lider "əl qaldırmaq" frazeologizmi ilə mövqe dəyişənlərə feilin əmr şəklində "eşitsinlər" ifadəsi ilə xəbərdarlıqla yanaşı "düz yola gəlsinlər"lə nəsihət verilir. "Ancaq mən imkan verirəm ki" ifadəsi ilə böyük səbr və iradə, ağsaqqallıq missiyasının yerinə yetirilməsindən söhbət açılır. "Əgər" şərt bağlayıcısı ilə (düz yola gəlməsə) feilin qəti gələcək zamanında işlədilən ifadə özünə yer alır (lazımi ölçülər götürüləcəkdir!): "Ona görə də mən bir daha deyirəm ki, bu yoldan çəkinməyəcək və dönməyəcəyik. Əgər kimsə bizim bu açıq, aydın yolumuza xələl gətirmək, respublikamızın daxilindəki ictimai-siyasi sabitliyi pozmaq, şayiələr yaymaq istəyirsə, yaxud kimsə bu gün bu siyasətə, sabah – döngəni o tərəfə dönəndə başqa bir siyasətə əl qaldırırsa, bizim sıralarımızda belə adamlar olmamalıdır. Onlar qulaqlarını açıb eşitsinlər: belələrini görürük, şəxsən mən də görürəm. Ancaq mən imkan verirəm ki, bu adamlar özləri özləri haqqında lazımi tədbirlər görsünlər, *düz yola gəlsinlər*. Əgər kim nəhayət *düz yola gəlməsə*, onlar haqqında lazımi ölçülər götürüləcəkdir" [II c., s.123].

Təkcə yuxarıdakı mətni frazeologizmlər ardıcıllığı kimi təsvir etmək mümkündür:

*İki stul üzərində oturanlar* bilsinlər ki, biz bu *yoldan çəkinməyəcək*, *dönməyəcəyik, bizim bu açıq, aydın yolumuza* xələl gətirmək istəyənlər, döngəni o tərəfə dönəndə başqa bir siyasətə *əl qaldıranlar qulaqlarını açıb eşitsinlər və düz yola* gəlsinlər.

Göründüyü kimi bütün leksik – qrammatik vahidləri ortadan götürüb kənara qoysaq Heydər Əliyevin frazeologizmlərdən ibarət möhtəşəm nitqini alarıq!

8 frazeologizmdən ibarət möhtəşəm bir cümlənin – "iki stul üzərində oturmaq", "yoldan çəkinməmək", "yoldan dönməmək", "açıq yol", "aydın yol", "əl qaldırmaq", "qulaqlarını açıb eşitmək", "düz yola gəlmək" – şahidi oluruq.

Qanunları saya salmamaq, qanunlara riayət etməmək, özbaşınalıq kimi mənalandırılan “qoçuluq”, “qoçuluq etmək” frazeologizmi özlüyündə qanun pozuntusuna işarədir. Məhz qanun pozuntusuna işarə olunan belə bir frazeologizm öz ətrafında gerçəkliyə qəti münasibət bildirən modal sözlərlə (“qətiyyən”, “şübhəsiz ki”, “sözsüz ki”, “güman edirəm ki”) prinsipiallığa xidmət edən inkar əvəzlikləri (“heç kəs”, “heç bir”), feilin lazım şəklindəki ifadələr (“işləməlidir”, “cavab verməlidirlər”, “tətbiq edilməlidir”), feilin qəti gələcək zamanda işlədilən ifadələr (“tədbir görəcək”, “məsuliyyət daşıyacaqlar”, “hər kəs özü üçün nəticə çıxaracaq”, “nail ola biləcəyik”) iştirak bağlıyıcıları ilə (“istər və istərsə”) əhatə olunmuşdur. “Qoçuluq etmək” loru, ümumişlək frazeologizminin ardınca bu qoçuluğun qarşısını kəsən ardıcıl, qətiyyətli tədbirlər sistemi həyata keçirilir: “Biz belə hallara dözə bilmərik, *qətiyyən* dözə bilmərik. Heç kəs fikirləşməsin ki, indiyədək belə işlər bağışlanmışdır, yaxud da kim isə qoçuluq etmişdir və qoçuluq davam edəcəkdir. Hamı qanun çərçivəsində işləməlidir. Qanunu pozan adamlar vəzifəsindən, keçmiş xidmətindən asılı olmayaraq cavab verməlidir. *Şübhəsiz ki*, inzibati orqanlar bu barədə tədbir görəcək, qanunu pozan adamlar məsuliyyət daşıyacaqlar.

*Sözsüz ki,* biz də bundan lazımi nəticələr çıxarırıq. Ancaq mən bu hadisə haqqında məlumat verərək – baxmayaraq ki, bu hadisə barədə məlumat yəqin bütün respublikaya yayılmışdır, – hamını xəbərdar etmək istəyirəm: heç bir vəzifəli şəxs qanundan kənara çıxa bilməz. *İstər* baş nazir olsun, *istər* nazir, *istər* icra hakimiyyətinin başçısı olsun, – fərqi yoxdur. Əgər biz demokratik dövlət qururuqsa, demokratiya yolu ilə gediriksə, deməli, heç kimin qanunu pozmağa ixtiyarı yoxdur.

Onu pozanlara qarşı isə, *şübhəsiz ki*, qanun tətbiq edilməlidir. *Güman edirəm ki*, bundan *hər kəs* özü üçün nəticə çıxaracaq, son vaxtlar cəmiyyətimizdə nizam-intizamın möh-

kəmləndirilməsi, mənəvi saflığa doğru irəliləyiş bundan sonra da davam edəcək və biz cəmiyyətimizdəki mənfi halların aradan qaldırılmasına get-gedə *nail ola biləcəyik*” [IIc.s.35].

Prinsipial mövqe bildirməklə bağlı işlədilən frazeologizmlər əsasən bu mövqeni əks etdirən “inkar əvəzlikləri”, “inkar ədatları”, “qüvvətləndirici ədatlarla” birgə işlədilir. “İpini çəkmək” frazeologizmi loru leksikaya mailkdir ki, bu cür frazeologizmlər qanunları kobud şəkildə pozanlara, əxlaqi dəyərlərə etinasızlıq göstərənlərə qarşı işlədilir. Xalq üçün xüsusi bir xidməti olmayan məmurların dövlətin pulunu kabinet təmirinə sərf edənlərə qarşı bu cür frazeologizmlər, necə deyərlər tətbiq olunur: “Ona görə də mən bu gün bu təşkilati qərarları qəbul edərək, eyni zamanda hamını xəbərdar edirəm, hamını.

*Heç kəs* burada özünə müstəsna bir yer tuta bilməz. Hamı qanun qarşısında cavabdehdir. *Heç kəs* hesab etməsin ki, onun üçün xüsusi bir status olmalıdır. Yaxud, onun hansısa xidmətləri var və o, nə istəsə edə bilər. *Yox*, bu nədir, – vəzifəyə təyin olunan kimi tez kabineti təmir etdirirlər. Yenə də deyirəm, mən üç ildir burada işləyirəm, Ədalət Əliyevin üzünü görməmişəm. Ancaq Nazirlər Kabinetinə gəlib-gedirdi, hətta deyirlər, Milli Məclisə də gəlib iştirak edib, nitqlər söyləyirmiş. Ancaq bilmirəm, nə nitqlər söyləyirmiş orada.

Bir adam bunun *ipini çəkəydi* ki, *axı* belə işlər görmək olmaz. İndi yoxlama zamanı gedib görüblər ki, 6 milyon, ya 5 milyon təmirə veribdir, yaxud da ki, kabinetini düzəltməyə veribdir” [VIIc.s.155]. İpi çəkilməli olan şəxslərə qədər iki yerdə “heç kəs” inkar əvəzliyi, “yox” inkar ədatı, “axı” qüvvətləndirici ədatı ilə ciddi, prinsipial nitq yaradır. Bu ciddilik yaddaqalması ilə, səfərbəredici ruhda olması ilə fərqlənir.

Frazeologizmlərin səslənməsinə qədər Heydər Əliyev dilində fəlsəfiliklə, poetikliklə dolu nitq işə düşür. Dünya azərbaycanlılarının qurultayındakı nitq bu qəbildəndir. “Bilir-

siniz" fəlsəfi ovqat yaradan modal sözlə başlayan nitq "qürbət" ifadəsinin bir neçə yerdə təkrarlanması ilə müşayiət olunaraq, "daha da çox" qüvvətləndirici ədatla "əl tutmaq" frazeologizminə qədər bir yol keçilir: "Bilirsiniz, nə olur-olsun, siz qürbətdə yaşayırsınız. İnsan öz doğma torpağında yaşayanda, nə qədər çətin olsa da, yenə də torpaq ona güc verir, necə deyərlər torpaq ona iradə verir. *Amma* siz qürbətdə yaşayırsınız. Mən bunu o mənada demirəm ki, qürbətdə yaşamaq pis şeydir. *Yox*. Ancaq bu anlayış bütün dünyada da var, bizdə də var. Ona görə də qürbətdə yaşayan insanlar bir-birinə *daha da* çox dayaq olsunlar, bir-birinə *daha da* çox *əl tutsunlar*"[XXXVIc.s.444].

"Heydər Əliyevin nitqində frazeologizmlərin digər nitq vahidləri ilə əlaqəsi" fəslini başa vuraraq aşağıdakı mülahizələri söyləmək mümkündür:

– Əksər təsadüflərdə frazeologizmlər ədatlarla harmoniyada verilir. Qüvvətləndirici ədatlar içərisində "axı", "bax", "ən" ədatları daha çox təsadüf olunur;

– Prinsipial mövqe tutmaqla bağlı işlədilən frazeologizmlər əsasən bu mövqeni əks etdirən "inkar əvəzlikləri", "inkar ədatları", "qüvvətləndirici ədatlarla", feilin inkarda işlədilən qəti gələcək zamanla birgə işlədilir;

– Heydər Əliyev dilinin frazeoloji inventarını struktur baxımdan təhlili sayların affirmativ feili frazeoloji birləşmələrin komponent tərkibi kimi az işlənmədiyini göstərir.

– Frazeologizmlərin şüurlara yönəlməsi yolunda, yaddaqalan olması baxımından nitqdə ritorik suallara xüsusi diqqət yetirilir;

– Heydər Əliyevin dilində frazeologizmlər digər nitq vahidləri ilə harmoniyada öz ekspressivliyini artırmış olur. Bir qisim hallarda böyük natiq frazeologizmlərin izahında qüvvətləndirici və dəqiqləşdirici ədatlardan müvəffəqiyyətlə istifadə edir.

# IV FƏSİL
# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ FRAZEOLOGİZMLƏRİN SİNONİMLƏŞMƏSİ

Sinonimlərlə zəngin olan Heydər Əliyev nitqi [208] sinonimik frazeologizmlərdən də yan keçmir. Sinonimlik hadisəsi burada da özünü bariz şəkildə göstərir. Bu fəslə keçməzdən öncə sinonimləşmə məsələləri ilə bağlı tədqiqatçıların [215] fikirləri ilə tanışlıq vacib sayılır. Bu gün də dilçilikdə frazeologiya sahəsində mübahisə obyekti kimi qəbul olunan sinonimlik və variantlıq hadisələrinə nitqin ekspressivliyini yüksəltmək baxımından biz öz tədqiqatımızda eyni müstəvidən yanaşdıq. Feili frazeologizmin komponenti rolunda hər cür sabit söz birləşməsini frazeologiyanın tədqiqat obyektinə daxil etmək olmaz. Bunun üçün sabit söz birləşmələri bir sıra əlamətlər çoxluğuna malik olmalıdır:

Bir sözdən ibarət frazeologizm ola bilməz. O, ən azı iki və daha artıq sözdən ibarət olmalıdır. Əgər söz məcazi mənada işlənirsə, bu heç də onun frazeoloji vahid olması demək deyildir;

Frazeologizm dildə özünə vəsiqə qazanmalı, öz işləkliyi ilə seçilməlidir. Təkcə bir qrup insan tərəfindən istifadə olunan birləşmə frazeologizm deyildir. O, dilin əksər daşıyıcıları tərəfindən lazım gəldikcə istifadə olunmalıdır. Frazeologizm leksik-sintaktik sabitliyə malik olmalıdır. Bu o deməkdir ki, frazeologizm hər dəfə nitq prosesində yaranmır, ondan hazır şəkildə istifadə edilir; Frazeologizmin komponentlərindən heç olmazsa biri məcazi mənada işlənməli, leksik-semantik və sintaktik cəhətdən vahid birləşmə xarakteri daşımalıdır; Bu əlamətlərdən biri çatışmadıqda ifadə frazeologizmin tədqiqat obyektindən kənarda qala biri çatışmadıqda, o artıq frazeologizm yox sintaksisin obyektinə çevrilir.

Frazeologizm bəzən yaxın və ya eyni mənalarda işlənsələrdə, tez-tez öz komponent tərkibini yeniləşdirməyə çalışır. Bu halda frazeologizmin bu və ya digər komponenti başqa sözlə əvəz edilir. Formaca yenidən düzəlmiş bu birləşmələr frazeoloji variantlar və ya frazeoloji sinonimlər adlanır.

Əslində, variantlar və sinonimlər bir-birinə çox oxşardır və bir-birini zənginləşdirməyə xidmət edir. Dilçilər əksər hallarda onları bir-birindən ayırmaqda çətinliklərlə üzləşirlər. Frazeoloji variantlar öz oxşarları sinonimlərdən hansı əlamətlərə görə fərqlənirlər?

Bu suala dilçilərin cavabları müxtəlifdir. Əksər dilçilər [248, 262, 266, 299] belə bir fikri dəstəkləyirlər ki, frazeoloji variantlar eyni bir frazeologizmin müxtəlif formaları olub, məna, leksik tərkibinə görə sözlərdə bu və ya digər forma fərqi olur və ya söz əslində, frazeoloji variantlar sinonimlərin yaranmasında bir növ baza rolunu oynaya bilər. Obraz fərqinə gəldikdə isə demək olar ki, frazeoloji variantların əsasında eyni və ya hədsiz dərəcədə yaxın obrazlar dayandığı halda sinonimlər eyni və ya yaxın anlayışları ifadə edən müxtəlif obrazlar əsasında formalaşır.

Variantlıq məsələsinin öyrənilməsində "invariantlıq və variantlıq" anlayışlarının fərqləndirilməsinin öyrənilməsi prinsipial məsələlərdən hesab olunur [266, 299]. İnvariantlıq əsasən frazeologiyanın müəyyən zaman kəsyində nitqdə və bədii əsərlərin səhifələrində öz işləkliyi ilə seçilməsidir. Frazeoloji variantların fərqli əlamətlərinə gəlincə, bunu təkcə obrazlarda deyil, eyni zamanda əvəz olunan komponentlərin mənalarının stilistik və qrammatik əlamətlərinin oxşar və fərqli cəhətlərində axtarmaq lazımdır.

Bəzən frazeoloji birləşmənin bir komponenti, bəzi hallarda isə bütün komponentləri əvəz olunsa da, variantlıq qorunub saxlanılır. Müşahidə edildiyi kimi, variantlılıq təkcə məhdud

qrammatik dəyişikliklərlə yox, həm də frazeoloji birləşmənin dayaq komponentinin dəyişməsi ilə müşayiət oluna bilər. A.V.Kunin frazeologiyanın tərkibində iki cür komponentin olduğuna diqqət yetirir: əvəzlənən və əvəzlənməyən. Variantlılıqla əlaqədar dörd əsas cərəyan mövcuddur: Bunlardan birincisi [266, 291] hesab edir ki, frazeoloji variantlar mənaca tamamilə eyni olub, struktur və leksik baxımdan fərqlənə bilər. Başqa bir qrup dilçilər [291] variantlar arasında stilistik və ekspressiv fərqlərin mümkünlüyünü önə çəkirlər, üçüncü qrup tədqiqatçılar belə bir fikri dəstəkləyirlər ki, frazeoloji variantlar arasında siqnifikativ fərqlər mövcuddur. IV qrup dilçilər frazeoloji variantların qrammatik və fonetik fərqlərindən danışaraq bu birləşmələrə köməkçi sözlərin daxil ola biləcəyini istisna etmirlər.

Beləliklə, frazeoloji variantlar bir-iki əlaməti ilə yox, əlamətlər çoxluğu ilə fərqlənirlər.

Bu əlamətləri aşağıdakı kimi səciyyələndirmək olar: Semantik eynilik (predmet və anlayış eyniliyi); Sintaktik və stilistik-ekspressivlik; Tərkibindəki komponentlərdən biri dəyişdiyi zaman invariant komponentə malik olması; Eyni obraz əsasında yaranması

Beləliklə, frazeoloji variantın tərkibində əvəz oluna biləcək komponenti çox məhdud qruplara ayırmaq olar:

1. Birinci halda əvəz oluna bilən komponent əvəzlənən sözlə sinonimlik təşkil edə bilər.
2. Əvəzlənən komponent yenisi ilə eyni leksik-semantik qrupa aid ola bilər
3. Bu komponentlər eyni leksik-semantik qrupa aid olmadıqda onlar arasında assosiativ əlaqələr mövcud ola bilər:
4. Nəhayət, sonuncu halda bu komponentlər bir sıra hallarda mənaca bir-birindən uzaq ola bilər

Beləliklə, feili komponentlərin frazeologiya ilə asanlıqla dəyişikliyə uğraması onunla izah edilə bilər ki, feillər bu frazeologiyanın ən məhsuldar komponentidir. İsmi komponentlərin dəyişikliyə uğraması isə əsasən isimlərin dilin leksik sistemində əsas yer tutması ilə izah edilə bilər.

Heydər Əliyevin dilində frazeologizmlər əksər təsadüflərdə sinonim cərgənin nüvəsini təşkil edir. Bu sıranın təsir gücünü artırır. Onun Yeni Azərbaycan Partiyası yaradılmasının 2-ci ildönümü münasibətilə keçirilmiş ümumrespublika müşavirəsindəki nitqində (19 noyabr 1994-cü il. Şəhriyar adına mədəniyyət mərkəzi) "gözümçıxdıya salmaq" (təqib etmək, təzyiq etmək, göz açmağa imkan verməmək) frazeologizmi bu qəbildəndir. Böyük natiq partiyanın yaradılmasında xidməti olan şəxslərin qiymətini verir, onların cəsarətini açıqlayır. Frazeologizm burada mətnin orta hissəsində dayanaraq nitqin başlanğıcını sonuna tikmək funksiyasını üzərinə götürür. "Yenə də deyirəm, mən sizin, yəni YAP təşkil edənlərin, quranların, o həvəskarların, uzun müddət bu məsələni mənim qarşımda qaldıranların nəhayət, Yeni Azərbaycan Partiyasının Naxçıvanda yaranmasına nail olanların fəaliyyətini qiymətləndirirəm və həmişə də qiymətləndirəcəyəm. Bu, bizim YAP tarixində qalacaqdır. Bunu heç kəs tarixdən silə bilməz. Ancaq siz də bilirsiniz və sonra da bildiniz ki, mən Heydər Əliyev kimi təkcə YAPa mənsub olan adam deyiləm. Düzdür, siz qabağa düşmüşdünüz, təşəbbüs göstərirdiniz, bu sahədə fədakarlıq, cəfakeşlik edirdiniz. Cəsarət göstərirdiniz, heç nədən qorxmurdunuz. Bakıda mitinqlər keçirib Heydər Əliyevin qayıtmaısnı tələb edəndə sizi döyürdülər, *gözümçıxdıya salırdılar*, qovurdular, hətta həbs edirdilər. Mən bunları bilirəm, qiymətləndirirəm. Sizi döyən, sizə təzyiqlər göstərən, sizi təqib edən adamlara mən nifrət edirəm. Amma Azərbaycan xalqı təkcə onlardan ibarət deyildir. Onlar sadəcə

olaraq tarixin müəyyən mərhələlərində Azərbaycanın hakimiyyət dairələrini əlinə keçirmiş bir qrup adamlar idi. Azərbaycan xalqının, Azərbaycan vətəndaşlarının böyük əksəriyyəti sağlam əhval-ruhiyyə ilə yaşayan insanlardır. Siz cəsarətli olub qabağa düşdünüz və bu ideyaları həyata keçirdiniz. Bununla bərabər, çoxları da həmin ideyaları qəlbində saxlayırdı, bu ideyalarla yaşayırdı. Məsələn mənim portretlərim milyonlarla adamın evində qalırdı. Onlar da məni istəyirdilər. Lakin hərə öz duyğularını öz imkanları daxilində büruzə verirdi" [IIc.s.525].

Frazeologizmlər Heydər Əliyevin dilində sinonim cərgənin bir əlaməti kimi səslənərək auditoriya üçün izahedici xarakterdə olur. Heydər Əliyev üçün frazeoloji birləşmələrin sinonimləri öz yerini həmişə dəqiqliklə tapır. O, əgər Azərbaycan ordusu tərəfdən baş verən ölümləri "həlak olmaq" kimi adlandırırsa, erməni tərəfdən baş verən ölümü "qırılmaq" kimi qiymətləndirir.

"Sovetlər İttifaqının rəhbərliyi bu münaqişəni nizama salmaq iqtidarında olmadı, daha doğrusu, sadəcə olaraq, bunu istəmədi, bu münaqişədə *birtərəfli mövqe*, Azərbaycan barəsində *ədalətsiz mövqe* və bununla yanaşı, Ermənistan barəsində *havadarlıq mövqeyi tutdu*. Bu münaqişə nəticəsində Ermənistana daha çox yardım göstərməyə başladıqlarına və bəzi subyektiv səbəblərə görə Ermənistan silahlı birləşmələri Azərbaycan ərazisinin 20 faizini işğal etmişdir. İşğal olunmuş torpaqlardan bir milyondan çox azərbaycanlı didərgin salınmışdır, onlar 7-8 ildən çoxdur ki, Azərbaycanın müxtəlif bölgələrində və əksəriyyəti də çadırlarda yaşayır, böyük çətinliklər çəkirlər" [XXVIIIc.s.305]. Elə bu mətndə "havadarlıq mövqeyi tutmaq" frazeologizmin "birtərəfli mövqe tutmaq", "ədalətsiz mövqe tutmaq" kimi sinonim frazeologizmlərini açır. Növbəti nitq mərhələsində bu havadarlığın hansı nəticə-

lərə gətirib çıxardığını bir-bir açıqlayaraq bu frazeologizmlə, həm mətni aydınlaşdırır, həm də nitq baxımından yaddaqalan edir.

"İndi siz də deyirsiniz, dünən də dedilər ki, mən incidim. Bilirsiniz, dost-dostdan inciyər. Azərbaycanda bir söz var, insan *uman yerdən küsər*. Bu söz sizdə varmı – uman yerdən küsərlər? Ummayan yerdən mən niyə küsürəm? Küsdüm-küsmədim, onun üçün də, mənim üçün də bunun əhəmiyyəti yoxdur, uman yerdən küsərlər. Azərbaycan Türkiyədən çox şey umur. Bütün xalqımızda, o cümlədən məndə də belə fikir var ki, Türkiyə böyük dövlətdir, böyük imkanlara malik olan dövlətdir. Türkiyə bizim qardaşımızdır, qan qardaşımız, can qardaşımızdır. Qan qardaşı olanda Azərbaycanda yenə bir söz var, *öz boğazından kəsib qardaşına verir*. Lazımdır ki, xalqımızın milli adət-ənənələri dövlətlərimizin arasında da olsun" [IXc.s.402].

Heydər Əliyevin dilində frazeologizmlərin tez-tez digər sözlərlə sinonimləşməsinə təsadüf olunur. Belə ki, "hər birisini inandırmağa, *başa salmağa*, anlatmağa çalışırdım ki, bu qərar ədalətsizdir, bunu ləğv etmək lazımdır" [XXVIIIc.s.305].

Hər hansi bir dilin frazeoloji təbəqəsi aid olduğu xalqın böyük həyat təcrübəsinin, müdrikliyinin, onun bilik səviyyəsinin nə dərəcədə inkişaf etməsini əks etdirən zəngin xəzinədir. Nəsillərdən-nəsillərə ötürülən frazeoloji birləşmələr dilin ifadəlilik xarakterinə malik olmasını nümayiş etdirən əsas faktorlardan biridir [143, 281, 282]. Frazeologiya ilə bağli tədqiqatlar nitq mədəniyyətinin və nitq ustalığının artırılmasına şərait yaradır [143].

Frazeoloji vahidlə söz arasında ümumi əlamət vardır. Frazeoloji vahidin əsas əlaməti, daha doğrusu, əsas meyarı söz kimi məna tamlığındadır. Yəni frazeoloji vahidin mənası onun ayrı-ayrı üzvlərinin mənası deyildir [143].

Məşhur alman dilçisi T.Şipan frazeologizmləri belə xarakterizə edir: “Frazeologizmlər dedikdə iki və daha artıq sözün möhkəm birliyi (feste Einheit) başa düşülür. Dilin frazeoloji tərkibini təşkil edən bu dil vahidlərinin başlıca xüsusiyyətləri sabitlik, idiomluq, tətbiq olunarkən dəyişikliyə uğramadan bir bütöv halda işlənməsi, tərkib elementlərinin sərbəstliyinin qismən və ya tamamilə itməsi (Reproduzierbarkeit, Stabilität, Lexikalität, Idiomazität) nəticəsində vahid semantikaya malik olmasından ibarətdir“ [28].

H.Burqer qeyd edir: “Frazeologizmlərdə komponentlərin əvəzlənməsi bir qayda olaraq onların idiomluğundan asılı olduğuna görə məhdudiyyətlə üzləşir. Bəzi hallarda frazeoloji komponentlərin əvəzlənməsi tamamilə qeyri-mümkündür, çünki onlarda leksik semantik sabitlik mövcuddur. Frazeologizmin bütöv mənası ayrı-ayrı konkret leksik elementlərin kombinasiyasından asılıdır və bu baxımdan model xüsusiyyətinə (Modellcharakter) malik deyildir” [314].

V.İ.Zimin [254] frazeologizmlərin sabitlik əlamətininin üç formada təzahür etdiyini qeyd edir:

1. semantik sabitlik; 2. sintaktik strukturdakı sabitlik; 3. istifadə olunarkən sabitlik. Y.Şternkopf [315] isə frazeologizmlərin sabitlik əlamətini belə izah edir: “Frazeologizmlərin sabitliyi heç də mütləq mənada başa düşülməməlidir. Sabitliyin özünün müxtəlif dərəcələri vardır, bəzən onun cüzi pozulması frazeologizmin mənasının itməsinə səbəb ola bilir” [314, 315]

Frazeoloji birləşmələrdə baş verən dəyişkənliyi H.Bayramov frazeoloji variantlar hesab edir: “Dildə eyni mənanı ifadə etmək üçün frazeoloji vahidin leksik, leksik-qrammatik cəhətdən dəyişikliyə uğramasına frazeoloji variasiya, bunun əsasında yaranan belə sabit birləşmələrə isə frazeoloji variantlar deyilir” [9, 161]. Ç.Qurbanov [258] frazeoloji

variantlardan bəhs olunan namizədlik dissertasiyasında problemi linqvistik aspektdə belə şərh edir: "Frazeoloji variantlar dedikdə eyni mənbədən parçalanma (şaxələnmə) nəticəsində əmələ gələn, eyni frazeoloji vahidin forma və məzmun assosiasiyasına, eyni valentliyə və yalnız konkret şəraitdə distribusiyaya malik olan qismən fərqli leksik tərkibli frazeologizmləri başa düşürük" [6, 10].

Azərbaycan dilində privativ frazeoloji birləşmələrdə leksik dəyişkənliyin baş verməsini görmək üçün aşağıdakı nümunələrə diqqət yetirək:

1. a) başına daş salmaq b) başını batırmaq;

2. a) ağlını itirmək b) başını itirmək c) başına hava gəlmək;

3. a) arzusu gözündə qalmaq b) arzusu ürəyində qalmaq;

4. a) yurduna od salmaq b) yurdunda turp əkmək c) yurdunu viran qoymaq və s.

"Amma eyni zamanda bunlar bizi heç də *işimizdən soyutmamalıdır*, əksinə, əldə olunan nailiyyətlər əsasında biz işimizi bundan sonra daha da sürətləndirməliyik" [VIIc.s.393]. "İdmançılar İlham Əliyevi özlərinə başçı, prezident seçəndən sonra o elə böyük həvəslə, elə böyük ruh yüksəkliyi ilə, elə məhəbbətlə bu *işdən yapışıbdır* ki, onu bundan heç cür ayırmaq mümkün deyildir" [XLIIc.s.260]. Elə burada "işdən yapışmaq", "işdən soyumamaq" kimi privativ frazeologizmlərə rast gəlirik.

"Amma onlar *kənarda durmuşdular* ki, qoy vursunlar, görək nə olar, sonra nə edərik" [XXIIIc.s.85]. "O zaman mən də *kənarda qalmadım*, öz sözümü dedim, münasibətimi bildirdim" [IVc.s.242]. Yuxarıdakı misallarda isə hər iki variantda fərq frazeologizmlərin konkret şəraitə görə işlənməsindədir.

Nümunələrdən göründüyü kimi, bir sıra privativ frazeoloji vahidlərin eyni məna ifadə etməklə leksik tərkibi, komponentləri arasındakı sintaktik əlaqənin səciyyəsi və bəzi başqa əlamətləri etibarilə bir-birindən fərqlənən iki, üç, hətta daha çox forması mövcuddur. Belə frazeoloji privativlər həm bədii üslubda, həm də danışıq üslubunda geniş tətbiq olunmaqla yanaşı, fikrin obrazlı ifadəsində və neqo-pozitiv variasiyanın yaranmasında mühüm rol oynayır. Çünki onlar təkrarların qarşısını alır və fikrin daha dərin, dəqiq və obrazlı ifadəsinə xidmət edir.

Privativ frazeologizmlərin sabitlik əlamətinə dair aparılan təhlillərdən belə bir nəticəyə gəlmək olar: privativ frazeologizmlərin 1:3 hissəsinin tərkib elementləri bu və ya digər formada müəyyən dəyişkənliyə uğrayır və bunun nəticəsində frazeoloji variantlar və yaxud frazeoloji sinonimlər yaranır. Privativ frazeoloji birləşmənin mətndaxili modifikasiyası zamanı o, struktur cəhətdən parçalanmaya məruz qalır və bu halda onun komponentlərinin inversiyası reallaşır. Privativ frazeoloji variantlar məhz belə inversiyalardan əmələ gəlir. Beləliklə, privativ frazeologizmlərin modifikasiyası dedikdə praqmatik aspektdə privativ frazeoloji birləşmələrin tərkibində baş verən fonetik, leksik və praqmatik dəyişkənlik imkanları başa düşülür. Modifikasiya zamanı privativ frazeoloji birləşmələrin komponentini əvəz edən söz onunla ya məna çalarına görə fərqlənən sinonim, ya da tematik cəhətdən eynicinsli leksik vahid olur. Privativ frazeologizmlərin sabitlik əlamətindən kənara çıxma hallarının təhlili göstərir ki, onların struktur baxımdan modifikasiyası inkar-təsdiq variasiyasının əmələ gəlməsinə səbəb olur [305, 306, 314, 315].

Ümumiyyətlə, Heydər Əliyev nitqləri sinonimlərlə zəngindir ki, bu nitq ünsürü frazeologizmlərin auditoriyalarda səslənməsi ilə müşayiət olunur. Fərasətsiz, dövlətçilik təcrü-

bəsi olmayanlar haqqında danışarkən işlətdiyi "dəm vurmaq", "ağızdolusu danışmaq", "boşboğazlıq etmək", "dil boğaza qoymamaq" kimi frazeologizmlərə qədər situasiyanı aydınlaşdırır. Aydınlaşan situasiya frazeologizmlərlə yekunlaşır: "Camaat daha işləmir, dolanmaq üçün xırda ticarətə girişmişdir. Vecsiz malları qalaq-qalaq alıb alverlə dolanırlar. Amma di gəl ki, bir şey istehsal etmirlər. Neft hasilatı kəskin şəkildə azalmışdır. Hakimiyyətə gələnlərin nə təsərrüfat, nə idarəetmə işlərindən, nə də siyasətdən başları çıxırdı! Kiçik elmi işçi, yazıçı olan bu adamlar dövlətin nə demək olduğunu başa düşmürlər. Halbuki özləri azadlıqdan, hürriyyətdən, haqq-ədalətdən *dəm vurur,* bunlardan *ağız dolusu danışırlar,* axırı nə oldu – hamılıqla oğurluğa qurşandılar. Xalq bütün bunları görürdü və buna görə də çox məyus olmuşdu. İş-gücləri küçələrdə "Mersedes"lərlə ora-bura çapmaq və *boşboğazlıq etmək* idi. Elə hey danışır, *dil boğaza qoymurdular*. Mənəviyyatsızlar, əxlaqsızlar, açıq-aşkar oğrular çox idi, lap çox" [Ic.s.58]. Bu kiçik mətndəki 4 yerdə işlənmiş sinonim frazeologizmlər digər "oğurluğa qurşanmaq", "başı çıxmamaq", "ora-bura çapmaq" frazeologizmlərlə, eləcə də "nə... nə də" inkar bağlayıcıları ilə bir yarıməişət, yarıpublisistik bir nitq nümunəsi yaradılır.

Frazeoloji sinonimlərdən tez-tez isifadə olunur ki, aşağıdakı cümlədə "can qoymaq", "özünü oda atmaq", "güllə qarşısına atmaq" kimi sinonim cərgə özünü göstərir: "Onlar *canlarını qoyublar, özlərini oda atıblar, güllə qarşısına atıblar*" [XXXIVc.s.63].

Sinonimlik geniş, əhatəli anlayış olmaqla dilin ayrı-ayrı səviyyələrinə aid olan dil vahidlərinin sinonimliyini özündə birləşdirir. Z.Verdiyeva [97] yazır: "Sinonimlərdən bəhs edən əsərlərdə sinonimlərin mahiyyətinin müəyyənləşdirilməsi üçün göstərilən meyarın özü dəqiq, bitkin olmamış və hətta

bəzən bir-birindən fərqli mülahizələr irəli sürmüşdür.” Böyük ensiklopedik lüğət (Dilçilik) sinonimliyi aşağıdakı kimi aydınlaşdırır: qismən uyğun gələn dil vahidlərinin semantik münasibətlərini əks etdirir. Sinonimlik dilin leksik, frazeoloji, qrammatik, sözyaratma sistemlərini əhatə edir [92, 103, 251].

“Dilçilik ensiklopediya”sında isə sinonimlərə nisbətən fərqli münasibət öz əksini tapır: “Mənaca bir-birinə eyni və ya yaxın olan, eyni və ya oxşar denotatı ifadə edən, lakin üslubca və məna çalarlığına görə fərqlənən sözlərə sinonim deyilir. Əsas növləri bunlardır: a) qrammatik və ya sintaktik b) mütləq sinonimlər c) nisbi sinonimlər ç) üslubi sinonimlər [55].

Sinonimlərə Dəmirçizadə tərifi isə aşağıdakı kimi səslənir: “Sinonim əsas mənasına görə mütləq və ya nisbi eyniyyət təşkil edən, lakin formasına və əlavə mənasına görə fərqlənən sözlərdir” [54].

Sinonimlərin dilin müxtəlif səviyyələrində özünü göstərməsi frazeologizmlərdən də yan keçmir. Sinonimlik dilin frazeoloji səviyəsində də, leksik səviyyədə olduğu kimi fərqli struktur xüsusiyyətləri ilə seçilən dil vahidlərinin oxşar və ya yaxın mənalar ifadə etməsi nəticəsində özünü göstərir: Biri digərini əvəz edə bilən belə frazeologizmlərə frazeoloji sinonimlər deyilir [38].

Leksik sinonimlər kimi, frazeoloji sinonimlər də ünsiyyət prosesi zamanı müxtəlif frazeologiyalar vasitəsilə oxşar məzmunun ifadə olunmasına imkan verir. Bu oxşar mənaların sinonim frazeologizmlərdə öz əksini tapmasında onların işləndiyi mətnin ümumi məzmunu, situasiya da mühüm rol oynayır. Məsələn, “razılığa gələ bilməmək” mənasını ifadə etmək üçün “sözü çəp gəlmək”, “tərəddüd etmək”, “sözü düz gəlməmək”.

Frazeoloji sinonimləri – üslubi boyasına, leksik tərkibinə görə fərqlənən və mənaca bir-birinə yaxın olan müstəqil ifadələr” də adlandırırlar [20, 21, 177, 281, 282].

Müəyyən hallarda frazeologizmlər sinonimlərin hansından istifadə olunması üslubi məqamlardan, mətnin məzmunundan və ifadə məqsədindən asılı olur. Bəzən isə mənanı daha da qüvvətləndirmək fikri daha da təsirli ifadə etmək üçün sinonim frazeologizmlərdən eyni zamanda istifadə edilir. Məsələn: 20 ildir ki, iki adam işləyib iynə ilə gor qazırlar, külüng çalırlar.

Bu 125 deputat gərək o qədər səviyyəli, Azərbaycan xalqının daxili mənəviyyatını o qədər təmsil edə bilən insanlar olsun ki, prezidentlə birlikdə Azərbaycanı bir daha *yuxarıya qaldırsınlar* və cəmiyyətimizi *irəliyə apara bilək*” [IVc.s.186].

Azərbaycan dilində ümumi mənasına görə yaxın və oxşar olan frazeologizmlərlə yanaşı, bir çox hallarda mənaca tamamilə üst-üstə düşən, yəni dublet səciyyəli frazeologizmlərə də təsadüf olunur. Bunların Azərbaycan dilində nə məna, nə də üslubi cəhətdən fərqi yoxdur [129,140,141].

Xalqın taleyüklü məsələlərində, ciddi seçimlər qarşısında Heydər Əliyev dilində “ölçüb-biçmək”, “götür-qoy etmək” frazeologizmləri öz yerini alır. Hər iki frazeologizm analitik təfəkkür sahibi siyasi lider dilində yerli-yerində işlənir. Məsələn, 23 dekabr 1994-cü ildə bazar iqtisadiyyatına keçid dövründə “Aqrar bölmədə iqtisadi islahatlara həsr olunmuş geniş müşavirədə”ki çıxışında “ölçüb-biçmək” frazeologizmi təsadüfən işlənmir. “Ümumin” malı hesab olunan sovet təsərrüfat sistemini yenidən öz yerinə – bazar iqtisadiyyatı sisteminə qaytarmağın çətinliyi özlüyündə məlumdur. Eləcə də insanların 70 il ərzindəadaptasiya etdiyi aqrar siyasəti dəyişməyin də bir çətin problem olduğunu bilən dövlət başçısı “yüz

ölç bir biç" zərb məsəlinə uyğun "ölçüb-biçmək" frazeologizmi ilə auditoriyanı səfərbər edir: "Ancaq bütün bu müzakirələrə baxmayaraq, mən yenə də bugünkü böyük müşavirənin keçirilməsini zəruri hesab etdim. Çünki məsələ çox ciddidir, mürəkkəbdir və bu məsələni həll etmək üçün gərək çox ölçüb-biçək" [IIIc.s.53].

Əgər aqrar islahatlarla bağlı "ölçüb-biçmək" frazeologizmi işə düşürsə, xalq şairi Məmməd Arazın "Azərbaycan – dünyam mənim" yaradıcılıq gecəsindən sonra ziyalılarla olan görüşdə "götür-qoy etmək" frazeologizmi özünə yer alır. "Düşünmək" təfəkkür feilinin sinonimi kimi "götür-qoy etməyi" işə salır. Bu gün də Azərbaycan xalqının müstəqillik mücadiləsində, savaşında ilk "İstiqlal" ordeni ilə təltif olunan ədəbiyyat xadimləri, şairləri Bəxtiyar Vahabzadə, Məmməd Araz, Xəlil Rza barəsində "götür-qoyun" yerində olması qənaətinə gəlirsən. Yaradıcı ziyalılar arasında, xalq yazıçıları və şairləri arasında bu frazeologizm Heydər Əliyevin dilində poetik çalarlarla auditoriyaya yön alır, "xırda-xırda, misra-misra, damcı-damcı yaratdığınız əhval-ruhiyyə" ifadəsi "ölçüb-biçən", "götür-qoy edən", "düşünən" və "qərar qəbul edən" lideri xalqa tanıdır: "Ən yüksək mükafat təsis olunub – bu, "İstiqlal" ordenidir. Kimə birinci çatmalıdır bu orden? Mən bir neçə aydır bu haqda düşünürəm. Çox *götür-qoy eləmişəm* və xeyli müddət bundan qabaq belə qərara gəlmişəm ki, bu orden bax, bizim şəxsiyyətlərimizə çatmalıdır. Şəxsiyyətlərimiz birinci növbədə buna layiq görülməlidirlər. Buna görə də dünən mən fərmanlar verdim. Azərbaycan xalqının milli azadlıq uğrunda mübarizəsində xüsusi xidmətlərinə görə hörmətli şairimiz Bəxtiyar Vahabzadə, çox hörmətli şairimiz mərhum Xəlil Rza bu ordenlə təltif edildilər. Güman edirəm ki, mən doğru *addım atmışam* və hesab edirəm ki, xalqımız, ictimaiyyətimiz bunu yaxşı qarşılayacaqlar. Ona görə də sizi

təbrik eləyirəm, Məmməd Araz, səni təbrik eləyirəm, Bəxtiyar səni təbrik eləyirəm. Sizin uzun illər həqiqətən xırda-xırda, misra-misra, damcı-damcı yaratdığınız əhval-ruhiyyə Azərbaycan xalqını gətirib bugünkü vəziyyətə çıxartdı" [IIIc.s.364].

Mütləq sinonimlərin olmaması dilçi alimlər tərəfindən birmənalı qarşılnır ki, bu tip frazeoloji sinonimlər Heydər Əliyevin dilində də geniş yer alımışdır. Heydər Əliyevin işlətdiyi sinonim frazeologizmlər böyük ustalıqla, təkrarlığa yol verilmədən işlənir.

Hakimiyyət adlı ağır bir yükü çiyinlərində aparmaq, daşımaq anlamı ilə həmin hakimiyyəti əldə saxlamaq ilk baxışda ayrı-ayrı mənalar daşısa da, sonda onların sinonimliyi üzə çıxır. "Yük aparmaq" və "əldə saxlamaq" frazeologizmlərinə diqqət yetirək: "Demək belə çıxır ki, prinsipial məsələlərdə müxalifət ilə hakimiyyətdə olan qüvvələr arasında fərq yoxdur. Onda bu müxalifətin məqsədi nədir? Yalnız hakimiyyətə gəlmək, vəzifəyə gəlmək! Ancaq bir ölçüb-biçmək lazımdır ki, sən hakimiyyətə gələndən sonra *bu yükü daşıya biləcəksən,* yoxsa daşıya bilməyəcəksən? Bu ağırlığı *çiynində apara biləcəksən*, ya bilməyəcəksən? Bunu bacara biləcəksən, ya bacara bilməyəcəksən? Təcrübə də, tarix də göstərdi ki, bəzilə – o hayqırıb qışqıranlar hakimiyyətə gələndən sonra bu *yükü apara bilmədilər"* [IVc.s.78]. Elə burada "yükü daşımaq" və "yükü aparmaq" mütləq sinonim üzə çıxır.

Dövlətçiliklə bağlı 16 avqust 1995-ci ildə Prezident Sarayında Azərbaycan Respublikasının yeni konstitusiya layihəsini hazırlayan komissiyanın geniş iclasındakı nitqdə ritorik suallı mətndə "əldə saxlamaq" frazeologizmi işlənir. Hakimiyyət yükünü aparmaq və ya daşımaqla onu əldə saxlamağın sinonimliyi auditoriyaya bəlli olur: "O biriləri istefa verib çıxıb getdilər, indi dönüb təzədən müxalifət olublar, yenidən

hakimiyyətə gəlmək istəyirlər. Yaxşı, hakimiyyətə gəlmişdiniz əgər bacarırdınızsa əlinizdə saxlayaydınız, kim sizə mane olurdı? Əgər bacarmadınızsa, onda çəkilin, durun kənarda, bir il, iki il, üç il təcrübə toplayın. Ondan sonra bəlkə bir də gücünüzü sınayasınız, bəlkə hakimiyyətə keçə bilərsiniz" [IVc.s.180].

Sinonim frazeologizmlər Heydər Əliyevin də nitqində bəzən ya yaranır, ya da az işlək olanlar nitqə gətirilir və ümumişləklik qazanır.

"Yuxarıya qaldırmaq" frazeologizmi kimi: "Parlament hakimiyyət orqanının bir qoludur. Əgər icra orqanının ən yüksək nöqtəsndə duran prezidentdirsə, hakimiyyətin bir qolu olan parlament 125 nəfərdən ibarətdir. Bu 125 deputat gərək o qədər səviyyəli, Azərbaycan xalqının daxili mənəviyyatını o qədər təmsil edə bilən insanlar olsun ki, prezidentlə birlikdə Azərbaycanı bir daha *yuxarıya qaldırsınlar* və cəmiyyətimizi *irəliyə apara bilək*" [IVc.s.186].

"Yuxarıya qaldırmaq" frazeologizminin sinonimi kimi "baş ucaltmaq" elə eyni nitq məqamında işlənərək nitqi yaddaqalan edir: "Arzu edirəm ki, biz elə bir parlament seçək ki, parlamentimizin hər bir üzvü də xalqın dəstəyini ala bilsin, eyni zamanda xalqın *başını ucalda bilən* adam olsun, xalqın səviyyəsini yüksəldə bilən adam olsun, xalq tərəfindən həqiqi seçilən adam olsun. Beləlləri Azərbaycanda çoxdur. Biz Azərbaycanın intellektual, mədəni səviyyəsi ilə fəxr edə bilərik. Çünki bizim çox dəyərli insanlarımız var. Ancaq şərait yaratmaq lazımdır ki, bu dəyərli insanlar *üzə çıxsınlar,* onlar parlament seçkilərində iştirak etsinlər və bizim parlamentə daxil ola bilsinlər" [IVc.s.192].

"Tarixini açmaq", "keçmişi vərəqləmək" yaxın məzmunlu, sinonim frazeologizmlər sayıla bilər ki, bu zaman Ulu Öndər özü demiş irəliyə getmək üçün tarixi keçmişimizə eks-

kurs etmək lazım gəlir. "Keçmişi vərəqləmək" deməklə sovetlər dövründə türkdilli xalqların tarixinin dərindən öyrənilməsinə maneçiliklər olduğunu auditoriyanın diqqətinə çatdırır: Bu tarixi öyrənməklə, keçmişi vərəqləməklə "ümid bəsləmək" frazeologizmini də ortaya qoyur: "Türk xalqlarının əksəriyyəti müstəqillik əldə edib. Onlar öz müstəqil dövlətlərini qurublar. Eyni zamanda özümüzü türk dünyasının bir hissəsi kimi hiss edərək, türk dünyasının bundan sonra böyük gələcəyinə də ümidlər bəsləyirik. Ümid edirik ki, müstəqilliyini əldə etmiş hər bir xalq, millət daha çox inkişaf edəcək, bir-birinə qovuşacaq və bunlar hamısı tarixi *keçmişimizi bir daha vərəqləyərək* bizi daha da irəliyə aparacaqdır" [Vc.s.177].

"Tarixi açmaq" frazeologizmi ilə Heydər Əliyev auditoriya üçün naməlum faktları aşkarlayır ki, bu da öz növbəsində dinləyicilər üçün maraq doğurmaya bilmir. Hansı faktların açılacağını gözləyən auditoriya nitqə diqqət kəsilir. "Bilirsiniz" modal sözü ilə səfərbər olunan Bakı məişət kondisionerləri zavodunun o dövrdə hansı çətinliklərlə başa gəldiyini öz liderinin dilindən eşidir: "Bu gün mən bu zavodun yaranması *tarixini də açmaq* istəyirəm. *Bilirsiniz*, mən sizə çatdırmalıyam ki, 60-cı illərin sonunda, 70-ci illərin əvvəlində mən Azərbaycanda müasir tipli maşınqayırma zavodunun yaradılması haqqında məsələlər irəli sürərkən – bu məsələlər o vaxtlar Moskvada, Sovet İttifaqının rəhbərliyində həll olunurdu – Azərbaycana inam olmadığını müşahidə edirdim... Mənim qarşımda çox ağır və çətin bir vəzifə dururdu" [Vc.s.211].

Heydər Əliyevin dilində dominant olaraq mərkəzdə yerləşən frazeologizmlər mövcuddur ki, özündən öncə və sonra gələn feili frazeologizmləri birləşdirir. Ancaq, yenə də yadda qalan frazeologizmlərdən ən mühümü olur. Məsələn: "yaxa qurtarmaq" frazeologizmi "nail olmaq", "ərazi bütövlüyünü

təmin etmək", "rahat inkişaf etmək", "yaxşı əməkdaşlıq etmək" ifadələrinin təyinedici olmaqla dinləyici şüuruna hakim kəsilir: "Bu münaqişələr həddindən artıq mürəkkəb münaqişələrdir, ona görə də hələlik nə siz, nə də biz istənilən nəticələrə nail ola bilməmişik. Lakin belə fikirləşirəm ki, nail olacağıq, mən buna əminəm. İnanıram ki, Gürcüstan da münaqişədən yaxa qurtaracaq, öz ərazi bütövlüyünü təmin edəcək və rahat inkişaf edəcəkdir. İnanıram ki, Azərbaycanda da belə olacaqdır. İnanıram ki, bütövlükdə Cənubi Qafqazda biz sabitliyə nail olacağıq və bu da, şübhəsiz, bütün sahələrdə daha yaxşı əməkdaşlıq etməyə imkan verəcəkdir" [XXXVIIc.s.322].

Böyük natiq nitqlərində frazeologizmləri sinonimləşdirir, leksik mənanı qüvvətləndirə bilir, feili tərkibli frazeologizmləri özünəməxsus nitq ustalığı ilə auditoriyaya yönəldir: "Bunlara görə də sizin Azərbaycanı görməyiniz, Azərbaycan həqiqətlərini, reallığını bilməyiniz lazımdır. Çünki, Türkiyədən Azərbaycana baxanda, ayrı-ayrı adamlar onu müxtəlif cür görür. Tam əksəriyyət Azərbaycanı olduğu kimi görür. Amma bəziləri də, onların gözlüyü qaradır, yaxud da nədirsə, onlar aydın görə bilmirlər, açıq görə bilmirlər. Mən bu barədə çox deyə bilərəm" [XXXVIc.s.39]. Yuxarıdakı mətn parçasında "görə bilmək" frazeologizmi inkarda "aydın görə bilməmək", "açıq görə bilməmək" sinonimləri ilə işlənərək ortaya prinsipial mövqe qoyur, Azərbaycan reallıqlarını görə bilməyənləri qınağa çəkir.

Sinonim frazeologizmlərdən ustalıqla istifadə Heydər Əliyev dühasına xasdır: "Keçən il oktyabrın 12-də (2000-ci il red.) Bakıda rus poeziyasının dühası Aleksandr Sergeyeviç Puşkinə heykəl qoyulmuşdur. Bu gün isə burada, Puşkinin Böyük Pyotrun əsəri adlandırdığı bu şəhərdə Nizamiyə heykəl ucaldılmışdır" [XXXIXc.s.40].

"Kömək əli uzatmaq" – "eyni zamanda dost-dosta gərək *kömək əlini uzatsın"* [IVc.s.116]. Və "yardım əli uzatmaq" – "bunun naminə biz müsəlman ölkələrinin inkişafına mane olan əngəlləri aradan qaldırmalı, bir-birimizə *yardım əli uzatmalıyıq*, parçalanmanın və təklənmənin qarşısını almalıyıq, dara düşmüz qardaşlarımıza birlikdə kömək etməliyik" [IIIc.s.19].

"Göydən düşmək" "havadan götürmək" – "şübhə doğurursa, dəqiqləşdirin. O, bu rəqəmi havadan götürməyib ki, hə?" [VIIc.s.139].

"İpini çəkmək" – "bir adam bunun ipini çəkəydi ki, axı belə işlər görmək olmaz" [VIIc.s.155].

"Azərbaycanın elmini, mədəniyyətini yüksəkliklərə qaldırmaqdır, respublikamızın adını, şanını-şöhrətini *dünyaya yaymaqdır*" [VIIc.s.394].

"Mən neçə ildir çalışıram, işləyirəm, bir məqsədim var: *xalqımızı tanıtmaq*" [VIIIc.s.341].

"Həyatdan getmək" və "dünyasını dəyişmək" frazeologizmləri sinonimlik xüsusiyyəti daşıyırlar.

Bayram tədbirlərində publisistik üslubda etdiyi çıxışlarda "həyatdan getmək" frazeologizmi yer alır: "*Həyatdan getmiş* yaxınların, xalqımızın qəhrəman oğul və qızlarının – Azərbaycanın azadlığı, müstəqilliyi və ərazi bütövlüyünün müdafiəsi uğrunda öz canlarını vermiş şəhidlərin xatirələrini bu əziz bayram günlərində yad etmək gözəl bir ənənyə çevrilmişdir" [XXIVc.s.159].

Məişət üslublu nitqlərində "dünyasını dəyişmək" frazeologizmi səslənir: "Yadımdadır, mən Azərbaycanda işləyərkən indi *dünyasını dəyişmiş* həyat yoldaşım bəzən deyərdi: "Bura bax, sən ki, respublikanın rəhbərisən, sənə heç kim nəzarət etmir. Nə üçün işə belə tez gedirsən" [XIV c., s.98]. Frazeologizm o vaxt sinonim hesab olunur ki, öz leksik

əhəmiyyətinə görə, tərkibində eyni komponentlərin olmamasına görə, eyni komponentlərin tərkibdə olmaması, eləcə də komponentlərin qarşılıqlı əvəz oluna bilməməsi baş verməlidir [219].

Poeziyada frazeologizm – zəngin semantik üslubi xüsusiyyətlərlə çıxış edir [96]. Düşdüyü kontekstdə onlar təsvir və tərənnüm obyektini təsirli poetik vüsətlə canlandırır. Məhz bunun nəticəsidir ki, "bütün zamanlarda frazeologizmlər ədəbiyyatşünaslar tərəfindən adi leksik vahiddən daha çox obrazlılıq, yüksək – ifadəlilik vasitəsi kimi dəyərləndirilmişdir. O da xüsusi vurğulanmışdır ki, xalq frazeologizmləri bu baxımdan daha aparıcı mövqelidir". Frazeoloji sinonimliyin imkanları onların estetik miqyasının genişlənməsinə səbəb olur. Xüsusi qeyd etmək lazımdır ki, frazeologizmlərdən istifadə zəngin poetik ənənələrə söykənir.

Dilin sinonim zənginliyi şairə (natiqə) imkan verir ki, üslubi məqam və situasiyadan asılı olaraq frazeologizmləri tekstdə işlətməklə (getmək – ayrılıq qapımı açar, köçmək – səfər etmək) lirik təfərrüata aydınlıq gətirsin, misraları fəlsəfi dərinlik və ümumiləşdirmə, bədii mənalandırma yolu ilə daha da silqətli etsin [151, 159].

Sənətkarlıq tələblərindən çıxış edən Hüseyn Arif frazeologizmlərin işləndiyi misraların yalnız məzmunu ilə deyil, həm də öz üslubi vüsəti ilə, cazibəli təbiəti ilə, poetik səslənmə keyfiyyətləri ilə oxucunu cəlb etməsinin təbii əsasları vardır. Buna görə də mütləq və nisbi eyniyyət təşkil edən ifadələrin axtarışına, forma və mənasına görə üslubi cəhətdən fərqlənən frazeologizmlərə üstünlük verir. Gerçəkliyi daha dolğun və mükəmməl göstərmək ehtiyacı frazeoloji sinonimlik üzərində seçmə əməliyyatını labüdləşdirir [151, 159].

Azərbaycanda isə bu mövzuda yenilik xalq dilinin mükəmməl bilicisi Yusif Vəzir Çəmənzəminli tərəfindən edilmiş-

dir. O, tərtib etdiyi “dilimizdə ikimənalı söz və cümlələr” adlı lüğətdə 140-a qədər frazeoloji sinonim vahid qeydə alınmışdır [131].

Daha sonralar bu barədə B.Çobanzadə, F.Ağazadə, H.Bayramov, M.Mirzəliyeva, N.Rəhimzadə və N.Seydəliyev dəyərli tədqiqat işləri aparmışlar [38, 153, 197]. İstər Azərbaycan ədəbi dilinin frazeologiyası, istər rus, Avropa xalqları dillərinə məxsus frazeoloji vahidlər, istərsə də digər türk dillərinin frazeologiyası ilə bağlı xeyli ədəbiyyat vardır. Lakin hələ də dilin frazeoloji sisteminə nəyin aid edilməsi məsələsi dəqiqləşdirilməmişdir. Bu mübahisə bütün frazeoloji tədqiqatlarda aydın şəkildə izlənilir.

Frazeologizmlərin araşdırılması söz və söz birləşməsinin araşdırılması ilə sıx əlaqəlidir. Hər bir frazeologizm dildə hazır şəkildədir və o bütöv olaraq bir mənanı ifadə edir. Başqa sözlə “Frazeoloji vahidin mənası onun ayrı-ayrı üzvlərinin mənası deyildir” [131].

Qrammatik birləşmənin özü və ya onun tərkibində olan sözlər məcazi mənaya keçərək mütəhərrikliyini itirdikdə, sözlər arasında əlaqə və münasibət yaradan vasitələr donuq hala gəlir və o bir məfhum ifadə edən sabit söz birləşməsinə çevrilir. Fikrimizi daha dəqiqləşdirmək üçün bir nümunəyə baxaq: başdan çıxarmaq. Adi leksik və qrammatik səviyyədə bu birləşmə başdan və çıxarmaq sözlərindən ibarətdir.

Müasir ədəbi dilimizdə olduğu, şivələrdə də baş, ayaq, dil, ağız, əl, ürək, göz, və s. bədən üzvlərinin adları vasitəsilə düzələn frazeoloji birləşmələr çoxluq təşkil edir. Xüsusilə də ad bildirən sözlər fellərə əlavə edilərək frazeoloji birləşmələr əmələ gətirmişdir. Nümunələrə baxaq: başa çıxartmaq – layiq olmadığı halda yüksək hörmət etmək; (Şuşa), ayağını kəsmək – (Ağdam) əlaqəni kəsmək, ağzını aramaq – fikrini bilmək; gözünün zılğını tökmək – ağlamaq; dil gəzdirməh – xəbərçilik

etmək; əlini ağzına təğbəh – toxtamaq üçün uyğun olanı etmək; ürəyi ərimək – qorxudan üzülmək və s.

Çoxmənalı frazeoloji vahidlər. Çoxmənalı frazeoloji vahidlər ilk olaraq omonim frazeoloji vahidlərə oxşasa da, tamamilə fərqli xüsusiyyət daşıyır. Azərbaycan dilində dil, göz, baş, ürək, ağız kimi sözlər çoxmənalı olduğundan bu sözlər ətrafında işlənən ifadələrin bir çoxu da çoxmənalıdır.

Sinonimlər frazeoloji vahidlər eynilə sinonim leksik vahidləri xatırladır. Sinonim ifadələr frazelogiyanın daha çox müşahidə edilən qrupdur.

Frazeloji sinonimlərdən danışarkən frazeoloji variantlar haqqında da danışmaq lazım gəlir. Çünki bir sıra feili frazeolojı vahidlər vardır ki, onlar ilk baxışda frazeoloji sinonimlərə oxşasa da, onlardan tamamilə fərqlidir.

Frazeoloji vahidlərin araşdırılması dilin sematik inkişafını izləmək baxımından vacibdir.

Tarixi abidələrimizin dilində, eləcə də folklor mətnlərində dilimizin dialekt və şivələrində rast gəlinən frazeoligizmlər gələcək tədqiqatlar üçün zəngin materialdır. Mənşəyini araşdırarkən qədim tarixə malik olduğunu sübut edən ifadələr dil tarixinin öyrənilməsində əvəzsiz mənbədir.

Bildiyimiz kimi, adi sinonim sözlərdə də sinonimlik dominant vardır və həmin söz ən azı bir çalarlıqda bütün sinonimlik qrup sözünün yerinə işlədilə bilər. Bu halda həmin söz, yəni dominant müəyyən həddə qədər o mənada işlədilir, həddən sonra artıq o işlədilə bilməz [94]. Azərbaycan dilinin sinonimikasının zənginləşməsində və semantik mənada emosiyanın yaranmasında frazeoloji sinonimlərin böyük rolu vardır. Frazeologizmlər dildə, əsasən, xalq tərəfindən yaradılır. O, bədii yaradıcılıqda müəllif dilindən (üslubundan) fərqli olaraq dialoq prosesində personajlar tərəfindən daha geniş miqyasda işlədilir. Personajların dilində işlənən belə ifadələr

leksik vahidlərlə, bəzən biri-biri ilə rabitə yaradaraq emosionallığı və ekspressivliyi artırır. Bu ifadələr Azərbaycan dastan və nağıl dilində daha çox özünü göstərir [185].

Dilin frazeoloji fondu da cəmiyyətin yaşadığı taxixi-coğrafi mühitlə, onun əmək məzmunu ilə, ətraf aləmlə bağlı olaraq yaranmışdı.

Söz kimi, frazeoloji vahidlər də təkmənalı və çoxmənalı keyfiyyət qazana bilir. Dildə işlənən leksik vahidlər kimi frazeoloji vahidlər də çoxmənalılıq xüsusiyyətlərə malikdir. Çoxmənalı frazeoloji vahidlər bir sıra mənaları bildirir. Leksik vahid frazeoloji birləşmə tərkibində metaforikləşərək öz real konkret semantikasından "imtina edir", tamam başqa bir məfhumu ifadə edir. Tədqiqatçıların bu haqda bir-birindən fərqli fikirləri olsa da, ümumi düşüncə budur ki, dilin frazeoloji fondu sübut edir ki, çoxmənalılıq leksik vahidlərdə olduğu kimi, frazeologizmlərə də şamil edilir. Misal bədən üzvlərinin adlannm birləşmənin birinci tərkib hissəsində gəlməsi ilə frazeoloji çoxmənalılıq meydana çıxır: *baş endirmək, baş əymək, başa gəlmək, dil tökmək, dilə gətirmək, dilindən düşməmək, dilindən çıxmaq, göz yetirmək, gözdən salmaq, gözdə-qulaqda olmaq, əldən-ayaqdan salmaq, ələ keçirmək, boynuna almaq, bağrına basmaq* və s. Bu misallar Azərbaycan dilindədir.

Frazeoloji omonimlik. Omonim frazeiloji vahidlər forma baxımdan oxşar olsalar da onlar arasında heç bir semantik bağlılıq yoxdur. Ona gorə ki, mənalar arasında ümumi semantik əlaqə yoxdur. Frazeologizimlərdə omonimlik bu məqamda formalaşmışdır. Ş.Balli yazır ki, omonimlik frazeoloji vahidlərin daxili keyfiyyətlərindən biridir [164].

Omonim frazeoloji mənaların əmələ gəlməsində 3 cəhəti göstərmək olar:

1) birmənalı frazeologizm ilkin mənasından əlavə olaraq yeni bir məna da qazanır; 2) çoxvariantlı frazemlərin variant-

larından biri omonimləşir; 3) bir sıra frazeologizmlərin omonim mənası bir dildən başqa dilə kalkalaşan zaman alınann frazeoloji vahidlərin mənası hesabına formalaşır.

Omonim frazeologizmlər də Ulu Öndərin ecazkar nitqlərində özünə yer tapa bilir:*Özünü öldürmək frazeologizmi kimi* – 1) ciddi çalışmaq; gecə-gündüz yatmadan çalışmaq; 2) kimi isə hədsiz çox istəmək, onun qulluğunda durmaq, ona pərəstiş etmək; ~ əldən-ayaqdan getmək; "Əgər bir dəfə alınmadısa, alınmadı, Rəşid Behbudovdan ötrü özümü gedib orada öldürməliydim?! Amma etdim, *özümü öldürdüm* – yəni məcazi mənada deyirəm – ancaq nail oldum" [XXXIXc.s.101].

Leksik-qrammatik əlamətləri bir-birinə müvafiq olan, lüğət tərkibinə görə seçilən, semantik cəhətdən bir-birinə yaxın olan ifadələrə sinonim frazeoloji vahidlər deyilir. Rus dilçisi N.Şanski yazır ki, frazeoloji sinonimlər obyektiv reallıqda eyni əşya bildirir, lakin müxtəlif komponentlərə malik olur [291].

Frazeoloji sinonimlik leksik sinonimlikdən onunla fərqlənir ki, leksik sinonimlər də ayrı-ayrı sözlərin sinonimliyi, frazeoloji vahidlərdə isə söz qruplarının (ifadələrin) sinonimliyi nəzərdə tutulur.

N.Seydəliyev yazır ki, sinonimikanın zənginləşməsində və semantik cəhətdən emosiyanın formalaşmasında frazeoloji sinonimlərin rolu böyükdür. Personajların nitqində işlənən belə ifdələr leksik vahidlərlə rabitə yaradaraq emosionallığı və ekspressivliyi artırır. Məs: ağlamaq– göz yaşı axıtmaq – qan-yaş axıtmaq – gözünün yaşını abi-leysan kimi axıtmaq – gözlərindən qan-yaş tokmək – qaçmaq-daban almaq-dabanına tüpürmək və s. Bu misallar böyük natiqin nitqində də tez-tez müşahidə olunur. Təvazökarlıq, səmimiyyət simvolu kimi tanınan siyasi lider "burnu yelli olmaq", "burnunu dik tutmaq", "burnunun ucundan o tərəfi görməmək" sinonim frazeolo-

gizmlərini müxtəlif nitq məqamlarında işlədərək nitqin kütlələrin şüuruna çatdırılması yolunda möhtəşəm nitq nümunələri yaradır: "Ancaq gənc, təcrübəsiz, necə deyərlər, *burnu yelli* adamlar idi" [VIIc.s.482]. "Heç vaxt *burunlarını dik tutmasınlar*" [XXXIXc.s.127]. "Mən dəfələrlə demişəm ki, bəziləri dünyanı anlamayan, *burnunun ucundan o tərəfi görməyən* adamlar indi hər şeyi pisləyirlər" [VIIIc.s.334]. Sinonim frazeoloji vahidlər məna yaxınlığını özündə əks etdirən cərgə yaradır, bədii mətnlərdə bunlar üslubi effekt yaradır.

Elə frazeoloji sinonimlərdən danışarkən antonimlərdən də yan keçmək olmur. Antonim frazeoioji vahidlər bir-birinin əksi olan birləşmələrdir. Qarşı-qarşıya qoymaq üçün zidd semantikası olan, sintaktik modeldə istifadə olunan, eyni leksik dairədə birləşən, bir disiribusiyalı frazeoioji vahidlər antonim frazeoioji vahidlərdir. Çox dar şəkildə dilə müşahidə olunan frazeoloji antonimlər vasitəsilə (*ürəyi açılmaq – ürəyi xarab olmaq – ürəyi dalğanmaq; ürəyipartlamaq – ürəyi yerinə gəlmək – söz almaq – söz vermək; adı batmaq – adı batmaq – adı çıxmaq və s.)* adi nitqdə və bədii üslubda təzad və anliteza yaradılır.

Böyük natiqin dilində də bu məsələlərin öz həllini tapması maraqlı olardı. Qeyri-qanuni yolla hakimiyyəti zəbt etmək anlamında "hakimiyyəti ələ keçirmək" frazeologizmi "Bunlardan istifadə edən xarici və daxili qüvvələr Azərbaycanda hakimiyyəti ələ *keçirmək* cəhdləri göstərirdilər" [XVc.s.400].

"Hakimiyyəti ələ keçirmək" frazeologizminin sinonimi kimi "hakimiyyətə yiyələnmək" nitq prosesinə qoşulur: "Öz torpağını, öz ölkəsini qorumaq üçün silahı olan bir çox adamlar sonra bu silahdan öz şəxsi məqsədlərinə çatmaq, silahlı yolla *hakimiyyətə yiyələnmək* üçün istifadə etməyə başladılar və şübhəsiz ki, bu, istər terror əməlləri törədilməsi ilə, istərsə

də silahlı yolla dövlət çevrilişi həyata keçirmək cəhdləri ilə bağlı idi” [XXIVc.s.440].

Hakimiyyəti devirmək, məğlub etmək anlamında isə “hakimiyyəti yıxmaq” antonim frazeologizmi nitqə gətirilir: “Xalq Cəbhəsi də öz hərbi dəstələrini oradan çıxarıb Azərbaycanın bu meydanlarına Prezident sarayının, parlamentin, Ali Sovetin önünə gətirib ki, bəli, burada mübarizə aparsınlar, *hakimiyyəti yıxsınlar*” [VIc.s.245].

Frazeoioji sinonimlərin nitqdə böyük rolu vardır. Belə ki, nitq mədəniyyətinin keyfiyyətini şərtləndirən başlıca faktorlardan biri də frazeoioji semantikadan uğurla istifadədir. Frazeoioji semantikanın növlərindən biri olan frazeoioji sinonimlər nitqin bədii təsir gücünü yüksəldir, emosionallığı və ekspressivliyi formalaşdırır. Frazeoioji vahidlərin sinonimliyi – dedikdə, formaca müxtəlif olub, yaxın mənalar bildirən sabit söz birləşmələri nəzərdə tutulur. Sinonim frazeogizmlər surət və personajların nitqini xarekterizə edir. Məs.: Nardalanlılar – Alə, ay evin tikilsin, neynirsən, ürək göbəyim düşdü ki,... (H.Abbaszadə), Vallah, Hacı, səni tanımayan adam olsa, görəndə bağrı yarılacaq (M.F.Axundzadə); Frazeoioji sinonimlərin istifadə olunması mətnin təsir gücünü yüksəldir. Misal üçün: dərsini vermək-üzünə itin sözünü demək-qabırğısına döşəmək (hər 3 frazeoioji məna “danlamaq” anlamını bildirir). Dili topuq vurmaq-dili dolaşmaq; az-az götürmək – aya-günə dönmək frazeoioji semantikası da bu qəlibdəndir;

“Heydər Əliyevin nitqində frazeologizmlərin sinonimləşməsi” fəslində yekun olaraq aşağıdakıları ümumiləşdirmək olar:

Ümumiyyətlə Heydər Əliyev nitqləri sinonimlərlə zəngindir ki, bu nitq ünsürü frazeologizmlərin auditoriyalarda səslənməsi ilə müşayiət olunur;

Mütləq sinonimlərin olmaması dilçi alimlər tərəfindən birmənalı qarşılanır ki, bu tip frazeoloji sinonimlər Heydər Əliyevin dilində də geniş yer alımışdır. Heydər Əliyevin işlətdiyi sinonim frazeologizmlər böyük ustalıqla, təkrarlığa yol verilmədən işlənir;

Heydər Əliyevin dilində dominant olaraq mərkəzdə yerləşən frazeologizmlər mövcuddur ki, özündən öncə və sonra gələn feili frazeologizmləri birləşdirir;

Heydər Əliyevin dilində frazeologizmlərin tez-tez digər söz və söz birləşmələri ilə sinonimləşməsinə təsadüf olunur;

Sinonim frazeologizmlər Heydər Əliyevin də nitqində bəzən ya yaranır, ya da az işlək olanlar nitqə gətirilir və ümumişləklik qazanır;

Böyük natiq nitqlərində frazeologizmləri sinonimləşdirir, leksik mənanı qüvvətləndirə bilir, feili tərkibli frazeologizmləri özünəməxsus nitq ustalığı ilə auditoriyaya yönəldir;

# V FƏSİL
# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ MÜXTƏLİF ÜSLUBLARDA FRAZEOLOGİZMLƏR

"Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti" adlı tərəfimizdən elmi ictimaiyyətin ixtiyarına verilmiş monoqrafiyanın I cildində Heydər Əliyev nitqlərinin təküslübluğa sığmadığını qeyd etmişik [214]. Monoqrafiyamızın frazeologizmlərə həsr olunan bu hissəsində – IV cilddə üslublarla əlaqədə frazeologizmlərin işlədilməsinə diqqət yetirməyi qarşımıza məqsəd qoyduq.

Dilin poetikliyinin müəyyənləşməsində, bədii təsir gücünün ifadəsində frazeologizmlər çox geniş əhatə dairəsi ilə iştirak edir. Xəlqiliklə yanaşı nitqə ifadəlilik, canlılıq, emosionallıq gətirən frazeologizmlər daha çox məişət və bədii üslublarda işlək materiala çevrilir [12]. Hətta dilimizin tarixinə nəzər yetirsək, klassiklərimizin dilində işlənmiş frazeoloji vahidlərin əksəriyyətinin bu gün də işlək səviyyədə olduğunu qeydə ala bilirik.

Söz birləşmələri dilçiliyin iki bölməsinə istiqamətlənir. Əgər sərbəst söz birləşmələri öz təhlil əhatəsini dilçiliyin "sintaktsis" bölümündə tapırsa, sabit söz birləşmələri "frazeoloji birləşmələr" adı altında leksikologiyada öyrənilir. Çünki qrammatik birləşmələrin əsasında yaranan frazeoloji birləşmələrin tərkib hissələrindəki sözlər əlaqələnərək öz əvvəlki semantikasını itirir, məcaziliyə doğru gedir, beləliklə, hər hansı bir leksik vahidin ekvivalentinə çevrilir və məna bütövlüyünün istifadəçisi rolunda çıxış edir. Sözlər ilkin mənalarını itirərək birləşmələrin leksik-semantik ünsürlərinə çevrilirlər [12, 156].

Türk dil ağacının mühüm bir qolu kimi Azərbaycan dilinin üstünlüklərini həmişə qeyd etmişlər: "Analitik dillərdən biri və ondakı sözlərdən feili ifadə və istilahları düzəltmək

üçün çox yararlı olan fars dili eyni halda bu kimi söz tərkiblərinin düzəlişi və işlədilməsi etibarilə türk dilindəki imkan və dolğunluğa malik deyildir. Türk dilində təkcə insanın bədən üzvlərilə bağlı ...yüzlərlə istilah və deyim vardır" [43].

Fərqli xüsusiyyətləri özündə daşıyan feili frazeoloji birləşmələrlə yanaşı, insan təfəkküründə ya yeni yaranan, ya da köhnəni yeniləşdirərək az da olsa, fərqlənməyə imza atan okkozional frazeoloji birləşmələrdir. Yəni şair və yazıçılar dilə hazır şəkildə gələn, yaddaşlarda bərkiyən frazeoloji birləşmələrlə yanaşı onlardan dəyişilmiş şəkildə də istifadə etmişlər [12]. Ümumiyyətlə, hər hansı bir söz ustadı dildə mövcud olan frazeoloji vahidlərə analoji frazeoloji birləşmələr də yarada bilər [12].

Bu baxımdan ən çox publisistik üslubda Heydər Əliyevin özünəməxsusluqla işlətdiyi frazeologizmlər mövcuddur: Dünya ilə müasirliklə tanış olmaq, dünyanı dərindən dərk etmək anlamında "gözünü dünyaya açmaq" frazeologizmi: "Əgər Cəlil Məmmədquluzadə kimi şəxsiyyət dünyaya gəlməsəydi, əgər "Molla Nəsrəddin" jurnalı yatmış insanları qaranlıqdan çıxarmağa çalışmasaydı, əgər onun "Ölülər" əsəri insanların *gözünü real dünyaya açmasaydı* xalqımız bu qədər inkişaf edə bilməzdi" [XXIIc.s.261]. Həyatın bütün sahələrində dili aparıcı etmək baxımından "hakim dil etmək" frazeologizmi, eləcə də yüzlərlə sabitləşmiş söz birləşmələri siyasi filologiyamıza Heydər Əliyev tərəfindən gətirilir. "Biz müstəqil Azərbaycanda Azərbaycan dilini dövlət dili etdiyimiz kimi, cəmiyyətimizə də, xalqımızın içində də Azərbaycan dilini mütləq hakim dil etməliyik." [XXIXc.s.415]. *Hakim dil etmək* – aparıcı dil *etmək, əsas dil etmək; "Bizim birinci nailiyyətimiz o olmalıdır ki, öz dilimizi Azərbaycanda hakim dil etməliyik" [XIIIc.s.136].

Uzun zamandan bəri xalq içərisində yaşayıb möhkəmlənən və həmin xalqın milli xüsusiyyətlərini özündə cəmləş-

dirən zəngin dil materialı olan frazeoloji vahidlərdən həm ədəbi dilin yazılı, həm də şifahi qolunda həmişə geniş şəkildə istifadə edilmişdir. Frazeoloji vahidlərdən təkcə bədii üslubda yazılan əsərlərin dilində yox, eyni zamanda elmi üslubda yazılan əsərlərin dilində də geniş şəkildə yaradıcılıqla istifadə edilmişdir [70, 126, 127, 268]. Siyasi natiqlikdə, siyasi lider nitqində frazeologizmlər ayrıca tədqiqat obyekti olmamışdır.

Heydər Əliyevin 25 aprel 2002-ci ildə "Yerli sahibkarlarla görüş nitqini" araşdırarkən məlum olur ki, bu nitq yarıelmi, yarıpublisistik və yarıməişət üslubda söylənərək tarixilik missiyasını özündə saxlayır. Heydər Əliyev nitqlərinin araşdırılması Azərbaycan nitq mədəniyyəti tarixinin inkişaf pillələrinə səyahət baxımından mühümdür.

Sosialist təsərrüfat sistemindən bazar iqtisadiyyatı sisteminə keçid bir sıra çətinliklərlə müşayiət olunur ki, bütün bunlar çıxışın əvvəlində fəlsəfiliklə, xüsusən də iqtisadiyyatın fəlsəfiliyi ilə auditoriyaya açıqlanır: "Azərbaycan dövlətinin iqtisadi siyasəti Azərbaycanın iqtisadiyyatını bazar iqtisadiyyatı yolu ilə inkişaf etdirməkdən ibarətdir... Aparılan siyasət, islahatlar və bazar iqtisadiyyatı prinsipi ölkədə yeni təbəqənin, sahibkarlar təbəqəsinin yaranmasına gətirib çıxarıbdır. Bu belə də olmalıydı, çünki bazar iqtisadiyyatının əsasında şəxsi mülkiyyət, özəl mülkiyyət və sahibkarlıq durur" [XXXVIIIc.s.150-152].

Növbəti nitq mərhələsində sahibkarlığın inkişafına mane olan səbəblər auditoriya üçün açıqlanır. "Boğaza gələn" sahibkarların düşdüyü vəziyyət bircə-bircə izah olunur: "Ancaq son dövrün müşahidəsi onu göstərir ki, bizim həyata keçirdiyimiz tədbirlərə baxmayaraq, yenə də müxtəlif hökumət orqanları sahibkarlara şərait yaratmaq, yardım etmək, onlara kömək etmək əvəzinə, müxtəlif maneələr törədirlər, yoxlamalar aparırlar, onların işinə müdaxilə edirlər, öz şəxsi mənafelərini təmin etmək istəyirlər. Bunlar da sahibkarlara mane olur.

Hətta mənə deyirlər ki, bəzi sahibkarlar belə yoxlamalardan, müdaxilələrdən o qədər *boğaza gəlirlər* ki, haqlı işlərini bağlayırlar. Sahibkar nə məqsədi daşıyır? O iş görür ki, pul qazansın. Onun istəyi pul qazanmaqdır, işi isə cəmiyyətə fayda verməkdir. Sahibkar müəyyən məhsulun istehsalı ilə məşğul olur, demək, o məhsul cəmiyyətə lazımdır. Yaxud ticarətlə məşğul olur, cəmiyyətin yaxşı ticarətə ehtiyacı var. Başqa xidmət sahələri ilə məşğul olur. İnsanların buna da ehtiyacı var. Əgər sahibkar bu işlərlə məşğul olaraq qoyduğu sərmayəni çıxara və qazanc götürə bilmirsə, demək, onun sahibkarlıqla məşğul olmasının mənası yoxdur. Təəssüf ki, bizə məlumatlar çatır ki, belə hallar var və az deyildir. Bu bizi narahat edir" [XXXVIIIc.s.154].

"Sahibkar nə məqsəd daşıyır" – ritorik sualı ilə səfərbər olunan auditoriyaya bu məqsədləri bircə-bircə aydınlaşdırır. "Təəssüf ki" modal sözü ilə sahibkarlığın inkişafına maneçilikləri diqqətə çatdırır. Auditoriya mətndə işlənən "boğaza gəlmək" frazeologizmin incəliyini duyur. Frazemin ekspressivliyi qabarıq şəkildə özünü büruzə verir. Çıxışın birinci hissəsi sahibkarlığın inkişafına qarşı törədilən manelərdən, əngəllərdən gedir və bu "boğaza gəlmək" frazeologizmini ortaya qoyur. Məlum olur ki, əlində səlahiyyət olan şəxslər sahibkarlara təzyiq də edə bilər, onları sıxışdırar da. Məhz bu təzyiq, bu sıxışdırma səmimi və qətiyyətli bir şəkildə diqqətə yönəlir. Sahibkarlar təbəqəsinin dövlətə sığınmasına çağırışlar edilir: "Biz bu görüşə yalnız Azərbaycanın yerli sahibkarlarını çağırmışıq. Burada Azərbaycanın sahibkarlıq və bazar iqtisadiyyatı prosesində iştirak edən hakimiyyət orqanlarından, onların başçılarından heş kəs iştirak etmir. Ona görə ki, siz burada sərbəst danışa biləsiniz, ayrı-ayrı nazirlər, hüquq-mühafizə orqanlarından, vergi orqanlarından sizə təsir edə bilməsinlər, *göz ağartmasınlar*" [XXXVIIIc.s.155].

Bu "göz ağartmağın" təfərrüatını açıqlayan böyük natiq sahibkar auditoriyasını başqa bir frazeologizmlərin eşidilməsinə hazırlayır. Bu artıq "açıq söhbət etmək", "açıq söhbət gözləmək" frazeologizmləridir: "Siz onların yanında danışmağa bir az çəkinə bilərsiniz, bu olmasın, sərbəstlik olsun. İndi siz deyə bilərsiniz ki, onlar burada yoxdur, amma televiziya vasitəsilə çəkirsiniz, bunu görəcəklər. Mən bu məsələni də, nəzərə almışam... Amma ondan sonra mən onları da uzaqlaşdıracağam ki, heç kəs narahat olmasın ki, dediyi sözlər yazıldı, şəkli çəkildi və onun asılı olduğu hansısa nazirə verildi, o da sonra ədavət aparmağa, yaxud da başqa işlər görməyə başladı. Təəssüflər olsun ki, bizim cəmiyyətimizdə hələ belə hallar var. Ona görə də mən bu görüşdə təmin etmişəm ki, sizinlə *açıq söhbət* olsun, *sərbət söhbət* olsun və Azərbaycanın prezidenti kimi, sizdən həqiqəti öyrənim" [XXXVIIIc.s.156].

Həmin çıxışda böyük natiq "açıq söhbət etmək" frazeologizmini "açıq söhbət gözləmək"lə yanaşı işlədir: "Biz bazar iqtisadiyyatını elan etdik, özəlləşdirməni apardıq, özəl sektor yaratdıq. Amma əgər bu özəl sektor istənilən səviyyədə fəaliyyət göstərə bilmirsə, onda, demək biz istədiyimizə nail ola bilmirik. Bizi bu da narahat edir. Bax, bu məqsədlə mən bu gün bu görüşü keçirməyi qərara almışam. Bu məqsədlə də sizi bu görüşə dəvət etmişəm. Bir də deyirəm, hər birinizdən açıq, ədalətli, obyektiv söhbət gözləyirəm" [XXXVIIIc.s.157].

Yuxarıdakı frazeologizm çıxış boyu bir neçə dəfə təkrarlanaraq yaddaqalan olur: "Mən xahiş edirəm ki, tribunaya, mikrafon qarşısına gəlmək istəyən hər bir şəxs ancaq və ancaq sahibkarlığın daha da uğurla həyata keçirilməsinə mane olan amillər barədə *açıq-aydın desin*, heç kəs utanmasın, heç kəs çəkinməsin" [XXXVIIIc.s.157].

"Açıq demək" frazeologizminə leksik cəhətdən "aydın" ifadəsini qoşmaqla fikri qüvvətləndirir. Yekun nitqdə də həmin frazeoloji ifadə gündəmə gəlir: "Mən bugünkü görüşdən

çox məmnunam. Çox məmnunam ki, bir neçə saatdır sahibkarlarla bir yerdəyik, sərbəst görüşürük, söhbət edirik. Bu mənim üçün çox əhəmiyyətlidir. Güman edirəm, sizin üçün də əhəmiyyətlidir. Elə bu, görüşün özünün əhəmiyyətli olduğunu təsdiq edir. Ancaq mən məmnunam ki, sahibkarlığa mane olan bir neçə məsələlər haqqında burada açıq fikirlər söyləndi" [XXXVIIIc.s.162].

M.Hüseynzadənin qənaətinə görə, "İdiomlar ümumxalq xarekteri daşıyır. Onların əsl yaradıcısı xalqdır. Buna görə də həm danışıq, həm də ədəbi dilimizdə çox geniş yayılmış olan idiomatik ifadələr xalqımızın məişəti ilə, tarixi həyat təcrübələri ilə bağlı olduğu üçün onların çoxu adi həyat tərzinin inikası kimi yaranmışdır" [151]. Müəllif daha sonra idiomatik ifadələrin mənbəyi kimi peşə və sənəti, köhnə əqidələri və mövhumi etiqadları göstərmişdir [151]. Bizim fikrimizcə Azərbaycan siyasi xadimlərinin nitqlərində işlənən idiomlar və s. bu xalq təfəkküründən süzülüb gələn deyimlərin xalqın özünə qaytarılması yolunda mühüm vasitədir. Bu baxımdan Ulu Öndərin çıxışlarındakı bir sıra deyimlər xüsusi əhəmiyyət kəsb edir. Ciddi siyasi ideyaları sadə xalq frazeologizmləri ilə auditoriyalara çatdırmaq Heydər Əliyev şəxsiyyətinə aiddir. "Öz böğazından kəsib qardaşına verir" deyimini qardaş Türkiyə auditoriyasında rəsmi – işgüzar üslubda dilə gətirməklə iki ölkə arasındakı münasibətlərin siyasi və iqtisadi cəhətdən möhkəmlənməsinə xidmət edir.

Azərbaycan dilində olan frazeoloji vahidlərin bəziləri "Kitabi-Dədə Qorqud" dastanından gəlir. A.Hacıyeva Kitabi-Dədə Qorqud dastanında olan frazeoloji vahidlər barədə yazır: "Kitabi-Dədə Qorqud" dastanı ümumxalq Azərbaycan dilinin ilk təşəkkül dövrünü aydınlaşdırmaq üçün çox zəngin, dolğun və dürüst faktları verən bir abidədir. Bu baxımdan da dastanın dili tarixi frazeologiya üçün çox qiymətlidir. Onun dilində müasir dövrümüzdə də öz işləkliyini qoruyub saxlamış elə

frazeologizmlərə rast gəlmək mümkündür ki, elə bil 1300 ilyaşı olan bir abidənin yox, müasir ədəbi dilimizin məhsulu olan bir əsərin dilidir. *...uğuru açıq olmaq, ağzının suyu axmaq, alnı açıq, gözü tutmaq, qanı qaynamaq, acığı tutmaq, bağrı sarsılmaq, and içmək, başına çevirmək* kimi... yüzlərlə misal gətirmək olar ki, həmin frazeologizmlər indi də ədəbi dilimizdə geniş şəkildə işlənir” [151]. A.Hacıyevanın nümunə göstərdiyi bu frazeoloji vahidlər üstündən illər və qərinələr keçməsinə baxmayaraq işlənmə tezliklərini saxlamışlar [151].

Böyük yazıçıların əsərlərində mənsub olduqları xalqın həyat tərzi, idealları, mübarizəsi əks etdirildiyindən milli səciyyə daşıyır və bunun sayəsində bu əsərlər beynəlxalq aləmə yol aça bilir. Yəni hər hansı bir yazıçının əsərinin ilk növbədə “milli vəsiqə” qazanması həmin əsərin daha “sonrakı, beynəlxalq yaşama ömrünü” təyin etmiş olur. “... yaxşı yazıçılar idiomlardan həmişə öz əsərlərində istifadə etmişlər, onlar idiomlara “dilin həyat və ruhu” kimi baxmışlar” [151]. Fikrimizcə, ən yaxşı yazıçılar idiomları yaradan və onlara “yaşama haqqı verənlərdir”. Düzdür, ingilis dili frazeoloji fondunun ən mühüm mənbələrindən biri Şekspirin adı ilə bağlıdır. Lakin tədqiqatlar göstərir ki, Şekspirdən əvvəl yaşayıb-yaratmış yazıçılar da idiom yaradıcısı kimi tədqiq edə bilərik.

Xüsusi, frazeoloji vahidlər həm Azərbaycan, həm də ingilis dilində mövcuddur və frazeoloji fondu zənginləşdirən mənbələrdən biridir. Hər hansı bir ədibin yaratdığı ifadəli və məcazi bir deyim illər keçdikcə özünə dilin frazeoloji qatında yer alır və dildə yaşamaq haqqı qazanır. Belə “yaşama” həmin frazeoloji vahidlərin ifadə etdikləri hadisə və ya hərəkəti nə dərəcədə uğurlu əks etdirmələri, eyni zamanda da həmin ifadələri yaradan ədibin məşhurluğu ilə bağlıdır. Belə ki, ingilis dilində “Şekspirə qədər də mövcud olan bəzi frazeoloji vahidlər yalnız Şekspirdən sonra məşhurluq qazana bilmişdir.

Azərbaycan dilinin lüğət tərkibinin ana xəttini Azərbaycan türklərinin mənəvi mədəniyyətinin müxtəlif sahələrini, adət-ənənələrini, ailə-məişət mərasimlərini, təqvimi-mövsümi mərasimləri, dini ayinləri, ayrı-ayrı bayramları, mifik görüşləri və s. əks etdirən söz, termin və frazeoloji ifadələr təşkil edir. Dilin leksikası ayrılıqda hər bir fərdin və ya ümumilikdə cəmiyyətin diaxronik planda dilin dünya sistemi ilə genetik əlaqəsini əks etdirir. Məsələn, V.V.Vinoqradov [222] bu barədə belə yazır: "Sözlərin məzmununun mahiyyəti, sözün anlayışındakı əsaslı dəyişikliklərin təhlili tarixi planda gözdən keçirilməlidir". Bu baxımdan hər bir dilin leksik layında xüsusi mövqeyi ilə seçilən dini terminlər digər qrup sözlərdən fərqli olaraq stabilliyi və ənənəviliyi ilə diqqət çəkir. Belə ki, hər bir dini termin incələndikdə, mənşəyi araşdırıldıqda dildə baş verən bir çox tarixi proseslərin aşkar və aydın izah edilməsi mümkün olur [120, 313, 316].

Bunların coxu təyini söz birləşmələri şəklindədir: gözəgörünməz allah, yeganə olan allah, misli olmayan cənab allah; allah bəndəsi, allah-taala yolunda, allahın yolu, allah-taala həzrətləri, allah məsləhəti, allah həzrətləri, allah hurufatı; allahın heyvanı, allahın mərhəməti, allahın yolu, allahın sayəsində, allah taalanın lütfü və mərhəməti, allahın dərdi, allah-taalanın sifətləri, allahın mömin bəndələri, cənab allahın adı, cənab allahın ismi-şərifi, allahın bədbəxt bəndələri, allahın yazıq insanı və s. İzafət şəklində olan birləşmələr cox az olub, bir necə tipik dini ifadəni əhatə edir: allahurrəhmanir-rəhim, allahu-əkbər və s. Canlı danışıq dilindən gələn bir sıra predikativ birləşmələr müasir dilimiz üçün hələ də xarakterikdir. Belə birləşmələrin subyektini allah sözü təşkil edir: allah bərəkət versin, allah ziyarətinizi qəbul etsin, allah sənə lənət eləsin, allah atana rəhmət eləsin, allah sizin evinizi yıxsın, allah onu pir eləsin, allah onu sənə cox görməsin və s. [120].

“Tərkibində allah sözü olan predikativ birləşmələr: pənah allaha, allah, kəráminə şukur, allah, bədnəzərdən saxla, allaha şükür, pənah aparıram bir allaha, and verirəm səni o allaha. Bunlardan əlavə, allah sözünün əsasında vallah, billah, bəzən də vallahi billahı, inşaallah kimi alqış, and məqamında işlənən sözlərə də rast gəlirik. Allahın xoş nəzəri üstündə olmaq mənasında “Allah əlini çəkməsin” frazeologizmi yeri gəldikcə Heydər Əliyevin dilində işlədilir: “Arzu edirəm ki, *Allah* sizin ölkənizin üzərindən *əlini* heç vaxt *çəkməsin*” [XXVIIc.s.194].

Qurani-Kərimin bütün kəlamları bu gün Azərbaycanda *Allahın yolu ilə getməyimiz* üçün məşəldir. Biz bu yolla gedirik və gedəcəyik” [IIc.s.144].

Dini etik dəyərlər böyük natiqin dilində “Allaha şükürlər olsun ki” modallaşmış frazeologizm ilə auditoriyalara ayaq açır. Qurani-Kərimin müddəaları sadə xalq dilində insanlara ünvanlanır: “İndi əgər biz burada *keçmişimizi qurdalasaq*, qaldırsaq, – nə təhər oldu, nə cür oldu, bunlar bizə xeyir gətirməyəcəkdir. *Allaha şükür olsun ki*, müstəqil dövlətimiz var. *Allaha şükür olsun ki*, ictimai-siyasi sabitlik yaranıbdır. *Allaha şükür olsun ki,* tam sülh olmasa da, sülh şəraitində yaşayırıq. *Allaha şükür olsun ki*, hamımız bir yerdəyik. Vaxtilə kimin başına nə gəlib, nə təhər olub, filan olub – bunlar keçmişdə qalıbdır. Mən bunları unuduram. Xahiş edirəm siz də unudasınız” [XIIIc.s.19]. Bu kiçik mətndə “Allaha şükürlər olsun ki” modal sözün dörd yerdə təkrarlanması, “keçmişimizi qurdalasaq”, “nə təhər oldu”, “nə cür oldu” ifadələrinin yarıməişət, yarıdini bir üslubda, ümumişlək sözlərin ekspressivliyi fonunda işlədilməsi ilə ağsaqqal öyüdü tipində nitq yaradılmasının şahidi oluruq.

Tarixi olduğu kimi qəbul etmək, auditoriyaya da bu fikri, bu ideyanı qəbul etdirmək Heydər Əliyev dühasına xasdır. Dini üslubun tələb etdiyi sadə cümlələrlə islam əxlaqı audi-

toriyalara yön alır: "Şübhəsiz ki, tarixən hər bir cəmiyyətdə mənfi ünsürlər olmuşdur və bu gün bizim cəmiyyətmizidə də var. Əgər belə olmasaydı, Qurani-Kərimdə də insanları *bəd əməldən*, *xətalı yoldan* çəkinməyə çağıran ayələr yazılmazdı. İnsanların həmişə *düz* yolla, *təmiz mənəviyyat yolu* ilə getməsinə çalışmaq lazımdır. Cinayətə, cürbəcür təxribata əl atan adamların həm qarşısını almaq, həm də onları tərbiyə etmək lazımdır. Bunu bizdən Allah-təala tələb edir, bizə bu dərsi peyğəmbər vermişdir. Bütün bunlar Allahın Məhəmməd peyğəmbərə nazil etdiyi müqəddəs kitabımızda yazılmışdır" [IIc.s.147]. Elə yuxarıdakı mətndə "bəd əməl", "xətalı yol", "düz yol", "təmiz mənəviyyat yolu" kimi əxlaqi anlayışların köməyi ilə dindarların qəlbi fəth olunur.

Heydər Əliyevin dini etika ilə bağlı çıxışlarının əksəriyyəti dini-publisistik üslubdadır. Publisistik üslublu cümlələr (Mən Azərbaycan xalqının yüksək mənəviyyatını xalqımızın böyük sərvəti hesab edirəm) dini üslubun tələb etdiyi sadə, dini terminlərlə zəngin (yaşadan, fəlakətlərdən xilas edən o böyük Allahdır, "böyük Allahın adı ilə") cümlələrlə çulğalaşır: "Sizi əmin edirəm ki, mən həmişə yüksək mənəviyyat uğrunda mübarizə aparmışam, mənim həyatım saf mənəviyyat əsasında qurulubdur, mənim gördüyüm işlər də, ***saf, təmiz*** mənəviyyat əsasında qurulubdur. Mən Azərbaycan xalqının yüksək mənəviyyatının xalqımızın böyük sərvəti hesab edirəm. Ona görə də mən indiyə qədər buna sadiq olduğum kimi, bundan sonar da sadiq olacağam.

Sizə təşəkkür edirəm. Sizə cansağlığı arzu edirəm. Bizim xalqımızı əsrlər boyu yaşadan o *böyük Allahdır*. Hər birimizi yaşadan, o cümlədən məni də həyatımda böyük fəlakətlərdən xilas edən *böyük Allahdır*. *Böyük Allahın adı ilə* sizə cansağlığı, səadət, yeni-yeni uğurlar arzulayıram [XVIIIc.s.16].

Bu və ya digər xalqa aid dünyanın dil mənzərəsi, onun koqnitiv dünya modeli əsrlər uzunu davam edən empirik müşahidələr əsasında formalaşan və həmin etnosa özəl olan bilik sisteminə istinad edir [68, 206, 207]. V.F.Humboldt [247] yazırdı: "Xalqın ruhu onun dilidir, xalqın dili – onun ruhudur. Bundan gözəl eyniyyət təsəvvür etmək olmaz" Başqa bir məqamda o: "Hər bir dil xalqın ətrafında dairə cızır. İnsan da həmin dairəyə aid olur". Başqa sözlə desək, hər bir fərd aid olduğu cəmiyyətin stereotipləri, dəyərləri, linqvokulturologiyası, etnopsixologiyası ilə şərtlənən gözəgörünməz "dairədədir". Həmin dairənin verbal həlli isə bilavasitə "dünyanın dil mənzərəsi" modelində əks olunur. Həmin biliklər sistemi mütləq şəkildə sosiallaşmaya məruz qalır və nəticədə toplumun dəyərlər sisteminin əsas doqmalarını formalaşdırmış olur [68, 118, 146, 148].

Heydər Əliyevin 19 noyabr 1994-cü ildə Yeni Azərbaycan Partiyasının yaradılmasının 2-ci ildönümü münasibətilə keçirilmiş ümumrespublika müşavirəsindəki nitq əsasən publisistik üslubda olsa da, bir sıra məqamlarda səmimiyyətin qabarıq səsləndiyi məişət çalarları da özünə yer alır. Məhz nitqin məişət üslublu hissələrində xalq dilinə yaxın frazeologizmlər, necə deyərlər, dilin qədim və dərin qatlarından gələn frazeologizmlər işə düşür.

"Qanad altında yaşamaq" frazeologizmini 3 yerdə işlədən böyük natiq siyasi partiyanın ildönümündə məişət çalarlı, pedaqoji yönlü bir nitq nümunısi yaradır. Öncə Oğuz övladlarını sınağa çəkən bir Dədə Qorqud timsallı nitq işə düşür: "Əgər əvvəldən prezident kimi mən Yeni Azərbaycan Partiyasını tam dəstəkləmiş olsaydım, siz elə mənim *qanadım altında yaşayacaqdınız*. Amma mən sizi təkbaşına buraxdım və fikirləşdim ki, görüm siz nəyə qadirsiniz. Bu da sizi daha da mətinləşdirdi, daha da cəsarətləndirdi" [IIc.s.526].

Sonrakı mərhələdə qanad altında olmağın nə ilə nəticələndiyini "səmimi söhbətlə" auditoriyaya bəyan edir: "İndi burada səmimi söhbət edirik, – hesab edirəm ki, söhbətlərimiz sadə və səmimi olmalıdır, heç vaxt basmaqəlib olmamalıdır, – məsələn, imkanlı valideynlərin uşağı yemək-içməyin haradan gəldiyini bilmir, yaxud məktəbə də asanlıqla girir, instituta da necə daxil olduğunu bilmir, vəzifəyə keçməkdə də ona kömək edirlər. Amma, o, həyatın çətinliklərini görmür və bu mərhələdən də keçməyəndə mürəkkəb vəziyyətlərə düşərkən yaşamaq ona çox çətin olur. Bunu hamınız bilirsiniz. Sizin də bəzilərinizin, professorların və s. uşaqları belə olmuşdur".

Mirzə İbrahimov təsadüfən yazmırdı ki, "dilimizin böyük bir çay kimi axarına bulanıq sular gəlməsin" Frazeoloji vahidlər təbiətən milli düşüncə tərzinin ən parlaq təzahür forması olub şeir dilini milli koloritlə zənginləşdirən linqvistik məxəzdir.

Müəlliflər [148] əbəs yerə frazeoloji vahidləri ümumxalq dilinin ruhundakı plastikanın, lakonikliyin, xəlqiliyin və özümlülüyün əsası, şəhdi, şirəsi hesab etmirlər.

Dil vahidləri kimi frazeologizm və söz ekvivalent deyillər, onların leksik mənaları adekvat səciyyə daşımır. Frazeologizmlərin istifadəsində yaradıcılıq səyləri özünü açıq-aşkar büruzə verir. Sözdən fərqli olaraq frazeologizmlər təsvir-tərənnüm predmetinin xarakterik cizgilərini daha sərrast nəzərə çatdırır ki, bunun nəticəsində də hissi-emosional təsir güclü olur. Təsvir obyektinin nəzərə çatdırılması nəzərdə tutulan bədii boyalar oxucunun yaddaşında asanlıqla həkk olunur [160].

Deməli, frazeologizmlərə şeir mətnində adi dil vahidi kimi baxılmır. Onlar daha çox obrazlı düşüncələrin faydalı təcəssüm vasitəsi olaraq şair qələmində bədii boyalar oxucunun yaddaşında asanlıqla həkk olunur [38, 96, 174, 273]. Deməli,

frazeologizmə şeir mətnində adi dil vahidi kimi baxılmır. Onlar daha çox obrazlı düşüncələrin faydalı təcəssüm vasitəsi olaraq şair qələmində bədii mətləbin açılmasına istiqamətlənir. Deyim tərzinə xüsusi dolğunluq verən frazeologizmlər fikrin dürüst və tutumlu ifadəsinə də rəvac verir [146, 148, 160, 186].

Analiz etmək, dərindən düşünmək, ələkdən keçirmək, ölçüb-biçmək anlamında olan “götür-qoy etmək” frazeologizmi Heydər Əliyev nitqində publisistik üslubda işlənir: “Çox *götür-qoy etmişəm* və xeyli müddət bundan qabaq belə qərara gəlmişəm ki, bu orden bax, bizim şəxsiyyətlərimizə çatmalıdır” [IIIc.s.364].

Xalq dilinin bədii psixoloji əsasları haqqında da bütöv və dolğun təəssürat əmələ gətirir. Frazeologizmlərin bəziləri dualardan götürülmüşdür.

Müasir dövrdə elə bir dil yoxdur ki, onun lüğət tərkibi yalnız öz frazeoloji birləşmələrindən ibarət olsun. Müasir inkişafla əlaqədar olaraq xalqlar bir-biri ilə elmi, mədəni, siyasi, iqtisadi cəhətdən sıx əlaqədardır. Bu dillərin yaxınlaşması, birinin digərinə frazeoloji birləşmə vermək üçün zəmin yaradır. Bir dildən başqa bir dilə keçən, müxtəlif xalqların biri-biri ilə sıx əlaqəsi, əmək fəaliyyəti, elm və incəsənətin inkişafı nəticəsində əmələ gələn frazeologizmlər beynəlxalq frazeologizmlər adlanır [34, 298].

Dini üslublu çıxışlarda xəlqiliyə söykənən, dini inanclarla bağlı frazeologizmlər Heydər Əliyevin dilində özünə möhkəm yer alır: “XIX əsrin əvvəllərində Azərbaycan uzunmüddətli dövlətlərarası müharibələr nəticəsində öz dövlətçiliyindən məhrum olmuş, sonra isə keçmiş Sovet İttifaqının bir hissəsinə çevrilmişdir. Bu illər ərzində bizim müsəlman məsləkimiz ciddi sınaqlardan keçmiş, Azərbaycan xalqı öz dini hisslərini açıq ifadə edə bilməmişdir. Amma bi hissləri biz

*içimizdə yaşatmışıq, qoynumuzda saxlamışıq*, hətta ən ağır dövrlərdə öz dinimizə etiqad bəsləmişik" [IIIc.s.20].

"İçimizdə yaşatmaq", "qoynumuzda saxlamaq" kimi frazeologizmlər böyük natiqin dilində sanki dini üslubun böyuna biçilmişdir. 13 dekabr 1994-cü ildə İslam Konfransı Təşkilatının üzvü olan ölkələrin dövlət və hökümət başçılarının Kasablanka zirvə toplantısının iştirakçılarının hafizəsində yaşayan uzunmüddətli nitq nümunəsi yaradılır.

Frazeologizmlər Heydər Əliyevin çıxış etdiyi müxtəlif üslublarda öz rəngarəngliyi ilə dinləyiciləri səfərbər edir. Belə ki, Respublika Nazirlər Kabinetinin 3 may 1995-ci ildəki geniş iclasındakı çıxış rəsmi-işgüzar xarakterdə olsa da xəlqiliklə yoğurulmuş frazeologizmlər burada da öz yerini tapır. Həmişə olduğu kimi bu çıxışda da frazeologizmin dilə gətirilməsinədək onun izahı, şərhi verilir, sonda isə möhürbənd kimi frazeologizmin özü meydana gəlir. Nazirlər Kabinetinin işi ilə bağlı işlədilən "işi axsamaq" frazeologizmindən öncə onun mənası kimi – qüsurlar, nöqsanlar, çatışmazlıqlar sadalanır: "Bütün bunlara qısaca yekun vursaq, mən tam cəsarətlə deyə bilərəm ki, keçid dövründə, yəni 1991-ci ilin axırlarında Azərbaycan Respublikasının müstəqilliyi elan olunduğu vaxtdan bəri Nazirlər Kabinetinin işi əslində lazımi səviyyədə təşkil edilməmişdir. Buna görə də onun işində çox böyük *qüsurlar, nöqsanlar və çatışmazlıqlar* olmuşdur. Həm də bunlar, indiyədək mövcuddur. Hətta deyə bilərəm ki, həmin müddətdə Nazirlər Kabinetinə başçılıq edən şəxslər onun işini lazımınca qurmağa müvəffəq olmamışlar. Bunun nəticəsində də Nazirlər Kabnetinin *işi* bu günədək *axsayır*" [III c. s.395].

Elə həmin çıxışda "bazara döndərmək" frazeologizmi ilə Nazirlər Kabinetinə başçılıq edənlərin fəaliyyəti ciddi araşdırılır və tənqidə məruz qalır. Və bu tənqid Heydər Əliyevin – müstəqillik yolunu seçən və bu yola bütün ömrünü həsr edən

siyasi liderin "yol"la bağlı işlətdiyi frazeologizmlər nitq səhnəsinə gəlir: "Ancaq təəssüflər olsun ki, Surət Hüseynov bu *yolla getmədi*. Elə mən də görürdüm ki, bu yolla getmir. Mən onu dəfələrlə *düz yola* dəvət etdim. O isə öz xasiyyətini dəyişdirmir, keçmişdə gördüyü işlərdən *əl çəkə bilmirdi***.** Ona görə də Nazirlər Kabinetini *bazara döndərmişdi* və böyük cinayətkarları gətirib buraya doldurmuşdur" [IIIc.s.319].

Növbəti nitq mərhələsində "böyük cinayətkarları gətirib buraya doldurmaq" ifadəsi yeni frazeologizmlərlə – "aparatı zibillənmək", "aparatı çirklənmək", "sağlam mühit"lə davam etdirilir: "Çünki ötən müddət ərzində həm Nazirlər Kabineti, həm də onun *aparatı* xeyli *zibillənmiş***, –** mən bu sözü tam cəsarətlə deyirəm, – *çirklənmişdir***.** Odur ki, indi gərək yuxarıdan aşağıya qədər Nazirlər Kabinetinin bütün sistemi bu zibildən, bu çirkdən təmizlənsin, burada mənən "*sağlam mühit"* yaransın və işlər respublikamızın bugünkü mənafeyinə uyğun surətdə sağlam istiqamətdə aparılsın" [IIIc.s.398].

Müstəqilliyə gedən yola mane olan hər bir şeyə "yol verməyəcəyəm" frazeologizmi ilə cavab verilir: "Mən bunları xatırlatmaqla xəbərdarlıq etmək istəyirəm ki, əgər kimsə keçmişin bu mənfi hallarını, yaranmış qeyri-sağlam ənənləri yenə də dirçəltmək, şəxsi iddialar mövqeyindən hərəkət etmək fikrinə düşsə, belə şeylərə, şübhəsiz, *yol verilməyəcəkdir*. Şəxsən mən bunlara *yol verməyəcəyəm*" [IIIc.s.400]. Və yenidən təkrarən "işi axsamaq" frazeologizmini işlədir: "Amma bəzi hallarda ayrı-ayrı vəzifəli şəxslər üzərinə düşən vəzifələri yerinə yetirmək əvəzinə, özünün bütün potensialını buna yönəltmək əvəzinə, kənar işlərlə məşğul olur və öz vəzifələri bir tərəfdə qalır. Beləliklə, *iş axsayır* və cürbəcür ziddiyyətlər yaranır" [IIIc.s.400].

Çıxışın sonuna doğru elmi-fəlsəfi üslub özünə yol tapır. Terminologiyaya söykənən elmi üslub çıxışın elmiliyinə

sübutdur. Belə ki, "böhran", "obyektiv", "subyektiv", "fantaziyaya uymaq", "ümumiyyətlə" kimi fəlsəfi terminlərə xüsusi yer ayrılır.

Təkcə, Heydər Əliyevin islətdiyi bir cümlə – "Çünki bu vəziyyət tək bizə deyil, ümumiyyətlə keçid dövrünə xas olan vəziyyətdir" – hadisələrə yekunlaşdırıcı ümumfəlsəfi yanaşmanı göstərir. "Xeyr" inkar ədatı ilə prinsipial mövqe nümayiş etdirir. Sonda fəaliyyətsizliyin, tənbəlliyin nəyə gətirib çıxaracağını auditoriya üçün "dərin quyuya salmaq" frazeologizmi ilə aydınlaşdırır: "İqtisadiyyatımız, sosial sahəmiz böyük bir böhran içərisindədir. Bu, hamiya məlumdur. Biz bunu dəfələrlə demişik. Şübhəsiz ki, bu böhranın həm obyektiv, həm də subyektiv səbəbləri də məlumdur. Siz obyektiv səbəbləri bilirsiniz. Mən güman edirəm ki, subyektiv səbəblər Nazirlər Kabinetinin 1991-ci ildən indiyə qədər fəaliyyəti haqqında, onun rəhbərliyi haqqında söylədiyim sözlərdən aydın oldu. Buna görə də təkrara ehtiyac yoxdur. Buna baxmayaraq, biz belə vəzyyətlə razılaşa bilmərik. Şübhəsiz, ciddi tədbirlər görülməlidir ki, iqtisadiyyat bu böhran vəziyyətdən tədricən çıxsın. Əlbəttə, heç vaxt *fantaziyaya uymaq* lazım deyildir ki, bu gün biz *bir addım atacağıq* və sabah vəziyyət dəyişəcəkdir. *Xeyr*, belə ola bilməz. Çünki bu vəziyyət tək bizə deyil, ümumiyyətlə keçid dövrünə xas olan vəziyyətdir. Lakin, hər şey bizim fəaliyyətimizdən asılıdır. Biz bir fəaliyyət göstərməyib, keçmişdəki kimi nöqsanlara, səhvlərə yol versək, özümüzü *daha dərin quyuya salarıq*" [IIIc.s.404].

Dini üsluba xas olan bir sıra frazeologizmlər ciddi müşavirələrdə belə Heydər Əliyev çıxışlarını tərk etmir. 10 iyun 1995-ci ildə Prezident Sarayında "Böyük Azərbaycan şairi və dramaturqu Hüseyn Cavidin ev – muzeyinin yaradılması ilə bağlı müşavirədə səslənən "torpağa tapşırılmaq", "qəbrin üstünü götürmək" frazeologizmləri bu qəbildəndir.

Dəfn olunmağın frazeoloji əvəzedicisi kimi “torpağa tapşırılmaq” o dövrkü situasiyanı tarixiliyinədək xalqın hafizəsinə çatdırır. Yəni Sibirdən cənazəsi gətirilən Cavidin Naxçıvanda torpağa tapşırılması yüksək dini-estetik nitq effekti yaradır. “Qəbrin üstünü götürmək” frazeologizmi milyonların qəlbinə yol açır. Xalq milli mentalitetin daşıyıcısı olan lideri ilə birgə düşündüyünün fərqinə varır: “1981-ci ildə biz Hüseyn Cavidin cənazəsini Sibirdən gətirərəkən geniş müzakirələr oldu və nəhayət bu müzakirələr belə nəticə verdi ki, o, Naxçıvanda – anadan olduğu yerdə dəfn olunsun. Biz belə də etdik. Hüseyn Cavidin cənazəsinin Naxçıvanda torpağa tapşırılması haqqında qəbul etdiyimiz qərarın əsas səbəblərindən biri o idi ki, onun qəbri adi bir qəbir olmasın, böyük bir məqbərə olsun. Ona görə də Hüseyn Cavidin cənazəsi Naxçıvana aparıldı və orada şəhərin mərkəzində dəfn edilidi. Ancaq təəssüf ki, sonrakı illərdə məqbərə də tikilməyib, hətta *qəbrin üstü də götürülməyibdir*” [IVc.s.5].

“Qəbrin üstünü götürmək” frazeologizmi təkrarən “heç olmasa” şərt formasında yadda qalan, təəssüf doğuran nitq nümunəsi yaradır: “Mən böyük bir fasilədən sonra – 1990-cı ildə Moskvadan Azərbaycana döndüm, Naxçıvana getdim və elə həmin gün Cavidin qəbrini ziyarət etdim. Doğrusu, mən belə təsəvvür etmirdim. Fikirləşdim ki məqbərə yoxdursa da, heç olmasa sənətkarın *qəbrinin üstü götürülüb*. Ancaq gedib oradakı vəziyyəti gördüm, təəssüfləndim, çox narahat oldum. Gördüm ki, qəbrin üstünə sadəcə olaraq daşlar qoyulub, məqbərə də tikilməyib” [IVc.s.6].

Üslublarla Heydər Əliyev dilindəki frazeologizmlər arasında bir harmonik əlaqə həmişə özünü göstərir. Ümumiyyətlə, Heydər Əliyev nitqlərinin giriş və sonluqları, sinonim cərgələr və çıxışın məzmununa uyğun seçilib auditoriyalara

yön alan frazeologizmlər arasında ardıcıl, ekspressivliyi yüksəldən ölçülər həmişə gözlənilir.

"Halva yemək deyil" xalq arasında özünə yer alan frazeologizmi həmişə qarşıya çıxan məsələlərin heç də asan olmadığına işarədir: "Ona görə də əsgərə qayğı, atalıq münasibəti göstərmək, onu tərbiyələndirmək lazımdır. Təsəvvür edin, hərbi qulluğa gələn gənc 18 yaşındadır. 18 yaşında gənc hələ tam formalaşmayıbdır. Onun tam formalaşması üçün bir neçə il lazımdır. Amma keçmişdə, bütün dövrlərdə belə olubdur ki, orduda xidmət, əsgərlik dövrü hər bir gənci möhkəmləndirir, cəsarətləndirir, onu daha da dözümlü edir, bütün çətinliklərə dözməyə öyrədir. Bu təbiidir, çünki əsgər olmaq *halva yemək,* yaxud anasının hər gün bişirdiyi plovu yemək deyildir. Elə bütün ordularda əsgərlik *asan məsələ deyildir"* [XXVIIIc.s.334]. Burada məişət çalarlı üslubda ordu, əsgər, əsgərlik məsələləri sadə dildə öz ünvanına çatdırılır.

*Bədii üslublu* çıxışların baş verdiyi məkanlarda Heydər Əliyev dilində satirik çalarlı ifadələr işə düşür. Satirik yolla elmimizin, mədəniyyətimizin inkişafındakı gerilikləri, çatışmazlıqları tənqid edir. Akademik Milli Dram Teatrdakı çıxışda olduğu kimi "Elçin həmin proseslərin bu hissəsini göstərmək istəyibdir, özü də çox məharətlə göstəribdir. Mən buna baxanda Cəlil Məmmədquluzadənin "Ölülər" əsəri yadıma düşdü. İndi görün, əgər o vaxt bizim xalqımız belə cahil idisə, Cəlil Məmmədquluzadə "Ölülər" əsərini yazmışdı. O, keçmişə aid idi ki, bir Şeyx Nəsrullah peyda olubdur. Ölüləri *qəbirdən qaldırır*, hamı da gəlib Şeyx Nəsrullahı axtarır, onu görmək istəyirlər ki, mənim bacımı qaldır, atamı dirilt nə bilim, nənəmi dirilt, filanı dirilt" [XXVIIIc.s.314]. "Diriltmək" anlamında olan "qəbirdən qaldırmaq" frazeolgizmində təbii ki, satirik çalar xüsusilə özünü göstərir.

Dini-məişət üslublu çıxışlarında böyük natiqin öz dediyi kimi "bir az loru dildə desək" ümumişlək frazeologizmlərdən yerindəcə, situasiyaya uyğun istifadə edir. Mirmövsüm Ağanın ziyarətgahında olan Heydər Əliyev indiki dövrü sovet dövrü ilə müqayisə edir, dini-mənəvi dəyərlərimizin bu gün öz qiymətini aldığını təfəkkür süzgəcindən keçirərək dindarlar auditoriyasına çatdırır. Bu çıxışın nüvə frazeologizmini "qarnı dolu olmaq" təşkil edir: "Bir vaxtlar həyatda bu qədər çətinlik yox idi. Ancaq biz dinimizdən, milli-mənəvi dəyərlərimizdən məhrum idik. Hamımız sovet hakimiyyətinin, sovet ideologiyasıın qanun-qaydaları ilə yaşayırdıq. Bir az loru dildə desək, onda *qarnımız daha dolu* idi. Ancaq qəlbimiz dolu deyildi, boş idi. İnsan isə təkcə qarın üçün yaşamır. Azərbaycan xalqı əsrlər boyu, islam dinini qəbul edəndən sonra dini adət-ənənləri, dini-mənəvi dəyərlərimizi hər şeydən üstün tutubdur" [XXXIc.s.245]. Elə həmin çıxışda auditoriyada canlanma yaranır, "qarın dolu olmaq", necə deyərlər camaatın dilinə düşür. Professor Kərşivəz Quliyev: "Sizin bura gəlməyinizdən camaatımız çox sevinir. Bayaq Sizin dediyiniz kimi, biz qarın camaatı deyilik. Müsəlman qarın müsəlmanı ola bilməz. Biz Sizə baxırıq, Sizin işlərinizə dəstək veririk" [XXXXIc.s.248].

*Dini üslublu* çıxışlarda səslənən bir qisim frazeologizmlər dinləyicilərdə emosional təsir yarada, kövrək ovqat formalaşdıra bilir. Bu frazeologizmləri eşidən auditoriyada öz liderinə sonsuz sevgi yaranır: "Deyirdim ki, doğulduğum yerə gəlmişəm, elə orada da həyatımı *sona verəcəyəm*" [XXVIIIc.s.273].

Dini frazeologizmlər Heydər Əliyev dilində bir məqamda poetiklik, digər bir məqamda kövrəklik yaradırsa, müəyyən hallarda isə kəskin ton qazanaraq auditoriyanı səfərbər edir: "İtaliya Xarici İşlər Nazirinin müavinindən əlavə, İtaliyanın Avropa Şürasında çalışan bir neçə yüksək vəzifəli şəxsi də

gəlmişdi – mən onlara dedim və bu sözü bir neçə dəfə təkrar etmişəm ki, Avropa Şurasına daxil olmaq bizim üçün bal yemək, *cənnətə düşmək* deyildir" [XXIXc.s.7].

Bir qisim *məişət* çalarlı frazeologizmlər, o cümlədən "baş çəkmək", "küçələrdə qalmaq", "dil tapmaq" kimi frazeologizmlər Heydər Əliyev dilində müxtəlif mövzulu çıxışlarda öz yerini alır. Yaxın adamlara, yaxın dost və qohumlara, xəstələrə "baş çəkmək" xalqın milli mentalitetindən irəli gəlir. Rusiyanın səfiri ilə görüşdə Moskva şəhərinin meri haqqında söylədiyi fikirlər içərisində bu frazeologizmə müraciət edir: "Biz Yuri Mixayloviçlə də bir-birimizi çoxdan tanıyırıq. Mən onun Sovetlər İttifaqı dövründəki dövlət və təsərrüfat fəaliyyətini həmişə qiymətləndirmişəm. O burada olubdur, biz onunla Azərbaycanda Rusiya mədəniyyəti günləri keçirdik, mən Moskvada ona *tez-tez baş çəkirəm*" [XXXc.s.267].

Kənd təsərrüfatında aparılan aqrar islahatın müsbət nəticələrini ritorik sualla məmurlar auditoriyasına çatdırır, sonda nəticə kimi "ət küçələrdə qalıbdır" frazeoloji ifadə ilə fikrini yekunlaşdırır. "Küçədə qalmaq" frazeologizmi bolluğa işarə kimi, ümumişlək söz kimi işlənir: "Hazırda kənddə o qədər mal, heyvan saxlayırlar ki, *ət küçələrdə qalıbdır*".

Başqa bir "dil tapmaq" frazeologizmi xəlqiliyə söykənən bir frazeologizmdir ki, bədii – məişət üslubunda işlənən bu frazeologizmi Heydər Əliyev siyasi-diplomatik səhnəyə gətirir: "Lakin onlar İranla *dil tapa* bilməyiblər. Mən də onlara demişəm ki, siz gedin İranla *dil tapın*" [XXXc.s.70].

*Rəsmi-publisistik üslubun* daha az frazeologizmlərlə boyanmasını nəzərə alıb Heydər Əliyevin 18 fevral 1997-ci ildə "Gülüstan" sarayında Gürcüstan Prezidenti Eduard Şevardnadzenin şərəfinə verilmiş rəsmi ziyafətdəki nitqi tədqiqata cəlb etdik. "Hörmətli Gürcüstan prezidenti cənab Eduard Şevardnadze! Möhtərəm qonaqlar! Xanımlar və cənablar!"

girişi ilə başlayan nitqdə ilk frazeologizm kimi "danışıqlar aparmaq" dilə gətirilir: "Bu gün biz səmərəli *danışıqlar apardıq,* iki prezident arasında dostcasına söhbət oldu, mühüm dövlətlərarası sənədlər imzalandı" [VIIIc.s.427].

Bu frazeologizm ümumişlək frazeologizmlərdən olub auditoriyada xüsusi ekspressivlik yaratmasa da rəsmi – işgüzar çıxışlarda öz yerini alır. Növbəti mərhələdə "əldə olunmaq" somatik və "sürətlə irəliləyən əməkdaşlıq" frazeologizmləri auditoriyada necə deyərlər canlanma yaradır: "*Şübhəsiz*, biz hamımız səy göstərəcəyik ki, *əldə olunmuş* razılaşmalar həyata keçirilsin, imzalanmış sənədlərdə müəyyən edilmiş vəzifələr yerinə yetirilsin və Gürcüstan-Azərbaycan əməkdaşlığı *sürətlə irəliləsin"* [VIIIc.s.427].

Bu "sürətli irəliləyiş"ə modal söz "şübhəsiz"lə güman yeri qalmır. Növbəti nitq mərhələsində xalqların inkişaf mərhələlərini əks etdirən, qayda-qanunları əks etdirən "yol"la balı frazeologizmlər auditoriyaya ayaq açır. Auditoriya "keçirilmiş yola" nəzər salaraq xalqların bərabər və birgə əməkdaşlığını "çiyin-çiyinə" yaşamaqla qeyd edir: "Ona görə də bu gün biz *keçilmiş yola* nəzər salaraq iftixarla deyə bilərik ki, xalqlarımız *çiyin-çiyinə,* birlikdə *yaşayaraq,* bir-birilə həmişə səmimi dostluq münasibətləri saxlamış, bir-birinə kömək etmiş, bir-birini təcrübə ilə, biliklərlə, malik olduqları hər şeylə zənginləşdirmişlər" [VIIIc.s.428].

Müstəqilliyin xalqları aparacağı "xoşbəxt yol", "hamar yol" frazeologizmləri təkrarlanır: "Baxmayaraq ki, bütün bunlar mürəkkəb və çətin şəraitdə gedibdir və gedir, lakin hər halda bu dövrün qiymətləndirilməsində müsbət amil üstün yer tutur, başqa sözlə, hər halda biz bu çətinliklərdən, bu itkilərdən, bu faciələrdən keçərək milli azadlığın və dövlət müstəqilliyinin xoşbəxt yoluna çıxmışıq" [VIIIc.s.429]. "Xoşbəxt

yol"la yanaşı həmin çıxışda iki yerdə "hamar yolu" səsləndirir.

"Lakin dostlar kimi, qardaşlar kimi bütün bunları müşahidə edərək həmişə inanmışıq ki, Gürcüstan *hamar yola* çıxacaqdır və çıxdı da" [VIIIc.s.429].

Bu hamar yola çıxmağın səbəbkarı kimi Gürcüstan liderinin xidmətlərini auditoriyaya bəyan edir: "O öz xalqının ən ağır günlərində və aylarında vətənə qayıdaraq, öz xalqına başçılıq etdi və onlar böyük çətinliklər bahasına vətəndaş müharibəsinin qarşısını aldı, digər bütün çətin prosesləri aradan qaldırdılar və Eduard Amvrosiyeviç öz xalqını, öz ölkəsini dövlət müstəqilliyinin və milli azadlığın *hamar yoluna* çıxardı" [VIII c s. 429-430].

Bu xoşbəxt və hamar yolla gedən gürcü xalqının bu yoldakı inkişafının "iri addımlar"ını dilə gətirir: "Zənnimcə, biz orada səmərəli işləyə bildik və belə bir şəraitdə bir ildən sonra Gürcüstan prezidentini, onu müşayiət edən şəxsləri qəbul edirik və artıq indi biz əməkdaşlıqda atılmış *iri addımlardan* və qarşımızda açılan böyük perspektivlərdən danışırıq" [VIIIc.s.430].

"Hamar" və "geniş" yollar sonda başqa yollara aparıb çıxarır, bu "yollar" təkrarlanır: "Biz Gürcüstanda gedən prosesləri böyük məmnunluqla izləyirik, ona görə ki, biz özümüz həyatın bu mərhələsindən keçirik, özümüz bu yolla, demokratik, hüquqi cəmiyyət qurmaq yolu ilə, həyatın bütün sahələrində demokratiya prinsiplərini bərqərar etmək yolu ilə, bazar iqtisadiyyatını inkişaf etdirmək yolu ilə gedirik" [VIIIc.s.431].

Qonşu respublika rəhbərliyi ilə görüşdə yaranan fürsətdən yararlanan böyük natiq Ermənistanla bağlı fikirlərini bəyan edərək, ərazi məsələlərində güzəştə yer qalmadığını "yol verə bilməmək" frazeologizmi ilə bəyan edir: "Ancaq eyni zamanda biz sərhədlərimizin pozulmasına, Azərbaycanın ərazi bü-

tövlüyünün tapdalanmasına heç vaxt *yol verə bilmərik”* [VIIIc.s.432].

Ərazi ilə bağlı məsələlərdə Gürcüstanla eyni mövqedə olmaq “üst-üstə düşmək” frazeologizmi ilə ziyafət iştirakçılarına xatırladılır: “Həm bu məsələdə, həm də bir çox digər məsələlərdə bizim – Gürcüstanın və Azərbaycanın mövqeləri *üst-üstə düşür,* bu isə bizi daha da yaxınlaşdırır, münasibətlərimizi, dostluğumuzu daha da möhkəmləndirir” [VIIIc.s.432]. Bu rəsmi-publisistik üslub həmişəki kimi Heydər Əliyev dilində ümumişlək, xoş məramlı ifadələrlə yekunlaşır.

“Məhəbbət bəsləmək” frazeolgizmi çıxışın sonunda səslənməklə xoş ovqat yaradır: “Buna görə də sizin gəlməyinizdən çox şadam. Bütün dövrlərdə olduğu kimi, Azərbaycanda indi də Gürcüstana, gürcü xalqına çox böyük *məhəbbət bəsləyirlər*” [VIIIc.s.433].

*Məişət üslublu* çıxış kimi 19 yanvar 1997-ci ildə Heydər Əliyevin Qədirli adına Mərkəzi Hövzə Xəstəxanasında müalicə olunan xalq şairi Bəxtiyar Vahabzadə ilə görüşdəki söhbətdə işlənən frazeologizmlərin araşdırılması maraqdoğurandır. Heydər Əliyevin xalq qarşısındakı xidmətlərini qeyd edən Bəxtiyar Vahabzadəyə “öz işimi aparmaq” frazeologizmi ilə təvazökarlıqdan uzaq bir cavab verir: “Sağ olun. O da sağ olsun, siz də sağ olun. Amma kimin dəstək verib-verməməsi əhəmiyyətli deyil, mən *öz işimi aparıram”* [VIIIc.s.333].

Söhbətin gedişində hadisələri düzgün qiymətləndirməyən, keçmişin müsbət cəhətlərini unudan insanlar qınağa çəkilir, onlar “burnunun ucundan o tərəfi görməyən adamlar” kimi dəyərləndirilir: “Elm, səhiyyə, tibb, təhsil, tibb xidməti sahəsində biz nə qədər yüksək səviyyəli adamlar yetişdirmişik, bunların qədrini bilmək lazımdır. Mən dəfələrlə demişəm ki, bəziləri dünyanı anlamayan, *burnunun ucundan o tərəfi görməyən* adamlar indi hər şeyi pisləyirlər” [VIIIc.s.334].

Sonrakı söhbət məqamında Heydər Əliyev Fransa səfəri barədə şairə məlumat verir, onu söhbətə çəkməklə sanki xəstənin fikrini xəstəlikdən uzaqlaşdırır. Oradakı çıxışı haqqında sadə cümlələrlə məişət üslublu söhbət aparır: "Böyük mütəxəssislər, Fransada olan səfirlər oraya toplaşmışdılar. Salon *ağzınadək dolu* idi. Mən orada çıxış etdim, suallar da verdilər. Mən təkcə orada yox, hər yerdə demişəm ki, respublikamızın müstəqilliyi tarixi nailiyyətimizdir, müstəqilliyimiz sarsılmazdır, dönməzdir və biz onu heç vaxt *əlimizdən verə bilmərik*" [VIIIc.s.335]. Bu sadə, səmimi söhbət əsnasında "heç vaxt"la prinsipial mövqenin "əldən verməmək" frazeologizmi ilə orada – Fransada ortaya qoyduğunu şairin timsalında xalqa ünvanlayır.

"Fürsətdən istifadə edərək" ifadəsi ilə Bəxtiyar Vahabzadənin 1990-cı il 20 Yanvar faciəsi ilə əlaqədar gördüyü işlərdən, onun vətəndaş mövqeyindən söhbət açır. O dövrdə hakimiyyətdə olanların faciənin "üstünü örtməyə, basdırmağa" etdikləri cəhdləri ifşa edir: "Təsəvvür edin, respublikanı, hökuməti idarə edən adamlar qaçdılar, sessiyaya Bəxtiyar Vahabzadə rəhbərlik etdi. Əgər sən dünənədək bu hökumətə, xalqa, dövlətə, respublikaya rəhbərlik edirsənsə, onun ağır günündə də gəl xalqla bir yerdə ol. Sən qaçıb evdə gizlənmisən, Bəxtiyar Vahabzadə isə özünü burada fəda, necə deyərlər, şəhid edir. Yəni Bəxtiyar Vahabzadə burada bu qərarı qəbul edir, amma sən gedib dörd gündən sonra özünü Azərbaycana hakim təyin etdirirsən və bu faciənin *üstünü örtməyə, basdırmağa* başlayırsan" [VIIIc.s.337].

Xalq şairi ilə olan görüş – söhbət sənət adamlarından, ədəbiyyatımızın bu günündən bəhs edir. Sonda "xalqı tanıtmaq" frazeologizmi ilə söhbət yekunlaşır. "Xalq onun sənətkar övladlarının ümumbəşəri ola biləcək yaradıcılığı ilə tanınır" müddəası əldə rəhbər tutulur: "Bəli, xalqımızı tanıtmaq

lazımdır. Mən neçə ildir çalışıram, işləyirəm, bir məqsədim var: *xalqımızı tanıtmaq"* [VIIIc.s.341].

Bir sıra frazeologizmlər Heydər Əliyevin nitqində bədii üslubun üstünlük təşkil etdiyi auditoriyalarda özünə yer alır. 8 noyabr 1996-cı ildə Respublika Sarayında dahi Azərbaycan şairi və mütəfəkkiri Məhəmməd Füzulinin anadan olmasının 500 illik yubileyinə həsr edilmiş təntənəli gecədəki nitqdə səslənən frazeologizmlər buna parlaq sübutdur.

Auditoriya ilk növbədə Heydər Əliyevi Füzuli irsini araşdıran filosof-filoloq kimi qəbul edir: "Məhəmməd Füzulinin yaradıcılığında elmin, fəlsəfənin bir çox sahələri geniş təhlil olunmuş və onun əsərlərində öz əksini tapmışdır. Onun bütün əsərləri şeir, poeziya, ədəbiyyat nümunələri olmaqla bərabər, eyni zamanda böyük fəlsəfi ideyalar, *elmi fikirlər* daşıyır. Məhəmməd Füzuli öz yaşadığı dövrdən əvvəlki dövrü geniş təhlil etmiş və həm Şərqin ona qədər yaratdıqlarını, həm də qədim yunan, rum antik ədəbiyyatının, qədim hind ədəbiyyatının nümunələrini öz əsərlərində cəmləşdirərək, yaradıcılığında Şərqin və Qərbin sintezinin nəticəsi olaraq şeirin, elmin, fəlsəfənin ən yüksək *zirvələrinə çatmışdır*" [VIIIc.s.25].

"Fikir daşımaq", "zirvəyə çatmaq" frazeologizmləri Heydər Əliyev dilində kontaminasiyaya (leksik zənginləşməyə) məruz qalaraq gözəl nitq nümunəsi yaradılır.

Füzulinin "Leyli və Məcnun" poeması əsasında Üzeyir Hacıbəyov tərəfindən yaradılan eyni adlı opera haqqında işlətdiyi "səhnədən düşməmək", "dünyanı dolaşmaq", "zirvələrə qaldırmaq" frazeologizmləri Heydər Əliyevin sənətə dərindən bələdliyinin bariz nümunəsidir.

Elmdə "istiqamət vermək" mənasında "yollar açmaq" frazeologizmini elmi-publisistik bir dillə bədii ədəbiyyatın inkişafına yönəltmək Heydər Əliyev dilinin zənginliyi və

çoxcəhətliliyidir: "Hesab edirəm ki, Füzuli yaradıcılığı, onun irsi elə bir dəryadır ki, onun dərinliklərinə nüfuz etmək üçün o dərin qatlardakı fikirləri, tövsiyələri mənimsəmək üçün, öyrənmək üçün hələ çox işlər görülməlidir. Güman edirəm ki, 500 illik yubiley tədbirləri Məhəmməd Füzuli yaradıcılığının elmi-nəzəri cəhətdən gələcəkdə də tədqiq, təbliğ olunması üçün böyük yollar açır" [VIIIc.s.28].

Hər bir üslub üçün xarakterik ola biləcək frazeologizmlər mövcuddur. Ümumişlək frazeologizmləri siyasi səhnəyə gətirmək Heydər Əliyev dühasına xasdır. "Qolu zorba olmaq" frazeologizmi vəzifəsinə güvənib xalqı incidənlərə bir cavab kimi səslənir: "Əgər kimsə, hər hansı bir adamsa – ya pulu çoxdur, yaxud vəzifəsi böyükdür, *qolu zorbadır* – gəlib ağacı kəsirsə, qorxmayın, çəkinməyin, siz ondan güclüsünüz [IXc.s.440].

Bəzən də məişət üslubunun loru leksikası işə düşür. "Quzu olmaq" frazeologizmi kimi: "Ona görə də biz deyə bilmərik ki, azərbaycanlıların hamısı burada *quzudurlar*, heç bir şey etmirlər, yəni qeyri-qanuni heç bir hərəkətə yol vermirlər" [IXc.s.76].

Rəsmi-publisistik üslubun tələb etdiuyi bir sıra frazeologizmlərlə tanış olmaq yerinə düşər. "Ölçü götürmək" frazeologizmi müəyyən tədbirlər görmək, məsələni vaxtında həll etmək baxımından istifadə olunur: "Mən baş nazir Artur Rasizadəyə tapşırıram ki, o, bu məsələlərə nəzarət etsin və bu layihənin həyata keçirilməsi üçün Azərbaycanın sənaye mütəxəssislərindən, şirkətlərindən, zavodlarından istifadə edilməsində əgər bir problem yaranarsa, bunlara vaxtında baxıb, lazımi ölçü götürsün" [IX c., c. 9].

Publisistik üslubun tələb etdiyi beynəlxalq mənşəli sözlərdən əmələ gəlmiş frazeologizmlər işə düşür: "Lakin mənə elə gəlir ki, onlar qeyri-mütəşəkkil səciyyə daşıyırdı, bəzən də

hətta açıq-aşkar uğursuzluğa məhkum idi, çünki açıq-aşkar *destruktiv* idi” [XVIIc.s.15]. Elə buradaca “destruktiv olmaq” frazeologizmi meydana çıxır: “Lakin erməni tərəfi bu dəfə də qeyri-konstruktiv mövqe tutdu və sənədin qəbul edilməsinə konsensus vermədi” [XIIc.s.35].

Bədii üslubda bir sıra frazeollgizmlər içərisində “beynini fəth etmək”, “şairlərin şairi olmaq”, “göz bəbəyi kimi qorumaq” və s. göstərmək olar.

“Sizi əmin edirəm ki, biz Azərbaycanın dövlət müstəqilliyini *göz bəbəyimiz kimi qoruyub saxlayacağıq* və onu heç vaxt *əldən verməyəcəyik*” [IXc.s.292].

Heydər Əliyevin bədii üslubdakı nitqləri və səslənən frazeologizmlər etik və estetik dəyərlər kmi səslənir. Şeirlərlə beynin fəth olunması özlüyündə estetik zövq yaratmaqdır: “Səməd Vurğun şeirinin böyüklüyü, eyni zamanda gözəlliyi ondan ibarət idi ki, onun hər kəlməsi, hər sətri hər bir azərbaycanlının *qəlbinə çatırdı,* onun *beynini fəth edirdi*, onu öz təsiri altına salırdı” [IXc.s.17-18].

Yaxud “şairlərin şairi olmaq” ən yüksək bədii-estetik zövqə işarədir: “Səməd Vurğun isə öz dövrünün şairlərinin şairi olubdur” [IXc.s.17]. “Ürəyinə yatmaq”da “beyinləri fəth etmək” anlamına gəlir: “Mirvarid xanımın şeirləri həmişə bizim cəmiyyətimizin ürəyinə yatandır” [XIXc.s.254].

İqtisadiyyatla bağlı elmi-publisistik üslublu çıxışlarda “meydan açılmaq”, “geniş yer verilmək” frazeologizmləri özünə yer tapır: “Sağlam, təmiz, pak bazar iqtisadiyyatı yolu ilə gedən iş adamlarına Azərbaycanda *geniş yer veriləcəkdir*, xarici şirkətlərə, sərmayəçilərə geniş *meydan açılacaqdır*” [VIIIc.s.206].

Heydər Əliyevin elmi-publisistik üslublu çıxışlarında da frazeologizmlər öz yerini tapır. 9 dekabr 1994-cü ildə Respublika Ali Sovetində “Aqrar islahat: problemlər və onların

həlli yolları" mövzusunda beynəlxalq konfransdakı çıxış bu sıradandır.

Çıxışın əvvəli "yolla bağlı" frazeologizmlərin auditoriyaya ayaq açması ilə başlayır. "Sahibkarlıq yolu", "bazar iqtisadiyyatı yolu", "demokratiya yolu" tipli frazeologizmlərlə beynəlxalq auditoriyaya müstəliq ölkənin gələcək inkişaf istiqamətlərini – yollarını açıqlayır: "Azərbaycan iqtisadiyyatının bütün sahələri, ümumiyyətlə, respublikanın bütün iqtisadiyyatı sərbəst iqtisadiyyat prinsipləri əsasında quruluraq, sahibkarlıq, bazar iqtisadiyyatı yolu ilə təşkil edilərək gələcək inkişaf yollarına düşməkdədir. Bununla əlaqədar son illər ölkəmizdə proseslər gedir, amma bu proseslər ağır, çətin gedir. Bunun obyektiv və subyektiv səbəbləri var. Lakin bütün bunlara baxmayaraq, Azərbaycan dövlətinin strateji yolu yalnız həmin yoldan ibarətdir. Bu yol demokratiya, sərbəst iqtisadiyyat prinsiplərinin bərqərar olması və bazar iqtisadiyyatı, sahibkarlıq yoludur" [XXc.s.582].

Analitik araşdırmalara söykənən, iqtisadi terminlərlə zəngin bu çıxışın ekspressivliyini artırmaq üçün frazeologizmlərdən yerindəcə məharətlə istifadə olunmuşdur. Aqrar sahədə baş verən dəyişiklikləri son bir əsrə yaxın zaman kəsiyində xronoloji olaraq diqqətə yönəldir. Sovet təsərrüfat sisteminə alışmış insanların yeni iqtisadi sistemə keçməsinin psixologiyasını insanlara çatdırır: "İndi aqrar sektorda işləyən, həmin sektoru idarə edən və onun ən aşağı pilləsində, yəni torpaqda işləyən adamların əksəriyyəti bu psixologiya ilə yaşayır, ona öyrəşmişdir və keçmişdə olan çətinlikləri, mənfi prosesləri, onların insan hüquqlarına, ümumiyyətlə, demokratik prinsiplərə nə qədər zidd olmasını unudub belə bir sistemə artıq alışmışdır. Odur ki, indi bu insanları həmin sistemdən ayırmaq, başqa sistemə yönəltmək böyük bir prosesdir, özü də mürək-

kəb prosedir və bəzən böyük müqavimətlərə, çətinliklərə rast gətirir” [IIc.s.584].

“Yapışıb qalmaq” frazeologizmi ilə süstlüyə, ətalətə işarə olunur, islahatların sürətini artırmaq tələb olunur: “Son illər Azərbaycanda iqtisadi istehsalın ilbəil aşağı düşməsi və iqtisadiyyatın getdikcə dağılması sübut edir ki, biz köhnəlmiş prinsiplər, köhnə sistem əsasında daha nailiyyət qazana bilmərik. Əgər bu prinsiplərdən möhkəm *yapışıb qalsaq*, yenə də böyük çətinliklərlə rastlaşacaq və şübhəsiz, iqtisadiyyatda, o cümlədən aqrar sahədə istehsal yenə də *aşağı düşəcəkdir*” [IIc.s.584].

İslahatlara keçmədən inkişafa nail ola bilməmək “heç dilə gətirmək” frazeologizmi ilə dinləyicilərin şüuruna çatdırılır: “Başqa məhsulların istehsalı da o qədər aşağı düşüb ki, onları *heç dilə gətirmək* istəmirəm” [IIc.s.585].

“Tam əminəm ki” ifadəsi ilə islahatların aparılacağı təqdirdə aqrar sektorda ixracatın dəfələrlə artırılması "qat-qat artırmaq" frazeologizmi ilə bəyan edilir: “Tam əminəm ki, əgər biz aqrar sektorda iqtisadi islahatlar aparıb istədiyimiz prinsipləri həyata keçiririksə, 70-80-ci illərin nailiyyətləri ilə müqayisədə daha yüksək səviyyəyə qalxıb, insanların sərbəst istehsal ilə məşğul olması sayəsində respublikanın kənd təsərrüfat məhsullarına tələbatını tamamilə ödəyə bilərik və aqrar sektorda əldə olunan məhsullar Azərbaycanın ixrac imkanlarını *qat-qat artıra* bilər” [IIc.s.585].

Aqrar islahatların aparılmasına həsr olunan müşavirənin sonluğu rəsmi-publisistik üslubda yekunlaşır. Bu yekun, bu sonluq “ciddi addımlar atmaq” frazeologizmi ilə özünəməxsus Heydər Əliyev üslubunu yaradır: “Güman edirəm ki, biz bundan sonrakı qısa müddətdə çox ciddi addımlar atacağıq. Mənim-prezidentin, Ali Sovetin təşəbbüsü ilə bu gün toplanmış konfrans da məhz bu məsələyə həsr olunmuşdur. Çox

məmnunam ki, bizim dəvətimizlə konfransa bir neçə ölkənin nümayəndələri də gəlmişlər” [IIc.s.588].

Frazeologizmlər Heydər Əliyevin nitqlərində cümlədaxili izahını tapa bilmir. Bunun üçün bütövlükdə çıxış, eləcə də çıxışın müəyyən hissəsini təşkil edən mətn tədqiqata cəlb olunmalıdır. “Xalqı dərin quyuya salmaq” və “xalqı uçuruma aparmaq” sinonim frazeologizmlərə qədər mətnin araşdırılması maraqdoğurandır. Azərneftyağ İstehsalat Birliyində avtomatik idarəetmə mərkəzinin kollektivi ilə görüşdəki çıxışda bu frazeologizmlərə qədər xalqın birliyinə xidmət edən “yol”la və “əl”lə bağlı frazeologizmlər nitqdə öz yerini alır: “Yolumuz hansı yoldur? Əlbəttə ki, yolumuz Azərbaycanın müstəqillyini qoruyub saxlamaq, Azərbaycanın ərazi bütövlüyünün, sərhədlərinin toxunulmazlığını təmin etmək, xalqımızı bu bəlalardan qurtarmaq, onun *rifahını yüksəltmək*, Azərbaycanda demokratik dövlət qurmaq, demokratiya prinsiplərini bərqərar etmək, Azərbaycan xalqının malik olduğu böyük təbii sərvətləri, böyük imkanları iqtisadiyyatımızın inkişafına və xalqımızın güzəranının yaxşılaşdırılmasına yönəltmək yoludur. Bu yol ilə hamımız birlikdə getməliyik. Hamımız əl-ələ verməli, hamımız bilməliyik ki, bizim başqa yolumuz yoxdur. Əminəm ki, Azərbaycan xalqının əksəriyyəti bu yolu bəyənir, bu yol ilə getməyə hazırdır, bu siyasətimizi dəstəkləyir və bizim bundan sonra da bu yol ilə getməyimiz üçün bizə arxa-dayaq olacaqdır [IIc.s.245].

“Yolumuz hansı yoldur” ritorik sualı ilə auditoriya səfərbər olunur, cavabı böyük natiqin dilində eşitməyə hazırlanır. “Əlbəttə ki” yekunlaşdırıcı modalla suala cavab verilir, həmin yol bircə-bircə təfərrüatı ilə açıqlanır. “Rifahı yüksəltmək” frazeologizmi ilə yeni bir frazeoloji ifadəni ümumişlək edir. “Əl-ələ vermək” frazeologizmi ilə xalqı bu yollarda, bu yolların real həyata keçirilməsində birliyə çağırır.

Xalqın bu yolları getməyinə isə "əminəm ki" ifadəsi ilə cavab verir. Növbəti nitq mərhələsində bu işıqlı gələcəyə aparan yollarda bu müqəddəs və vacib işə maneçilik törədənlərə təəssüf edir.

"Eşidirsən, bilirsən, duyursan" sinonim cərgənin köməyi ilə ictimai-siyasi vəziyyəti pozanlara "nə üçün", "nəyə görə" ritorik sualları yönəldir. Elə arxasınca da cavab ləngimədən verilir: "Yalnız və yalnız öz şəxsi məqsədlərini, öz çirkin niyyətlərini həyata keçirmək üçün".

Hadisələrə ümumfəlsəfi prizmadan yanaşan təfəkkür insanı Heydər Əliyev "bəli" təsdiq ədatı ilə cəmiyyətdə fikir plüralizmini – "bəli, aramızda beləlləri də var" – qəbul edir. "Biz insanlara azadlıq vermişik" deyən lider "azadlıq"ları təkrarlayaraq xüsusi bir ekspressivlik yaradır. Sonda "yox" inkar ədatı "istifadə olunmalıdır" feilin lazım şəkli ilə qətiyyətli nitq nümunəsi yaradır. Beləliklə, "xalqı dərin quyuya salmaq", "xalqı uçuruma aparmaq" frazeologizmləri ilə yaddaqalan, mətnin mənasına uyğun olan obrazlı, ecazkar nitq Azərneftyağ əməkdaşları timsalında çoxmilyonlu Azərbaycan xalqı auditoriyasına yönəlir: "Təəssüf ki, indi, Azərbaycanın bu ağır və çətin dövründə bizim bax, bu yolla getməyimizə mane olan qüvvələr də, bu işləri pozmağa can atan qüvvələr də var. Eşidəndə ki, bəziləri müharibənin qurtarmasını istəmir, bəziləri də onun davam etməsini istəyirlər, adam dəhşətə gəlir. *Eşidirsən, bilirsən, duyursan* ki, bəziləri respublikada yaranmış bu sabit ictimai-siyasi vəziyyəti pozmaq istəyir. *Nə üçün*? *Nəyə görə*? Yalnız və yalnız öz şəxsi məqsədlərini, öz çirkin niyyətlərini həyata keçirmək üçün.

*Bəli*, aramızda belələri də var. Biz insanlara azadlıq vermişik. Azərbaycan Respublikasının ərazisində *söz azadlığı, vicdan azadlığı, mətbuat azadlığı*, bir sözlə, bütün azadlıqlar bərqərar edilmişdir. Amma bu azadlıqlardan yalnız və yalnız

xalqın mənafeyi naminə istifadə olunmalıdır, xalqı daha *dərin quyuya salmaq* üçün yox. Xalqı bu bəladan qurtarmaq üçün istifadə etmək lazımdır, xalqı daha da *uçuruma aparmaq* üçün yox" [IIc.s.245].

Böyük natiq "daha", "daha da" qüvvətləndirici ədatları frazeologizmlərə qoşmaqla xüsusi nitq effekti yaradır. Burada frazeologizmin bir komponenti "azadlıq" hissəsinin təkrarlanmasının şahidi oluruq.

Publisistik üsluba uyğun frazeologizmlər əksər hallarda ümumişlək olub "olmaq"la sonuclanan frazeologizmlərdir. Dünya azərbaycanlılarını səfərbər etmək baxımından, onların qarşısında yaxın olmağı, bir-birlərinə kömək etməyi tələb kimi qoyur: "Ümidvaram ki, altı il bundan öncə təməli qoyulmuş bu bayram günü bütün dünya azərbaycanlıları tərəfindən ilbəil qeyd olunacaq və azərbaycanlıları bir-biri ilə qovuşdurmaq, bir-biri ilə əlaqələrini inkişaf etdirmək, bir-biri ilə *sıx olmaq* üçün daha da böyük fəaliyyətə dəvət edəcək" [XIVc.s.315]. Bir sıra məişət üslubu üçün xarakterik olan somatik frazeologizmlərdən "ayaq basmaq" publisistik üslubda da özünə yer tapır: "Mən keçən zamanlarda olduğu kimi bu dəfə də Türkiyə torpağına ayağımı basandan özümü qonaqpərvərlik və dostluq, mehribanlıq şəraitində hiss edirəm" [XIVc.s.254].

Başqa bir frazeologizm "zirvələrə qaldırmaq" da böyük natiqin publisistik üslublu çıxışlarında tez-tez təsadüf edir: "Bu quruluşun imkanlarından istifadə edən Azərbaycan xalqı elmini, təhsilini, mədəniyyətini yüksək zirvələrə qaldırmışdır" [Ic.s.367].

Somatik frazeologizm olan "əl çəkmək" də Heydər Əliyevin publisistik ruhlu çıxışlarında tez-tez təsadüf edir: "Onun ətrafında olan adamlara bir daha başa salsınlar ki, bu

qanunsuz hərəkətlərdən *əl çəkmək* lazımdır, xalqı parçalamasınlar" [Ic.s.94].

İstiqamət, mövqe, inkişaf mənasında "yol"la bağlı frazeologizmlər içərisində "yol verməmək" çıxışların ana xəttini təşkil edir. Xüsusilə, XX əsrin 90-cı illərində müstəqilliyin ilk dövründə bu frazeologizm publisistik və eləcə də digər üslublarda da çox işlənir: "Hamını əmin etmək istəyirəm ki, biz bu *yoldan çəkinməyəcəyik*, Azərbaycanın dövlətçiliyini, müstəqilliyini qoruyacağıq və respublikanın parçalanmasına *yol verməyəcəyik*" [Ic.s.106].

Məişət üslublu frazeologizmlər əsasən somatik frazeologizmlərdən ibarət olur. Belə ki, "ağız dolusu danışmaq", "dil boğaza qoymamaq", "əlini ağdan-qaraya vurmamaq" kimi frazeologizmlər müxtəlif mövzulu çıxışlarda səslənsə də əsasən, məişət üslubu xarakterindədir: "Ən dəhşətlisi bu idi ki, adamlar daha əlini *ağdan qaraya vurmur*, işləmirdilər" [I c s. 58].

Reallığa söykənməyən, populist çıxışlar edənlər üçün böyük natiqin dilində "ağız dolusu danışmaq" frazeologizmi mövcuddur: "Halbuki, özləri azadlıqdan, hürriyyətdən və haqq-ədalətdən dəm vurur, bunlardan *ağızdolusu danışırlar* axırı nə oldu – hamılıqla oğurluğa qurşandılar" [Ic.s.58].

Başqa bir loru leksika üçün xarakterik olan "dil boğaza qoymamaq" frazeologizminin də məişət xarakteri bəri başdan məlumdur: "Elə hey danışır, dil boğaza qoymurdular" [Ic.s.58].

Dini-publisistik ruhlu nitqlərdə "ürəklə", "qəlblə" bağlı frazeologizmlər işə düşür. Bu tip frazeologizmlər xalqa müraciət, xalqa söykənmək, xalqı səfərbər etmək anları üçün daha məqbul sayılır.

Elə "ürəklərə yol tapmaq" frazeologizmi buna misaldır: "Mənim bu gün televiziya ilə xalqa müraciətim ürəklərə yol

tapdı, insanlara təsir etdi, onları oyatdı və hamı başa düşdü ki, respublikamızın indi bir problemi var" [IIc.s.362].

Ulu Öndərin on illərlə ürəyində gəzdirdiyi arzuları dindarlar qarşısında "ürəkdə gəzdirmək" frazeologizmi ilə bəyan edilir: "Müqəddəs yerləri ziyarət etmək, özünü o yerlərlə bağlamaq mənim illərlə, on illərlə *ürəyimdə gəzdirdiyim* ən böyük arzum idi" [II c.s.82]. Müstəqillyin elə ilk günlərindən məscidlərin geniş şəkildə xalqın üzünə açılması, din ocaqlarının təmiri, bərpası kimi tədbirlərin ahənginə uyğun "dinə qayıtmaq" frazeologizmi səslənir: "Biz indi öz *dinimizə qayıtmışıq*" [IIIc.s.79].

Dini konfranslarda, dinlə bağlı tədbirlərdə Heydər Əliyevin dilində "yardım əli uzatmaq" frazeologizmi auditoriyalara yönəlir. Müsəlmanların bir-birinə yardım etməsi, kömək göstərməsi onlardan bir din qardaşları kimi tələb olunur: "Bunun naminə biz müsəlman ölkələrinin inkişafına mane olan əngəlləri aradan qaldırmalı, bir-birimizə *yardım əli uzatmalıyıq,* parçalanmanın və təklənmənin qarşısını almalıyıq, *dara düşmüş* qardaşlarımıza birlikdə kömək etməliyik" [IIIc.s.19]. "Yardım əli uzatmaq"la "dara düşmək" frazeologizmi arasında ardıcıllıq əlaqəsi özünü aydın göstərir.

Elə həmin dini üslublu çıxışlarda dinimizə olan sevgi bir çıxışda "ürəyimizdə gəzdirmək"dirsə, başqa bir çıxış məqamında "qoynumuzda saxlamaq"la – sinonim frazeologizm ilə əvəzlənir: "Amma bu hissləri biz *içimizdə yaşatmışıq*, *qoynumuzda saxlamışıq*, hətta ən ağır dövrlərdə öz dinimizə etiqad bəsləmişik" [IIIc.s.20].

Elmi üslublu çıxışlarda böyük natiqin ağla, təfəkkürə söykənən, eləcə də auditoriyanı düşündürən frazeologizmləri, yaddaqalan frazeologizmləri var ki, bu sıradan "boyalı nəticələr vermək" frazeologizmi maraqlıdır: "Biz heç vaxt belə fikirdə deyilik ki, ağır, çətin bir şəraitdə keçirilən bu ümum-

xalq tədbiri çox hamar keçəcək, çəhrayı rənglərlə *boyalı nəticələr verəcək* və hamısı tam müsbət olacaqdır" [Vc.s.11].

Həyat reallıqlarına söykənən siyasi liderin dilində hər şey dialektik qanunlara tabedir, burada populizmə yer yoxdur. Faktlara söykənən, ciddi araşdırmalar üzərində qurulan elmi üslub üçün "ələkdən-süzgəcdən keçirmək" frazeologizmi yerində səslənir: "Özünüz bir komissiya düzəldin, yığışın, müzakirə eyləyin, hər bir cümləni, sətri *ələkdən-süzgəcdən keçirin ki,* düzgün, ədalətli olsun" [VIc.s.49].

Dəqiqlik tələb edən elmi üslubda "havadan götürmək" kimi frazeologizmlər meydana çıxır: "Şübhə doğurursa, dəqiqləşdirin. O, bu rəqəmi *havadan götürməyib* ki, hə?" [VIIc.s.139].

Tariximizlə bağlı, xüsusən ölkənin və onun insanlarının keçmişi ilə əlaqədar tarixi həqiqətlərin gizlədilməsi, təhrif olunması, bilərəkdən saxtalaşdırılması, yaxud keçmişdə nail olduqlarımızın üstündən xətt çəkilməsi hallarında "tarixi qaralamaq" frazeologizmi ilə sanki yuxarıdakı hallara cavab verilir: "Amma olan həqiqətləri də unutmaq, qaralamaq olmaz. Yenə də deyirəm, *tarixi qaralamaq olmaz"*.

Tariximizlə bağlı başqa bir məqamda "adlarını tarixdən silmək" frazeologizmi dilə gəlir. Bu frazeologizmi işlətməklə heç kəsə tariximizi saxtalaşdırmağa imkan verilməyəcəyini göstərir: "Vətən müharibəsi qəhrəmanlarının *adlarını tarixdən silməyə* cəhd göstərən zaman, Qələbə gününü Azərbaycanda ləğv edən adamlar belə şəxslərə mənfi münasibət göstərən zamanda Ziya Bünyadov Sovet İttifaqı Qəhrəmanının Qızıl Ulduzunu döşündə həmişə iftixarla gəzdirirdi" [VIIIc.s.449].

Heydər Əliyevin dilində Azərbaycan elmi-fəlsəfi dünyagörüşünü əks etdirən frazeologizmlər də az deyil və bu frazeologizmlər yerli-yerində işlənir. Diqqət yetirsək "elmi fikirlər daşımaq" frazeologiyası özlüyündə elmi üslubdan

xəbər verir: "Onun bütün əsərləri şeir, poeziya, ədəbiyyat nümunələri olmaqla bərabər eyni zamanda böyük fəlsəfi ideyalar, elmi fikirlər daşıyır" [VIIIc.s.24].

Ədəbiyyatımızla bağlı Heydər Əliyevin dilində elmi üsluba yaxın poetik çalarlı nitqlər həmişə yer alır: "Ancaq Vaqifi geniş tanıtmaq, onu xalqa daha da yaxınlaşdırmaq, Vaqifin *şəxsiyyətini açmaq,* onun surətini xalqa göstərmək və Vaqifi xalqa doğma etmək – bunların hamısını Səməd Vurğun etdi" [IXc.s.18].

Yaxud elmi-bədii üslubda onun işlətdiyi "öz dövrünü yazmaq" frazeologizmi də "şəxsiyyəti açmaq" kimidir: "Şərqdə həmişə şeir böyük hörmətə layiq olubdur və hər bir şair öz dövrünün aşiqi olubdur, *öz dövrünü yazıbdır*" [IXc.s.20].

Bir qisim frazeologizmlər hüquqi dövlət quruculuğu yolunda rəsmi-publisistik üslubda səslənərək dövlət başçısının mövqeyini əks etdirir. "Düz yola gəlmək" frazeologizmi ilə insanları qanuna riayət etməyə çağırır: "Onun rəhbərliyi altında olan polislərin hər birinə müraciət edirəm: *düz yola gəlin*, ayılın, hələ gec deyildir" [IIc.s.342].

"Canlarını qurtara bilməmək" də bu sıradan olan frazeologizmlərdəndir: "Cinayətkarlar tapılacaq, cəzalandırılacaq və o qaçmış adamlar da Azərbaycan xalqının əlindən canlarını qurtara bilməyəcəklər" [IIc.s.281].

Bu sıradan ikinci komponenti "olmaq", "etmək" kimi səslənən ümumişləklik qazanmış frazeologizmlər arasında "özbaşınalıq etmək"də maraqdoğurandır: "Təəssüf ki, bəzi yerlərdə qanunlar pozulur, bəzi yerlərdə adamlar *özbaşınalıq edirlər*, bəzi yerlərdə də vəzifəli şəxslər öz mövqelərindən şəxsi mənafeləri naminə sui-istifadə edirlər" [IIc.s.120].

Bəzən loru leksikaya məxsus məişət üslublu frazeologizmlər dilə gəlir: "Ona görə də biz deyə bilmərik ki, azərbay-

canlıların hamısı burada *quzudurlar*, heç bir şey etmirlər, yəni qeyri-qanuni heç bir hərəkətə yol vermirlər" [IXc.s.76].

Ağsaqqal öyüdünü xatırladan məişət üslublu nitqlərdəki frazeologizmlər əksər təsadüflərdə gənclərə yönəlir: "Ona görə də siz *ağlınızı başınıza yığın*, cavan adamlarsınız, öz işinizlə məşğul olun" [XIIc.s.97].

Rəsmi-publisistik çıxışlarda belə idiomlardan müvəffəqiyyətlə istifadə olunur: "azərbaycanda bir söz var – "hələ yumurtasından çıxmamış bir cücə kimi" bəyanatlar verirlər ki, Azərbaycan unitar dövlətdir, burada muxtariyyət ola bilməz, bu muxtariyyəti ləğv etmək lazımdır" [XXIIc.s.249].

Beləliklə, Heydər Əliyevin təküslubluğa sığmayan nitqi müxtəlif üslublarda frazeologizmlərin işlənməsində də özünü göstərir;

– Heydər Əliyevin elmi üslublu çıxışlarında elmi terminologiyadan geniş istifadə olunur ki, bu sonda çıxışın məzmununu özündə əks etdirən frazeologizmlərlə yekunlaşmaya gətirib çıxarır;

– Dini üslublu çıxışlarda dini-etik və dini-estetiklik yaradan, çıxışların semantik gücünü yüksəldən frazeologizmlər öz yerini tapır;

– Üslublarla Heydər Əliyevin dlində işlədilən frazeologizmlər arasındakı harmonik əlaqə həmişə gözlənilir;

– Çıxışların məna yükünü azaltmadan eyni bir frazeologizm müxtəlif üslublu çıxışlarda işlənə bilir;

– Frazeologizmlərin adətən az işləndiyi rəsmi-publisistik üslubda belə Heydər Əliyevin dilində bu dil vahidləri kifayət qədər özünə yer alır;

– Heydər Əliyevin bütün çıxışlarında frazeologizmlər digər nitq elementləri ilə dərin, daxili dialektik vəhdət halında verilir;

– Məişət üslublu çıxışlarda frazeologizmlər Heydər Əliyevin dilində əsasən somatik xarakterdə olur;

– Bir qisim frazeologizmlərə gəldikdə isə onlar konkret üslublara aiddir;

– Dini üslublu çıxışlarda xəlqiliyə söykənən, dini inanclarla bağlı frazeologizmlər Heydər Əliyevin dilində özünə möhkəm yer alır;

– Dini-publisistik ruhlu nitqlərdə "ürəklə", "qəlblə" bağlı frazeologizmlər işə düşür ki, bu tip frazeologizmlər xalqa müraciət, xalqa söykənmək, xalqı səfərbər etmək anları üçün daha məqbul sayılır;

– Elmi-fəlsəfi üslublu çıxışlarda "böhran", "obyektiv", "subyektiv", "fantaziyaya uymaq", "ümumiyyətlə" kimi fəlsəfi terminlər əsasında yaranan frazeologizmlərə xüsusi yer ayrılır.

# VI FƏSİL
# HEYDƏR ƏLİYEV NİTQİNDƏ FEİLİN LÜĞƏVİ NÖVLƏRİ ƏSASINDA FRAZEOLOGİZMLƏR

Bütün xalqların dilində frazeologizmlər müxtəlif ictimai-tarixi şəraitdə və çox müxtəlif səbəbələr əsasında əmələ gəlmişdir. Bu dilin frazeologizmlərinin əsas mənbələri səma kitabları, bədii ədəbiyyat, mifik rəvayərlər və əfsanələrdir [20, 40]. Kamal Abdullayev [8] təsadüfən qeyd etmir ki, dillər müxtəlif olsa da xalqların təfəkkür tərzi əsasən eynidir. Bir sıra frazeoloji birləşmələr insanların hisslərini ifadə edirlər. İzahlı dilçilik lüğətində insanın keçirdiyi hiss-həyacanla bağlı ifadələr emosional-ekspressiv leksikada izah edilir [14, 40, 155]. Emosional-ekspressiv frazeoloji birləşmələr bir neçə elementdən ibarət olub, bütöv bir məna ifadə edən və sözə bərabər ifadələrdir. Bu birləşmələrin tərkibindəki sözlər öz müstəqil mənasını itirərək tam məcaziləşmə yolu ilə mənaca yeni ifadələr əmələ gətirir [40].

Bu da onu göstərir ki, frazeoloji birləşmələr bu və ya digər anlayışı ayrı-ayrı sözlərdən dəfələrlə təsirli və obrazlı əks etdirirlər. Bu birləşmələr yazıçı fikrinin tutumunu böyüdür, bədii əsərin emosionallığının, üslubi kefiyyətlərinin zənginləşməsinə xidmət edir. Başqa sözlə, ekspressiv-emosional frazeologizmlər bu və ya başqa obrazın danışığını fərdiləşdirmək və s. üçün əsas vasitələrdən birinə çevrilmişlər [40, 194, 270, 271, 308].

Feili frazeoloji birləşmələr onları təşkil edən sözlərin mənaca qovuşma dərəcəsinə və digər xüsusiyyətlərinə görə də çox rəngarəngdir. İnsanların bir-birinə və ətraf mühitə münasibəti ünsiyyəti haqqında olan feili frazeoloji birləşmələr sırasına hiss, həyəcan, emosional vəziyyətlə əlaqədar olan feili frazeoloji birləşmələri aid etmək olar. Məs: Həyəcandan alışıb yanmaq; Baş çıxarmamaq; Təsir altına düşmək və s. [134]

Struktur-semantik baxımdan frazeologizmlər təsnif edilərkən onların adlandırma (nominativlik) və hərəkət məzmunu ifadə etmə (kommunikativlik) xüsusiyyətləri əsas götürülür. Yəni, dildə bəzi frazeologizmlər vardır ki, bu və ya digər obyekt haqqında daha geniş təsəvvür yaratmaq üçün onları obrazlı şəkildə adlandırır, həmin obyektlər barədə müəyyən məlumatları da özündə əks etdirir. Bu tipli frazeologizmlər həm ingilis, həm də Azərbaycan dillərində nominativ frazeologizmlər adlandırıla bilər. Burada komponentlərin aparıcı məna yükünü özündə əks etdirən sözlər, adlardır [35].

Struktur – semantik baxımdan frazeologizmlərin ikinci tipi kommunikativ və ya feili frazeologizimlər hesab edilir ki, bu tipli frazeologizmlər dildə daha fəal işləkliyə malik olmaqla aparıcı məna yükü frazeologizmin strukturunda xüsusi mövqeyə malik olan feilin üzərinə düşür və ona görə də çox vaxt hərəkət məzmunu daşıyır və predikativ keyfiyyəti ilə seçilir. Onlar həm də kommunikativ prosesdə daha fəal olması ilə diqqəti cəlb edir. Ona görə də bu tipli frazeologizmlər dildə daha fəal işləkliyə malik olur [33].

“Tərkibində fellərin iştirak etdiyi frazeoloji vahidlərin isə nitqdə aktuallaşarkən mütəhərrikliyi ismi frazeoloji vahidlərdən qat-qat güclü olur” [28].

Bu həm də feillərin semantik zənginliyi ilə bilavasitə bağlıdır. Belə ki, məcazlaşma, semantik rəngarənglik və digər xüsusiyyətlər feillərdə daha çox müşahidə edilən xüsusiyyətlərdəndir. Məhz bu cəhəti nəzərə alaraq ingilis dili frazeologiyasının tədqiqatçıları qeyd edirlər ki, “Feili frazeoloji birləşmələr bütövlükdə və qismən məcazlaşaraq motivləşən və ya motivləşməyən feili tərkiblərdən ibarət ola bilir” [35, 202, 203].

Kommunikativ və ya feili frazeologizmlərin bu xüsusiyyətinə görə də onlar həm ingilis, həm də Azərbaycan dilində

ən işlək və fəal frazeologizmlər hesab edilir və dildəki frazeologizmlərin daha çox hissəsini özündə ehtiva edir [35].

Düşünsək ki, feili frazeologizmlər Heydər Əliyevin nitqlərində geniş yayılmışdır, bu baxımdan feilin müxtəlif lüğəvi mənaları ilə qurulmuş frazeologizmlərə ekskurs etmək maraqlı olardı. Təfəkkür sahibi, fəlsəfi təfəkkürə söykənən dövlət xadimi, böyük natiq Heydər Əliyevin nitqlərində təfəkkür və nitq feilləri əsasında formalaşmış frazeologizmlər geniş yayılmışdır.

Frazeologiyanın tədqiqat obyektinin çoxsaylı adlara malik olması bu sahədə hələ də problemlərin olduğunu göstərir. Bu sıraya: sabit söz birləşmələri, idiomlar, frazeoloji birləşmə, frazeoloji vahid, frazeoloji qrup, frazeoloji tərkib, frazeologizm, frazem, frazeoloji ifadələr, tərkib hissələrinə bölünməyən söz birləşmələri, dəyişməz söz birləşmələri, idiomatik ifadələr, leksik söz birləşmələri və s. aiddir ki, elə mövzunun aktuallığı da buradan qaynaqlanır.

Frazeologizmin sərhədi müəyyənləşdirilməmiş, onların dildəki funksiyası və yeri aydınlaşdırılmamış, frazeologiyanın bir sıra əsas problemləri (frazeoloji vahid və mürəkkəb termin, feili frazeoloji birləşmələr və mürəkkəb feillər, frazeoloji vahidlər və atalar sözləri) dilçilikdə bu gün də mübahisəli şəkildə qalmaqdadır.

Xalqın taleyüklü, emosiya doğuran psixoloji məqamlar üçün böyük natiqin dilində hazır frazeologizmlər işlənir: "Mənim bu gün televiziya ilə xalqa müraciətim *ürəklərə yol tapdı*, insanlara təsir etdi, onları oyatdı və hamı başa düşdü ki, respublikamızın indi bir problemi var" [IIc.s.362] "Bu bizim ağrımızdır, *ürəyimizdə olan yaradır*" [Vc.s.43]. "Mən *ürək ağrısı* ilə deyirəm ki, bəzən gənclər bu silahlı dəstələrə, bu cinayətkar qruplara nə üçün getdiklərini bilməyərək özlərini bədbəxt etdilər" [VIIIc.s.391]. "Ürəklərə yol tapmaq", "ürək ağrısı", "ürəkdə yara" kimi hissi-emosional frazeologizmlər li-

deri xalqa yaxınlaşdırır, xalq – lider dialektik vəhdətini ortaya qoyur.

S. Cəfərova görə qrammatik birləşmənin özü və ya onun tərkibində olan sözlər məcazi mənaya keçərək mütəhərrikliyini itirdikdə, sözlər arasında əlaqə və münasibət yaradan vasitələr donuq bir hala gəlir və o vahid bir məfhumu ifadə edən sabit söz birləməsinə çevrilir [53, 55, 91].

Sözün qiymətini bilən, sözlə işin vəhdətini öz həyatında həmişə ciddi şəkildə gözləyən siyasi lider üçün nitq feillərinin işlənməsi təbiidir. Nitqlə bağlı frazeologizmlər içərisində ictimai-siyasi dövrün gərgin olduğu 90-cı illərdə tez-tez istifadə olunanı "boş-boş sözlər danışmaq"dır: "Ancaq burada tamamilə doğru deyildi ki, baş nazir gündə üç dəfə müşavirə yığanda, orda *boş-boş sözlər danışanda*, axmaq işlərlə məşğul olarkən onun yanında oturan müavinlər ya *ağızlarına su alırdılar*, ya da ki, "baş üstə, baş üstə" deyirdilər" [IIc.s.385].

Sözlə bağlı frazeologizmlər müxtəlif üslublarda, fərqli ictimai-siyasi çıxışlarda özünü göstərir. "Yağlı-yağlı söz verib" iş görməyənlər, dövlətin əmlakına *göz dikənlər* sonda layiqli cəzalarını alırlar: "Kənd təsərrüfatı naziri indi həbsxanadadır. Ona dəfələrlə xəbərdarlıq olunmuşdur ki, sən bu *pis yoldan çəkin, düz işlə*. Hər dəfə durub burada *yağlı-yağlı sözlər verdi*, amma iş də görmədi" [IIc.s.386].

Nitqlə bağlı başqa bir məqamda "səs qaldırmaq" frazeologizmi özünə yer alır: "Harada sən öz *səsini qaldırdın*, harada dedin ki, belə şey yaramaz?" [IIc.s.387].

Nitqlə, səslə bağlı frazeologizmlər müxtəlif üslublarda özünə yer alır. Heydər Əliyev Türkiyə Cumhuriyyətinin prezidentinin iqamətgahı "Çankaya" köşkündə rəsmi qarşılanma mərasimində "səsi gur gəlmək" frazeologizmini işə salır: "Bu dövrdə Azərbaycan torpaqlarının bir qismi erməni silahlı qüvvələri tərəfindən işğal olunmuşdur. Bunun bəzi subyektiv və obyektiv cəhətləri vardır. Ancaq Azərbaycan xalqı yaxşı

bilir ki, bütün bu illərdə Azərbaycanı müdafiə etmək üçün Türkiyənin *səsi çox gur gəlib*” [Ic.s.360].

Başqa bir məqamda “söz deməyin” sinonimi kimi “səs qaldırmaq” Heydər Əliyevin dilində auditoriyaya ünvanlanır: "Təəssüf ki, xalqın öndə gedən adamları, vəzifədə olanları onun şərəfini, namusunu, mənliyini tapdaladıqları halda, xalq bu dörd ildə buna dözmüşdür. Lakin mən dözə bilmirəm. Bir vətəndaş kimi, mən bu dörd il müddətində bu barədə dəfələrlə *səsimi qaldırmışam*. O vaxtlar mənim səsimə fikir vermədilır. Amma indi imkanım var. Hesab edirəm ki, yanvarın 20-dək televiziya və radiomuzda, mətbuat orqanlarında 20 Yanvar faciəsinin səbəbləri, onun günahkarları haqqında və bu faciəni ört-basdır edənlər haqqında, indi ayrı-ayrı yerlərdə cinayət törədib Azərbaycana qarşı təxribat hazırlayanlar haqqında məlumat verilməli, fikirlər söylənməli, söhbətlər aparılmalıdır və xalq öz sözünü deməlidir” [Ic.s.330-331].

Yuxarıdakı mətndə iki yerdə səslə bağlı “dəfələrlə səsimi qaldırmışam”, “səsimə fikir vermədilər” frazeologizmləri “söz demək” ifadəsi ilə çulğalaşır. Burada da son illər arxaikləşmə təhlükəsinə məruz qalan “səs qaldırmaq” ifadəsini gündəmə gətirir. Xalqın milli ruhunu əks etdirən ifadələrə yaşamaq hüququ verilir.

Tərkibində feillərin iştirak etdiyi frazeoloji vahidlərin isə nitqdə aktuallaşarkən mütəhərrikliyi ismi frazeoloji vahidlərdən qat-qat güclü olur. Çünki burada bir tərəfdən, vahidin başqa nitq hissələrindən ibarət komponentlərinin dəyişmələri ilə yanaşı feil komponentlərin şəkil və formaca, zamana, şəxsə, kəmiyyətə görə bitkinlik, qeyri-bitkinlik və. s. dəyişmələri müşahidə edilir. Morfoloji növlərə görə işlədilməsi və bütövlükdə frazeologizmlərin aktuallaşmasında əsas rollardan birini oynayır. Azərbaycan dilində feillərin aşağıdakı lüğəvi məna qrupları vardır: 1) hərəkət feilləri 2) iş feilləri 3) hal-

vəziyyət feilləri 4) nitq feilləri 5) təfəkkür, görmə, eşitmə prosesləri ilə bağlı feillər [82].

Sözlə bağlı frazeologizmləri nitq feillərindən əmələ gələn frazeologizmlərə aid etmək normal görünür: “Amma mənim dediyim *sözləri əyməyəsiniz*, onları başqa formaya salmayasınız” [XLc.s.114-115]. “Bütün zal məni *hoydu-hoyduya basdı* və axşam iclasına da rəhmətlik Bayram Bayramovu hazırladılar, o da gəlib çıxış etdi” [XLc.s.117]. “Mən iqtidarın nümayəndəsi kimi – mən prezidentəm – hər bir jurnalistə çox minnətdar olacağam ki, iqtidara, prezident kimi, mənə bəlli olmayan hansısa səhvi, yəni haradasa pis görülən işi, bizə zərər verən halları siz *üzə çıxardasınız* və biz də bundan istifadə edib o nöqsanların, səhvlərin aradan qaldırılması ilə məşğul olaq” [XLc.s.138].

Müəlliflər [82] “Müxtəlif sistemli dillərdə feilin semantik təsnifatı” adlı monoqrafiyada feilin məna qruplarını ayırır: 1) iş feilləri 2) hərəkət feilləri 3) vəziyyət feilləri 4) təbiət hadisələrini bildirən feillər 5) psixi-fəaliyyət bildirən feillər (nitq, hissi-qavrayış, təfəkkür, idrak feilləri) 6) arzu bildirən feillər 7) duyğu (hissi) feilləri 8) emosional vəziyyət 9) emosional təəssürat feilləri 10) emosional münasibət bildirən feillər 11) səslənmə bildirən feillər

Leksikologiyada leksik mənalarına görə birləşən, semasiologiyada isə sözlərin mənaları arasında əlaqələrə görə birləşən söz qrupları “leksik-semantik” söz qrupu termini ilə adlandırılır. Sözlərin leksik-semantik qrupları semasiologiyanın obyekti olmaqla bərabər həm də leksikologiyaya daxildir. Hər iki şöbənin obyekti leksik vahidlərdir [68].

A.M.Qurbanovun [129] qeyd etdiyi kimi leksikologiya dilin leksik sistemini, semasiologiya isə dildə söz və ifadənin mənası, mənanın dəyişməsi məsələlərini tədqiq edir. Sözlərin leksik-semantik qrupu leksikologiyada əşyaların, proses və hadisələrin əlaqələrinə, semasiologiyada isə sözlərin məna

əlaqələrinə söykənir. Birinci halda leksik-semantik qrup çoxlu miqdarda sözü, ikinci halda isə tərkibcə məhdud sözlər qrupunu əhatə edir.

Feillərin semantik təsnifatı əslində dil əlamətlərinə əsaslanır. Feillərin semantik təsnifatı konkret isimlərin təsnifatından onunla fərqlənir ki, bu və ya digər qrupa daxil olan feillər dil əlaqələrinə malik olur. Onlarda ümumi sintaktik göstəricilər daha çoxdur, özü də məhz dil göstəriciləridir. Buna görə də linqivistik tədqiqatlarda onlar leksik-semantik qruplar adlandırılır. Nitq və təfəkkür münasibətləri bir vəhdət təşkil etsə də, əslində burada iki fəlsəfi-linqivistik kateqoriyadan söhbət gedir. Onların birləşdirilməsi və ya ayrı götürülməsi sonrakı məsələdir. Əgər biz bu feilləri bir yerdə götürmüş olsaq, bu, sonrakı vəhdəti əks etdirəcəkdir, vəhdət isə hansısa komponentlərin məcmusudur. Deməli, bu vəhdəti "xırdalamaq, parçalamaq", üzvləndirmək mümkün olacaqdır. Bunu nəzərə alıb nitq-təfəkkür vəhdətinin atributlarını ayrılıqda öyrənməyi münasib sayırıq. Çünki onlardan hər birinin özünəməxsus spesifik leksik-semantik incəlikləri ola bilər. Məsələn, nitq, təfəkkür, hərəkət, iş feillərinin özünün ayrıca kateqorial leksik seması məlumdur. Nitq feillərinin kateqorial leksik seması "danışmaq", "nitqdən istifadə etmək"dir. Burada "danışmaq" feili özünün əsas mənasında bütövlükdə nitq feilləri leksik-semantik qrupunun baza identifikatorudur. Bu əlamətdən çıxış etdikdə deyə bilərik ki, "fikirləşmək" feili təfəkkür feilləri leksik-semantik qrupunun baza identifikatorudur və bu qrupun kateqorial leksik seması "fikirləşmək", "təfəkkürdən bəhrələnmək"dir. Ümumiyyətlə, bu leksik-semantik qrupa aid feillərin iki mənası vardır. "Stativ məna" – insan beynində mümkün ola bilən fakt haqqında təsəvvürün olmasını göstərir və "aktiv məna" – mümkün olan faktla əlaqədar məqsədyönlü təfəkkür prosesini göstərir. Məlum olur ki, təfəkkür feillərinə fikirləşmə prosesini həyata keçirmək

kimi ümumi manifestiyalı feillərlə yanaşı təfəkkür-düşüncə aktı mənasında işlənən və öz növbəsində "təsəvvür etmək", "zənn etmək", "qət etmək", "inanmaq", "başa düşmək", "düşünmək", "arzulamaq", "səhv etmək" nüvə mənalarına malik feil qruplarına bölünən başqa feillər də aid edilir. Bu xüsusiyyətlərinə görə, təfəkkür feillərinin semantik əhatə dairəsi nitq feillərinin əhatə dairəsindən daha genişdir. Bunu nəzərə alan tədqiqatçılar bizə məlum olan elmi araşdırmalarında nitq və təfəkkür feillərini bir-birindən fərqləndirmək, onların hərəsini ayrıca leksik-semantik qrup kimi müəyyənləşdirmişlər.

Gələcəyi nəzərə almadan tətbiq etmək, düşünülməmiş hərəkət etmək kimi anlaşılan "kor-koranə tətbiq etmək" təfəkkür feili frazeologizmi böyük natiqin dilində özünəməxsus yer alır: "Aydındır, inkişaf etmiş ölkələrdə, böyük imkanlara malik ölkələrdəki – hansılar ki, burada dedilər – qaydaların hamısını bizdə *kor-koranə tətbiq etmək* olmaz" [XXXVc.s.46].

Faktlara, rəqəmlərə, mühakiməyə əsaslanmaq mənasında işlənən "kor-koranə getməmək" frazeologizmi təfəkkür qrupuna aid olan, Heydər Əliyev dilində çox işlənən frazeologizmlərdən biridir: "Mən hesab edirəm ki, həm Azərbaycan dövləti, həm də dünyanın bizimlə əməkdaşlıq edən böyük neft şirkətləri bu yolu *kor-koranə getməmişlər*" [XXVc.s.292].

Əsaslandırılmamış şəkildə, elmi-nəzəri biliklərə əsaslanmadan tətbiq etmək anlamında olan "kor-koranə tətbiq etmək" frazeologizmi də təfəkkür feili frazeologizminə aiddir: "Ancaq dünya təcrübəsini də götürüb *kor-koranə tətbiq etmək*, inanin ki, istənilən nəticəni verməz" [Ic.s.168].

Bütün nitq və təfəkkür feilləri dilin frazeoloji vahidlərinin formalaşmasında iştirak edir və bu zaman ikili dil hadisəsi baş verir. Bir tərəfdən, danışıq və təfəkkür feillərinin ekvivalenti olan feili frazeologizmlərin yaranmasına kömək edir. Digər tərəfdən, nitq və ya təfəkkür semasına aid olmayan başqa

feillər frazeoloji vahidin tərkibində işlənməklə nitq və təfəkkür qrupunu zənginləşdirən yeni feili frazeologizmlərin formalaşmasında iştirak edir. Nitq və təfəkkür feillərinin cəmləşdiyi leksik-semantik qruplar aşağıdakı 3 istiqamətdə zənginləşir:

1) Başqa qruplara mənsub feillər leksik-semantik modifikasiya olunur və bu qruplardan birinə daxil olur;

2) Nitq və təfəkkür feilləri frazeoloji sistem vasitəsi ilə öz leksik semantik qruplarını zənginləşdirir;

3) Başqa qruplara mənsub olan frazeologiya vasitəsilə nitq və təfəkkür feillərinin ekvivalentlərinin yaranmasına və bu iki leksik-semantik qrupun zənginləşməsinə kömək edir.

Siyasi-fəlsəfi təfəkkür sahibi Heydər Əliyevin dilində təfəkkür feilləri ilə bağlı frazeologizmlər mühüm yer tutur. Sonda ağlın, təfəkkürün qalib gələcəyini bilən lider münaqişə və müharibəyə sürüklənən erməni xalqına çağırış edir: "Fürsətdən istifadə edərək, erməni xalqına, Azərbaycan vətəndaşları olan Dağlıq Qarabağın erməni sakinlərinə *üz tutur*, onları *ağıl-kamala çağırıram*, çünki bu çoxillik müharibə heç nə verməmişdir" [Ic.s.349].

Ruhlandırmaq, gələcəyə ümid vermək, mənəvi cəhətdən kömək etmək anlamında olan "ürək-dirək vermək" frazeologizmi ilə Heydər Əliyev xalq ruhunu nitqinə gətirir, nitqi cazibədar edir: "Bu adamlar məni axtarıb tapır, mənə *ürək-dirək verir*, *gözdən salınmış* xadimlə ünsiyyət üzərində özlərinin də rüsvay ediləcəyindən qorxmurdular. Bu adamın qəlbini riqqətə gətirir və unudulmazdır" [Ic.s.48].

Məlumdur ki, "şaquli konfekst" müvafiq obraz, personaj və ya predsedent onim şəklində təzahür olunarkən müəyyən emosiya daşıyan semanın ifadəsinə xidmət edə bilir. Predsedent onim yəni, predsedent ad deyildikdə (bura predsedent antroponim, toponim və s. daxildir) bu və ya digər cəmiyyətə xas olan xüsusi növ linqvometaforik kodlaşma nəzərdə tutu-

lur. Yəni, həmin ad özlüyündə müəyyən informasiya tutumuna malik olur, müəyyən allyuzial fona işarə edir [10].

Ölkə həyatında kütlələrin həyəcana gəldiyi hallarda Heydər Əliyevin dilində həmin vəziyyətləri təsvir edəcək frazeologizmlər mövcuddur. 24 avqust 1993-cü ildə Bakıda keçirilmiş Ümumrespublika müşavirəsindəki çıxışda qondarma "Talış-Muğan Respublikası" ilə bağlı əhali arasında yaranmış əhval-ruhiyyəyə uyğun "çaş-baş qalmaq" frazeologizmi özünə yer alır: "Həm Milli Məclisdə, həm də avqust ayının 13-də keçirdiyimiz müşavirədə bəzi iradlar tutublar ki, Azərbaycan Respublikası rəhbərinin, dövlət orqanlarının mövqeyi məlum olmadığına görə, xalq da *çaş-baş qalmışdır.* Bəli, bu iradlar müəyyən qədər günahımızdır. Biz günahımızı boynumuza almağa hazırıq. Ancaq mən sizə proseslərin gedişini, mərhələlərini izah edərkən, yəqin ki, siz və bizi eşidənlərin hamısı bu günahlarımızın o qədər də böyük olmadığını dərk edərlər" [Ic.s.105].

Öz şəxsi maraqlarını əyri yollarla təmin edə bilməyənlərin ölkədə aparılan islahatlara, stabilliyə sevinə bilməməsi xəlqiliklə səslənən "yasa batmaq" frazeologizmini meydana gətirir. Bu yasa batmağın nədən ibarət olmasını öz nitqində xalqa anladır: "Amma qulağıma müəyyən səslər gəlir ki, dünənə qədər hakimiyyətdə olan, hakimiyyəti saxlaya bilməyib qaçıb gedənlər orda-burda gizlənib, Azərbaycanın son uğurlarından *yasa batıblar*, cürbəcür təxribatlar hazırlayırlar. Ancaq biz bunlara yol verməyəcəyik" [Ic.s.325].

Hissiyyatlarla bağlı bir sıra frazeologizmləri kütlələr necə deyərlər, ilk dəfə Heydər Əliyevin dilindən eşidirlər. Bu frazeologizmlər sonralar ümumişləklik qazanmağa başlayır: "Əvvəla, təşəkkür edirəm ki, siz iki il bundan öncə gördüklərinizi indi müqayisə edərək, ədalətli olaraq Azərbaycanda bu barədə öz sözlərinizi dediniz. Təşəkkür edirəm. Ona görə ki, bəzən düzgün qiymətləndirə bilmirlər. İkincisi, öz ölkəmizin

daxilində elə adamlar var ki, onlar müxalifətdə olduqlarına görə Azərbaycanda baş verən hər şeyi *qara eynəklə görürlər* və hər bir şeyi də pis qiymətləndirirlər" [VIIIc.s.144].

Hiss-həyəcan bildirən frazeologizmlər bəzən bir-iki cümlədə sinonimləşərək auditoriyalara ayaq açır. Belə ki, "iradəsini sındırmaq", "əyilmək", "baş əyməmək" kimi – qürurunu, məğrurluğunu saxlamaq mənasında işlənir. "Acı söz demək" frazeologizmi Heydər Əliyevin dilində öz dərindən-dərinə izahını tapır. Acı sözün arxasında nələrin dayandığını auditoriya siyasi natiqin öz dilindən eşidir: "Amma bunların heç birisi Ziya Bünyadovun *iradəsini sındırmayıbdır*. O, heç vaxt əyilmədi, heç vaxt sınmadı, heş vaxt heç kəsə *baş əymədi*. Ona görə də Ziya Bünyadovu çoxları sevirdi, mən də sevirdim, ona xüsusi hörmət edirdim. Bəzən o, kiməsə *acı söz deyə bilərdi*, lakin onu anlamaq lazım idi ki, o acı sözün içində xeyirxah münasibət vardı, onun arxasında vətəndaşlıq vardı, onun arxasında Azərbaycan xalqına sevgi, məhəbbət vardı, onun arxasında böyük insan dururdu" [VIIIc.s.456].

"Danışmaq" feilinin məcazi mənada, öz xidmətini şişirtmək mənasında olan "meydanda qışqırmaq" frazeologizmi Heydər Əliyevin dilində təvazökarlıqdan uzaq dayanan insanlara yönəlir: "Bilirsniz, heç kəs deyə bilməz ki, mənim filan vaxt filan xidmətim olubdur, filan vaxt *meydanda* bir az çox *qışqırmışam*, yaxud da az qışqırmışam, mənim qanunu pozmağa ixtiyarım var. Yox, artıq bizdə hüquqi dövlət yaranıbdır. Artıq bizim çox dəyərli Konstitusiyamız var, çox dəyərli qanunlarımız var, bizim çox dəyərli parlamentimiz və çox dəyərli strukturlarımız var. Ona görə də kiminsə qanunu pozmasına yol vermək olmaz. Bilmək lazımdır ki, buna *yol verməyəcəyik*" [XIIIc.s.278].

"Bilirsiniz" fəlsəfi çalarlı feili modal sözlə auditoriyanı dinləməyə səfərbər edən natiq "yox" inkar ədatı ilə ciddi dövlətçilik prinsipini ortaya qoyur, "çox dəyərli" ifadəsinin tək-

rarı ilə nitqinə ekspressivlik qazandırıb "qışqıranlara" qəti gələcək zamanda səslənən "buna yol verməyəcəyik" ifadəsi ilə cavab verir.

Təfəkkür feilləri ilə bağlı Heydər Əliyevin işlətdiyi frazeologizmlərdə nitqə, nitq prosesinə münasibət aydınca görünür. "Azərbaycanın xalq artisti Tofiq Quliyevin 80 illiyinə həsr edilmiş yubiley gecəsindəki çıxışda "beynimdən gələn söz" frazeologizmini dilinə gətirir, bu frazeologizmin "əlimdə kağız olmayıb" sinonimini auditoriyaya açıqlayır.

"Əziz Tofiq! Mən sənin 80 illik yubileyin münasibətilə sənə təbrik məktubu göndərmişəm. Onu da bil ki, mən göndərdiyim və ümumiyyətlə, yazdığım məktubların hamısını əvvəldən axıradək özüm yazıram. Siz də, hamınız da bilirsiniz ki, mənim dediyim sözlərin də hamısı öz *beynimdən gələn sözlərdir,* heç vaxt *əlimdə kağız olmayıbdır"* [XIIIc.s.214].

"Unutmaq" – hissi feili əsasında qurulmuş "hər şeyi unutmaq" frazeologizmi siyasi lider dilində təəccüblə səslənsə də bu unutmanın uşaqlarla, Azərbaycan xalqının gələcəyi ilə bağlı olduğunu düşünəndə auditoriya gözəl bir frazeologizmlə qarşılaşdığını anlayır: "Bizi bu həyatda ən çox sevindirən sizsiniz. Həyatımızda nə qədər çətin dəqiqələr, çətin günlər olsa da sizi – uşaqları görərkən insan hər bir çətinliyi unudur. Şəxsən mən öz haqqımda deyirəm. Mənim işim ağırdır. Çox işləyirəm. Həyatımın hamısı işə sərf olunubdur. Bəzən çox ağır hadisələrlə üzləşirəm. Amma uşaqlara baxanda, öz övladlarıma, öz nəvələrimə baxanda, sizlərə baxanda *hər şeyi unuduram*" [XIIIc.s.395].

Hissi feili frazeologizmlər də Heydər Əliyevin müxtəlif üslublu çıxışlarında öz yerini tapır. Bu feili frazeologizmlər ciddi rəsmi görüşlərdə "hissiyyat" konseptini həmişə əldə rəhbər tutan lider dilində səslənir. "Hüsn-rəğbət oyatmaq" hissi feili frazeologizm Bakıda, ABŞ səfirliyində "Amerika Birləşmiş Ştatlarının İstiqlaliyyət gününün 219-cu ildönümü

münasibətilə təşkil edilmiş bayram mərasimində Amerika dövlətinə, onun prezidentinə ünvanlanır: "Biz gənc, müstəqil dövlətik. Ancaq müstəqilliyimizin möhkəmlənməsi və inkişaf etməsi üçün çox böyük dəstək və köməyə ehtiyacımız var. Respublikamızın ərazi bütövlüyü pozulub. Bir milyondan artıq vətəndaşımız öz evindən, yurdundan qaçaq düşübdür. Belə bir zamanda Azərbaycan Respublikasının ərazi bütövlüyünün bərpa edilməsi və bu məsələlərin sülh yolu ilə həll olunması üçün bizim hər bir ölkədən yardıma ehtiyacımız var. Amerika Birləşmiş Ştatlarının, onun prezidentinin bu məsələlərə münasibəti və prinsipial mövqeyi bizdə böyük hüsn-rəğbət oyadır" [IVc.s.80].

İşlə bağlı, hərəkətlə bağlı feili frazeologizmlər situasiyanı çox dəqiq əks etdirir. "Qara fəhləlik etmək" frazeologizmi haqqı az ödənilən, ağır fiziki işlə bağlı olan iş frazeologizmdir: "O vaxtlar (red. – Sovetlər dönəmində) bizim ən mürəkkəb münasibətlərimiz məhz Yuqoslaviya ilə idi. Elə olurdu ki, biz saatlarla müzakirə, mübahisə edirdik, əlbəttə, bu zaman bizdə, sovet rəhbərliyində olan nəzəriyyəni əsas tuturduq. Mən onları qınayaraq deyirdim ki, bu nə olan işdir, siz, sizin vətəndaşlarınız Almaniyaya gedirsiniz, adamlarınız qara fəhləlik edir, başqa ideologiyanın təsiri altına düşürlər və sair və sair" [XXVIIIc.s.256].

Bir sıra frazeologizmləri auditoriya sanki ilk dəfə eşidirmiş kimi diqqətlə qulaq asır. Məsələn, "öz dövrünü yazmaq" frazeologizmi kimi: "Şərqdə həmişə şeir böyük hörmətə layiq olubdur və hər bir şair öz dövrünün aşiqi olubdur, *öz dövrünü yazıbdır.* Biz buna görə keçmiş əsrlərin heç bir şairinə hər hansı bir mənfi münasibət göstərə bilmərik və kimisə qınaya bilmərik. Səməd Vurğunu da heç kəs qınaya bilməz ki, o şeirləri, poemaları yazıbdır" [IXc.s.20-21].

Nitqlə bağlı frazeologizmlərdən Heydər Əliyevin dilində tez-tez işlənən "səs ucaltmaq" frazeologizmi müxtəlif çıxış-

larda səslənir. "Səs ucaltmağın" heç də hamıya aid olmayan, görkəmli şəxslərə aid bir frazeologizm olduğu məlum olur. Dünya şöhrətli bəstəkar Mstislav Rastropoviç, onun zövcəsi Qalina Vişnevskaya və ailəsinin digər üzvləri ilə Prezident sarayındakı (29 aprel 1997-ci il) görüşdəki nitqdə səs ucaltmaq bir tərəfdən Rastropoviçə və auditoriyaya yönəlirsə, digər tərəfdən natiqin özünə yönəlir. Auditoriya zülmə, haqsızlığa, rejimə qarşı çıxan insanları – bir siyasi lideri – Heydər Əliyevi və digər bir sənətkarı – Rastropoviçi görür, "görkəmli şəxs" olmağın sirrinin etiraz "səsini ucaltmaqla" bağlı olduğunu dərk edir. Elə məsələ də bundan ibarətdir ki, məqamında xalqının yolunda səsini ucaltmayanlar görkəmli ola bilmir: Siz məhz elə adamlarsınız ki, Azərbaycanda Yanvar faciəsindən hələ xeyli əvvəl, bundan 20 il qabaq belə hadisələrə qarşı *öz etiraz səsinizi ucaltmışdınız...* Yeri gəlmişkən, o vaxtlar 1987-ci ildə məni çalışdığım yüksək vəzifələrdən uzaqlaşdırmışdılar, lakin Moskvada yaşayırdım və Azərbaycana qarşı bu hərbi təcavüzlə əlaqədar *öz etiraz səsimi ucaltdım.* Buna görə təqiblərə məruz qaldım və bir neçə aydan sonra Moskvanı tərk etməli oldum, çox çətinliklərdən keçdim. Bunlar sizə məlumdur" [IXc.s.240].

"Şairlərin şairi olmaq" frazeologizmi ilə Azərbaycan xalqının görkəmli söz adamlarına verdiyi qiymət öz əksini tapır. "Çox nadir xüsusiyyətə malik olan istedadı, eyni zamanda ən gənc yaşlarından yazıb-yaratmaq əzmi Səməd Vurğunu qısa bir zamanda xalqımızın sevimli şairinə çevirmiş və o, həm Azərbaycanda, həm də bir çox xarici ölkələrdə tanınmış, sayılan bir insan olmuşdur. Səməd Vurğun böyük şairdir. Şərq aləmində şair həmişə ən yüksək hörmətə layiq olubdur. Səməd Vurğun isə öz dövrünün *şairlərinin şairi olubdur*" [IXc.s.17].

Nitqlərinə fəlsəfi bir ruhun hakim olduğu Heydər Əliyev təfəkkür feili frazeologizmlərdən geniş istifadə edir ki, bu tip frazeologizmlər, xüsusən bədii-fəlsəfi aspektli şıxışlarda

özünü daha çox göstərir. Xalq şairi Səməd Vurğunun 90 illik yubileyinə həsr olunmuş gecədəki nitqdə onun "beyni fəth etmək", "qəlblərə çatmaq", "şairlər şairi", "sayılan bir insan olmaq" kimi işlətdiyi frazeologizmlər şairlər, alimlər auditoriyasında heyranlıqla qarşılanır: "Səməd Vurğun şeirinin böyüklüyü, eyni zamanda gözəlliyi ondan ibarət idi ki, onun hər bir kəlməsi, hər sətri, hər bir azərbaycanlının qəlbinə çatırdı, onun beynini fəth edirdi, onu öz təsiri altına salırdı. Səməd Vurğunun şeiri bu gün də müasirlərimizə, gənc nəslə ilham, ruh verir, onları coşdurur, daha da vətənpərvər edir, onlara vətəni, milləti, torpağı sevməyi öyrədir" [IXc.s.17].

Elə buradaca "qəlbinə çatmaq"la "beynini fəth etmək" yanaşı işlənərək təfəkkür frazeologizmlərinin sinonimini yaradır. Çıxış boyu təfəkkür feilləri əsasında yaranan frazeologizmlər tez-tez auditoriyalara yön alır.

Hissi feili frazeologizmlər də böyük hissiyyat adamı Heydər Əliyevin dilində digər feili frazeologizmlərdən az işlənmir. "Kinayə ilə baxmaq", "istehza etmək" söz birləşmələri ilə müqayisədə "gəc baxmaq" frazeologizmi işlənir. "Gəc baxmaq" hissi frazeologizmin işlənməsinə qədər əhalini təbəqələrə bölənlər sərt qınağa çəkilir, belə bir bölgünü – şəhərdə və ya dağ rayonunda doğulmağa görə təsnifi –pisləyir: "Bilirsiniz, keçmişdə belə bir əhvali-ruhiyyə vardı ki, guya bizim dağ rayonlarımız geridə qalmışdır, orada camaatın mədəni, yaxud bilik səviyyəsi o qədər də yüksək deyildir. Bəzən şəhərdə onlara bir az *gəc baxır,* yaxud başqa cür yanaşırdılar" [VIc.s.47].

Başqa bir məqamda məcburi köçkünlərlə görüşdə işlətdiyi "yaraları sızıldamaq" frazeologizmi dərin emosionallıqdan xəbər verir. Xalqın düçar olduğu acınacaqlı vəziyyət bu vəziyyəti əks etdirən frazeologizmlə açıqlanır: "Əgər satqınlıq, xəyanət olmasaydı, daxildən Azərbaycana düşmən olan adamlar öz şəxsi mənafelərinə çatmaq üçün cürbəcür hoqqabazlıqla,

hakimiyyət uğrunda mübarizə ilə məşğul olmasaydılar, Şuşa qalası da Azərbaycanın məğrur qalası kimi yaşayacaqdı, Laçın dağları da və indi biz sadəcə olaraq başqa ərazilərimizdən erməni silahlı qüvvələrinin çıxarılması ilə məşğul olacağıq. Bu satqınlıq, xəyanətlər xalqımızın qəlbinə böyük yaralar vurubdur, o yaralar sağalmayıb, sarınmayıbdır, o *yaralar sızıldayır*” [VIc.s.213].

“Gəc baxmaq” frazeologizmi ilə yanaşı onun variantlığı kimi “xor baxmaq” da işlədilir. Folklor janrına məxsus meyxanaya bir zamanlar mövcud olan münasibəti əks etdirmək üçün bu frazeologizm yaddaqalan nitq yaranmasında iştirak edir: “Amma bəzən nədənsə meyxanaya xor baxırdılar” [VIIc.s.259].

Heydər Əliyev nitqində hissi və təfəkkür feilləri ilə yanaşı hərəkət feilləri əsasında yaranmış frazeologizmlər də az yer tutmur. Bu frazeologizmlər iqtisadiyyat və siyasətdə dinamik inkişafı əks etdirir.

Londonda, 29 noyabr 1995-ci ildə “Azərbaycanda investisiya imkanları” beynəlxalq konfransının açılışı mərasimində “ayağa qalxmaq” və “birlikdə addımlamaq” frazeologizmləri işə düşür: “Mən Adam Smit İnstitutunun dəvətini böyük məmnuniyyətlə qəbul etdim və xüsusi olaraq buraya gəldim ki, sizinlə şəxsən görüşüm və sizə, bu konfransın iştirakçılarına respublikamız haqqında, onun bugünkü vəziyyəti, ölkəmizdəki ictimai-siyasi mühit haqqında, bizim imkanlarımız və əməkdaşlıq etmək istəyimiz barədə danışım. Ona görə də mən sizi əməkdaşlığa dəvət edirəm. Hesab edirəm ki, Adam Smit İnstitutu bundan sonra da Azərbaycana diqqət göstərəcək və bizə, necə deyərlər, *ayağa qalxmaqda,* seçdiyimiz demokratik yolda iqtisadi cəhətdən inkişaf etmiş ölkələrlə *birlikdə addımlamaqda* kömək edəcəkdir” [Vc.s.31].

Azərbaycanın bazar iqtisadiyyatı yoluna başladığı illərə təsadüf edən bu çıxışda “ayağa qalxmaq” frazeologizmi

konkret tarixi şəraitə uyğun gəlir. Bu bir daha frazeologizmlərlə konkret ictimai-siyasi və iqtisadi dövrlər arasındakı dərin, daxili vəhdətin Heydər Əliyevin dilində həmişə gözlənilməsinə işarədir: "Azərbaycan dörd il bundan öncə müstəqilliyi *əldə edibdir.* Azərbaycan demokratik, hüquqi dövlət quruculuğu yoluna, bazar iqtisadiyyatına, bazar münasibətlərinə əsaslanan demokratik vətəndaş cəmiyyəti formalaşdırmaq yoluna *qədəm qoyubdur* və mövcud beynəlxalq standartlara uyğun olaraq dünya iqtisadiyyatına sıx bir şəkildə qovuşmaq istiqamətində strateji *xətt götürübdür*" [Vc.s.23]. "Əldə etmək", "qədəm qoymaq", "xətt götürmək" kimi frazeologizmlər iqtisadiyyatını formalaşdıran gənc ölkənin iqtisadi siyasətini dəqiq əks etdirir.

Müxtəlif nitq məqamlarında sinonim frazeologizmlər öz yerini tutur. Dərindən nüfuz etdikdə bu hərəkət feilləri əsasında yaranmış frazeologizmlərin semantik baxımdan fərqli olduğu nəzərə çarpır.

Əgər vaxtilə Bakı kondisionerlər zavodunun tikilməsinə əngəl törədənlərə münasibətdə "çəpərləri yarmaq" frazeologizmi işlədirsə: "Əks qüvvələr çox idi. Bir tərəfdən inanmırdılar, ikinci tərəfdən də, mən sizə bu gün *açıq deyirəm,* o vaxt mərkəzdə olan bəzi dairələr belə nəhəng müəssisələrin Azərbaycanda yerləşməsini istəmirdilər. Çünki onlar bizim respublikamızı elə daim geridə qalmış respublika kimi saxlamaq istəyirdilər. Bax, bütün maneələri, *çəpərləri yarıb keçmək* lazım idi və mən də mübarizə aparırdım" [Vc.s.213]. Mətndə "bax" qüvvətləndirici ədatı ilə "çəpəri yarmaq" frazeologizmini çulğalaşdırır.

Soyuq münasibətlərin aradan qaldırılması zəminində "buzu yarmaq" işlədilir. "Buz" konseptini eşidən auditoriya soyuq münasibət və onun aradan qaldırılmasını göz önünə gətirir: "Doğrudur, şikayətləri də var ki, gəlib Azərbaycanda iş görmək üçün şərait bəzən o qədər də uyğun deyil, yaxud

bəzi bürokratik əngəllər meydana çıxır. Hökumətin, dövlətin ayrı-ayrı orqanlarında bəzi şəxslər bu məsələləri anlamadıqlarına, yaxud işlərimizə qəsdən mane olmaq istədiklərinə görə belə əngəlləri süni surətdə yaradırlar. Ola bilər bunlar var. Mən buna etiraz etmirəm, hesab edirəm ki, yəqin respublikamızda belə qüsurlar mövcuddur. Ancaq mən demişdim və bir də demək istəyirəm: Azərbaycanla Türkiyənin əlaqələri elədir ki, gərək Türkiyənin iş adamları bizim aramızda bəziləri tərəfindən yaradılan *buzu yara-yara* ölkəmizə gəlsinlər" [Vc.s.155].

Ciddi irəliləyişlər olmayan məsələlərin həlli yolunda o zaman "xırda-xırda irəliləmək" frazeologizmi səslənir: "Güman edirəm ki, Budapeşt görüşündən sonra həmsədrlərin hesabatı bəyan ediləcək, dərc olunacaq, siz onunla tanış ola biləcəksiniz. Məhz buna görə də mən deyirəm ki, *xırda-xırda* da olsa biz *irəliləyirik* və bunlar hamısı *ümid verir ki,* məsələlərin sülh yolu ilə həll edilməsinə nail ola biləcəyik" [Vc.s.82].

Hərəkət feilləri ilə bağlı frazeologizmlər incəsənət əsərləri ilə, kino ilə, dünya şöhrətli əsərlərlə bağlı nitqlərdə "dünyanı gəzmək" ustalıqla Heydər Əliyev nitqində yer alır: "Amma gəlin İkinsi Dünya Müharibəsindən əvvəl yaranan filmləri götürək. Xalqımız onları nə qədər sevirdi! Mənim özüm gəncliyimdə "Bakılılar", "Kəndlilər" filmlərinə nə qədər böyük həvəslə baxırdım. Yaxud, açıq danışaq "Çapayev" filmi o vaxtlar bütün *dünyanı gəzdi,* bizim kimi gənclərə nə qədər böyük təsir buraxdı. Mən "Çapayev" filmini ona görə deyirəm ki, o, hər yerdə böyük qəbul olunan film idi" [Vc.s.185].

Yaxud "açıq danışaq" ifadəsi ilə Heydər Əliyev bolşevik-qəhrəmanı Çapayevdən yox, "Çapayev" filminin üstünlüklərindən, onun dünyanı gəzməsindən, bu baxımdan kino sənətinin incəliklərindən danışır.

Elə bunun ardınca "quyruq bulamaq" frazeologizmini gündəmə gətirir: "Mənə Bakıda danışırdılar. Bir nəfər alim, elmlər doktoru var, heç vaxt vəzifəsi olmayıbdır. Götürdük onu nazir qoyduq. Sonra elə bir rejim yaradıbdır ki, səhər işə gələndə onun iki nəfər – eyib olmasın – *quyruq bulayanı* gərək qapıda dursun. O, avtomobillə gələndə biri onun qapısını açacaqdır, biri də portfelini götürəcəkdir, gedəcəklər yuxarıya" [XXXIXc.s.127].

Hərəkət feilləri əsasında yaranan frazeologizmləri siyasi lider öz nitqində tez-tez işlədir. Belə ki "yerində saymaq", "qaça-qaça getmək", "kiçik addımlarla irəliləmək" kimi hərəkətlə bağlı frazeologizmlər çıxışın müəyyən məqamlarında özünə yer alır: "Siz indi sürətlə getməlisiniz, bu, lazım da deyildir. Bəlkə də *yerinizdə sayasınız*, yaxud da ki, çox *kiçik addımlarla irəliləyəsiniz*. Amma biz gərək *qaça-qaça gedək*. Biz bunu anlayırıq. Amma istəyirik ki, bizi də anlasınlar. O şey ki, Azərbaycanda mümkün deyil, onu tələb etmək və o alınmayanda ittiham etmək ki, burada demokratiya yoxdur və sair, bu, obyektivlikdən kənar bir şeydir" [XLc.s.16].

Hərəkətin sürətli olduğunu auditoriya "axıb gəlmək" frazeologizmi ilə anlayır: "Heç bir partiyaya mənsub olmayan – sübhəsiz ki, Yeni Azərbaycan Partiyası orada idi, – yüz minlərlə adam iki saartın içərisində Prezident sarayının qarşısına *axıb gəldi"* [XVIIIc.s.238].

Həmin "axıb gəlmək" frazeologizminin başqa bir nitq prosesində "axın başlanmaq"la əvəz olunması baş verir: "Görüş iştirakçılarına məlumat verim ki, indi Azərbaycan müstəqil dövlətdir, müstəqil dövlət kimi fəaliyyət göstərir, çoxpartiyalı sistem əsasında demokratik parlament seçilmiş, xarici sərmayələrin ölkəmizə böyük axını başlamışdır" [XXc.s.86].

Heydər Əliyev dilində həm təfəkkür (həqiqətin harada olduğunu anlamaq), həm də hərəkət (toxunmaq, bərk dəymək) frazeologizmi kimi "başı daşa dəymək" də səslənir: "Yəqin, Azərbaycan ağır vəziyyətdə olarkən onun və onun kimilərinin *başları daşa dəydi,* fikirləşirdilər ki, Heydər Əliyevə müraciət etmək lazımdır" [XXIV c s. 46].

Düzgün qərar qəbul etmək, müdriklik nümayiş etdirmək anlarında Heydər Əliyevin dilində "ağıl-zəka göstərmək" təfəkkür frazeologizmi işə düşür: "Mən əminəm ki, gürcü xalqı aprelin 9-da düzgün qərar qəbul edəcək, müdriklik, *ağıl-zəka göstərəcək* və seçkilər gürcü xalqının milli mənafelərinə uyğun olan nəticələr verəcəklər" [XXIVc.s.51-52].

Nitq frazeologizmlərindən biri də "üzünə demək"dir: "Ancaq mənim xüsusiyyətim bir də ondan ibarətdir ki, kimi çox qiymətləndirirəm, onuin səhvini də, günahını da *üzünə deyirəm"* [XXVIc.s.425].

Bəzən də mənfi mənada təfəkkür frazeologizmləri auditoriyaya ayaq açır. Elə bu tip frazeologizmlərin mənasını araşdıran dinləyici izahı, cavabı Ulu Öndərin öz dilindən eşidir: "Oxucu faktları riyakarcasına saxtalaşdıran, kriminal əhvalatlardan ləzzət alan, özlərindən *toxuduqları uydurmalarla adamların beynini dolduran* bu qəzetlərin təsiri altına düşür" [XXVIIc.s.216].

Elə "ağa qara demək" özlüyündə həm təfəkkür (yalan demək) həm də nitq (demək) frazeologizmi ola bilir: "Onlar *ağa qara deyirlər, qaraya da ağ deyirlər"* [XXVII c. s.78].

Nitq frazeologizmləri sırasına "gur danışmaq" da aid edilə bilər. Bu frazeologizm populist çıxış etməyin sinonimi kimi səslənə bilər: "Bu barədə *gur danışan adamlar* özləri çox şeylərin günahkarlarıdır" [XVIIc.s.430].

Qarşı tərəfin xidmətlərini qiymətləndirmək lazım gələndə işlədilən bir nitq frazeologizmi sayıla biləcək "üzünüzə demək olmasın" işlədilir: "Xatirimdədir, siz Danimarkada da,

Əfqanıstanda da işləmisiniz. Sonra bu müddət ərzində bir çox sahələrdə də işləmisiniz və *üzünüzə demək olmasın,* hər yerdə çox qeyri-adi bacarıq nümayiş etdirmisiniz və çox böyük təcrübə toplamısınız" [XVIIc.s.16].

"Bəyan etmək" başqa bir anlamda "dünyaya səs qaldırmaq" kimi səslənir: "1990-cı ildə bu faciə baş verən kimi mən yanvar ayının 21-də Moskvada öz etirazımı bildirdim, *öz səsimi dünyaya qaldırdım* və o vaxtdan da mən Azərbaycan xalqına edilmiş bu təcavüzü xalqımızın həyatında ən dəhşətli bir səhifə hesab edirəm" [XIXc.s.50].

Nitqlə bağlı idiomlar da öz layiqli yerini tutur. Kütlələrə təsir üçün, auditoriyalara yeni söz demək imkanı tükənən populist natiqlərə yönələn "aşığın sözü qurtaranda" – "neynim, neynim" deyər idiomu səhnəyə gəlir: "Azərbaycanda bir məsəl var: "aşığın sözü qurtaranda" – "neynim, neynim" deyər" [XIc.s.403].

Təfəkkür-nitq əlaqələri baxımından "suallar qalxmaq" frazeologizmi maraq doğurandır: "Burada çıxış edənlər danışdıqca o qədər *suallar qalxır*, o qədər təəccüb doğuran rəqəmlər gətirdilər ki, bunu heç təsəvvür etmək mümkün deyildir" [XIIIc.s.436].

Neqativ baxımdan, etdiyi xidmətlərə uyğun olmayan tələblər qoymaq baxımından "meydanda qışqırmaq" frazeologizmi nitq frazeologizminə aid edilə bilər: "Bilirsiniz, heç kəs deyə bilməz ki, mənim filan vaxt filan xidmətim olubdur, filan vaxt *meydanda* bir az çox qışqırmışam, yaxud da az qışqırmışam, mənim qanunu pozmağa ixtiyarım var" [XIIIc.s.278].

Görülən işlərə qiymət verməmək, nailiyyətlərə kölgə salmaq baxımından başqa bir "qələmə vermək" frazeologizmi diqqət çəkir: "Düzdür, burada müxalifətdə olan qüvvələr yenə də bunu belə *qələmə verdilər* ki..." [XIIIc.s.278].

Hissi-emosional tiplu frazeologizmlər sırasında "qəlb"lə bağlı olanlar Heydər Əliyevin dilində tez-tez səslənir. "Qəlb-

ləri fəth etmək", "ürəkdən istəmək", "qəlbimin hökmü ilə getmək", "ağrı-acısını çəkmək" bu qəbildəndir. Sözlə, nitqlə, musiqi dili ilə bağlı məqamlarda "qəlbləri fəth etmək" frazeologizmi işə düşür: "60-cı illərdə sizi gənclərin sevimlisinə çevirmiş istedadınız bu gün də Yer kürəsinin bütün guşələrində adamların qəlbini fəth edir" [XIIc.s.5].

"Qəlb"lə yanaşı "ürək"lə bağlı hissi frazeologizmləri siyasət meydanına, səhnəyə gətirmək Heydər Əliyev dühasına xasdır. Bəzən də bu hissi-emosional frazeologizmlər sinonim şəklində səslənir ki, buna "ürəkdən istəmək" frazeologizmi misal ola bilər: "Biz Ukraynaya, Ukrayna xalqına böyük dostluq hissləri bəsləyirik və bunu *ürəkdən istəyirik*" [XIIc.s.25] – və "qəlbinin hökmü ilə getmək" frazeologizmləri mütləq olmasa da sinonimdir: "İndi Polşa tamamilə azad ölkədir müstəqil dövlətdir və Polşa xalqı öz *qəlbinin hökmü* ilə istədiyi yolla gedir" [XIIc.s.33]. Hissi frazeologizmlər içərisində "ağrı" ilə də bağlı "ağrı-acısını çəkmək" tez-tez dilə gəlir: "Biz bu zərbələrin ağrı-acısını çəkirik" [XIIc.s.327].

Hərəkətə aid frazeologizmlərdən məişət üslublu nitq üçün xarakterik olan "yağ kimi getmək" işlərin maneəsiz gedişinə işarədir. "Necə deyərlər" ifadəsi və "amma" ziddiyyət bağlaycısı işlərin maneə ilə getməsini auditoriyaya bəyan edir: "Dövlət əmlak naziri, zavodun nümayəndəsi indi burada çıxış etdilər. Onlar elə təsvir etdilər ki, hər şey, *necə deyərlər, yağ kimi gedibdir. Amma* belə deyildir. Bu şirkət respublikamızda bir çox çətinliklərlə rastlaşıb, *amma* mənim bunlardan xəbərim olmayıbdır. Bu məsələni bilən kimi mən bu cənabı – Jan – Pol Lanfrankini qəbul etdim. Ona dedim ki, utanmayın, mənə hər şeyi *açıq deyin*. Xatirimdədir, sən də mənə hər şeyi dedin" [XXXc.s.188].

İşlərin rahat, heç bir maneəyə rast gəlmədən irəli getməsini şərtləndirən "yağ kimi getmək" frazeologizmi iki yerdə "amma" bağlayıcısı ilə inkarlıq statusunu qazandırır ki, belə

nitq priyomları böyük natiqlərə müyəssər olur. Həyəcanlı anları auditoriyaya ünvanlamaq məqamlarında hissi-emosional frazeologizmlər işə düşür: "Ancaq siz Sidneydə çıxış edən zaman ürəyimiz *tıp-tıp vururdu* ki, necə, nə cür olacaq" [XXXc.s.208].

Bir qisim hallarda isə hissi və təfəkkür frazeologizmləri qoşalaşır: "Salonda əyləşib hiss etdiklərimin hamısı *ürəyimdən keçir...* Bu yaxınlarda görkəmli dramaturqumuz, klassikimiz Cəfər Cabbarlının "Aydın" pyesi göstərildi. Mən bu pyesi bir neçə dəfə, yeniyetmə, gənclik çağlarında görmüşəm, yəni bu pyeslə tanışam. Lakin indi mən bu pyesə 30-40 il bundan əvvəl baxmış adam deyiləm. Ona görə də indi mən *başqa nəzərlə baxıram*" [XXVIIIc.s.348].

"Mən sadəcə olaraq gəlib "sağ olun, çox yaxşıdır" demirəm. Mən hökmən pyesin özünün, müəllifin, sonra da tamaşanın quruluşunun məziyyətlərini *saf-çürük etməliyəm.* Bax, belə ənənə yaranmışdır. Bu heç kimdən – nə məndən, nə də onlardan asılıdır. Bunu heç kim düşünüb tapmamışdır. Bu, sadəcə, həmişə, bütün həyat boyu olmuşdur" [XXVIIIc.s.348].

"Basmaqəlib ifadələr"dən istifadə etməyən, hadisələrə, proseslərə, araşdırmalara öz təfəkkür süzgəcindən münasibət bildirən Heydər Əliyev dilində təfəkkür frazeologizmləri yerli-yerində işlənərək auditoriyaları öz sehrinə salır. "İndi mən başqa nəzərlə baxıram" ifadəsi Demokritin "hər şey axır, hər şey dəyişir" ifadəsinə uyğunlaşır. Bu "başqa nəzər" əgər bir tərəfdən şəxsin özünün əqli inkişaf səviyyəsi ilə bağlıdırsa, digər tərəfdən ictimai-siyasi hadisələrin zaman və məkan kontekstində dəyişməsi ilə bağlıdır: "Səhnə adamının əməyi ağırdır, onun dəstəyə ehtiyacı var. Ehtiyac duyulur ki, onun haqqında hansısa ümumi ifadələrlə deyil, *ürəkdən gələn xoş sözlər* söyləsinlər, elə sözlə ki, həqiqətə uyğun olsun. Mən heç zaman basmaqəlib ifadələrdən istifadə etməmişəm" [XXVIIIc.s.348].

Təfəkkürlə bağlı frazeologizmlər böyük natiqin nitqlərini bəzəyir. Əgər bir nitq anında ulu öndər "beyinləri zəhərlənmiş" gənclikdən danışırsa, digər bir nitq anında isə həmin gəncliyə "ağlınızı başınıza yığın" frazeologizmi ilə müraciət edir. Mənfi mənada işlənmiş "beyinləri zəhərlənmək" frazeologizmi ictimai-siyasi proseslərin mənfi təsirindən danışır: "Çünki o illərdə bəzi şəxslər həqiqətən vətənpərvərlik göstərərək gedib torpaqlarımızı müdafiə etmişdilər və hərbi peşəni, silahı öyrənmişdilər, amma Azərbaycanın daxilində gedən mənfi ictimai-siyasi proseslər həmin gənclərin bir çoxunu *yoldan çıxarmışdı,* onların *beynini* zəhərləmişdi" [XXVIIIc.s.330].

Elə buradaca "beyni zəhərlənmək" frazeologizmi ilə "yoldan çıxarmaq" frazeologizminin sinonimliyi üzə çıxır. "Yoldan çıxan" beyni zəhərlənmiş sayılır, yaxud "beyni zəhərlənmiş" insan təbii ki, "yoldan çıxacaq". İzahedici nitq qəlibi bu situasiyada da özünü göstərir. Analitik təfəkkürlə bağlı, analiz etmək, araşdırmaq baxımından böyük natiqin dilində səslənən "saf-çürük etmək" frazeologizmi özünə yer alır.

Böyük natiqin nitqlərində hissi-emosional və nitq feillərinin birgə təsadüf etdiyi feili frazeologizmlərə az təsadüf edilmir. "Hərarətli çıxış etmək" frazeologizmində "hərarətli çıxışın emosionallığına işarədirsə" "çıxış etmək" artıq sırf nitq feilinə işarədir: "Birliyin əmək veteranı, mənim dostim Cahangir Quliyev burada çox *hərarətli çıxış etdi.* Baxın, 40 ildir burada çalışır. Bura nə qədər bağlıdır. Amma o buranın ağır dövrünü də görübdür, o dövrü də yaşayıbdır. Həmin o hisnən nəfəs alıb, o zəhərləyici maddələrlə də nəfəs alıb, amma görünür ki, çox sağlam adamdır, indiyə qədər də sağlam qalıbdır, gümrah qalıbdır" [XXVIIIc.s.16].

Dinləyicidə belə bir fikir yaranır ki, zəhmət adamı, həyatın bütün çətinliklərini görən adam hərarətli çıxış etmək gücündədir. Kürsüyə sinə gərib söz deyən insanın buna haqqı olmalı, o haqqı qazanmalıdır.

Nitq frazeologizmləri içərisində "rahat-rahat söhbət etmək" məişət üslublu frazeologizm işə düşür: "Güman edirəm ki, bu rəsmi səfər zamanı bizim daha da geniş imkanlarımız olacaqdır ki, həm bir çox məsələləri müzakirə edək, həm də *rahat-rahat söhbət edək*" [XXVIIc.s.200].

Hərəkət feilləri əsasında formalaşan frazeologizmlərin bir qismi güclü inkişafı auditoriya üçün göstərmək məqamlarında işlənir: "Ona görə biz tərəqqi ilə ayaqlaşmalıyıq, inkişaf etmiş ölkələrin *səviyəsinə qalxmalıyıq"* [XIIIc.s.339].

Hərəkətsizlik baxımından hərəkət feillərinin neqativ formaları əsasında formalaşan frazeologizmlər arasında "donub qalmaq" işlənir: "Ona görə ki, heç nə bir yerdə *donub qalmır,* hər şey inkişafda, hərəkətdədir" [XVc.s.334].

Statistik hərəkət baxımından "cəsarətlə durmaq" frazeologizmi özünə yer alır. "Əminəm ki, onlar üzərlərinə düşən şərəfli vəzifəni yerinə yetirəcək, inanıram ki, silahlı qüvvələrimizi Azərbaycanın dövlətçiliyinin, torpaqlarımızın, müstəqilliyimizin qorunmasının keşiyində həmişə *cəsarətlə duracaqlar*" [XVc.s.419].

Eyni yerdə qalmaq, statistik frazeologizmlər arasında "ömrü boyu qalmaq" maraq doğurandır: "Az insan tapılar ki, onlar doğulduqları yerlərdə bütün *ömürləri boyu qalsınlar*" [XVIc.s.45].

Gördükləri iş, əldə etdikləri nailiyyət onu göstərir ki, insan bir işə həvəslə, *ürəklə-canla yanaşarsa,* həqiqətən xalqa xidmət etmək istəyirsə, o, çox işlər görə bilər" [XIIIc.s.219].

Təfəkkür feilləri ilə bağlı frazeologizmlərdən biri də "fikirləşmək"lə bağlıdır, "papağını qabağına qoyub fikirləşmək" idiomudur: "Amma bunun üçün indi siyasət aləminə çıxan, siyasətlə məşğul olmaq istəyən adamlar və hakimiyyət iddiasında olan adamlar gərək – Azərbaycanda bir söz var, – *papağını qoysun qabağına və dərindən fikirləşsin*" sən bu suya girə bilərsən, ya girə bilməzsən?" [XVc.s.179].

"Danışıqlar aparmaq" frazeologizmi artıq ümumişlək sözə çevrilmiş frazeologizmlər sırasına qoşulsa da bu Heydər Əliyev dilində həmişə yeni bir çalarla səslənir: "Ermənistran-Azərbaycan münaqişəsinin sülh yolu ilə həll edilməsi məqsədi ilə mən Minsk qrupunun sədri, İtaliyanın nümayəndələri ilə dəfələrlə görüşüb *danışıqlar aparmışam"* [XVIc.s.7].

Hadisələri müşahidə edərək nəticə çıxarmaq, analitik təfəkkürə söykənmək anlarında "ağı-qaradan seçmək" frazeologizmi meydana gəlir: "Yəni xalq hər şeyi görür, adamlar *ağı-qaradan seçirlər*" [XIc.s.357].

Təfəkkür feilləri əsasında yaranmış frazeologizmlərin bir çoxu "baş" somatizmi əsasında yarananlardır: "Çünki o qərəzli adamları da *başa salmaq* lazımdır" [XIc.s.402].

Hissi frazeologizmlər sırasına "həsrətlə baxmaq" da aid edilə bilər: "Bizim vətəndaşlarımız ayrı-ayrı ölkələrdə mobil telefonlardan istifadə edilməsinə əvvəllər *həsrətlə baxırdılar*" [XXc.s.7].

"Göz"lə bağlı, görmə hissiyyatı ilə bağlı, neqativ şəkildə işlənən "göz yummaq"da Heydər Əliyevin dilində öz yerini alır: "Amma burada hamı vahid mövqe ilə çıxış etməli və elə olmamalıdır ki, bu separatizmə qarşı çıxmaq lazımdır, başqa separatizmə isə *göz yummaq* və ya onu hətta təsdiq etmək və ona kömək etmək olar" [XXc.s.37].

Hərəkət feilləri əsasında yaradılmış "xalqın içinə atmaq" frazeologizmi diqqət çəkir. Bu frazeologizm ilə Heydər Əliyev "Xalq-Heydər", "Heydər-xalq" məfhumunu siyasi diskursa daxil edir: "Çünki burada, Azərbaycanda, Bakıda vəziyyət o qədər ağır, gərgin idi ki, mən sadəcə, xalqın bu *çağırışına səs verərək gəldim, özümü xalqın içinə atdım*" [XVIc.s.11].

Elə bu cümlədə "çağırışına səs vermək" nitq frazeologizmi hərəkət frazeologizmi ilə harmoniya yaradır.

Müəlliflərin [10, 11] qeyd etdiyi kimi somatizm tərkibli emosemiyalı frazeoloji vahidlər arasında kinestetik əsaslı ifadələr xüsusilə seçilir. Xatırladaq ki, "dil qavrayışında emosionallıq obyektin hissi qiymətləndirməsi, insanlann əhval-ruhiyyəsi, hiss və həyəcanların dil və nitq ifadəsidir". N.A.Ayupovanın da qeyd etdiyi kimi, bizdə ən az maraq doğuran istənilən bir şey, bir kəs bizdə az da olsa, emosiya doğurur [234, 235]. Həmin emosional fon, emosional reaksiya bir çox halda kinestetik ifadəyə malik olur. Kinestetika yunan dilində "hərəkət etmək, toxunmaq" və "hissiyyat, emosiya" anlamlarını bildirən sözlərin (kinesis, aesthesis) birləşməsindən yaranmışdır və "bədənin, onun ayrı-ayrı hissələrinin, əzələlərin hissi reseptorlarından başlanğıc götürmüş reaksiyası"nı ifadə edir [11, 235]. Başqa sözlə desək, kinestetik əsasda formalaşmış olan və somatik komponentə malik olan emosemiyalı frazeoloji vahidlərin əsas göstəricisi danışanın obyektə münasibətdəki reaksiyasının mimik-jestikulyator ifadəsilə şərtlənir. Məsələn, *"kimisə saymazyana davranmaq, etinasız münasibət bəsləmək, kiməsə yuxarıdan aşağı baxmaq, ikrahla kiməsə və ya nəyəsə yanaşmaq"* [234] frazeoloji vahidini bu sırada qeyd etmək olar. Hərfi tərcüməsi "*burnundan aşağı baxmaq (kiməsə)"*anlamını ifadə edən bu frazeologizm bilavasitə insanın ikrah doğuran obyektə mimik reaksiyasını əks etdirir. Qeyd edək ki, *"burnu havada olmaq, başqalarına təkəbbürlü münasibət bəsləmək, yuxarıdan aşağı baxmaq"*[10, 235] emosemiyalı frazeologizmi də eyni semantik nüvədən törəmişdir. Burada da təkəbbürlü insanın duruşundakı "burnu diklik" məqamı neqativ konnotasiyalı həmin frazeoloji vahidin meydana gəlməsinə yol açmışıdır. Bu isə dolayısı ilə "demək olar ki, hər bir sözdə (eləcə də frazeoloji vahiddə – C.A.) insanın izini tapmaq olar" – fikrini bəyan etmiş tədqiqatçıların yanaşmasının məntiqi olduğunu əyani şəkildə sübut etmiş olur [234, 241]. Əgər nəzərə alsaq ki, istənilən

inkişaf etmiş dünya dilində metaforik kodlaşmada dünyanın antroposentrik qavranılmasından törəyən implikasiya modelləri öncüllük təşkil edir, bu zaman əksər frazeoloji ifadələrdə insanın dünyanı öz qəlibinə görə "biçimləndirmək" vərdişi tam anlaşılan görünür. Xatırladaq ki, antroposentrik termini yunan dilində "insan" anlamını ifadə edən *anthropos* və latın dilindəki *centrum* "mərkəz" sözünün birləşməsindən yaranan istilah olub "antropomorfizmin ən qatı formasının" adlandırılması üçün istifadə edilir. Antroposentrizm yanaşmaya görə, "istənilən təbiət və cəmiyyət haqqında biliklərin, habelə özünüdərkin ölçü vahidi insandır"[7]. Bu mənada "Frazeologiyada insan: antroposentrik və aksioloji aspektlər", mövzulu araşdırmasında bu növ ölçü vahidinin bir çox frazeosematik sahələrdə ön plana çıxdığını vurğulayan Q.A.Baqautdinovanın [237] mövqeyi ilə razılaşmamaq olmaz. O da maraqlıdır ki, dilçi antroposentrik mahiyyətli frazeotematik qruplar arasında "İnsanın emosiyaları və hissləri" adlı frazeosemantik qruplar toplusunu xüsusilə fərqləndirir [237]. Qeyd edək ki, emosemiyalı frazeologizmlərin antroposentrik şərtlənməsi mexanizmlərini təhlil etmiş digər tədqiqatçı subkodlar mexanizmindən çıxış edərkən "antroposensor subkodları" ayrıca səviyyə şəklində fərqləndirir və kinestetik mahiyyətli frazeoloji vahidlərin də məhz, həmin səviyyəyə aidliyini önə sürür [302].

Məsələn, "*ikrahla dodağnı büzmək", "ağzını əymək*' [256] frazeoloji vahidi kinestetik əsasda yaranmışdır. Belə ki, burada insanın konkret emosional vəziyyətdə qeyri-şüuri və ya şüurlu şəkildə gerçəkləşdirmiş olduğu mimikanın verbal reprezentasiyasından törəmiş frazeoloji vahidlə qarşılaşırıq.

Hərəkətlə bağlı frazeologizmlər ən çox "əl", "ayaq" somatizmləri ilə əlaqədə işlənir. "Ayağını çəkməmək" frazeologizmində olduğu kimi: "Məscidi partladıblar, dağıdıblar,

yerlə yeksan ediblər, amma insanlar *ayağını* o yerdən *çəkməyiblər*" [XVIIc.s.395].

Hərəkət frazeologizmləri arasında addımla bağlı olanlar da vardır: "Dünən hökumətlərimiz arasında imzalanmış sənədlər əməkdaşlığımızı daha da inkişaf etdirmək yolunda *yeni addımdır*" [XVIIIc.s.87].

Təfəkkürə aid ola biləcək, yaddaşla bağlı, tarixi yaddaşımızın saxlanması və qorunması yolunda "xırda-xırda unutmaq" frazeologizmi dilə gəlir: "Çünki dilini unudan adam, şübhəsiz ki, milli keyfiyyətlərini də *xırda-xırda unudur*" [XVIIc.s.228].

Təcrübə toplamaq, müşahidə etmək təfəkkürlə bağlı olan məsələlərdəndir ki, "yumurtadan çıxmamış cücə" idiomu təcrübəsiz insanlara yönəlir: "Azərbaycanda bir söz var – *hələ yumurtadan çıxmamış bir cücə kimi"* bəyənatlar verirlər ki, "Azərbaycan unitar dövlətdir, burada muxtariyyət ola bilməz, bu muxtariyyəti ləğv etmək lazımdır" [XXIIc.s.249].

"Götürmək-qoymaq" hərəkət feilləri əsasında "götür-qoy etmək" frazeologizmi "araşdırmaq" və "müzakirə etmək" mənalarında da işlənə bilir. Artıq bu frazeologizm təfəkkürü ifadə edir: "Məsələnin sülh yolu ilə həlli imkanlarını tapmaq üçün biz bir daha ətraflı *götür-qoy etdik*, müzakirə etdik" [XXIIc.s.178]

"Danışıq aparmaq" frazeologizmin sinonimi kimi "söhbət aparmaq" da nitqi əhatə edir. "Uzun-uzadı söhbətlər aparmaq" qarşı tərəfə dözümlülük göstərmək, qanunlara əməl etmək yolunda səbrlə danışıqları həyata keçirmək kimi başa düşülür: "*Uzun-uzadı söhbətlər apardım*. Xeyli vaxt sərf edərək onları başa salmağa çalışdım ki, siz çox pis yola düşmüsünüz, cinayət etmisiniz, bu yoldan çəkinin, siz komandirsiniz, gedin onları başa salın, anladın" [XXVc.s.412-413].

Elə bu iki cümlədə "başa salmaq", "pis yola düşmək", "yoldan çəkinmək", "söhbət aparmaq" kimi hissi, nitq və təfəkkür frazeologizmləri çulğalaşır.

Müxtəlif çalarları (təfəkkür, nitq, hərəkət) özündə birləşdirən frazeologizmlər də Heydər Əliyevin dilində mövcuddur. Belə ki, "ağzını yummaq" frazeologizmi özlüyündə həm nitq (neqativ frazeologizm), həm təfəkkür (mənitqi əsaslarla susdurmaq), həm də hərəkəti (açmaq, yummaq) ehtiva edir. Həm də bu somatikdir: "Amma bunu nə qədər tez başlasaq, bu işin qarşısını almaq istəyənlərin ağzını o qədər tez yumacağıq" [XXIVc.s.158].

Statistik hərəkət frazeologizmi kimi "kənarda durmağı" göstərmək olar: "Amma onlar *kənarda durmuşdular ki,* qoy vursunlar, görək nə olar, sonra nə edərik" [XXIIIc.s.85].

Sözü birbaşa, heç bir informasiya vasitəsinə söykənmədən birbaşa demək mənasında yüksək səviyyəli görüşlərdə Heydər Əliyevin üzbəüz söz deməyi "üzbəüz demək" frazeologizmi ilə dinləyicilərə ünvanlanır: "Təsəvvür edin, Fransanın prezidenti kimi çox hörmətli, dünya siyasətində böyük bir yer tutan adama – mən onun qonağı olduğum halda – *üzbəüz dedim ki,* biz sizə inanmırıq" [XXIIIc.s.76].

Təfəkkür (dünyanı dərk etmək) və hərəkət feillərinin birgə işləndiyi frazeologizmlərdən "gözünü dünyaya açmaq" bədii-publisistik çıxışlarda səslənir: "Əgər Cəlil Məmmədquluzadə kimi şəxsiyyət dünyaya gəlməsəydi, əgər "Molla Nəsrəddin" jurnalı yatmış insanları qaranlıqdan çıxarmağa çalışmasaydı, əgər onun "Ölülər" əsəri insanların gözünü real dünyaya açmasaydı, xalqımız bu qədər inkişaf edə bilməzdi" [XXIIc.s.261].

Emosional frazeologizmə aid edilə bilən "özünü oda atmaq" ifadəsi xalqla bağlı çıxışlarda səslənir: "Amma mən şəxsi həyatımı, ailəmi, övladlarımı bir tərəfə qoydum, xalqın mənafeyi üçün özümü *odun içinə atdım*" [XVIIc.s.319].

Emosional frazeologizmlər arasında variantlıq halları da Heydər Əliyevin dilində tez-tez təsadüf edilir. Məs: "Oda-alova atmaq" frazeologizmi kimi: "Mən öz vətənimə oğulluq borcumu yerinə yetirdim, sədaqətimi bir daha nümayiş etdirdim, özümü *oda-alova atdım*" [XVIIIc.s.73].

Hissi-emosional frazeologizm kimi "özünə gələ bilməmək"də istifadə olunur: "Hissiyyatları o qədər idi ki, *özünə gələ bilmirdi*" [XXV c. s.218].

Bir sıra frazeologizmlərdə həm hissi, həm emosional, həm də təfəkkür çalarları müşahidə edilir: "Bununla da bizim partiya indi müxalifətdə olan və bu gün Azərbaycan iqtidarına *düşmən gözü ilə baxan* bütün partiyalardan fərqlənir" [XXIVc.s.52].

Hissi-emosional frazeologizmlərdən Heydər Əliyevin Naxçıvana münasibətdə işlətdiyi frazeologizmlərdən biri də "qoynuna almaq"dır: "Burada məni qucaqladılar, *qoyunlarına aldılar*, burada məni yaşatdılar" [XXIIc.s.243].

Həm hissi, həm təfəkkür mənasında işlənən frazeologizmə misal olaraq "yuxuya getməyi" göstərmək olar: "Orada yazılmışdı ki, Siyasi büronun bu *yuxuya getmiş* üzvləri arasında Əliyev zahirən Hollivud aktyorunu xatırladır" [XXIIc.s.143].

Mətbuatda yalan informasiya yaymaq həm də "haray çəkmək" mənasındadır: "Çeçenistanda müharibə gedərkən Moskvada gah televiziya ilə gah qəzetlərdə, gah da ayrı-ayrı şəxslərin bəyanatlarında ardı-arası kəsilmədən *haray çəkirdilər* ki, Əfqanıstandan, Pakistandan, Türkiyədən, nə bilim İrandan, daha haralardan silah Çeçenistana Azərbaycan vasitəsilə gətirilir" [XXIIc.s.29].

Yekunda onu qeyd etmək yerinə düşər ki:

– Təfəkkür sahibi, fəlsəfi təfəkkürə söykənən dövlət xadimi, böyük natiq Heydər Əliyevin nitqlərində təfəkkür və nitq feilləri əsasında formalaşmış frazeologizmlər geniş yayılmışdır;

– Hissi feili frazeologizmlər də Heydər Əliyevin müxtəlif üslublu çıxışlarında öz yerini tapır. Bu feili frazeologizmlər ciddi rəsmi görüşlərdə "hissiyyat" konseptini həmişə əldə rəhbər tutan lider dilində səslənir. Sözün qiymətini bilən, sözlə işin vəhdətini öz həyatında həmişə ciddi şəkildə gözləyən siyasi lider üçün nitq feillərinin işlənməsi təbiidir;

– Digər tərəfdən, nitq və ya təfəkkür semasına aid olmayan başqa feillər frazeoloji vahidin tərkibində işlənməklə nitq və təfəkkür qrupunu zənginləşdirən yeni feili frazeologizmlərin formalaşmasında iştirak edir;

– Hissiyyatlarla bağlı bir sıra frazeologizmləri kütlələr necə deyərlər, ilk dəfə Heydər Əliyevin dilindən eşidirlər. Bu frazeologizmlər sonralar ümumişləklik qazanmağa başlayır;

– Heydər Əliyev nitqində hissi və təfəkkür feilləri ilə yanaşı hərəkət feilləri əsasında yaranmış frazeologizmlər də az yer tutmur. Bu frazeologizmlər iqtisadiyyat və siyasətdə dinamik inkişafı əks etdirir;

– Hissi-emosional tipli frazeologizmlər sırasında "qəlb"lə bağlı olanlar Heydər Əliyevin dilində tez-tez səslənir. "Qəlbləri fəth etmək", "ürəkdən istəmək", "qəlbimin hökmü ilə getmək", "ağrı-acısını çəkmək" bu qəbildəndir.

– Bir sıra frazeologizmlərdə həm hissi, həm emosional, həm də təfəkkür çalarları müşahidə edilir.

# VII FƏSİL
# HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ SOMATİK FRAZEOLOGİZMLƏR

Türk dillərinin leksikasının qədim layı insanın bədən hissələri və üzvlərinin adları ilə bağlıdır. Çoxmənalılıq, metaforik və metonimik kimi keyfiyyətlərə malik olan belə adlar əsas mənalarına görə anatomik anlayışlardır. Bədən hissələri və üzlərinin adları türk dillərinin ilkin formalaşma dövrünə təsadüf edir [kazımov]. Frazeoloji birləşmələrə daxil olan nümunələrin əksəriyyəti somatik əlamət daşıyır. Yəni birləşmə insanın bədən üzvləri ilə bağlı olur. Dilə tutmaq – tovlamaq – sözlə fikirdən daşındırmaq (uzaqlaşdırmaq) və s.

Hər bir milli dilin somatik frazeologiyasının dərindən öyrənilməsi o dilin daşıyıcılarının zəngin, rəngarəng və bir qədər də sirli aləmlərinə açılan pəncərədir. Somatizmlər dilin ən qədim leksik qatını təşkil edir, onlar sadə söz tərkibindən ibarət olub çoxmənaliliğa malikdirlər. Bu xüsusiyyətlər frazeoloji birləşmələrin əmələ gəlməsində həmin somatizmləri şərtləndirən yüksək göstəricidir [86,165].

Ə.Hacıyeva somatik frazeologizmləri bir qayda olaraq həm söz, həm söz birləşmələri, həm də cümlə səviyyəsində məcazlaşma prosesinə məruz qalıb semantik bütövlük qazanan və dildə hazır vəziyyətdə mövcud olan sabit dil vahidləri kimi göstərir [86, 142, 165].

Azərbaycan dilində somatik frazeologizmlərin obrazlılığının səviyyəsini artıran vasitələrdən biri də bədii əsərlərin dilində frazeoloji kontaminasiyadan geniş istifadə edilməsidir. Bu zaman ifadələrin komponentləri sırasına əlavə leksik vahidlər artırılır. Belə bədii priyomdan daha çox klassik ədəbiyyat nümayəndələri istifadə etmişlər. Məs: “başına dolanmaq” – “Durum, dolanım başına”, “ələ düşmək” – “Düşdüm dil bilməz əlinə”.

Bədii əsərlərdə frazeoloji kontaminasiya əksər hallarda fərdi müəllif priyomu kimi başa düşülür. Yəni sənətkar öz məqsədindən asılı olaraq fikrini daha qabarıq ifadə etmək üçün bir neçə yaxın, bəzən isə müxtəlif mənalı somatik frazeologizmləri birləşdirir, beləliklə, üslubi cəhətdən daha əlverişli bir tərkib yaranmışdır [86, 87].

Yuxarıda "kontaminasiya" dediyimiz anlayışı təkcə bədii əsərlərin dilində yox, böyük siyasət adamı Heydər Əliyevin çıxışlarında da daha yaxşı izləmək olur. "Ağzını yummaq" somatik frazeologizmi "ağzını o qədər tez yumacağıq" formasında səslənərək obrazlılığı dəfələrlə gücləndirmiş olur: "Amma bunu nə qədər tez başlasaq, bu işin qarşısını almaq istəyənlərin *ağzını o qədər tez yumacağıq*" [XXIVc.s.158]. Başqa bir məqamda bu özünü aşağıdakı kimi göstərir: *"Gözünü dünyaya açmaq* – dünya ilə müasirliklə tanış olmaq; dünyanı dərindən dərk etmək; "Əgər Cəlil Məmmədquluzadə kimi şəxsiyyət dünyaya gəlməsəydi, əgər "Molla Nəsrəddin" jurnalı yatmış insanları *qaranlıqdan çıxarmağa* çalışmasaydı, əgər onun "Ölülər" əsəri insanların *gözünü real dünyaya açmasaydı* xalqımız bu qədər inkişaf edə bilməzdi" [XXIIc.s.261]. "Qaranlıqdan çıxarmaq" frazeologizmi "gözünü açmaq" somatik frazeologizminin kontaminasiyası ilə auditoriyalara yönəlir.

– somatik frazeologizmlər insanın ətraf mühitə və başqa adamlara münasibətini ifadə edir, həmçinin insanların qarşılıqlı münasibətlərini səciyyələndirir. Məsələn, *buynuz göstərmək (cavab verməyə hazırlaşmaq)* mənasını verir;

– somatik frazeoloji birləşmələr insanın fiziki və emosional vəziyyətini göstərir, hərəkətlərini (əməllərini) təsvir edir Məsələn, *tükləri biz-biz durmaq (dəhşətdən);*

– somatik frazeoloji birləşmələr insanın keyfiyyət-dəyərləndirici, obrazlı (zehni keyfiyyətlərinin, özünü aparmaq qabi-

liyyətinin) səciyyəsini verir. Məsələn, *eşşəyin dal ayağı (qanmaz mənasında);*

– somatik frazeoloji birləşmələr bədən üzvləri ilə bağlı ənənəvi simvolikanı əks etdirilər. Məsələn, *səmimi ürəkdən (düzünü demək)* və s.

Somatik frazeologizmin hər hansı komponentinin dəyişilməsi nəticəsində onun malik olduğu daxili forma (məzmun) dəyişikliyə uğrayarsa, bu variant kimi deyil, sinonim kimi qəbul olunmalıdır. Somatik firazeologizmlərin variantları isə komponentlərdən birinin başqa bir sözlə əvəz edilməsi nəticəsində daxili formaya heç bir xələl gətirmədiyi zamanda mövcud olur [85, 87].

Dildə eyni mənanı ifadə etmək üçün somatik frazeoloji vahidin leksik, leksik-qrammatik və qrammatik cəhətdən dəyişikliyə uğramasına somatik frazeoloji *variasiya*, bunun əsasında yaranan belə sabit birləşmələrə isə frazeoloji *variantlar* deyilir, daha doğrusu, ifadə keyfiyyəti və kəmiyyəti, üslubi və sintaktik funksiyaları, eləcə də mətn asılılığı baxımından fərqli münasibətlərdə olan ortaq komponentli, yaxud keçdiyi inkişaf dövründə ortaq komponentə malik olmuş (iki pilləli və çox pilləli variantlarda) frazeoloji vahidləri frazeoloji variantlar adlandırırlar [307].

Somatik frazeoloji vahidlərin nitqdə işlənmə tezliyinin artması onların komponentlərinin çoxalması ilə müşaiyət olunmasında variantlıq müşahidə olunur.

Somatik frazeoloji antonimlər sırasına, əvvəla bir-birinin əksinə leksik mənaya malik olan, ikinci, hərəsində bır komponent, adətən, genetik cəhətcə antonimlə əvəz edilən söz, müstəsna olmaqla, eyni komponent tərkibinə malik olan və eyni leksik-qrammatik xarakterli somatik frazeoloji birləşmələr daxildir. Somatik frazeoloji antonimlər bir hərəkəti, hadisəni əks istiqamətlərə yönəldir. Məsələn, *başa salmaq – başdan*

*çıxarmaq, ələ almaq – əldən salmaq, əl-ayağa düşmək – əl-ayağa düşməmək və s.*

*Ayaq* tərkibli feili somatik frazeologizmlərdə hərəkət situaiyası müəyyən nöqtədən başlayaraq hərəkət edən obyekin varlığı ilə müəyyənləşir. Hərəkət feillərinin ilk semantik valentliyi hərəkət prosesində olan fiziki varlığa müvafiq gəlir. İstənilən hərəkət hər hansı subyektin müəyyən nöqtədən baş-ayaraq yerdəyişməsi ilə xarakterizə olunur. Hərəkət situasiyası üçün hərəkətin müxtəlif anlarında subyektin lokallaşdırılması prinsipial şərt sayılır. Hərəkətin başlanğıc və son nöqtələri böhran nöqtələri hesab olunur ki, buna müvafiq olaraq hərəkət feillərinin iki müvafiq semantik valentlikləri – başlanğıc və son valentlikləri meydana çıxır [293, 294]. Ayaq tərkibli somatik frazeologizm Heydər Əliyevin dilində inkişafla bağlı məsələlərdə yerli-yerində işlənir: "Biz yenicə doğulmuş bir cocuq, bəbə kimi, hələ *ayaqlarımızı ata bilmirdik*, ancaq Türkiyə bizim *qolumuzdan tutmuşdu*, bizə yardım etmişdi və öz təcrübəsini bizə göstərmişdi" [XLIIc.s.64]. Milli birliyə, milli barışığa çağırış yolunda "ayağından çəkmək" frazeolo-izmi auditoriyalara yön alır: "Dedi-qodu, ədavət, bir-birinin *ayağından çəkmək*, bir-biri ilə münaqişə aparmaq, bir-birinə paxıllıq etmək və özü öz millətini ləkələmək" [XIc.s.363]. Dirçəlmək, inkişaf etmək, inkişafa start vermək baxımından "ayaq üstə qalxmaq" somatizmi işə düşür:"Çox şey dağıldı, amma bir-iki ildən sonra kəndlilər *ayaq üstə qalxdılar*" [XXXVIc.s.74]. Səbatlılıq, özünəgüvənmək, etibarlı şəkildə suverenliyi qorumaq anlarında isə "ayaq üstündə möhkəm dayanmaq" kimi statistik frazem xalqı səfərbər edir: "İndi Azərbaycan müstəqil dövlət kimi *ayaq üstündə möhkəm daya-an* və öz suverenliyinin, öz dövlət müstəqilliyinin, öz milli azadlığının keşiyində möhkəm dayanan bir dövlətdir" [XIIIc.s.237].

– somatik frazeologizmlər insanın ətraf mühitə və başqa adamlara münasibətini ifadə edir, həmçinin insanların qarşılıqlı münasibətlərini səciyyələndirir. Məsələn, *buynuz göstərmək (cavab verməyə hazırlaşmaq)* mənasını verir;

– somatik frazeoloji birləşmələr insanın fiziki və emosional vəziyyətini göstərir, hərəkətlərini (əməllərini) təsvir edir Məsələn, *tükləri biz-biz durmaq (dəhşətdən);*

– somatik frazeoloji birləşmələr insanın keyfiyyət-dəyərləndirici, obrazlı (zehni keyfiyyətlərinin, özünü aparmaq qabiliyyətinin) səciyyəsini verir. Məsələn, *eşşəyin dal ayağı (qanmaz mənasında);*

– somatik frazeoloji birləşmələr bədən üzvləri ilə bağlı ənənəvi simvolikanı əks etdirilər. Məsələn, *səmimi ürəkdən (düzünü demək)* və s.

Somatik frazeologizmin hər hansı komponentinin dəyişilməsi nəticəsində onun malik olduğu daxili forma (məzmun) dəyişikliyə uğrayarsa, bu variant kimi deyil, sinonim kimi qəbul olunmalıdır. Somatik firazeologizmlərin variantları isə komponentlərdən birinin başqa bir sözlə əvəz edilməsi nəticəsində daxili formaya heç bir xələl gətirmədiyi zamanda mövcud olur [85, 87].

Dildə eyni mənanı ifadə etmək üçün somatik frazeoloji vahidin leksik, leksik-qrammatik və qrammatik cəhətdən dəyişikliyə uğramasına somatik frazeoloji *variasiya*, bunun əsasında yaranan belə sabit birləşmələrə isə frazeoloji *variantlar* deyilir, daha doğrusu, ifadə keyfiyyəti və kəmiyyəti, üslubi və sintaktik funksiyaları, eləcə də mətn asılılığı baxımından fərqli münasibətlərdə olan ortaq komponentli, yaxud keçdiyi inkişaf dövründə ortaq komponentə malik olmuş (iki pilləli və çox pilləli variantlarda) frazeoloji vahidləri frazeoloji variantlar adlandırırlar [307].

Somatik frazeoloji vahidlərin nitqdə işlənmə tezliyinin artması onların komponentlərinin çoxalması ilə müşaiyət olunmasında variantlıq müşahidə olunur.

Somatik frazeoloji antonimlər sırasına, əvvəla bir-birinin əksinə leksik mənaya malik olan, ikinci, hərəsində bır komponent, adətən, genetik cəhətcə antonimlə əvəz edilən söz, müstəsna olmaqla, eyni komponent tərkibinə malik olan və eyni leksik-qrammatik xarakterli somatik frazeoloji birləşmələr daxildir. Somatik frazeoloji antonimlər bir hərəkəti, hadisəni əks istiqamətlərə yönəldir. Məsələn, *başa salmaq – başdan çıxarmaq, ələ almaq – əldən salmaq, əl-ayağa düşmək – əl-ayağa düşməmək və s.*

*Ayaq* tərkibli feili somatik firazeologizmlərdə hərəkət situasiyası müəyyən nöqtədən başlayaraq hərəkət edən obyektin varlığı ilə müəyyənləşir. Hərəkət feillərinin ilk semantik valentliyi hərəkət prosesində olan fiziki varlığa müvafiq gəlir. İstənilən hərəkət hər hansı subyektin müəyyən nöqtədən başlayaraq yerdəyişməsi ilə xarakterizə olunur. Hərəkət situasiyası üçün hərəkətin müxtəlif anlarında subyektin lokallaşdırılması prinsipial şərt sayılır. Hərəkətin başlanğıc və son nöqtələri böhran nöqtələri hesab olunur. Buna müvafiq olaraq hərəkət feillərinin iki müvafiq semantik valentlikləri – başlanğıc və son valentlikləri meydana çıxır [293, 294]. Ayaq tərkibli somatik frazeologizm Heydər Əliyevin dilində inkişafla bağlı məsələlərdə yerli-yerində işlənir: “Biz yenicə doğulmuş bir cocuq, bəbə kimi, hələ *ayaqlarımızı ata bilmirdik*, ancaq Türkiyə bizim qolumuzdan tutmuşdu, bizə yardım etmişdi və öz təcrübəsini bizə göstərmişdi” [XLIIc.s.64]. Milli birliyə, milli barışığa çağırış yolunda “ayağından çəkmək” frazeologizmi auditoriyalara yön alır: “Dedi-qodu, ədavət, bir-birinin *ayağından çəkmək*, bir-biri ilə münaqişə aparmaq, bir-birinə paxıllıq etmək və özü öz millətini ləkələmək” [XIc.s.363]. Dirçəlmək, inkişaf etmək, inkişafa

start vermək baxımından “ayaq üstə qalxmaq” somatizmi işə düşür:“Çox şey dağıldı, amma bir-iki ildən sonra kəndlilər *ayaq üstə qalxdılar*” [XXXVIc.s.74]. Səbatlılıq, özünəgüvənmək, etibarlı şəkildə suverenliyi qorumaq anlarında isə “ayaq üstündə möhkəm dayanmaq” kimi statistik frazem xalqı səfərbər edir: “İndi Azərbaycan müstəqil dövlət kimi *ayaq üstündə möhkəm dayanan* və öz suverenliyinin, öz dövlət müstəqilliyinin, öz milli azadlığının keşiyində möhkəm dayanan bir dövlətdir” [XIIIc.s.237].

*Baş* sözü feili ad kimi görünür, əvvəllər “bağlı, əlaqə” mənaları daşımış, bu isə sonralar *baş* sözünün yeni məzmununun təşəkkülü üçün baza olmuşdur.

*1. Əqli fəaliyyət və təfəkkür prosesi bildirənlər*;

*2. Əqli qabiliyyət bildirənlər:*

3. *İnsanın xarakterini, xaşiyyətini bildirən somatik frazeologizmlər;*

Soyuq qanlı olmaq; başını itirmək; tərifdən başı gicəllənmək;

4. *İnsanın emosional vəziyyəti, fiziki durumunu bildirən somatik frazeologizmlər:*

*5. İnsanın davranışını bildirən somatik frazeologizmlər:*

“Baş” sözü ilə formalaşan somatik feili frazeoloji birləşmələr həm Azərbaycan, həm də başqa dillərdə çox zəngin və rəngarəngdir. Təkcə onu demək kifayətdir ki, müasir Azərbaycan dilində “baş” somatizmi ilə əmələ gəlmiş yüz otuz somatik frazeoloji birləşmə qeydə alınmışdır.

Frazeologiyada polisemiya hadisəsinə uyğun olaraq “baş”la bağlı ikikomponentli “başlı-başına buraxmaq” frazeologizmi maraqlı nitq məqamları üçün deyilmiş frazemdir: “Yəni bilirəm ki, bu artistlər xüsusi məxluqdur. Onların işinə qarışmaq olmaz. Onları gərək *başlı-başına buraxasan*” [XLIIIc.s.92]. “Əgər istifadə etmirsə, *başlı-başına buraxıbsa*, orada müdirin heç bir haqqı yoxdur” [XIVc.s.40]. Bu situa-

siyada birinci məqamda siyasi və azadfikirlilik mühüm yer alırsa, ikinci məqamda özbaşınalıq önə keçir.

Xalqın milli ruhuna uyğun olaraq neqativ formada işlənən "başı aşağı əyməmək" somatik frazeologizmi gərgin ictimai-siyasi vəziyyətlərdə auditoriyalara ayaq açır: "Bu gecə vaxtı sizin buraya toplaşmağınız da onu göstərir ki, həyatımız nə qədər çətin olsa da, nə qədər əziyyət içində yaşasaq da, qəddimizi əymirik, *başımızı aşağı dikmirik*" [IIc.s.361].

Etdiyi hər hansı hərəkətdən peşman olmaq, uğursuzluğa düçar olmaq, həqiqəti dərk etmək, situasiyanı anlamaq, həqiqətin harada olduğunu bilmək vəziyyətlərində "başı daşa dəymək", "başı qayaya dəymək" somatizmləri ağsaqqal öyüdü təkin səslənir: "Yəqin, Azərbaycan ağır vəziyyətdə olarkən onun və onun kimilərinin *başları daşa dəydi*, fikirləşdilər ki, Heydər Əliyevə müraciət etmək lazımdır" [XXIVc.s.46]. Xalqı ləyaqətlə təmsil etmək, müəyyən vəzifələrə irəli çəkilərkən etimadı doğrultmaq anları üçün "baş ucaltmaq" frazeologizmindən istifadə edilir: "Eyni zamanda xalqın *başını ucalda* bilən adam olsun, xalqın səviyyəsini yüksəldə bilən adam olsun" [IVc.s.193].

Əl sözü ilə formalaşmış somatik frazeologizmlərin tarixi Azərbaycan dilində də qədim köklərə malikdir. Belə ki, XIV əsr şairi İ.Nəsiminin dilində əl yumaq ifadəsi "əl çəkmək', "tərk etmək" mənasında işlənmişdir; "Əhdü peymanından, ey yar, istədi can əl yumaq, Qoymadı mehrin vəfası, əhdü peymanın yenə". Əl leksik vahidi sonrakı dövrlərdə də somatik ifadələrin yaranmasında fəal olmuşdur: "Karvan gedər, saqçın, geri qalırsan, Haman əldən qoyma yolu bulunca" (Xətai, XV-XVI əsrlər), "Ta ölüncə əl götürmənəm səndən" (Vaqif, XVIII əsr), "Əl götürüb xakpayinə gəlmişik" ("Şəhriyar", XVII əsr), "Əl qoyub, cümlə fəsadə tikdilər şeytan evin" (Vidadi, XVIII əsr), "Əl çəkdim cahanın varü yoxundan" (Vidadi, XVIII əsr) və s. Somatik frazeoioji birləş-

mələrin əlavə funksiyaları söz birləşmələrində təqlid edilmə prosesini yaradan amillərdən ibarətdir. Onların nitqdə rolu yalnız nominativ və kommunikativ funksiyalarla məhdudlaşmır. Nitqdə somatik frazeoioji birləşmələr daha əlavə funksiyaları da yerinə yetirir: nitqi daha obrazlı və ifadəli edir; – nitqi yığcamlaşdırır; – nitqə ekspressiv-emosionallıq rəngarənglik verir; – nitqdə ümumiləşdirilmiş nəticələr çıxarmağa (geniş həyati ümumiləşdirmə) imkan yaradır; – nitqi terminoloji dəqiqliklə təmin edir; – nitqdə sözlərin mənaca yığımını, birləşməsini yüngülləşdirir [ 66, 85, 295].

Beləliklə, somatik frazeoioji birləşmələr əsas dil funksiyasından başqa əlavə funksiyalar əldə etməklə nitqi zənginləşdirən və ondan istifadə etməyi əsaslandıran ümumişlək söz birləşmələrini təqlid edilən birləşmələrin arasına daxil olur.

Obrazlı frazeologizmlərin öyrənilməsində onların ayrı-ayrı komponentlərinin frazeoloji bağlanmasının böyük əhəmiyyəti olduğu meydana çıxır. Elmi ədəbiyyatın xülasəsi göstərir ki, dilçilikdə tiplərin və məna növlərinin müxtəlifliyi baxımından bir çox nöqteyi-nəzərlər mövcuddur. Alman mütəxəssisi V.Şmidt bu problemlə bağlı, xüsusilə feil sahəsində çox ciddi işlər görmüşdür. İki əsas kontekstdə – leksik və sintaktik kontekstdə obrazlılıqla bağlı feillərin frazeoloji bağlılığını tədqiq edərkən, müəllif belə bir mühüm nəticəyə gəlir ki, frazeoloji cəhətdən məna bağlılığı özünün qradasiyasına malikdir. Somatik frazeoloji vahidlərin obrazlılığının əsasında fiziki və psixi vəziyyətin emosional ifadəsinə xidmət edən ümumbəşəri formalar kimi müxtəlif bədən hərəkətləri və jestlər, yaxud müəyyən sosial – simvolik mənalı işarələr durur [221, 222, 224, 255].

Bununla belə örnəklərin sətiraltı mənaları daha geniş, daha əhatəli anlam ifadə edir. Göründüyü kimi, birləşmələrin genişləndirilmiş sətiraltı mənaları somatik əlamətli deyildir. İstənilən bir məfhumun insan əzaları vasitəsilə ifadə olunması

həmin məfhuma daha təsirli, dərin məna çaları vermək istəyindən irəli gəlir. Amma sonralar bu ifadələr – idiomlar, dolayı yolla, olsa da, o dərəcədə sabitləşirlər ki, nəticədə öz-özlüklərində müstəqil bir məfhumu ifadə etmək qəlibində formalaşırlar. Struktur-semantik xüsusiyyətlərinə görə somatik frazeologizmləri iki yerə ayırmaq olar: Bir somatik sözlü frazeologizmlər; İki somatik sözlü frazeologizmlər. Bir somatik sözlü frazeologizmlər Azərbaycan dilinin dialekt və şivələrində geniş yayılmışdır [98]. Əlini ağzına təpmək, qarnı burnuna dəymək, ürəyi qarnına düşmək və s. Somatik frazeologizmlər əsasən məişət xarakterli çıxışlarda səslənir, bu frazeologizmlər təkrar olunaraq çıxışı yaddaqalan edir [125].

Somatik frazeologizmlərin Azərbaycan dilində mühüm yer tutması siyasi lider Heydər Əliyevin də dilindən yan keçmir. Böyük natiqin işlətdiyi somatik frazeologizmlərlə yanaşı bədən hissələri ilə yanaşı birbaşa bütöv bədən mənasını verən frazeologizmlər də özünə yer alır: “Bunları eləməlisən, çünki sənin imkanların bütün başqa təşkilatların imkanlarından çoxdur. Amma sən bu imkanları *altına yığmısan*. Bəli, Sumqayıtın çox imkanlarından istifadə edirsən, amma Sumqayıta heç bir şey vermirsən. Belə şey olmaz, Fikrət, olmaz!” [XLIVc.s.200]. Yaxud “yaxına buraxmamaq”, “üstünə düşmək”, “canımızı qurtarmaq” kimi somatik frazeologizmlər xəlqiliklə yanaşı müasir insanın da hadisələrə münasibəti baxımından maraq doğurur.

Qeyri-qanuni yolla sərvət toplamağın məcazi mənası kimi “altına yığmaq” işlədilir. Sıxışdıırlmağın, normal işləməyə imkan verilməməyin “üstünə düşmək” frazeologizmlə ifadəsi özünə yer alır: “Təvəkkül Məmmədov deyir ki, Fikrət Sadıqovun qardaşı icra hakimiyyəti başçısının müavini idi, mən onu işdən azad etdim. Ona görə indi Fikrət Sadıqov mənim *üstümə düşübdür*” [XLIVc.s.201].

Eləcə də mənimsəmənin, qeyri-qanuni yolla sərvətin toplanması başqa bir somatik frazeologizmdə – "əlinə almaq"da öz ifadəsini tapır: "Yaxşı, sən bunları *əlinə almısan*, özəlləşdirmisən, götürdüyünü götür. Bəs, Sumqayıta nə xeyir vermisən? " [XLIVc.s.201].

Yaxud məmurların xalqdan ayrı düşməsi, kreslolar tutandan sonra, necə deyərlər xalqı "yaxına buraxmaması" işə düşür: "Amma icra hakimiyyətinin başçısı deyir ki, Sadıqov bizi *yaxına qoymur*" [XLIVc.s.200]. İnsanları əsassız olaraq tutduqları vəzifədən uzaqlaşdırmaq mənasında "çölə atmaq" frazeologizmi işə düşür: "O biri qardaşım iqtisadçıdır. Tibb İnstitutunda iqtisad kafedrasının müdiri idi. O vaxt çıxartdılar, *atdılar çölə*" [XLIVc.s.204]

"**Baş**" sözü ilə bağlı olanlar:

"**Üz**" sözü ilə bağlı olan frazeologizmlər: (h/t üzü əti tökülmək) – xəcalət çəkmət, utanmaq.

Üzü ağ; Üzündən zəhər axmaq

"Ağızla" bağlı frazeologizmlər: ağzına su almaq; Susmaq, lal olmaq mənasında işlənir.

Azərbaycan dilində gözdən düşmək ifadəsi işlənir avar dilində ona ağız sözü də əlavə olunur.

Özünü gözə soxmaq.

"Gözlə" bağlı işlənən frazeologizmlərdən G. Xəlilova geniş bəhs etmişdir. O, hətta Azərbaycan dilində göz sözü ilə bağlı yaranan çoxlu sayda sözlərə, o cümlədən frazeologizmlərə, həmçinin onların ifadə etdiyi mənaları izah etməyə çalışmışdır. Ona görə də biz onun üzərində çox dayanmağa ehtiyac duymadıq, bir neçə nümunənin izahı ilə kifayətlənməli olduq.

gözləri hədəqəsindən çıxmaq; gözləri ağrıdan tökülmək; baxıb göz çatmayan yer – uzaq yer;

"Əl, ayaq" sözləri ilə bağlı olan frazeologizmlər: – əlini heç nəyə vurmamaq;

"Ürək" sözü ilə bağlı işlənən frazeologizmlər: – ürəkdən sevmək, fərəhlənmək.

1. İki komponentli frazeologizmlər.
2. Üç komponentli frazeologizmlər.
3. Üçdən artıq komponentli frazeologizmlər.

Avar dilçiliyində Maqamedxanov M. [116] isə avar somatik frazeologizmlərini 6 yerə bölmüşdür ki, bunlar da aşağıdakılardır: 1) ismi frazeologizmlər 2) feli frazeologizmlər 3) sifət mənalı frazeologizmlər 4) zərf mənalı frazeologizmlər 5) modallıq bildirən frazeologizmlər 6) nida bildirən frazeologizeologizmlər [116].

Aristotelə görə əl "alətlər alətidir". Kvintilian deyir: "Söyləyə bilərik ki, əllər demək olar ki, danışırlar. Məgər biz tələb edərkən, söz verərkən, yekun vurarkən, hədələyərkən, yalvararkən, ikrah və qorxunu, sual və inkarı ifadə edərkən onlardan istifadə etmirikmi? Məgər sevinci, kədəri, etirafı, tənbehi, peşmanlığı, ölçünü, miqdarı, sayı və vaxtı demək üçün onlardan faydalanmırıqmı? Məgər həyəcanlandıran və qadağa qoyan, razılıq, təəccüb, utanc ifadə edən onlar deyilmi?" [145]. Danışıq etiketində, jestlərdə əllər əvəzedilməzdir. Azərbaycan və rus xalqlarının uzaq keçmişinə söykənən, siyasi, ticari və mədəni əlaqələr nəticəsində meydana gələn ortaq jestlər kifayət qədərdir. Zamanla frazeoloji birləşmələrə çevrilmiş belə jestlər dildə insanın əhval-ruhiyyəsini, emosiyalarını, xarakterini, eləcə də onun hərəkət və ya davranışım ifadə edirlər: *əl qaldırmaq-поднимать руку, əli ağzında qalmaq (təəccüblənmək) – разводить руками, əlini əlinə vurmaq, всплеснуть руками, əllə görüşmək – здороваться за руку, əlini sıxmaq – сжать руку, əl çalmaq – бить в ладони (ладоши).*Q.K.Kreydlin [253] bunları jest frazeologizmlər *("жестовой фразеологизм)* və ya jest frazemlər ("*жестовая фразема")* adlandırır [253]. Əl jestlərinin bir çoxu bütün dünyada eyni məna daşıyır; əllərin yuxarı qaldırılması müqa-

vimətə son qoymaq, mərhəmət diləmək ifadə edir: *əllər yuxarı” –* ***рукиввepx****!*

Əl dostluq, etibarlılıq, sədaqət rəmzidir; insanlar bir-birilə rastlaşanda əllə görüşər, tərəflər müəyyən razılığa gələndə bir-birinə əlini uzadarlar. Əl qayğı, diqqət və sevgi nişanəsidir. Əl həm də hörmət, pərəstiş rəmzidir; qərb mədəniyyətində qadın və ya rahibin əlini öpmək adəti buradan qaynaqlanır. İslam dünyasında (xüsusən türklərdə) isə uşaqlar və gənclər müqəddəs bayramlarda yaşlı insanların əlini öpər, bunun qarşılığında onlara *“əl öpənlərin çox olsun”* deyilər. Əlöpmə adəti oğuzlardan gəlir.

Əl demək olar ki, bütün mədəniyyətlərdə hakimiyyət, idarəçilik rəmzi olaraq gücü, qüvvəti bildirir. Dövlətlərin bayraq və gerblərində qılıncdan və digər hakimiyyət atributlarından yapışan əl təsviri bunu sübut edir. Əl komponentli frazeoloji birləşmələrin bir hissəsi insan şəxsiyyətini simvolizə edir. İnsan xarakterinin müsbət və mənfi tərəflərini səciyyələndirmək üçün əllər yaxşı vasitədir [145, 261, 285].

İnsanın ilk say, hesab “maşını” elə onun öz əlləri olmuşdur [145]. Bu fikri frazeoloji birləşmələr də təsdiqləyir: əllə saymaq olar – по пальцам рук можно пересчитать, əlini uzatsan çatar – рукой подать, əlinini altında – под рукой. “Bir şeyin az olduğunu bildirmək üçün bu gün də xalq arasında işlədilən “bu əllərim, ayaqlarım var olsun” deyimi isə insanların bərk ayaqda, başqa güman yeri görmədikdə özünün ilk əmək alətinə (eyni zamanda ölçü vasitəsinə) ümid bəslədiyini, ona arxalandığını göstərir” [161].

Əlinin forması, onun üzərində olan qırışlarla insanın təbiətinə və ürək sirrinə bələd olmaq, keçmişi və gələcəyindən xəbər tutmaq olar: əlinin içi kimi tanımaq – знать как свои пять пальцев. Dilimizdə “əlimin içini iyləmişdim?” frazeoloji birləşməsi də buradan qaynaqlana bilər. Əlin rəmzi mənasından danışarkən qeyd etmək lazımdır ki, sağ əllə sol əl bir-

birindən fərqli – əks mənalar ifadə edir. Bütün mədəniyyətlərdə üstünlük sağ ələ verilir, onun uğur daşıdığına inanırlar: "sağ əlin qaşınsa pul gələr", "sağ əlin başıma", "sağ əlin verdiyini sol əl bilməməlidir" [145].

Geniş yayılmış "əl" somatik frazeologizminin siyasi natiqlikdə yerini müəyyənləşdirmək maraqlı olardı. Bu baxımdan Heydər Əliyev dilində özünəməxsusluğu ilə seçilən bu frazeologizmin tədqiqi gənc diplomatlar üçün, dilçilər üçün aktualdır. Müəyyən çətinliklər qarşısında, bədbin əhval-ruhiyyə anlarında insanın öz qüvvələrini səfərbər edə bilmədiyi vaxtlar "əla almaq" frazeologizmi işə düşür: "Təəccüblənmək olar ki, insan bəzən bir az xəstə, yaxud da bir çatışmazlığı olanda onda bədbinlik əmələ gəlir, özünü *ələ ala bilmir*" [XXXIc.s.60].

Siyasi və iqtisadi layihələrin həyata keçirilməsi ilə bağlı yaşanılan çətinliklərdə "əliboş dağılmaq" frazeologizmi Heydər Əliyevin dilində aşağıdakı kimi auditoriyalara yön alır: "Yəni mən prinsipcə bunun əleyhinə deyiləm, istənilən vaxt toplaşmaq olar, amma düşünmək lazımdır, necə etməli ki, bu beşlik (red. beş təşkilat) həqiqətən görüşüb, *əliboş dağılmasın*" [XXXIc.s.29].

Maaşından əlavə pul, rüşvət alanlar üçün xalq dilində, necə deyərlər, loru leksikada "əlləri qızdırmaq" frazeologizmi səslənir: "Xatirimdədir, 70-ci illərdə (XX əsr) biz qanun pozuntusunun yaxud da müəllimlərin vəzifədən sui-istifadə etməsinin, rektorların bu işdə *əllərini qızdırmasının* və sairənin qarşısını almaq üçün çox işlər görürdük" [XXXc.s.358].

Qanunsuz işlərini davam etdirənlərə hüquqi-siyasi dildə ulu öndərin nitqində inkarda işlədilən "əl çəkməmək" frazeologizmi, səslənir: "Ancaq ondan sonra da daxildə hakimiyyət uğrunda qanunsuz mübarizə, silahlı mübarizə aparan dəstələr öz əməllərindən *əl çəkmədilər*" [XXIIc.s.99]. Fəaliyyətin tam məhdudlaşması anları üçün "əl-qolu bağlanmaq"

frazeologizmi meydana çıxır: "O vaxt bu sahədə çalışan vəzifəli şəxslər o cümlədən də Nazirlər Kabineti, nazirliklər, müəssisə rəhbərləri çox sikayətlənirdilər ki, onların əl-qolu bağlanıb" [IIc.s.30].

Ərazilərimizin itirilməsi ilə barışmayan natiq bu "itirilməni" əldən getmək kimi qiymətləndirir. Xalq ruhu bu frazeologizmdə də duyulmaqdadır: "Kəndlərimiz *əldən gedir* və bu, son illərdə Azərbaycanın həyatının adi bir amili olmuşdur" [Ic.s.101].

"Yardım əli uzatmaq" əllə bağlı bu frazeologizm türkdilli xalqların dövlət başçıları, nümayəndələri qarşısında, müsəlman ölkələrinin iqtisadi, siyasi forumlarında bir-birinə kömək etmək anlamında özünə yer tapır. Bu frazeologizm "dara düşmək"lə bərabər işlənərək frazeologizmin məna yükünü gücləndirməklə yanaşı, izahını da özünəməxsusluqla verir: "Bunun naminə biz müsəlman ölkələrinin inkişafına mane olan əngəlləri aradan qaldırmalı, bir-birimizə *yardım əli uzatmalıyıq,* parçalanmanın və təklənmənin qarşısını almalıyıq, dara düşmüş qardaşlarımıza birlikdə kömək etməliyik" [IIIc.s.19].

Qanunlarımızı təkrar pozaraq, müstəqilliyimizin möhkəmlənməsi yolunda bəd əməllərindən əl çəkməyənlərə Heydər Əliyev dilində hazır frazeologizm – "baş qaldırmaq" var: "Ancaq indi yenə baş qaldırmışlar" [IIIc.s.264].

Kiməsə güvənərək, kiməsə arxalanaraq, kiminsə "əlindən tutaraq" qeyri-qanuni yollar axtaranlar üçün "əl yeri tapmaq" frazeologizmi ünvanlanır: "Bu üsulun tətbiqi zamanı bəzi qüvvələrin yenə də *əlyeri tapıb*, qeyri-qanuni hallara yol verməsinin qarşısını almaq gərəkdir" [IIc.s.217].

Dövlətçilik əleyhinə olan çıxışlarda qanunları pozmağa yönələn cəhdlər "əl atmaq" frazeologizmi ilə dilə gəlir: "Beləliklə, Azərbaycanı parçalamaq, talış köklü Azərbaycan

vətəndaşlarını respublikanın başqa hissələrinə qarşı qoymaq kimi hallara *əl atdılar*" [Ic.s.103].

"Bacardığı qədər", "gücü çatanadək" mənalarında işlədilən "əlindən gələni etmək" somatik frazeologizmin də Heydər Əliyev nitqində xüsusi çəkiyə malikdir: "Qürur hissi ilə qeyd etmək istəyirəm ki, müstəqil Azərbaycan Respublikası və onun dövləti öz böyük oğlunun – böyük Füzulinin xatirəsini bu günün imkanları çərçivəsində qeyd etmək üçün *əlindən gələni etmişdir*" [VIIIc.s.31]. "Bu günün imkanları çərçivəsində" ifadəsi tədbirlərlə bağlı xoşagəlməz fikirlərin səslənməsinə yer qoymur. Diplomatik dil həmişəki kimi parlayır.

Xalqın qazandığının mənimsənilməsi, qeyri-qanuni yollarla büdcədən çıxarılması situasiyaları nitqdə "əlinə keçmək" frazeologizmi ilə dinləyici şüuruna çatdırılır: "Bir çox sahələrdə ixrac olunmuş malların dəyərinin heç 10 faizi də respublikaya qayıtmamış, haradasa qalmışdır, ayrı-ayrı adamların *əlinə keçmişdir*" [I c.s. 253]. Müstəmləkə olmaq mənasında işlədilən "əlinin altına keçmək" somatik frazeologizmi işlədilir: "Ancaq bu cümhuriyyət o dövrün şəraitinə görə 23 ay yaşadı, sonra isə Azərbaycan sovet hakimiyyətinin *əlinin altına keçdi*" [XXIIc.s.322].

Təcavüzkarlar, dövlətçiliyə qarşı olanlar "əlləri kəsmək" somatik frazeologizmi ilə yerində oturdulur: "Dərs olmalı idi ki, Azərbaycan bütün daxili problemləri kənara qoyub xarici qüvvələrin respublikamıza uzatdığı *əlləri kəsə bilsin*, onların bu qəsbkar meyllərinin qarşısını ala bilsin" [VIc.s.79]. Əgər "əl uzatmaq" bir mənada müstəqilliyə qarşı, dövlətçiliyə qarşı yönələn əməllər kimi başa düşülürsə, Heydər Əliyevin dilində başqa bir məqamda maddi və mənəvi cəhətdən kömək etmək kimi anlaşılır: "Amma bu təbii qanunlar içərisində də bir olmaq, daha da sıx olmaq, bir-birinə dayaq olmaq, *əl uzatmaq* üçün imkanlar çoxdur" [VIIc.s.18]. Məsələni şəxsi nəzarətə almaq, nəzarətə götürmək mənasında "ələ götürmək" somatik

frazeologizmi öz yerini alır: "Bu məsələni *öz əlinizə götürün*" [XXIIc.s.272].

Hər bir milli dilin somatik frazeologiyasının dərindən öyrənilməsi o dilin daşıyıcılarının zəngin, rəngarəng və bir qədər də sirli aləmlərinə açılan pəncərədir. Somatizmlər dilin ən qədim leksik qatını təşkil edir, onlar sadə söz tərkibindən ibarət olub çoxmənalılığa malikdirlər. Bu xüsusiyyətlər frazeoloji birləşmələrin əmələ gəlməsində həmin somatizmləri şərtləndirən yüksək göstəricidir.

Ə.Hacıyeva somatik frazeologizmləri bir qayda olaraq həm söz, həm söz birləşmələri, həm də cümlə səviyyəsində məcazlaşma prosesinə məruz qalıb semantik bütövlük qazanan və dildə hazır vəziyyətdə mövcud olan sabit dil vahidləri kimi göstərir [165].

Araşdırmalar göstərir ki, dünya dillərində somatik frazeologizmlərin çoxu əl və ayaq anlayışları ilə bağlıdır. "Dünya dillərinin hamısında idiomatikliyi yaradan ən mühüm və aparıcı üzv əldir" [261, 285]. Çünki *əl* insanın fiziki fəaliyyətində həmişə əsas köməkçi funksiya daşımışdır. Təəccüblüdür ki, ayrı-ayrı bədən üzvlərinin simvolik dil kimi müxtəlifliyi genişdir. Dünyanın hər yerində yaşayan xalqların müdrikliyi və təssəvürü simvollarda cəmləşir. Xüsusilə də mədəniyyət mərkəzi kimi sayılan Çin, Hindistan, Misir, İtaliya və s. ölkələrdə işarə dili mühüm rol oynayır. Bir çox mənbələrə müraciət etdikdə görürük ki, simvol, işarə dili kimi rol oynayan bədən üzvləri hər şeydən əvvəl müxtəlif dinlərdən irəli gəlir. Qol və qıç simvolları ilə əl və ayağın simvolik mənası sıx əlaqədardır. Frazeologiyada qol adətən hakimiyyət simvolu daşıyır [85].

Əl sözü ilə formalaşmış somatik frazeologizmlərin tarixi Azərbaycan dilində də qədim köklərə malikdir. Əl leksik vahidi sonrakı dövrlərdə də somatik ifadələrin yaranmasında

fəal olmuşdur. Məsələn, əldən qopmaq, əldən tutmaq, əl çəkmək və s.

Somatik söz birləşmələrinin leksik-semantik təhlili müxtəlif dillər üçün ümumi xarakterli bir neçə qanunauyğunluğu aşkar etmişdir. Sərbəst söz birləşməsinə keçməsi ictimai amillərlə şərtləşir, eyni zamanda dilin daxili qanunlarına tabe olmağı ilə bağlıdır. Söz birləşməsi frazeologiya kateqoriyasına keçən kimi semantik struktur cəhətdən məhdudiyyətə uğrayır və frazeologizmə xas olan təkmənalılıq əldə edir. Bu dilin leksik-semantik sisteminə keçdikdə, frazeoloji söz birləşmələrində milli dil parlaq şəkildə özünü göstərir. Somatik frazeoloji cümlələrin növləri ilk baxışda feili və ya ismi xəbərli qrammatik cümlələri xatırladır. Somatik tərkibli frazeoloji cümlələrin bir qisminin xəbəri feillə, bir qisminin xəbəri isə adlar qrupundan olan sözlərlə işlədilir. Buna görə də belə konstruksiyaları iki qrupa ayırmaq olar [100].

1) Feili xəbərli somatik frazeoloji cümlələr

2) İsmi xəbərli somatik frazeoloji cümlələr

Feili xəbərli somatik cümlələr iş, hal vəziyyət ifadə edir və ya səciyyələndirici məzmuna malik olur [267].

Somatik frazeologizmlər Heydər Əliyevin dilində ekspressivlik qazandırmaq baxımından tez-tez səslənir. Bütün nitq və çıxışlarda olduğu kimi izahedicilik, frazeologizmin məna çalarlarının açıqlanması ön planda olur: “Sonrakı illərdə də biz çox çətinliklərlə, maneələrlə rastlaşdıq. Bir neçə ölkədə bizim əleyhimizə mətbuatda indiyə qədər də təbliğat aparılır. Təbiidir ki, Azərbaycana düşmən gözü ilə baxan, yaxud da ki, qısqanan dairələrin fəaliyyəti nəticəsində yenə də Azərbaycanı dünya miqyasında *gözdən salmaq* istəyirlər” [XXXVIc.s.136].

Başqa bir nitq situasiyasında “əl çalmaq” frazeologizmi auditoriyaya yönəlir: “Nümunə göstərirəm Səfərəli Babayev. Mən onu tanıyıram. *Əl çala* bilərsiniz, doğrudan da o, layiqli adamdır. O da başqaları kimi burada yaşadı, böyüdü, alim

oldu. Ondan sonra düşünərdi ki, mən niyə Naxçıvanda oturum, Bakıya gedim, orada özümə ev alım, uşaqlarımı da yığım ora." Yuxarıdakı mətndə "əl çalmaq" frazeologizmi ilə Naxçıvandakı ləyaqətli şəxsləri xalqa nümunə göstərir, xalqa tanıdır. Məskunlaşmanı, doğma torpaqları tərk etməməyi Səfərəli Babayev timsalında auditoriyaya söyləyir. Heydər Əliyevin nitqlərində etik dəyərlər monoqrafiyanın III cildində geniş işıqlandırılmışdır. Burada biz bu etik dəyərləri frazeologizmlərlə verməyə üstünlük verdik. Nitqin gedişində antietik dəyərləri frazeologizmlərin köməyi ilə vermək, eləcə də bu frazelogizmləri digər nitq hissələri ilə harmoniyada təqdim edə bilmək Heydər Əliyev nitqlərində mükəmməl səslənir. Naxçıvan Olimpiya İdman kompleksinin təntənəli açılış mərasimindəki nitqdə (15 iyun 2002-ci il) Naxçıvan əhalisinin ümumən malik olduqları yüksək insani dəyərləri sadalayır: "Naxçıvanlılar fədakardırlar. Naxçıvanlılar təvazökardırlar, zəhmətkeşdirlər. Mən bir-iki dəfə demişəm, naxçıvanlılar Naxçıvanı əhatə edən *məğrur qayalar* kimi məğrurdurlar" [XXXIXc.s.126].

Sonrakı nitq mərhələsində feilin əmr şəklində səslənən "gərək təvazökar aparsınlar", "burunlarını dik tutmasınlar" ifadələrlə qətiyyət dolu nitq nümayiş etdirilir, auditoriya səfərbər olunur: "Ancaq birincisi, naxçıvanlılar özlərini gərək təvazökar aparsınlar. Heç vaxt *burunlarını dik tutmasınlar*. Yəni *başı dik tutmaq* olar. İnsanın başı dik olmalıdır, amma burnu yox. Onda o insanın *keyfiyyəti mənfi olur*. Mən indi nazirlərə bu qədər göstərişlər verirəm. Ondan sonra siz hər bir naziri gətirib qapınızda saxlayasınız, yaxud deyəsiniz ki, mənim bu gün vaxtım yoxdur, sabah gəlin. Yaxud da özünüzü təkəbbürlü aparasınız, təvazökar olmayasınız. Siz bununla mənim dediyim gözəl sözlərə böyük *ləkə vurmuş* olacaqsınız" [XXXIXc.s.127]. Elə bu mətndə Heydər Əliyev frazeologizm-

lərin pozitiv və neqativ mənada işlənməsinin izahını özü auditoriyalara bəyan edir.

Somatik frazeologizmlər Heydər Əliyevin müxtəlif üslublu çıxışlarını və müxtəlif məqamlı görüşlərini bəzəyir. Hissi-emosional vəziyyətlərə uyğun olaraq "gözünün üstündə qəbul etmək" frazeologizmi eləcədə diplomatik məqsədlər güdür: "Azərbaycan xalqı sizi bax, belə sevgi ilə, belə məhəbbətlə, hörmətlə qarşılayır, sizi qucaqlayıb öpür, sizi gözünün üstündə qəbul edir" [IIIc.s.390]. "Üz"lə, "sifət"lə bağlı "üzgörənlik" frazeologizmi mənfi mənada dövlətçilik əleyhinə olaraq insanlara fərdi yanaşmaq hallarında işlədilir. Bu frazeologizm məmurları səfərbər edərək düzgün mövqe tutmağa çağırış kimi səslənir: "Onlardan hər hansı birinə üzgörənlik etmək nəticə etibarı ilə hər birinə eyni münasibət bəsləməlidir" [IIIc.s.90]. Birgə işləmək, birgə fəaliyyət göstərmək anlamında "çiyin-çiyinə işləmək" frazeologizmi dilə gətirilir: "Vaxtilə mənimlə *çiyin-çiyinə işləmiş* adamlardan bir çoxu da mənimlə görüşməkdən çəkinirdi" [IIIc.s.178]. "Üz"lə bağlı başqa bir nitq məqamında "üz-üzə gəlmək" işlənir: "Azərbaycan xalqı belə çətinliklərlə çox *üz-üzə gəlmişdir*, lakin milli qürurunu, mənliyini, mənəviyyatını, ən nəhayət, ümidini heç vaxt itirməmişdir" [IIc.s.147].

Digər somatizmlər kimi "göz"lə də bağlı "gözdən qaçmaq" frazeologizmi qanunlara qarşı çıxanların sərt şəkildə cəzalandırılmasını diqqətə çatdırır: "Mən bir daha xəbərdarlıq edirəm: qoy heç kim güman etməsin ki, belə əməllər gözdən qaçacaq, yaxud onları görən yoxdur, bunlara görə cəza verilməyəcəkdir" [IIc.s.109]. "Göz"lə bağlı başqa bir frazeologizm "göz dikməmək" Heydər Əliyevin dilində daha çox səslənir: "Bir daha bildirirəm ki, biz öz torpaqlarımızı müdafiə edirik, başqalarının torpaqlarına *göz dikməmişik*, heç bir ölkənin torpağını zəbt etməmişik və etmirik" [Ic.s.305]. Burada inkarda işlənən "göz dikməmək" frazeologizmi işə düşür.

Tədqiqatlar göstərir ki, somatik frazeoloji vahidlərin obrazlı əsası ingilis və Azərbaycan dillərində əsasən uyğun gəlir. Obrazlılığın meydana çıxmasındakı fərqlər qeyri-somatik komponentlərin, həmçinin də somatizmlərin yüksək dərəcədə detalizasiyası ilə bağlıdır. İngilis dilinə nisbətən Azərbaycan dilində daha yüksək obrazlılığa və bununla da, böyük frazeoloji əlaqəlilik ifadəsinə meyllillik müşahidə edilir [85, 87].

"Boğaz"la bağlı frazeologizm qardaş Türkiyədə səfərdə olarkən bəyan edilir. Bu frazeologizmi eşidən qonşu respublikada Azərbaycanın problemlərinə diqqət göstərilməsini tələb kimi qoyur: "Azərbaycanda yenə bir söz var, öz *boğazından kəsib qardaşına verir*" [IXc.s.402].

Somatik frazeologizmlər arasında sinonimlik hadisəsi də diqqəti cəlb edir. Somatik frazeologizmlər Heydər Əliyev dilində geniş istifadə olunur. Azərbaycan xalqının bu tip frazeologizmlərdən çox istifadə etməsi onun siyasi xadiminin də dilində səslənir: "Əgər böyük dövlətlər bəyanat verirlərsə ki, biz Azərbaycanın ərazi bütövlüyünü tanıyırıq, sonra da Azərbaycanın ərazisinin 20 faizinin Ermənistan silahlı qüvvələrinin işğalı altında olmasını görür və buna göz yumurlarsa və hətta deyirlərsə ki, özünüz dil tapın, danışın, deməli bunlar *iki üzlülük* edir, məsələyə *ikili standartla* yanaşırlar" [XLc.s.81]. Yuxarıdakı mətndə üç yerdə somatik frazeologizmlərdən ("göz yummaq", "dil tapmaq", "iki üzlülük") nitq ustalığı ilə istifadə olunmuşdur. Bir bütöv cümlə, bir mətn, üç somatik frazeologizm. Bax, budur fenomenal natiqlik. Təkcə "ikiüzlülük" frazeologizminin ikili standartla qarşılığının verilməsi bir daha izahedici Heydər Əliyev nitqindən xəbər verir.

Somatik frazeologizmləri həm zahiri formasına, həm də daxili mənasına görə başqa frazeologizmlərdən fərqləndirən əsas cəhət onların semantik strukturudur. Frazeoloji birləşmələrin tərkibində somatizmlərdən geniş istifadə olunması,

əsasən, müxtəlif dillərin leksikasında ən qədim qatlardan biri olması və dilin əsas lüğət tərkibinə daxil olması ilə şərtlənir. Somatik frazeoloji birləşmələrin əsas xüsusiyyətlərindən biri onların obrazlı, emosional ifadəli olmasıdır. Bu frazeoloji vahidlər dilin ekspressivliyində xüsusi rol oynayır. Onlar anlayışları digər frazeoloji birləşmələrə nisbətən daha təsirli və obrazlı şəkildə əks etdirir. Məhz bu səbəbdən, Nəsiminin poetik xəzinəsində bu tipli frazeoloji vahidlərin işlənməsi təsadüfi deyil [17]. Məşhur "Yazık" ("Dil") əsərində sözün bu ya digər mənasının meydana çıxmasında mətnin həlledici roluna yüksək qiymət verilir: "Sözün mənası hər dəfə mətn vasitəsilə müəyyənləşdirilir. Sözün müxtəlif mənalara malik olmasına baxmayaraq, məhz onun "xüsusi" mənasını konkretləşdirir".

İnsanın nitq fəaliyyəti dilin bütün vahidləri kimi, frazeoloji vahidlərin də əmələgəlmə mənbəyidir. Xalqın təfəkkür tarixinin inkişaf pilləri, onun milli mədəniyyəti, digər xalqlarla siyasi, iqtisadi, ictimai əlaqələrini dərindən öyrənməyə imkan verən frazeoloji birləşmələr çox qədim tarixə malikdir və həmişə aktual olmuşdur.

Belə problemlərdən biri də bədən üzvlərinin adlarını bildirən «somasemiya» termini ilə adlandırılan leksik. vahidlərdir. Bu və ya başqa xüsusiyyətlər onları qeyri dillərin somasemiyasına yaxınlaşdırır. Frazeologiya V.L.Arxangelski, A.M.Bobkin, S.Q.Qvozdarov, V.P.Jukov, L.A.İvaşko, M.M.Kopılenko, L.N.Kostyuçuk, B.A.Larin, V.M.Mokiyenk, A.İ.Molotkov, M.F.Palevskaya, P.N.Popov, Z.D.Popova, L.T.Royzenzon, Q.A.Selivanov, V.N.Teliya, İ.S.Toropsev, A.İ.Fyodorov, N.M.Şanski, D.N.Şmelov, H.A.Bayramov, A.M.Qurbanov, M.T.Tağıyev, F.H.Hüseynov, Ə.Orucov, M.M.Mirzəliyeva, Ç.H.Qurbanov və başqalarinin əsərlərində həm diaxron, həm də sinxron planda dəfələrlə tədqiq olunmuşdur. Dilin frazeoloji sisteminin müasir vəziyyəti və tarixi

inkişafının bir sıra məsələləri öz prinsipial həllini onların əsərlərində tapmışdır. Lakin bu günə kimi hələ de somatik frazeologizmlər mübahisəli qalmış və bu problem öz həllini tapa bilməmişdir. Bu mövzu ya "frazeologiya"nın bir sahəsi kimi, ya da həmin bəhslə yanaşı öyrənilmişdir. Bu da somatik frazeologizmlərin sərhədinin dəqiqləşdirilməməsi, onun linqvistik xüsusiyyətlərinin aşkar edilməməsi və işlənmə imkanlarının üzə çıxarılmaması, ona məxsus kateqoriyaların müəyyənləşdirilməməsindən irəli gəlir [85].

Təxminən eyni qənaətə A.A.Axundovun "Ümumi dilçilik" kitabında da rast gəlirik: "Dil sistemi deyərkən, bu dil vahidlərinin bir-birilə qırılmaz əlaqədə yaratdıqları mütəşəkkil, vahid bir bütöv, dil quruluşu adı altında isə həmin vahidlərin qarşılıqlı əlaqələrinin toplusunu başa düşürük" [85, 87].

Əgər dilin bütünlükdə lüğət tərkibi ilə frazeoloji vahidlərdə iştirak edən sözlərin kəmiyyətini müqayisə etsək, aydın olur kı, frazeoloji lüğət dəfələrlə azlıq təşkil edir, çünki, hər bir istənilən söz frazeolojı birləşmədə iştirak edə bilmir. Başqa bir cəhət də diqqəti cəlb edir ki, frazeoloji tərkib özünün xüsusi "inventarına", yəni ona daxil olan sözlərə heç də həmişə eyni münasibətdə olmur: bəzi sözlər bir sıra sabit birləşmələrin tərkibində iştirak edir (məsələn, somatizmlər, zoometaforizmlər, botasemizmlər, müəyyən qrup feillər vo s.), digərləri isə, bir, yaxud iki birləşmədə çıxış edə bilir. Külli miqdarda frazeoloji vahidlər azsaylı sözlər vasitəsilə (məsələn, somatizmlərlə) formalaşır. Konkret bir dilin frazeoloji sistemi öz qrammatik və semantik xüsusiyyətlərinə görə həmin dilin bütöv sistemindən kənarda qalmır. Bu əlaqə, bağlılıq bir sıra cəhətlərlə səciyyələnir. Hər şeydən əvvəl, dil sisteminin «sərbəst» cəhəti frazeologiyada xarakterini dəyişir. Sonra, dilin struktur xüsusiyyətlərindən asılı olan frazeologiya dilin heç də yalnız bir səviyyəsində – adətən sintaktik səviyyədə – özünü göstərmir, müxtəlif dil səviyyələrinin qarşılıqlı əlaqə-

lərindən asılı olaraq (məsələn: frazeoloji vahidlərin sintaktik strukturu və sözdüzəldici elementlərin morfoloji strukturu) meydana çıxır. Nəhayət, dilin ümumi sistemi baxmımdan anomal sayılan və yaxşı norma vasitəsilə tənzimlənən dil hadisələri frazeoloji yarımsistemlərin daxilində elə xüsusiyyətlər qazanır ki, onlar başqa keyfiyyətdə olsa da, daimi ifadəlilik qazanır [85, 87].

Birinci növ təyini söz birləşmələri; ikinci növ təyini söz birləşmələri; üçüncü növ təyini söz birləşmələri. Birinci növ təyini söz birləşmələri morfoloji əlamətə malik olmur, yəni bu qrupa daxil olan birləşmələrin tərəfləri heç bir morfoloji əlamət qəbul etmədən yaranır. Bu tip birləşmələrin yaranmasında əsas vasitə yanaşma əlaqəsidir və birləşmənin birinci tərəfi ntributiv, ikinci tərəf isə substantiv xüsusiyyət daşıyır.

“Birinci növ təyini söz birləşmələrinin ikinci tərəfi, bir qaydu olaraq, isimlə və ya substantivləşmiş hər hansı bir sözlə, birinci tərəfi isə isimlə, sifətlə, sayla, əvəzliklə və feili sifətlə ifadə olunur. Misallara diqqət edək: Pişik *asılı ytıfta* əli çatmayanda deyər el-aləmin malını yemək mənə yaraşmaz; *fäıtsız türk* olma, başsız börk olmıı; *Ikl burğa* çarpışır, ortada *göy mllçok* qırılır; Ovçu bezməsə *boz quş* tutur, tələsməsə *aЦ ųų* tutar; *çaşqın qonaq* ev yiyəsini əzizlər, ağırlar; *Beş barmaq* bir olmaz; *Varlı adam* tez qocalmaz; *Omzikli qadın* iştahlı olar; bir cələdən *qorxan quş* qırx il hoçu ağac üstünə qonmaz [112].

Müşahidə və araşdırmalar göstərir ki, dildə tam köhnəlmiş, yaddan çıxmış somatik ifadələr – somasemiya yoxdur, canlı danışıq dilində, eləcə də bədii əsərlərin dilində belə ifadələr həmişə rast gəlir.

«Ümumi dilçilik» kitabında da rast gəlirik: «Dil sistemi deyərkən, bu dil vahidlərinin bir-birilə qırılmaz əlaqədə yaratdıqları mütəşəkkil, vahid bir bütöv, dil quruluşu adı altında isə

həmin vahidlərin qarşılıqlı əlaqələrinin toplusunu başa düşürük.

Dilin sisteminin kəmiyyət səciyyəsi özünü daha çox frazeoloji vahidlərdə əks etdirir. Məsələn, fransız dilində *de* söz önlüyü digər söz önlüklərinə nisbətən üç dəfə çox frazeoloji birləşmələrin yaranmasında iştirak edir.

Frazeologıyaya aid elmi ədəbiyyatın təhlili və aparılan müşahidəlar göstərir ki, hər hansı bir dilin frazeoloji sistemində somatik vahidlərlə yaranmış frazeoloji vahidlər də (somatik frazeologizmlər) əhəmiyyətli yer tutur. Dilin semantik sistemindən asılı olaraq, somatik frazeoloji birləşmələrin komponenti kimi müxtəlif somatizmlər iştirak edir (somatizm – soma "bədən, bədənə aid" yunan sözündən yaranmışdır). Somatizm insanın bədən üzvlərinin adlarını bildirən terminlərdir.

Kozırev L.İ. "əl va ayaq" komponentləri ilə düzələn frazeologizmlərin yaranması ila bağlı özünün namizədlik dissertasiyasında geniş məlumat vermişdir.

Belə frazeologizmlər yüksək dərəcəlı tipolojı oxşarlığa malikdirlər. *Əl və ayaq* somatizmleri çox qədim dövrlərə aid olub, onların fraza yaratma qabiliyyətləri uzun müddət ərzində baş verib [223, 254, 257, 259].

Somatizmlə somatik frazeoloji birləşməni semantik cəhətdən müqayisə etsək, görərik ki, bunlar arasında oxşarlıqlar var. Bu oxşarlıq ondadır ki, hər ikisinin leksik mənaları, özünəməxsus semantikası və qrammatik kateqoriyaları var. Somatik frazeoloji birləşmənin mənası ilə sözün mənası uyğun gələ bilər, *Məsələn, dilini kəsmək-susmaq, gözü su içməmək-şübhələnmək və s.*

Somatik frazeoloji birləşmələr də sözlər kimi qrammatik funksiya yerinə yetirir, cümlə daxilində başqa bir sözlə uzlaşa bilir, idarə edə bilir və yanaşma əlaqəsinə girə bilir. Somatik frazeoloji birləşmələrin qrammatik kateqoriyası onun forma-

sında deyil, məzmunundadır, daha doğrusu leksik mənasının müəyyən bir qrammatik kateqoriyaya aid olmasındadir və leksik mənasına görə də müxtəlif kateqoriyaya malik olurlar.

Dildə mövcud olan somatik frazeoloji birləşmələri müqayisəli şəkildə təhlil etmədən, onlara məxsus ümumi və spesifik cəhətləri araşdırmadan frazeoloji birləşmələrin açıqlanmasından danışmaq mümkün deyildir. Somatik frazeologizmlər iki və daha çox sözün birləşməsindən əmələ gələn hər hansı birləşmə yox, mənaca bütöv, sabit leksik tərkibli və sintaktik quruluşlu ifadələrdir. Biləşmənin sabitliyi və ya onları təşkil edən sözlərin bir məfhum ifadə etməsi sözlərin leksik mənalarından, onların məcazlaşma və obrazlılıq dərəcəsindən asılıdır. Birləşən sözlər öz müstəqilliyini, əşyaya aidliyini itirərək tam məcazlaşma yolu ilə mənaca bütöv və cümlə daxilində bir üzv kimi çıxış edən somatik ifadələr əmələ gətirir. Onları yaradan sözlərin hər biri ayrılıqda məna strukturuna malikdir Lakin onlar tərkibcə öz məna strukturunu dəyışərək bütövlükdə birləşmənin məna strukturunun elementlərinə çevrilir [20, 221, 248].

Somatik firazeologizmlərin məna strukturu üçün tərkib üzvlərinın ayrı-ayrı mənaları yox, məna strukturunun bütövlükdə qrammatik cəhətdən formalaşması və sistem halında dil əlaqəsi lazımdır.

Beləliklə, somatik frazeologizmiəri şərtləndirən əsas əlamətlər aşağıdakılardır; – somatik firazcologizmlər ümumi bir məna ifadə edir; – məna və strukturca tərkiblidir; – tərəfləri məcazi mənada işlədilir; – dildə hazır şəkildə mövcuddur; – milli səciyyəlidir; – obrazlı, emosional və ifadəlidir.

Digər frazeoloji birləşmələr kimi somatik ifadələrin də ümumi mənası onu təşkil edən ayrı-ayrı sözlərin mənası ilə müəyyənləşir, yəni burada ayrı-ayrı sözlərin müstəqil mənalarından asılı olmayaraq bütövlükdə birləşmənin ümumi mə-

nası meydana çıxır. Məsələn, əl-ayağını bağlamaq; özünü ələ almaq; başını itirmək və s.

Göründüyü kimi, belə ifadələri təşkil edən somatik sözlərin mənaları ayrılıqda ifadə etdiyi mənalardan uzaqlaşaraq, ancaq birləşmə daxilində müəyyən bir fikir ifadə edir. Somatik frazeologizmləri tədqiq edən dilçilərdən L.X.Kozırev, O.S.Abdikaimova, R.M.Veyntraub, V.M.Quluxov, N.V.Djanamedze, V.M.Skiner, S.Raye,Y.A.Dolqopolov, A.İsayev, Q.M.Qurbanlı və başqalan da bu fikri təsdiq edirlər.

A.A.Axundovun [20] 1976-cı ildə çıxmış əsərində cəmi bur neçə bədən üzvlərinin (əl, ayaq və s.) adları ilə bağlı materialdan yalnız tarixi-fonetik aspektdə bəhs edilmişdir. Lakin yenicə çapdan çıxmış “Dil və ədəbiyyat” əsərində Azərbaycan dilində insanın bədən üzvləri adlarının fonetik ümumiləşdirilməsini vermiş və qrammatik təsviri təcrübəsini hazırlamışdır. Burada müəllif qeyd edir ki, müasir Azərbaycan dilinin lüğət tərkibində yüzə yaxın somatizmi göstərmək olar [20].

Somatik frazeologizmlərdə (xüsusilə feili somatik frazeologizmlərdə) növ kateqoriyasının təsdiq və inkarlığın ifadəsi özünü göstərir. Müasir dilçilikdə inkarlıq kateqoriyasına istisnasız olaraq daxili və zahiri strukturların müvaziliyi prizmasından yanaşmaq, inkarlıq komponentlərinin reallaşma formalarını cümlənin semantik-sintaktik modifikasiya elementi kimi tədqiq etmək ideyası üstün yer tutur [20].

Dil strukturlarına həqiqətən zahiri forma baxımından yanaşdıqda, müəyyən məntiqi-semantik və üsübi məhdudluqlar nəzərə alınmazsa, hər bir inkar cümlənin müvafiq ilkin strukturdan – təsdiq cümlə formasından – törəndiyini söyləmək olar. Məsələn, göz yummaq – göz yummamaq, uğur qazanmaq – uğur qazanmamaq, ağız açmaq – ağız açmamaq və s. Məsələnin belə sadələşdirilmiş radikal həlli qrammatik inkar-

lıq komponentlərinin reallaşma şərtlərinin linqvistik mexanizminin dürüst və yığcam şəkildə ifadə etsə də, bu “generativ sxematizm” kommunikativlik baxımından özünü doğrultmur, qeyri-universal və birtərəfli xarakter daşıyır, inkarın zəngin və çoxcəhətli ifadə variativliyini bütün genişliyi və rəngarəngliyi ilə əhatə edə bilmir. İnkarlıq semantikasının reallaşması üçün dil-nitq bütövlüyündə eksplisit (aşkar) ifadə vasitələri ilə yanaşı geniş implisit (gizli) ifadə formaları sistemi, kontekstual-semantik kommunikativ-praqmatik və üslubi yönlərdən araşdırılması mühüm nəzəri və əməli əhəmiyyət kəsb edir.

Dil faktlarının təhlili göstərir ki, müəyyən məntiqi-semantik və struktur məhdudiyyətlərin təsiri altında heç bir inkar törədiciliyə yol verməyə təsdiq strukturla yanaşı, təsdiq “ilkinliyə” əsaslanmayan inkar strukturlar da mövcuddur. Birinciləri kommunikativ pozitivlər, ikinciləri isə neqativlər adlandırmaq olar. Bunların sırasında sintaktik frazeoloji birləşmələr – idiomatik cümlə quruluşları, neqativ və privativ frazeologiya xüsusi yer tutur.

Azərbaycan dilində feili somatik ifadələri birinci və ya ikinci tərəfə görə, müxtəlif şəkildə qruplaşdırmaq olar:

Birinci komponentin qrammatik mənsubiyyətinə görə feili somatik frazeologizmləri aşağıdakı şəkildə qruplaşdırmaq olar:

– yönlük halda olan isimlə felin birləşməsi: *gözə gəlmək, başa vurmaq, başa çıxmaq, başa gəlmək, üzə vurmaq, dilə düşmək və* s.; *Gözə çarpmaq* – diqqət mərkəzində olmaq, nəzərdən qaçmamaq, ara-sıra görünmək, nəzəri cəlb etmək; “Bu həmişə *gözə çarpır*” [XXXVIIc.s.429].

– təsirlik halda olan isimlə felin birləşməsi: *dil tökmək, ağız açmaq, başını piyləmək, baş aparmaq, göz vurmaq, əl tutmaq, əlçəkmək* və s.; *Bənd-bərəni bağlamaq* – bütün yolları bağlamaq, inkişafa mane olmaq, hər tərəfi kəsmək; “Yenə də

*bənd-bərəni bağlayaq* və deyək ki, həmin iqtisadiyyatı saxlamaq lazımdır” [Ic.s.26].

– yerlik halda olan isimlə felin birləşməsi: *başda oturmaq*, *ayaqda sürünmək, əldə qalmaq, gözdə olmaq* və s.; *Əldə kağız olmamaq* – şifahi danışmaq, sərbəst fikirləri auditoriyaya yönəltmək; “Siz də, hamımız da bilirsiniz ki, mənim dediyim sözlərin də hamısı öz beynimdən gələn sözlərdir, heç vaxt *əlimdə kağız olmayıbdır*” [XIIIc.s.214].

– çıxışlıq halda olan isimlə felin birləşməsi: *əldən-dildən düşmək, başdan eləmək, gözdən çıxarmaq, ağızdan qaçırmaq*, *gözdən düşmək* və s. *Gözdən qaçmamaq* – diqqətdən yayınmaq; nəzərdə olmamaq; “Mən bir daha xəbərdarlıq edirəm: qoy heç kəs güman etməsin ki, belə əməllər *gözdən qaçacaq*, yaxud görə cəza verilməyəcəkdir” [IIc.s.109].

İkinci komponentinə görə feili somatik frazeologizmləri feilin növünə, təsirli və təsirsizliyinə, zamanına və formalarına görə qruplaşdırmaq olar. Heydər Əliyevin nitqləri somatik frazeologizmlərlə o qədər zəngindir ki, hər bir qrammatik situasiya üçün hazır cümlələr mövcuddur. Felin məna növünə görə:

– feilin məlum növündə işlənənlər: *başa vurmaq, başa qaxmaq* və s.;

– feilin məchul növündə işlənənlər: *alnına yazılmaq, dilindən daş asılmaq, ürəyindən daş asılmaq* və s.;

– feilin qayıdış növündə işlənənlər: *boğazı kilidlənmək*, *boğazı tikilmək, boynuna sarılmaq, ayağına yıxılmaq* və s.

Təsirli və təsirsiz feillərin iştirakına görə işlənənlər:

– təsirli feillərlə işlənənlər: *boğazını üzmək, boğazını islatmaq* və s.

– təsirsiz feillərlə işlənənlər: *başa çıxmaq, boğazında qalmaq, gözdə-qulaqda olmaq, ürəyində qalmaq* və s.

Feilin zamanına görə işlənən somatik frazeologizmlər: – indiki zamanda işlənənlər: *ağzından süd iyi gəlir, gözlərindən qan axır, ağzından qan iyi gəlir* və s., – keçmiş zamanda işlənənlər: *elə bil başına daş düşdü, ağzında quruyub, başına kül olub, başına bir qaynar su tökdü, gözləri kor olmuşdu* və s,; *Dişimizə vurmaq* – sınamaq, yoxlamaq, sınaqdan keçirmək, təyin etmək; ~ sınaqdan çıxarmaq; "Loru dildə desək, biz çox şeyi *dişimizə vurduq* və nəyin nə olduğunu artıq anlamağa başladıq" [Ic.s.166].

– gələcək zamanda işlənənlər: *burnunu tutsan canı çıxar.*

Feilin formalarına görə işlənənlər:

– feilin xəbər formasında: *ağzı qatıq kəsmir, ağız deyəni qulaq eşitmir, barmağına dolayıb*, *ağzına qurd düşüb, dilini udub* və s.

– feilin əmr və arzu formasında işlənənlər: *dilin qurusun, adını çək qulağını bur, gözün çıxsın, dilin ağzında yansın* və s. Felin əmr və arzu formasında işlənən somatik frazeologizmlər daha çoxdur.

Cümlə tipli somatik frazeologizmlər də cümlə daxilində bir sintaktik vəzifə daşıyır, bir cümlə üzvü olur. Adətən, belə frazeologizmlərin xəbərləri daha çox ismi olur və ya *var, yox* sözləri ilə tamamlanır: *ağzının kəsəri yoxdur, ağzında dili yoxdur, ürəyində daş parçası var* və s.

Bir qisim somatik frazeologizmlər Heydər Əliyevin dilində tərbiyəvi xarakter daşıyır. "Döşünə döymək" frazeologizminin ekvivalenti lovğalanmaq, "özündən demək", "təkəbbürlülük etmək"dir ki, bu frazeologizm sovetlər dönəmində səsini çıxarmayan "müstəqillik qəhrəmanlarını" düz yola çağırmağa səsləyir: "Biz hamımız həmin dövrdə yaşayır və onun stereotiplərindən kənara çıxa bilmirdik. Çıxmağa imkan da yox idi, çünki o zaman yazıçı da, alim də, adi adam da belə hesab edirdi ki başqa cür ola bilməz. Ona görə də indi kiminsə dö-

şünə döyməsi mənasızdır. Belələrinin özləri də o zaman bu cür yazmışlar. Bu bizim tariximizin reallığıdır. Onu təhrif etmək olmaz” [IIc.s.95]. Tarix fəlsəfəsini reallıqla dinləyici şüuruna yönəldən böyük natiq “döşünə döymək” frazeologizmi ilə nitqin ekspressivliyini gücləndirməklə yanaşı, məhz somatik frazeologizmi köməyi ilə yaddaqalan nitq nümunəsi yaradır.

Somatik frazeologizmlər Heydər Əliyevin dini-fəlsəfi çıxışlarında özünə yer alır. “Ürəkdə gəzdirmək” frazeologizmi dindarlar auditoriyasında heyranlıqla səslənir: “Səfərin əhəmiyyəti bir də ondan ibarətdir ki, mən və məni müşayiət edən şəxslər müsəlmanların müqəddəs yerlərini ziyarət etdik”. Somatik frazeologizmlər ölkə həyatının müxtəlif sahələrində böyük natiqin nitqlərini tərk etmir. Prezident sarayında respublika iqtisadiyyatının və “həyat”ın digər sahələrinin cari məsələlərinə həsr olunmuş müşavirədə “əl-qolu bağlanmaq” somatik frazeologizmi ilə fəaliyyətin məhdudlaşdırılmasını nəzərə çarpdırır: “Onu da qeyd etmək istəyirəm ki, bir müddət öncə imzaladığım bir fərmanda strateji malların ixracı mərkəzləşdirilmiş və məhdudlaşdırılmışdır. O vaxt bu sahədə çalışan vəzifəli şəxslər, o cümlədən də Nazirlər Kabineti, nazirliklər, müəssisə rəhbərləri çox şikayətlənirdilər ki, onların *əl-qolu bağlanıb*, bu məsələlər mərkəzləşdirilib, sərbəst fəaliyyət göstərə bilmirlər. Halbuki aprelin 5-də verilmiş fərman idxal və ixracın sərbəstləşdirilməsi prinsiplərinə tam müvafiq bir sənəddir və burada əvvəllər qoyulan məhdudiyyətlərinin hamısı götürülmüşdür” [IIc.s.30]. Elə mətndən göründüyü kimi frazeologizmin açıqlamasını “məhdudlaşdırmaq”, “məhdudiyyətlər qoymaq” ifadələri ilə Ulu Öndər özü bəyan edir.

Neft sənayesinin iqtisadiyyatımızdakı vacib rolunu auditoriyanın diqqətinə yönəldən Heydər Əliyev bu sahəni

“onurğa sütunu” ilə müqayisə edir. Onurğa sütununun patologiyalarında orqanizm iflic vəziyyətinə düşdüyü kimi neft sənayesinin də inkişafdan qalması iqtisadiyyatda həmən vəziyyəti yaradır: “Neft sənayesi Azərbaycan xalqına böyük nemətlər veribdir. Azərbaycan xalqının həm iqtisadi, həm elmi, həm mənəvi inkişafında əvəzsiz rol oynayıbdır. Bu gün də Azərbaycanın neft sənayesinin demək olar ki, *onurğa sütunudur*. Ona görə də neft sənayesi daim diqqət mərkəzindədir və neft sənayesində çalışan Azərbaycan vətəndaşları “həmişə hörmət və ehtirama layiqdirlər” [IIc.s.239].

“Qol çirmalamaq”, “qıç çırmalamaq” kimi somatik frazeologizmlər böyük natiqin dilində süstlükdən, ətalətdən, tənbəllikdən çıxmaq mənasında auditoriyaları səfərbər edir, sosial-iqtisadi böhrandan çıxmağın yollarını kənd təsərrüfatı sahəsində çalışanlara göstərir: “Təsəvvür edin, biz gəlib elə bir mərhələdə dayanmışıq ki, buradan nə geriyə çəkilmək, nə də yerində durmaq mümkündür. Amma irəliyə getmək üçün, necə deyərlər, gərək qolumuzu da, qıçımızı da çırmayıb çox cəsarətlə hərəkət edək. Bunun, şübhəsiz ki, çətinliyi olacaqdır” [IIc.s.489]. “Necə deyərlər” ifadəsi ilə frazeologizm “şübhəsiz ki” modalı ilə gerçəkliyə münasibətdə qəti mövqe bildirir.

Başqa bir çıxış məqamında susmaq, etinasızlıq, prinsipsizlik, mövqesizlik mənasında səslənən “ağıza su almaq” somatik frazeologizmi səslənir: “Ancaq burada tamamilə doğru deyildi ki, baş nazir gündə üç dəfə müşavirə yığanda, orada boş-boş sözlər danışanda, axmaq işlərlə məşğul olarkən onun yanında oturan müavinlər ya *ağızlarına su alırdılar*, ya da ki, “baş üstə, baş üstə” deyirdilər” [IIc.s.385].

Çiyinlə bağlı somatik frazeologizmi ciddi siyasi, rəsmi danışıqların gedişində də böyük natiq tərəfindən bəyan edilir. Xalqların, ölkələrin, insanların birgə çalışmaq məqamlarında

"çiyin-çiyinə vermək" frazeologizmi özünə yer alır: "Türkiyə ilə Azərbaycan arasında əlaqələrin böyük tarixi var. Biz kökü bir olan xalqıq. Bizim tariximiz bir, dilimiz bir, dinimiz birdir. Əsrlər boyu xalqlarımız bir-birinə oxşayan, yaxud azca fərqlənən adət və ənənələrini, mədəniyyət və elmini qoruyub saxlamış və inkişaf etdirmişdir. Əsrlər boyu xalqlarımız bir olmuş, *çiyin-çiyinə vermişlər*, Azərbaycan ilə Türkiyə arasında əlaqələri dostluq, qardaşlıq əlaqələri adlandırmışlar". Mətndən göründüyü kimi böyük natiq "çiyin-çiyinə verməyi" elə "dili bir, dini bir" olmaq kimi izahını verir, bu günümüz üçün diplomatik bir frazeologizm yaradır.

Somatik frazeologizmlərə "qan" məfhumu əsasında qurulanları da aid etmək olar. Bu sıraya bir sıra somatik frazeologizmlər aiddir: "qardaş qanı tökülmək", "qana bulamaq", "qanını yerdə qoymamaq" və s.

Hakimiyyətdə olduğu illərin ictimai-siyasi hadisələrin gərgin dövrünə, erməni separatçıları ilə, Ermənistanla müharibəyə təsadüf etdiyi Heydər Əliyevin dilində "qan"la bağlı somatik frazeologizmlərin işlənməsi təbii görünür. "Vətəndaş müharibəsi" anlayışını "qardaş qanının tökülməsi" kimi auditoriyalara anlatmaqla nitqin təsir gücünü, frazeologizmin kütlələrə tərbiyəvi təsirini dəfələrlə artırır: "1993-cü ildə respublikamızın ictimai-siyasi həyatında böyük qarışıqlıqlar olmuşdur. Ayrı-ayrı qruplar arasında qarşıdurma, separatçı qüvvələr tərəfindən Azərbaycanın parçalanmasına yönəldilən meyllər, ictimai-siyasi sabitliyi pozmuş və ilin ortalarında respublikamız demək olar ki, son həddə – vətəndaş müharibəsi həddinə gəlib çatmışdı. Demək olar ki, vətəndaş müharibəsi artıq başlamış, Azərbaycanın bəzi regionlarında *qardaş qanı tökülmüş*, bu da respublikada daxili vəziyyəti həddindən artıq gərginləşdirmişdir. Lakin xalqımız öz müdrikliyini bir daha nümayiş etdirmiş, vətəndaş müharibəsinin qarşısı alınmış, yaranan qarşıdur-

ma aradan götürülmüş, respublikamızı parçalamağa çalışan separatçı qüvvələr zərərsizləşdirilmişdir" [Ic.s.306].

Başqa bir nitq məqamında bu vətəndaş müharibəsinin baiskarları, öz siyasi məqsədləri naminə bu hərəkətləri törədənlər "qana bulamaq" frazeologizmi ilə xalqa tanıdılır. Qardaş qanı axıdanlar, ölkəni "qana bulamağa" hazır olanlar ifşa olunur. Bu ifşa yolunda "qana bulamaq" frazeologizminin semantikası aydın olur: "Xüsusən, son vaxtlar Azərbaycanın daxilində siyasi gərginlik artığına görə, ayrı-ayrı qüvvələr bir-birinə qarşı durduğuna görə və bəzi şəxslər, bəzi qruplar xalq qarşısında tamamilə ifşa olunduqlarına görə təxribat əməllərini daha da genişləndirmişlər. Onlar həmin əməlləri gizlətmək üçün, çirkin niyyətlərinə nail olmaqdan ötrü xalqı, milləti, torpağı qana bulamağa, torpağı satmağa, xalqa xəyanət etməyə nəinki hazırdırlar, hətta bunu həyata keçirirlər" [Ic.s.101].

"Qanı yerdə qalmamaq" frazeologizmi ilə vətəndaş müharibəsinin, Qarabağ müharibəsinin baiskarlarını ciddi qınağa çəkir, qanun qarşısında, ədalət qarşısında tökülən qanların hesabının istəniləcəyi diqqətlərə çatdırır, xalqı səfərbər edərək nikbinliyə çağırır: "Sizin qarşınızda çıxış edərkən Azərbaycan torpaqlarının müdafiəsi yolunda şəhid olmuş həmvətənlərimizin ruhu önündə *baş əyərək* bir də deyirəm ki, Vətən yolunda həlak olanların, müstəqil Azərbaycanın torpaqlarını qorumaq uğrunda şəhid olanların xatirəsi qəlbimizdə əbədi yaşayacaqdır. Allah onlara rəhmət eləsin, qəbirləri nurla dolsun. Onların qəhrəmanlıq nümunələri sizi daha mübariz olmağa dəvət etsin. Mən inanıram ki, siz şəhidlərin qanını yerdə qoymayacaq, Azərbaycanın torpaqlarını şərəflə müdafiə edəcək, respublikamızın ərazi bütövlüyünü təmin etmək üçün əlinizdən gələni əsirgəməyəcəksiniz" [Ic.s.565].

Somatik frazeologizmlər müxtəlif çıxış məqamlarında, müxtəlif üslublarda özünəməxsus Heydər Əliyev nitqində auditoriyalara yön alır. “Qol-qanad açmaq” frazeologizmi bədii üslublu çıxışlarda ənənəvi olaraq izahediciliyi ilə səslənir: “Mən bu gün, saraydakı çıxışımda dedim ki, 25 il bundan əvvəl ilk dəfə Qazaxıstanda olmuş və Azərbaycan xalqı adından Qazaxıstan xalqını təbrik etmişdim. Əsrin dörddə biri qədər vaxt keçmişdir. Qazaxıstan xalqı *tərəqqi etmiş*, *qol-qanad açmış*, özünün bütün ərazisinin, bütün çöllərinin, bütün torpaqlarının sahibi olmuşdur. İndi Qazaxıstan müstəqil dövlətdir. Qazax xalqı öz taleyinin sahibidir və öz məsələlərini istədiyi kimi həll edir. Böyük Abay öz xalqına bunu diləyirdi. Bu arzu, dilək həyata keçmişdir” [IVc.s.163].

Böyük qazax şairi Abay Kunanbayevin 150 illik yubileyindəki çıxışda “qol-qanad açmaq” frazeologizmin sinonimi və izahı verilir: tərəqqi etmək. Və böyük qazax şairinin yubileyində bu cür poetik ovqat yaratmağa xidmət edən frazeologizm seçmək Heydər Əliyev dühasına xasdır.

Xalqların, millətlərin tarixi köklərinin araşdırılmasında frazeologizmlərin əhəmiyyətinin nə dərəcədə böyük olmasını sübut etməyə ehtiyac yoxdur. Necə deyərlər, bugünkü “nitq mədəniyyətinə” qədər xalqlar sadə anlaşıqlı bir dildə bir-birlərini anlaya, fikirlərini izah edə bilirdilər. Bu baxımdan somatik frazeologizmlərin öyrənilməsi dil tarixi baxımından, ümumiyyətlə xalqların tarixi təşəkkülü baxımından çox maraqlıdır. Monoqrafiyada diqqət çəkən məqamlardan biri Heydər Əliyevin Türkiyə ilə bağlı keçirdiyi görüşlər, səfərlər, qəbullar və s. oldu. Heydər Əliyevin 8 may 1997-ci ildə, İstanbulda, “Çırağan” oteldə Türkiyənin “TRT”, “TQRT”, “Samanyolu”, “NTV” televiziya kanallarının rəhbərləri ilə görüşündə və eyni tarixdə “Suis” otelində Türkiyənin iş adamları ilə görüşündəki nitqləri natiqlik, o cümlədən frazeolo-

gizmlər baxımından tədqiq olunaraq aşağıdakı fikirləri ortaya qoydu.

“Boğazından tutmaq”, “barmağı olmaq”, “ağrımayan başı ağrıtmaq”, “qulağının dibində”, “əl çəkmək” kimi çoxsaylı somatik frazeologizmlər işlənir. Bu frazeologizmlərin dilə gətirilməsi Heydər Əliyevin aşağıdakı sitat şəkilli fikirlərinin sübutu kimi səslənir: “Gəlin biz daha da yaxınlaşaq. Millətlərimiz bir-biri ilə nəinki yaxındır, birdir. Dilimiz, dinimiz, qanımız, canımız birdir. Gəlin iqtisadiyyatda da daha da yaxınlaşaq” [IXc.s.417].

Müsahibəsinə “yaralı yer” frazeologizmi ilə başlayır ki, elə bu frazeologizm də somatik sayıla bilir. Yaranın mövcudluğu bədənlə bağlıdır ki, bu zaman yaralı yerin hara olduğunu diqqətə çatdırır. Türk dünyasını vahid bir orqanizmə oxşadan böyük natiq ritorik sualla “yaralı yerin” harada olmasını gündəmə gətirir: “Bilirsiniz, biz türk dünyası haqqında danışırıq, elədirmi? Burada da, Ankarada da, İzmirdə də hamımız böyük iftixar hissi ilə deyirik ki, türk dünyası qalxır, heç vaxt olmadığı kimi bir-birinə yaxınlaşır. Amma bu türk dünyası böyük bir yurddursa, orqanizmdirsə bunun yaralı yeri haradır? Yaralı yeri haradır? Yaralı yeri Azərbaycandır. Hesab edin ki, insanın bədənində harasısa yaralıdır – qolu, qıçı, ya qafası yaralıdır. Qarabağ məsələsi, Ermənistanın Azərbaycana təcavüzü təkcə Azərbaycana qarşı olan təcavüz deyildir” [IX c.s. 397].

Sonrakı müsahibə məqamlarında “boğazından tutmaq” frazeologizmini iki yerdə həm yaxın mənalarda, lakin fərqli çalarlarda işlədilir. Ümumiyyətlə Heydər Əliyevin nitqlərində frazeologizmlərin tam mənasını mətn çərçivəsində tədqiq edib anlamaq mümkündür. Əgər bir mənada “boğazından tutmaq” siyasi məqsədlərlə bağlı işlənirsə: “Amma siz də bilməlisiniz ki, Xalq Cəbhəsi 1992-ci ildə hakimiyyətə gəldi, ondan sonra

20 Yanvar hadisələrini unutdu. Əgər sən müxalifətdə olanda hakimiyyətdəki adamın boğazından tutmuşdunsa ki, 20 Yanvar hadisəsində günahkarsan, filan-beşməkansan, indi hakimiyyət sənin əlindədir, aç bu məsələni, açmadılar!" [IXc.s.399].

İqtisadi anlamda bu frazeologizm maddi olanı, iqtisadi olanı geri almaq, geri qaytarmağı tələb kimi səslənir. Ritorik sualla frazeologizmin təsirini gücləndirir: "Amma Türkiyə Azərbaycana heç bir kömək etmir, – mən maddi köməyi deyirəm. Bir dəfə kredit verib, indi də *tutub boğazımızdan*. Üç-dörd ildən sonra krediti də verə bilməyəcəyik, faizi də o kreditə bərabər olacaqdır. Belə də şey olarmı?" [IXc.s.404].

"Barmağı olmaq" frazeologizminin deyiminədək "nə... nə də" inkarlıq bağlayıcıları ilə, davamiyyət bildirən modallarla (birincisi, ikincisi), ardıcıl ritorik suallarla möhtəşəm nitq qurulur: "Çünki" bağlayıcısı ilə səbəb məlum olur: "Dedim ki, 50 ildən sonra nə sən olacaqsan, nə o, nə də mən olacağam. Şahidlər də olmayacaqdır. Bu, *birincisi*. *İkincisi*, əgər biz bu gün araşdıra biləriksə, nə üçün araşdırmayaq? Nə üçün araşdırmayaq? Nə üçün belə deyirdilər? Çünki hamının bu işdə barmağı vardı – biri o tərəfdən, biri bu tərəfdən" [IXc.s.400].

Türk televiziya işçilərinə ünvanlanan sual: "Azərbaycanda belə bir söz var: ağrımayan başımı niyə ağrıdım. Sizdə belə söz varmı?" – bu məsəlin onlarda da olduğunu göstərir. Bu ritorik sual zərb-məsəllərin də eyniliyini ortaya qoyur. Xalqın azadlığı, ölkənin müstəqilliyi yolunda hər şeydən keçməsini dilə gətirir: "Ona görə mən 20 Yanvar hadisəsini qoymuram unudulsun. 1994-cü ildən indiyə qədər hər il – bu il də – bir ay Azərbaycan televiziyasında bütün bu məsələlər yenidən qaldırılır. Buna Moskvada çox pis baxırlar. Çünki Moskvada o vaxt vəzifədə olan bəzi admlar bu işin günahkar-

larıdır. Əgər mən də özümü o tərəfdən də, bu tərəfdən də qorumaq istəsəm, deyərəm ki, niyə bunu edim, oradan da, buradan da mənə pis baxacaqlar, niyə *başımı ağrıya salım*? Azərbaycanda belə bir söz var: ağrımıyan başımı niyə ağrıdım. Sizdə belə söz varmı? Hesab edirəm ki, əgər mənim başım ağrıyırsa millətin faciəsi ilə bağlı qoy on dəfə də ağrısın"[ IXc.s.400].

Passivliyin, biganəliyin hansı bəlalara səbəb olduğunu həmişə qeyd edən Heydər Əliyev burada da məmurları kəskin şəkildə qınayır: "Amma bizim millətin də passivliyi olub. 1989-cu ildə Gürcüstanın paytaxtı Tbilisidə də xalq *ayağa qalxmışdı*, meydanda mitinq eləmək istəyirdi. Gürcüstanda olan Sovet əsgərləri onları bir az sıxışdırdı, 15-16 adam öldü. Gürcülər *dünyaya hay saldılar*. Moskvadan gürcü xalqından üzr istəməyi tələb etdilər. Moskva hakimiyyəti, yəni Sovet hakimiyyəti gürcü xalqından üzr istədi" [IXc.s.400].

Bu söz sizdə varmı? – deyərək türk dil ağacının şaxələri kimi qardaş Türkiyənin Azərbaycana kömək etməli olduğunu dilə gətirir: "İndi siz də deyirsiniz, dünən də dedilər ki, mən incidim. Bilirsiniz, dost dostdan inciyər. Azərbaycanda bir söz var, insan *uman yerdən küsər*. Bu söz sizdə varmı – uman yerdən küsərlər? Ummayan yerdən mən niyə küsürəm? Küsdüm-küsmədim, onun üçün də, mənim üçün də bunun əhəmiyyəti yoxdur, uman yerdən küsərlər. Azərbaycan Türkiyədən çox şey umur. Bütün xalqımızda, o cümlədən məndə də belə fikir var ki, Türkiyə böyük dövlətdir, böyük imkanlara malik olan dövlətdir. Türkiyə bizim qardaşımızdır. Qan qardaşı olan da, Azərbaycanda yenə bir söz var, *öz boğazından kəsib qardaşına verir.* Lazımdır ki, xalqımızın milli adət-ənənələri dövlətlərimizin arasında da olsun" [IXc.s. 401-402].

Rəhimzadəyə görə [176, 177] dilçilik ədəbiyyatında frazeoloji sinonimlik adı altında "üslubi boyasına, leksik tərki-

binə görə fərqlənən və mənaca bir-birinə yaxın olan müstəqil ifadələr" kompleksi nəzərdə tutulur. Fikri hərtərəfli, obrazlı və dəqiq ifadə etmək üçün bu cür vahidlər əlverişli bədii vasitələrə çevrilir. Bədii əsərlərin dilində (həmçinin nitqdə) belə sinonim cərgələrdən nə qədər geniş istifadə edilsə, o, qədər zəngin olur və canlı danışıq dili ilə əlaqə, frazeoloji ifadə yaradıcılığındakı novatorluq aydınlaşır [87].

"Beyindən gəlmək" kimi səslənən frazeologizmdə siyasi lider Heydər Əliyev çıxışlarında hazır mətnlərdən istifadə etmədiyini dilə gətirir: "Siz də, hamımız da bilirsiniz ki, mənim dediyim sözlərin də hamısı öz *beynimdən gələn* sözlərdir, heç vaxt əlimdə kağız olmayıbdır" [XIIIc.s.214].

Somatik frazeologizmlər arasında Heydər Əliyevin dilində etibarlılıq, zəmanət, timsalı kimi, sütun kimi möhkəmlik anlamında "bel"lə bağlı frazeologizmlər də səslənir: "İkincisi, sizə çox ümid edirəm, *bel bağlayıram*, sizi dayağım hesab edirəm" [XVc.s.412].

"Bel bağlamaq", "onurğa sütunu" kimi frazeologizmlər sinonim somatik frazeologizmlər sayıla bilir "Bu gün də Azərbaycanın neft sənayesi iqtisadiyyatımızın dayağıdır, Azərbaycan sənayesinin demək olar ki, *onurğa sütunudur*" [IIc.s.239]. "Onurğa sütunu" kimi ismi somatik frazeologizmə başqa bir siyasi lider dilində az-az təsadüf edə bilir ki, bu təbii ki, Heydər Əliyevin tibbi biliklərlə zəngin təfəkküründən xəbər verir. "Onurğa sütunu" somatik frazeologizmini eşidən auditoriyanın heyranlığını hər kəs qəbul edər.

"Diz" somatizmi ilə də bağlı böyük natiqin hazır frazeologizmləri var: "Xarici düşmənlərimiz, ayrı-ayrı ölkələrdə Azərbaycanın müstəqilliyinin əleyhinə olan adamlar satqınlıqdan, xəyanətkarlıqdan o qədər istifadə edərək ölkəmizi yenə də *diz çökdürməyə* çalışırlar" [IVc.s.198].

Məsafə ilə bağlı, məkanla bağlı frazeologizmlərdən “qulağının dibində olmaq” yerindəcə işlənir: “Türkiyənin ictimai rəyi, xalqı düşünməlidir ki, Türkiyənin *qulağının dibində* Rusiyanın böyük hərbi, əsgəri hissələri yerləşibdir” [IXc.s.410].

Günahların bağışlanması yolunda, günahların səmimiliklə etirafı yolunda “günahı boynuna almaq” somatik frazeologizmi özünə yer tapır: “Əksinə, onlar öz günahlarını *boyunlarına almaqla*, etiraf etməklə bəlkə də müəyyən qədər cəmiyyətdə anlaşıla bilərlər” [XIXc.s.308].

Qanunlara riayət etməkdən yayınan insanlara “boyun qaçırmaq” frazeologizmi ilə müraciət olunur, bu “boyun qaçırmanın” məsuliyyətini yada salır: “Orduya səfərbərlikdən yayındığına görə, vətəndaşlıq borcunu yerinə yetirməkdən *boyun qaçırdığına*, ordu sıralarından qaçdığına görə məsuliyyətə alınmış gənclərimiz var” [IVc.s.374]. Məsuliyyəti qəbul etmək, xalqın qarşısında məsuliyyət yükünü bölüşmək anları üçün Heydər Əliyevin dilində “yükü boynuna götürmək” somatik frazeologizmin kontaminasiyasına təsadüf edirik. Belə ki, “yük” anlayışı “məsuliyyət”də ola bilər, “ağırlıq” və “çətinlik”də ola bilər: “Amma bu ağır dövrdə xalqın mənə müraciətini qəbul edərək və eyni zamanda qarşımda duran çətinlikləri, böyük problemləri dərk edərək mən bu *ağır yükü boynuma götürmüşəm*” [IIc.s.284]. Elə “boynuna götürməyin” antonimi kimi “boyun qaçırmaq” somatik frazeologizmi dilə gəlir: “Ayrı-ayrı adamlar rüşvət verərək orduda xidmət etməkdən *boyun qaçırırlar*” [Ic.s.494].

“Boğazlarında qalmaq” somatik frazeologizmi ilə xalqın sərvətini talayanlara, mənimsəyənlərə sərt təpki kimi ünvanlanır: “Onların oğurladıqları *sümük kimi* öz *boğazlarında qalmalıdır*” [Ic.s.493].

Tədqiqatımız göstərdi ki, Heydər Əliyevin dilində işlənməyən somatizmlər demək olar ki, yoxdur. Və bu somatik

frazeologizmlər təbii ki, siyasi prinsip və məqsədləri özündə ehtiva edən frazeologizmlərdir. "Barmaq"la bağlı "barmaqla göstərilmək" somatik frazeologizmi kimi: "Xüsusən də xalq içərisində tanınmış adamlar, xalq arasında *barmaqla göstərilən*, həmişə xalqın hörmətini görmüş, həmişə dövlətin qayğısı ilə yaşamış adamların biganə qalmağa mənəvi haqqı yoxdur" [IIc.s.343]. Alınla da bağlı bir çox somatik frazeologizmlər böyük natiqin dilində mövcuddur: "Peyğəmbərin namaz qıldığı minbərin pilləsində oturub, Quranı öpüb gözümə, *alnıma basdım*" [IIc.s.82].

Cinayətlərinin, səhvlərinin bağışlanmasını istəyən şəxslər üçün böyük natiqin dilində "göz yaşı" ilə bağlı somatik frazeologizm mövcuddur: "İndi də güzəşt istəyir, *göz yaşı tökür*" [XVc.s.20].

Nitqlə bağlı somatik frazeologizmlər sırasında "dilə tutmaq", "dilə vurmaq" tez-tez işlənir. "İkincisi, mən hakimiyyətə özüm gəlməmişəm, məni dəvət etmişlər. Məni təkidlə *dilə tutmuşlar*" [Ic.s.23].

Vətənə sevgiylə bağlı, xüsusən xarici səfərlərdə olarkən soydaşlar ausitoriyasında "ürəyi getmək" frazeologizmi özünə yer tapır: "Bilirəm ki, vətəndən ötrü sizin *ürəyiniz gedir*, vətəni çox istəyirsiniz" [VIIIc.s.326].

Ağızla bağlı "hər ağızdan bir hava gəlmək" frazeologizmi Heydər Əliyevin dilində vahid məqsədə xidmət etməyə yox, müxtəlif məqsədlərə kömək edən fikir ayrılıqları zamanı yüksək semantik yükə malikdir: "Əvvəllər *hər ağızdan bir avaz gəlirdi*, müxtəlif fikirlər, müxtəlif baxışlar vardı, bəzən onlar qeyri-məqbul olurdu, hərə öz mövqeyinin üstün olduğunu sübut etmək istəyirdi" [XVIIIc.s.17]. Kütlələrin liderinə sevgisinin təzahürü olaraq onların meydanlara axışması "ağzınadək dolmaq" somatik frazeologizmi ilə əks olunur: "Bu insanların gecə yatmamasına, istirahət etməməsinə

baxmayaraq ayın 5-də Azadlıq meydanı insanla *ağzınadək dolmuşdur*" [XXc.s.319].

"Əl" və "göz bəbəyi" frazeologizmlərin müştərək işləndiyi məqamlar mövcuddur: "Sizi əmin edirəm ki, biz Azərbaycanın dövlət müstəqilliyini *göz bəbəyimiz kimi qoruyub* saxlayacaq və onu heç vaxt *əldən verməyəcəyik*" [IX c.s. 292]. "Kimi" qoşması ilə düzələn frazeologizmlər sırasına qoşulur. Sinonim frazeologizmlər ən çox somatik frazeologizmlərdə özünü göstərir. Belə ki "üz göstərmək" və "sifət göstərmək" frazeologizmləri bu qəbildəndir: "Amma siz öz *sifətinizi göstərdiniz*" [XXc.s.344].

Digər nitq situasiyasında isə bu "üz göstərmək" variantlıq anlamındadır: "Dedim ki, bilirsiniz nə var, dünyanın dövranı uzundur, bəlkə siz hesab edirsiniz ki, Heydər Əliyev ya öləcək, yaxud da işləməyəcək, ona görə belə *üz göstərirsiniz*" [XXc.s.342].

Nitqimizin, dilimizin inkişafı ilə bağlı hazır somatik frazeologizmlər də mövcuddur. "Dili əritmək" bu gün dilçilik termini kimi "dilin assimilyasiyaya uğraması"nın məcazi mənada ifadəsidir. Və bu çox uğurlu ifadədir: "Amma eyni zamanda, bir *dili* başqasının içərisində *əritmək* lazım deyil" [VIIc.s.22].

Bu ərəfədə Ustad Şəhriyarın və Aşıq Şəmşirin dilimizlə bağlı dərin və hikmətli misraları yada düşməyə bilmir. Seyid Məhəmmədhüseyn Şəhriyar [216] yazırdı:

*Türkün dili tək sevgili, istəkli dil olmaz,*
*Öz şeirini farsa, ərəbə qatmasa şair,*
*Şeiri eşidənlər, oxuyanlar kəsil olmaz.*

Ulu Öndər Heydər Əliyevin Azərbaycan hakimiyyətinə gəlişi hər şeydən öncə onun dilimizə olan sonsuz sevgisiylə

başladı, onun səlis Azərbaycan dilində etdiyi çıxışlar auditoriyalara ayaq açdı, əsarətdə qalan "baldan şirin" sözlər şairlərin dilində yeni nəfəs aldı. Elə 1971-ci ildə Aşıq Şəmşirin "Güllər içində" qoşması da onun Heydər Əliyevin dil siyasətinə ürəkdən şərik olmağı idi:

*Baxırsan qurğuya, hər işi incə,*
*Elə bil ki, bahar açıb indicə*
*Öz ana dilimiz baldan şirincə,*
*Şəkərdi, şərbətdi dillər içində* [213].

Rəhimzadəyə görə [180] bir sıra somatik frazeologizmlər müxtəlif mənalı feillərin müxtəlif mənalı lüğəvi formalarına uyğun gəlir. Belə ki, "dil tapmaq" frazeologizmi nitq feili kimi diplomatiya sahəsində işlənə bilir: "Lakin onlar İranla dil tapa bilməyiblər. Mən də onlara demişəm ki, siz gedin İranla *dil tapın"*[XXXc.s.70].

İnsanların, siyasilərin eyni, ortaq fikirdə olması "eyni dildə danışmaq" frazeologizmi ilə dinləyicilərə çatdırılır: "Amma mən sizin *eyni dildə danışmaq* fikrinizdən anlayıram ki, yəni eyni fikirdəsiniz" [XXXIc.s.196].

Təfəkkür insanı, siyasət meydanında baş sahibi Heydər Əliyevin dilində "baş" somatizmi ilə əlaqədar səslənən frazeologizmlərə diqqət yetirmək yerinə düşər. Tapşırılan işlərin öhdəsindən ləyaqətlə gələ bilməyən, məsuliyyətsiz şəxslər üçün "baş girləmək" frazeologizmi səslənir: "Amma indiyə qədər siz orada oturub, necə deyərlər *başınızı girləmisiniz*, bu təşkilatın lazımi avadanlıqla təchiz edilməsi ilə məşğul olmamısınız" [XXXIc.s.108].

Vaxtilə Sovetlər dönəmində partiya – sovet sistemində belə bir ifadə işlədilirdi: müvəffəqiyyətdən başgicəlmə!.. Bu söz müstəqillik dövründə Heydər Əliyev dilində "başgicəllən-

məsi olmaq" kimi bəyan edilir: "Amma eyni zamanda gərək çalışasınız ki, mənim bu təriflərimdən *başgicəllənməsi olmasın*" [XXXc.s.359].

Qətiyyətli dövlət başçısı kimi "ağlını başına yığmaq" frazeologizmi məsuliyyət hissini itirənlərə, qanunlara riayət etməyənlərə həm öyüd, həm də sərt təpki kimi ünvanlanır: "Müraciət edirəm ki, onlar *ağıllarını başlarına yığsınlar*, hərəkətlərindən əl çəksinlər" [IIc.s.357]. Elə buradaca bir cümlədə iki somatik frazeologizmin qoşa çəkilməsi görünür. Xəcalət hissi keçirmədən yaşamaq, qısa bir ömrü ləyaqətlə başa vurmaq anlamında "başı aşağı dikməmək", onun sinonimi "qəddini əyməmək" frazeologizmləri meydana gəlir: "Bu gecə vaxtı sizin buraya toplaşmağınız da onu göstərir ki, həyatımız nə qədər çətin olsa da, nə qədər əziyyət içində yaşasaq da, *qəddimizi əymirik*, *başımızı aşağı dikmirik*" [IIc.s.361]. Ecazkar Heydər Əliyev nitqi həmişəki kimi burada da özünü göstərir. Bu bir bütöv cümlədə iki somatik və əziyyət içində yaşamaq frazeologizmləri poetik bir ovqatda harmonik şəkildə işlənmişdir. İtənilən sahədə tərəflərin razılığa gəlmə anlarında "baş tutmaq" frazeologizmi özünə yol tapır: "Güman edirəm ki, söhbətimiz *baş tutacaqdır*" [Ic.s.390].

N.Seyidəliyev [185, 186] maraqlı bir faktı qeyd edir ki, hansı sözlər leksik vahid kimi çoxmənalı sayılırsa, o sözlər frazeoloji birləşmənin tərkibində də çoxmənalı olur. *Baş, dil, əl, göz* kimi leksik vahidlər çoxmənalı olduğu üçün həmin sözlər frazeoloji ifadələrin tərkibində də çoxmənalılıq yaradır. Məsələn, "baş əymək" ifadəsi". Bu ifadənin birinci mənası "təzim etmək", ikinci mənası isə "tabe olmaq, alçalmaq" mənalarını ifadə edir. Müasir Azərbaycan dilində çoxmənalı frazeologizmlərin sayı çox olmasa da müəyyən qədər vardır. Məsələn, *Dil tökmək* – şirin sözlərlə razı salmağa çalışmaq; xahiş etmək, yalvarmaq, *Dilə gəlmək* – təsirli şəkildə danış-

dırmaq; haqqında, ibarəsində danışmaq, *Əldən*-ayaqdan salmaq – çox gəzmək, hər yerdə olmaq; yormaq, taqətdən salmaq, *Ələ keçirmək*-əldə etmək; sahib olmaq, ixtiyarına keçirmək, *Ələ keçirmək*-əldə etmək; sahib olmaq, ixtiyarına keçirmək, *Ələ gətirmək*-özünə tabe etmək; tovlamaq; tutmaq, *Əlindən qurtarmaq* – fəlakətdən , ölümdən qurtarmaq; xilas etmək, azad etmək, *Gözdə – qulaqda olmaq* – gözüaçıq olmaq; nəzarət etmək, *Gözdən salmaq* – unutmaq, yaddan çıxarmaq; hörmətdən salmaq, *Ayaq tutmaq* – təzə-təzə yeriməyə başlamaq; kimləsə bərabər olmaq, *Bağrına basmaq* – nəvazişlə qucaqlamaq; sinəsinin üstünə qoymaq; *Dünyaya gətirmək* – törətmək, yaratmaq; doğmaq və s.

Aşağıda "gözünü açmaq" frazeologizmi bu qəbildəndir: *Gözlərini açmaq* – hadisələrə düzgün qiymət vermək, bəsirət gözünün açılması; 1) ayıltmaq, bilmədiyini öyrətmək ~ başa salmaq 2) ayılmaq, ~ özünə gəlmək 3) diqqət etmək, fikir vermək; "Onlara bildirmək istəyirəm ki, *gözlərini açsınlar*, ayılsınlar, ağı-qaradan seçə bilsinlər" [Ic.s.96].

"Başında durmaq" frazeologizmi Heydər Əliyevin dilində bir sıra hallarda satirik üslubda işlədilirdi. Öz təhsili və təcrübi vərdişləri olmayanların rəhbərliyə keçməsinə bu frazeologizm ilə cavab verilir: "Əgər kənd müəllimi deyək ki, iri bir üzümçülük təsərrüfatına rəhbərlik edirsə, dünənki bazar alverçisi isə bütöv bir sahənin *başında durursa*, buna nə ad verəsən, burada nədən danışasan?" [Ic.s.48].

Vaxt məhdudluğuna işarə kimi "başı qarışmaq" somatik frazeologizmi işlənir: "Sizin də imkanınız olmur, *başınız qarışıqdır*, mənim də imkanım olmur" [XIIIc.s.5].

İdarə olunmamaq, rəhbərliksiz qalmaq məqamlarında "başsız qalmaq" somatik frazeologizmi auditoriyalara yön alır: "Təəssüflər olsun ki, həmin bina neçə illərdir *başsız qalıbdır*" [XIVc.s.40]. Elə "başsız qalmaq" somatik frazeo-

logizmin sinonimi kimi "başlı-başına buraxmaq" somatik frazeologizmi gəlir: "Əgər istifadə etmirsə, *başlı-başına buraxıbsa*, orada müdirin heç bir haqqı yoxdur" [XIVc.s.40]. "Başı qarışmağ"ın antonimi kimi, əks somatik frazeologizmi kimi "başı açılmaq" meydana gəlir: "Bu işlərdən yalnız dünən *başım açıldı*, hava həqiqətən xoş, mülayimdir, bizdə deyildiyi kimi, indi ilin ən yaxşı çağıdır" [XVIIc.s.297]. Xalqı lidersiz vəziyyətə qoymaq, xalqı taleyin ixtiyarına buraxmaq halları üçün "başlı-başına qoymaq" frazeologizmi meydana çıxır: "Camaatı *başlı-başına qoyub* dağda yerləşən Kələki kəndinə getdi, orada gizləndi, öz vəzifəsini yerinə yetirmədi, fərarilik etdi" [XIIIc.s.350].

"Başı əngələ salmaq" frazeologizmi isə özünə aid olmayan işlərlə məşğul olub hüquq-mühafizə sistemi tərəfdən cəzalandırılanlara tuşlanır: "Biri də deyibdir ki, get, özünü *işə salma, başını əngələ salma*" [XIIIc.s.271].

Bəzi insanların xalqın problemlərini həll etmək yolundan boyun qaçırmaq halları üçün "ağrımayan başı ağrıtmaq" frazeologizmi dilə gətirilir: "Azərbaycanda belə bir söz var: ağrımayan başımı niyə ağrıdım. Hesab edirəm ki, əgər mənim başım *ağrımırsa*, millətin faciəsi ilə bağlı qoy on dəfə də *ağrısın*" [IXc.s.400].

Problemlərlə üzləşmək, əsassız olaraq maneçiliklər törədilməsi baxımından "başa iş gəlmək" somatik frazeologizmi situasiyanı əks etdirir: "Hamı da bilir ki, biz birinci neft müqaviləsini imzalayanda – artıq mən dedim – *başımıza nə işlər gəldi*" [XXc.s.333]. "Nə" leksik vahidini "başa iş gəlmək" somatik frazeologizminə qoşmaqla nitqin obrazlılığını dəfələrlə yüksəltmiş olur.

Bir böyük cümlədə iki sinonim frazeologizmi işlədərək nitqə obrazlılıq vermək Heydər Əliyev natiqliyinin başlıca xüsusiyyətlərindəndir. Yaxud "özünü işə salma", "başını ən-

gələ salma" frazeologizmləri qoşa səslənir: "Biri də deyibdir ki, get, *özünü işə salma, başını əngələ salma*" [XIIIc.s. 271].

Məntiqə uyğun olmayan, ağla sığmayan fikirlərin mövcud olduğu anlar üçün Heydər Əliyevin nitqində "başı qayaya vurmaq" somatik frazeologizmi mövcuddur: "Biz bunların hamısını həyata keçirdiyimiz, dövlətimizi qoruyub saxladığımız, bu dövləti yaşatdığımız halda hələ ki, dövlətə heç bir xeyir verməmiş, ancaq müxalifətçiliklə, hay-küylə məşğul olmuş hansısa qüvvələrin indi Azərbaycan dövlətinə təzyiq göstərməsi ona bərabərdir ki, gedib *başını qayaya vurasan*" [XXIXc.s.329].

"Başlı-başına qoymaq" somatik frazeologizmin də öz yeri var: "Məhz bunların nəticəsində, ancaq buna görə, Azərbaycanın o vaxtkı iqtidarları – 1988-ci ildən başlayaraq 1993-cü ilə qədər – yalnız özləri haqqında düşündüklərinə görə, yalnız öz hakimiyyətini bərkitmək üçün, yaxud birinin o birisinin əlindən hakimiyyəti alması üçün, daxili mübarizə apardıqlarına görə Azərbaycanın vətənpərvər, canını *torpaq yolunda şəhid etməyə* hazır olan yüz minlərlə insanı *başsız qaldı*" [XXIIc.s.215]. "Başsız qalmaq" somatik frazeologizmi "əlindən almaq"la və eləcə də yolla bağlı "torpaq yolunda şəhidlik" frazeologizmləri ilə çulğalaşır.

Həqiqəti dərk etmək, səhvləri anlamaq baxımından Heydər Əliyev dilində "başı daşa dəymək" somatik frazeologizmi dinləyicilərə yönəlir: "Yəqin, Azərbaycan ağır vəziyyətdə olarkən onun və onun kimilərinin *başları daşa dəydi*, fikirləşdilər ki, Heydər Əliyevə müraciət etmək lazımdır" [XXIVc.s.46].

Araşdırmalar göstərir ki, dünya dillərində somatik frazeologizmlərin çoxu *əl* və *ayaq* anlayışları ilə bağlıdır. "Dünya dillərinin hamısında idiomatikliyi yaradan ən mühüm və

aparıcı üzv əldir" [85, 87]. Çünki *əl* insanın fiziki fəaliyyətində həmişə əsas köməkçi funksiya daşımışdır.

Təəccüblüdür ki, ayrı-ayrı bədən üzvlərinin simvolik dil kimi müxtəlifliyi genişdir. Dünyanın hər yerində yaşayan xalqların müdrikliyi və təssəvürü simvollarda cəmləşir. Xüsusilə də mədəniyyət mərkəzi kimi sayılan Çin, Hindistan, Misir, İtaliya və s. ölkələrdə işarə dili mühüm rol oynayır. Bir çox mənbələrə müraciət etdikdə görürük ki, simvol, işarə dili kimi rol oynayan bədən üzvləri hər şeydən əvvəl müxtəlif dinlərdən irəli gəlir. Qol və qıç simvolları ilə əl və ayağın simvolik mənası sıx əlaqədardır [85, 87, 165]. Frazeologiyada qol adətən hakimiyyət simvolu daşıyır. Əl sözü ilə formalaşmış somatik frazeologizmlərin tarixi Azərbaycan dilində də qədim köklərə malikdir. Əl leksik vahidi sonrakı dövrlərdə də somatik ifadələrin yaranmasında fəal olmuşdur. Məsələn, əldən qopmaq, əldən tutmaq, əl çəkmək və s. [165].

Özünəməxsus somatik frazeologizmlərdən biri də Heydər Əliyevin dilində mühüm təcrübəyə malik olmaq mənasında "saç-saqqal ağartmaq"dır: "Mənə elə gəlir ki, Abbasov birgə Azərbaycan – Rusiya komissiyasının həmsədri olmaqla, necə deyərlər, *saç-saqqal ağartmışdır*" [XXIIc.s.30]. Dözülməz iş şəraiti yaratmaq mənasında "boğaza yığmaq" somatik frazeologizmi öz yerini alır: "Zərəri də odur ki, siz iş adamlarını artıq *boğaza yığmısınız*" [XXVIc.s.426].

Heydər Əliyev nitqlərinin daha bir ecazkarlığı bir cümlədə bir neçə somatik frazeologizmi işlətməklə bitkin bir nitq yaratmaqdır. "Əl", "ürək", "baş" somatizmləri hesabına yaranan somatik frazeologizmlər cərgəsi buna əyani sübutdur: "Vaxtilə belə bir məşhur kəlam var idi ki, *soyuq baş, hərarətli ürək, təmiz əllər* olmalıdır" [XVc.s.126].

Sərbəst söz birləşməsinin tərkibindəki sözlər öz ilkin nominativ mənalarında işləndiyi halda, frazeoloji vahidlər

həmin söz birləşmələrinin yeni metaforik məna qazanması ilə yaranır. Bu qrupu təşkil edən frazeoloji vahidlər türk dillərində çox işləkdir. Bu da həmin söz birləşməsinin komponentlərinin bədən üzvlərini bildirən sözlərdən ibarət olmasından irəli gəlir. Lakin zaman keçdikcə sözün işlənmə dairəsi daralır və getdikcə onun deaktuallaşması, daha dəqiq desək, yalnız frazeoloji vahidin tərkibində "yaşaması" mümkün olur [37, 45, 143, 150, 205].

Beləliklə, Heydər Əliyevin dilində səslənən somatik frazeologizmlərin bir sıra xüsusiyyətləri mövcuddur ki, onları aşağıdakı kimi qruplaşdırmaq olar:

– Heydər Əliyevin nitqlərində somatik frazeologizmlərin obrazlılığının səviyyəsini artıran vasitələrdən biri də frazeoloji kontaminasiyadan geniş istifadə edilməsidir. Bu zaman ifadələrin komponentləri sırasına əlavə leksik vahidlər artırılır;

– Somatik frazeologizmlər Heydər Əliyev dilində ictimai-siyasi gərgin dövrlərdə daha çox özünə yer alır;

– Somatik frazeologizmlər Azərbaycan dilində mühüm yer tutması siyasi lider Heydər Əliyevində dilindən yan keçmir. Böyük natiqin işlətdiyi somatik frazeologizmlərdə bədən hissələri ilə yanaşı birbaşa bütöv bədən mənasını verən frazeologizmlər də özünə yer alır;

– Somatik frazeologizmlər Heydər Əliyevin dilində ekspressivlik qazandırmaq baxımından tez-tez səslənir. Bütün nitq və çıxışlarda olduğu kimi izahedicilik, frazeologizmin məna çalarlarının açıqlanması ön planda olur;

– "Qol çirmalamaq", "qıç çırmalamaq" kimi somatik frazeologizmlər böyük natiqin dilində süstlükdən, ətalətdən, tənbəllikdən çıxmaq mənasında auditoriyaları səfərbər edir, sosial-iqtisadi böhrandan çıxmağın yollarını kənd təsərrüfatı sahəsində çalışanlara göstərir;

– Başqa bir çıxış məqamında susmaq, etinasızlıq, prinsipsizlik, mövqesizlik mənasında səslənən "ağıza su almaq" somatik frazeologizmi səslənir;

– Heydər Əliyev nitqlərinin daha bir ecazkarlığı bir cümlədə bir neçə somatik frazeologizmi işlətməklə bitkin bir nitq yaratmaqdır;

– Tədqiqatımız göstərdi ki, Heydər Əliyevin dilində işlənməyən somatizmlər demək olar ki, yoxdur. Və bu somatik frazeologizmlər təbii ki, siyasi prinsip və məqsədləri özündə ehtiva edən frazeologizmlərdir.

## HEYDƏR ƏLİYEVİN NİTQİNDƏ SƏSLƏNƏN FRAZEOLOGİZMLƏRİN LÜĞƏTİ

Xalqın milli ruhunu, milli mentalitetini özündə əks etdirən frazeologizmlərin Heydər Əliyevin nitqlərində mühüm yer tutması böyük natiqin dilində səslənən frazeologizmlərin lüğətinin tərtibini zəruri etdi. Təbii ki, lüğətin tərtibindən öncə müasir lüğətçilik, onun qarşısında duran əsas vəzifələrin araşdırılması olmadan bu missiyanı yerinə yetirmək çətin olardı. Məhz AMEA Nəsimi adına Dilçilik İnstitutunun Tətbiqi dilçilik şöbəsi tərəfindən yerinə yetirilən elmi işlər bu lüğətin formalaşmasında mühüm rol oynadı.

Şöbənin əməkdaşı Xədicə Heydərovanın "Azərbaycan filoloji lüğətlərində ümumişlək olmayan sözlərin verilməsi" monoqrafiyasında Azərbaycan lüğətçiliyinin keçdiyi yol, bu yolda ciddi addımlar atmış alimlər və onların əsərləri (S.M.Qənizadə "Lüğəti-rusi və türki", R.Axundov iki cildlik "Rusca-Azərbaycanca lüğət", Ə.Orucov "Azərbaycan dilinin izahlı lüğəti", İ.Məmmədli və b. "Azərbaycanca -rusca danışıq kitabı", N.Seyidəliyev "Azərbaycan dilinin sinonimlər lüğəti" və s.) sadalanır.

Lüğətlərin köməyi ilə xalqların həyat və düşüncə tərzləri öyrənilir, tərcümə problemləri öz həllini tapır. Tarixi inkişaf nəticəsində əmələ gəlmiş mürəkkəb frazeoloji sistem o dərəcədə zəngindir ki, danışıq prosesində frazeologizmlərin vasitəsi ilə bu və ya digər fikri aydın şəkildə ifadə etmək mümkündür. Dilin lüğət tərkibi ayrı-ayrı sözlərdən və söz birləşmələrindən ibarətdir. Dildə mövcud olan bəzi söz birləşmələri leksik vahidlər kimi çıxış edir və tədqiqatçıların daim diqqətini cəlb edir. Leksik vahidlər adı altında frazalar, sabit söz birləşmələri və frazeologizmlər başa düşülür. Frazeoloji vahidin xarakterik xüsusiyyəti onunla müəyyən olunur ki, frazeoloji vahidin ayrı-ayrı komponentlərinin mənası ilə sabit ifadə-

nin mənası arasında qeyri-qanuni əlaqə hökm sürür [57, 195, 204].

Ümumiyyətlə hər bir dilin frazeologizmləri öz zənginliyi və müxtəlifliyi ilə digər dillərin frazeologizmlərindən fərqlənir. Bu frazeologizmlərin başqa dillərə tərcüməsi dilçilikdə ən mühüm və mürəkkəb məsələlərdən biridir [16, 57, 137, 149]. Frazeologizmlərin başqa dillərə tərcüməsi çox çətin və məsuliyyətli işdir. Təcrübə göstərir ki, dünyanın ən zəngin dillərində verilmiş elə bir fikir tapmaq çətindir ki, onu bizim dilimizdə ifadə etmək qeyri-mümkün olsun. Frazeoloji birləşmələr hər bir xalqın milli kaloritin adət-ənənəsini, nəhayət dil sistemindəki özünəməxsus leksik-qrammatik formalarını əks etdirdiyindən, belə ifadələr Azərbaycan dilinə tərcüm edilərkən orijinaldakı xüsusiyyətlərinin hamısını eyni dərəcədə saxlama imkanı xaricindədir. Digər tərəfdən, sözün daxili formasında və bir sıra başqa hadisələrdə dillər arasındakı yalnız fərqli cəhətlərin deyil, həm də uyğun gələn cəhətlərin frazeologizmlərdə mövcud olmasını görməmək mümkün deyil. Belə ki, frazeologizmlərin leksik vahidlərinin mənalarını hər iki dilə məxsus lüğətlərlə tutuşdursaq, onlar arasında müəyyən məna yaxınlığı tapmaq olar.

Müxtəlif dillərə məxsus frazeoloji birləşmələrin məna və formaca bəzən bir-birinə uyğun olması insan təfəkkürünün eyni istiqamətdə, eyni qanunlar üzrə inkişaf və təkamül etməsini göstərən əlamətlərdən biridir [57, 64, 171].

Digər bir səbəb isə tərcüməçinin seçilmiş bu frazeologizmləri yanlış dərk etməsidir ki, bu da çox zaman mətnin təhrifinə gətirib çıxarır. Buna görə də frazeologizmlərin tərcüməsində səhvə yol verməmək üçün tərcüməçi ilk növbədə onları verilmiş mətndən düzgün seçməli, onları düzgün dərk etməli və orijinaldakı fikri təhrif etmədən ifadə edə bilməlidir. Onun orijinalda təsvir olunan xalqın həyatını və milli varlığını təşkil edən xüsusiyyətlərini bilməsi vacibdir. Frazeologizm-

lərin tərcüməsi zamanı lüğətdən düzgün istifadə olunmalı, dil və üslubi məsələlərə dərindən diqqət yetirilməlidir.

Buna baxmayaraq bütün lüğətlərdə sözün düzgün yazılışı əhəmiyyət kəsb edir. Çünki hər bir lüğətə istifadəçi normativ vasitə kimi yanaşır. İzahlı lüğəti orfoqrafiya və orfoepiya lüğətləri ilə müqayisə etsək, onun məlumat yükünün kifayət qədər tutumlu olduğunu görərik [37, 39, 59, 69, 84, 88, 171, 208, 239]. İzahlı lüğətdən istifadəçi sözün müxtəlif mənaları haqqında məlumat alır. Sözün kontekstdə işlənməsinə dair illüstrativ nümunələr, bu və ya digər sözün daxil olduğu sabit söz birləşmələri belə lüğətlərdə yerləşdirilir [1, 2, 3].

"Frazeologizm (frazeoloji vahid) – nitqə hazır şəkildə daxil edilən (nitq prosesində düzəlməyən", sabit semantikaya malik söz birləşmələri və cümləlridir. Frazeoloji lüğətin tərtibi zamanı həm söz birləşməsi, həm də cümlə şəklində olan vahidlər seçilib sözlük siyahısına daxil edilir. Nəticədə strukturca fərqli vahidlər bir lüğətin tərkibində birləşdirilir. Onu da nəzərə almaq lazımdır ki, atalar sözləri, zərbi-məsəllər, hikmətli sözlər, idiomlar da ffazeologiyada birləşdirilir. "Atalar sözləri frazeologiyaya daxil edilməklə yanaşı, bu frazeologiyanın daxilində çox səciyyəvi və xüsusi mövqe tutur" [39, 59, 69, 172, 173].

Vahid frazeoloji ikidilli və çoxdilli elektron frazeoloji lüğətin tərtibinin mümkünlüyünü nəzərə alaraq frazeoloji sistemə daxil edilə biləcək bütün vahidləri bir yerə toplamağı məqsədəuyğun sayırıq. Belə bir lüğətin hazırlanması və onun avtomatik axtarış sistemi ilə təchiz edilməsi frazeoloji vahidlərin ekvivalentlərinin tapılmasında əhəmiyyətli rol oynaya bilər [5, 172, 173].

Təklif olunan axtarış sistemi frazeoloji vahidlərə daxil olan nüvə sözlər və ümumi semantik prototip üzrə qurula bilər. Hər bir frazeoloji vahidin tərkibində nüvə söz vardır. Məsələn, *ayağa salmaq, ayağı topal, ayağı yerdən üzülmək,*

*ayağı yerə yapışmaq* frazeologizmlərində nüvə söz"ayaq" sözüdür. *Ayaq* bədən üzvüdür və frazeologiyada somatik frazeologizmlər ayrıca bir sinif kimi öyrənilir. Belə olan halda frazeoloji vahidlərin tərkibində işlənən bütün bədən üzvləri adları nüvə söz statusu almış olur. Digər frazeoloji vahidlər əsasında tədqiqat və təhlil aparıldıqda onlarda müxtəlif sözlərin nüvə söz kimi işlənməsini aşkara çıxarmaq olur. Məsələn, *hirsi soyumaq, hiyləyə əl atmaq, xam xəyala düşmək, özünü yeddinci göydə bilmək, yola verməmək, yoldan saxlamaq, yerə-göyə sığmamaq, pişiyini ağaca dırmaşdırmaq, yolunda can qoymaq* və s.

Frazeoloji lüğətlər üçün avtomatik axtarış sisteminin ümumi semantik prototip üzrə qurulması daha effektli nəticə verə bilər. Bu zaman ekvivalent və qismən ekvivalent mənalar daşıyan frazeologizmlər qruplaşdırılır. Məsələnin bu cür qoyuluşu və həlli semantik prototiplərin müəyyənləşdirilməsini tələb edir. Qeyd edək ki, frazeologizm qrupları üzrə belə prototiplərin təyini ilə bağlı bir sıra tədqiqatlar aparılmışdır. Həmin tədqiqatlarda prototiplərə görə, frazeoloji freymlər yaradılır. Frazeoloji lüğətdə axtarış sistemi belə freymlərin adları əsasında aparıla bilər [6, 172, 173, 263, 311].

Lüğətlərdə frazeoloji vahidin tərkibindəki sözün müxtəlif qrammatik vairantları varsa, ən geniş yayılmış variant əsas götürülür. Bu, daha çox birləşmə daxilində ismin hal, cəm, mənsubiyyət və ya feilin inkar şəkilçisi ilə işlənə bilən sözlərə aiddir.

Bu vaxta qədər yaradılan maşın tərcüməsi sistemləri sözbəsöz tərcüməyə əsaslanmışdır. Lakin bu üsulla yaradılmış sistemlər özünü doğrultmur və effektli deyildir. Yaradılan sistemlər insan-tərcüməçi modeli üzrə hazırlansa, daha keyfiyyətli olar. Çünki insan-tərcüməçi bir təbii dildən, digər dilə tərcümədə böyük səriştə, biliyə, təcrübəyə malikdir. Doğrudan da, mürəkkəb proses olan tərcümədə tərcüməçi təkcə linqvis-

tik biliklə kifayətlənməyib, tərcümə etdiyi mətnin məxsus olduğu sahədən asılı olaraq, həmin sahəni dərindən bilməli, bir sözlə mütəxəssis olmalıdır. Sistemin effektli olması üçün dil və təfəkkürün qayda-qanunlarını dərindən tədqiq etmək lazımdır. Bu səpkidə aparılan tədqiqatlar istənilən səviyyədə deyildir. Tərcüməçi mətnin tərcüməsində sözlərin deyil, ayrı-ayrı frazeoloji ifadələrin, durğu işarələri ilə ayrılmış seqmentlərin kontekstdəki mənalarını dərk edərək, əhatə etdiyi elm sahəsini nəzərə alaraq mətnləri tərcümə edir [157, 239, 240, 263].

Dilin milli-mədəni özəllikləri ilə seçilən frazeoloji vahidlər lüğət tərkibinin zənginləşməsində xüsusi rola malikdir. Xalqın milli kaloritini özündə əks etdirən bu vahidlər dillərin qarşılıqlı əlaqəsinin daha da zənginləşdirilməsi baxımından müqayisəli-tipoloji tədqiqatlar üçün mühüm obyektlərdən sayıla bilər. Çünki, onlar xalqın həyat tərzi, adət-ənənəsi, əsrlər boyu formalaşmış dünyagörüşü üzrə yaranmışdır. Struktur baxımından söz birləşmələri və cümlələr əsasında yarandığı üçün formaca onlara bənzəyən frazeologizmlər ekspressivlik, metaforiklik və emossionallığı ilə digər birləşmələrdən fərqlənir. Bu keyfiyyətlər frazeoloji vahidlərə yüksək obrazlılıq verir. Əslində bu vahidlərin əsas vəzifəsi də dilin obrazlı ifadəsinin yüksəlməsinə xidmət etməkdir. Bu baxımdan frazeoloji vahidlərin tərcüməsi, onların bir dildən digər dilə ötürülməsi zamanı həmin obrazlılığın mümkün qədər qorunub saxlanılması qarşıda duran əsas vəzifələrdən biridir [64, 296].

Əlavə etmək istərdik ki, frazeologizm sözdən, əvvəlcə, öz strukturuna görə fərqlənir: söz morfemdən ibarətdir, amma istənilən frazeologizm, hər şeydən əvvəl, bu və ya digər dilin qrammatik qaydaları üzrə sözlərin birləşməsidir. Frazeoloji tərkibin komponentləri öz bağlılıqlarında sərbəst deyillər və onların öz aralarında birləşməyə girmələri qapalı xarakter daşıyır. Frazeologizmlər leksik tərkibin sabitliyi və dəyişməzliyi ilə səciyyələnirlər [189, 232, 236, 238, 265, 269, 280].

Frazeoloji vahidlər dilin yaradıcısı və daşıyıcısı olan xalq tərəfindən yaradılır, lüğət tərkibinə, yeni frazeoloji vahidlərin formalaşması üçün mənbə rolunu oynadıqda hətta dilin əsas lüğət fonduna daxil olur [20, 69, 88, 104, 172, 307].Tərcümə olunmayan, yalnız yenidən mənalandırılaraq qavranılan frazeoloji birləşmələrin köməyilə dilin estetik aspekti qüvvətləndirilir. "İdiomların köməyi ilə, güllərin müxtəlif rəng çalarları ilə olduğu kimi, dilin informasiya cəhəti dünyamızın hissi – intuitiv təsvirilə dolğunluq qazanır" [227]. N.İ.Tolstoyun dəqiq ifadəsinə görə, "Bu və ya digər frazeologizmlərin etimoloji tərəfinin öyrənilməsi mənimsənildiyi xalqların mədəniyyətini və məişətini başa düşməyə kömək edir" [286].

Frazeologizmlər xalqın həyat və məişəti, adət-ənənələri, əxlaqi görüşləri ilə bağlı yaranır. Frazeoloji birləşmələrin istər məzmun, istərsə də forma etibarilə zənginliyi, onların dildə geniş şəkildə işlədilməsi frazeologiya lüğətlərinin tərtibini zəruri edir. Belə dilimizin frazeologiyasını qeydə almaq, zənginliyi, onların dildə geniş şəkildə işlədilməsi frazeologiya lüğətlərinin tərtibini zəruri edir. Belə lüğətlərin tərtibində əsas məqsəd dilmizin frazeologiyasını qeydə almaq, zənginliyini bir daha göstərmək, eyni zamanda, dilin məna çalarlarını daha dərindən mənimsəmək istəyənlərin sözlüyə olan ehtiyacını təmin etməkdir [41].

Frazeloji birləşmələrin ifadə etdiyi mənalar bütöv haldadır. Frazeoloji birləşmələr sabit birləşmələrdir, yəni belə birləşmələrdə sözlərin sırası dəyişməzdir, buna görə də onlar qrammatik cəhətdən ayrı-ayrılıqda təhlil olunmur [117].

Hər hansı xalqın frazeologizmlərini öyrənməklə, biz həmin xalqın mədəniyyəti, tarixi, həyat və yaşayış tərzi ilə yaxından tanış oluruq [117].

Bu leksik vahidlərdən biri də dilin xalq fizionomiyası hesab olunan frazeoloji birləşmələrdir. Frazeologizmlərin daxili məna quruluşunun xarici strukturunun, ayrı-ayrı dillərdə tər-

cümə olunma imkanlarının öyrənilməsi, milli və beynəlmiləl mahiyyətinin şərhi aktuallıq kəsb edir [129, 157, 264].

Xalq onun dilində səslənən frazeologizmlərlə qurulan nitqi daha asan qəbul edir. Belə nitq xalqı daha asanlıqla səfərbər edir, yaddaqalan olur. Məhz buna görə də Heydər Əliyev nitqi digər siyasi natiqlərin nitqindən köklü şəkildə, əsaslı şəkildə fərqlənir.

Monoqrafiyada biz çalışdıq ki, Heydər Əliyevin dilində səslənən frazeologizmləri – xüsusən, siyasi məsələləri bəyan etmək məqsədi ilə səslənən frazeologizmləri lüğətdə yerləşdirək. Bir sıra hallarda məişətdə işlənən sözlər siyasi lider Heydər Əliyevin dilində frazeologizm səviyyəsinə yüksəlir.

Bizim tərtib etdiyimiz lüğətin əsas üstünlüyü, üstünlüyü deməyək, özünəməxsusluğu bu frazeoloji vahidlərin siyasi lider dilində səslənməsində və siyasi diskursla əlaqəsindədir. Bu lüğət də digər lüğətlər kimi ümumi qaydalara tabe olaraq tərtib edilmişdir. Ümumişlək olmayan frazeologizmlər ulduz (*) işarəsi ilə qeyd olunmuşdur.

# LÜĞƏT

## *Aa*

***Allah əlini çəkməmək** – Allahın xoş nəzəri üstündə olmaq; "Arzu edirəm ki, Allah sizin ölkənizin üzərindən əlini heç vaxt çəkməsin" [XXVIIc.s.194].

***Ab-hava** – mühit, şərait; "Bu şəhərin bənzərsiz yaradıcılıq ab-havası Rusiyanın taleyini əziz tutan bütün insanlara daim ilham vermişdir" [XXXIXc.s.41].

***Ab-hava yaranmaq** – mühit yaranmaq; "Ümumiyyətlə insanların iqtisadiyyatla davranış formalarının tamamilə dəyişdirilməsidir, cəmiyyətimizdə yeni bir ab-havanın yaranmasıdır" [IVc.s.174].

***Ab-hava yaratmaq** – hava və su kimi lazım olmaq, yaşayış üçün zəruri şərait yaratmaq; "Bütün bunlar bizim əməkdaşlığımızın yeni, daha yüksək səviyyələrinə və formalarına çıxmaq üçün əlverişli ab-hava və şərait yaranmasına kömək etmişdir" [IXc.s.232].

***Ac toyuq yuxusunda darı görər*** – populist yollarla hakimiyyətə gəlmək; "Belə bir məsəl yadıma düşür: Ac toyuq yuxusunda darı görər" [XXXVc.s.382].

***Acı söz demək (1)*** – *tənqidi söz demək; "*Görüşümüzün sonunda mən sizə bir az *acı sözlər dedim*" [XLIc.s.133].

***Acı söz demək (2)*** – sözü üzə demək, birbaşa ünvanlamaq; "Bəzən o, kiməsə *acı söz* deyə bilərdi, lakin onu anlamaq lazım idi ki, o acı sözün içində xeyirxah münasibət vardı, onun arxasında vətəndaşlıq vardı, onun arxasında Azərbaycan xalqına sevgi, məhəbbət vardı, onun arxasında böyük insan dururdu" [VIIIc.s.456].

***Açıq danışmaq** – fikir və ideyaları gizlətmədən danışmaq, səmimi danışmaq, çəkinmədən danışmaq; "Məqsədimiz odur ki, sahibkarlar öz işləri haqqında, onlara mane olan səbəblər haqqında *açıq danışsınlar*" [XXXVIIIc.s.131].

***Açıq göstərmək*** – hadisələri olduğu kimi göstərmək; "Çünki Azərbaycan Kommunist Partiyası Mərkəzi Komitəsinin birinci katibi olmağıma baxmayaraq, mən Sovet hakimiyyətinin, cəmiyyətinin içində olan mənfi halların hamısını *açıq göstərmişdim*" [XXIXc.s.250].

***Açıq söhbət getmək*** – səmimi söhbət aparmaq; çəkinmədən fikirləri söyləmək; "Qorxmasınlar, çəkinməsinlər, *açıq söhbət getsin*" [XXXVIIIc.s.132].

****Açıq-aşkar destruktiv olmaq*** – pozucu olmaq, dağıdıcı olmaq, dağıdıcı mövqedə olmaq, aşkar dağıdıcı olmaq; "Lakin mənə elə gəlir ki, onlar qeyri-mütəşəkkil səciyyə daşıyırdı, bəzən də hətta açıq-aşkar uğursuzluğa məhkum idi, çünki *açıq-aşkar destruktiv* idi" [XVIIc.s.15].

***Açıq-aydın bildirmək (1)*** – heç nəyi gizlətmədən söyləmək, situasiyanı aydınlaşdırmaq; "Mən bu barədə öz fikirlərimi dünən prezident cənab Jak Şirakla görüşərkən *açıq-aydın bildirdim* və ona öz təkliflərimi verdim" [VIIIc.s.278]

***Açıq-aydın bildirmək (2)*** – "Azərbaycan dünyanın bir çox dövlətləri ilə qarşılıqlı əlaqələr qurmuş, sazişlər imzalamış, beynəlxalq təşkilatlarda öz sözünü, mövqeyini *açıq-aydın bildirmişdir*" [VIIc.s.414].

****Açıq-aydın görmək*** – mübahisəsiz görmək, maneəsiz görmək; "Mən bu gələcəyi *açıq-aydın görürəm*" [XIIc.s.334].

***Ad çıxarmaq (1)*** – yaxşı və ya pis əməlləri ilə tanınmaq; məşhur olmaq; – barmaqla göstərilmək, ad qazanmaq; xalq içində ad almaq; xalq arasında mövqeyi müəyyən olmaq; "Amma yenə də xarici şirkətlər gəlib Azərbaycanda o qədər də yaxşı ad çıxarmayan bəzi adamlarla birləşib auditor təşkilatlar yaradırlar."[XXXVc.s.114]

***Ad çıxarmaq (2)*** – tanınmaq; "yaxşı ad çıxarmaq", "pis, ad çıxarmaq" kimi sinonim cərgələrdən təkrardan uzaqlaşmaq baxımından qaçır: "Amma yenə də xarici şirkətlər gəlib Azərbaycanda o qədər də yaxşı *ad çıxarmayan* bəzi adamlarla bir-

ləşib auditor təşkilatları yaradırlar... Bir çox hallarda dediyim təşkilatlar Azərbaycanda mənfi ad çıxarmış adamlarla yaradılır. Bizim orqanlar belə adamlara müsbət münasibət göstərə bilməzlər. Amerikanın hansısa bir şirkəti gəlib burada çox pis ad çıxarmış adamla bir iş görürsə, onda bizim cəmiyyətimiz də bunu başa düşməz ki, nə üçün belə adamla iş görür" [XXXVc.s.114].

***Ada kimi qalmaq** – hər tərəfdən mühasirədə qalmaq; "Amma Kəlbəcər bir *ada kimi qalmışdı*" [VIc.s.45].

***Adam əlindən tərpənə bilməmək** – sıxlıq; adamların çox olması; ayaq basmağa yer olmamaq; bir yerdə çox tünlük, qələbəlik, izdiham olmaq; ~ iynə atsan yerə düşməz; "Dünən axşam saat on idi, çıxdım sizin parklara baxmağa, adam əlindən tərpənə bilmədim" [XLc.s.201].

***Adam su içdiyi quyuya tüpürməz***– keçmiş tarixə hörmətsizlik etmək; "Bir xalq məsəli var: "Adam su içdiyi quyuya tüpürməz". Biz hamımız o quyudan su içmişik və ora tüpürməyə heç kəsin haqqı yoxdur" [XVIIc.s.349].

***Adamı itirmək** – dünyadan köçmək, vəfat etmək; "Ona görə belə bir dostu, belə bir yaxın *adamı itirmək* çox ağırdır" [IXc.s.144].

***Adbaad bilməmək** – adların hamısını bilməmək; "Doğrudur, hamısını *adbaad bilmirəm*" [XIIIc.s.271].

***Addımlar atmaq*** – təşəbbüs etmək, yeni bir işə başlamaq, qərarlar qəbul etmək; "Bəzi cəsarətli *addımlar atdıq*, müqavilələri imzaladıq və bu yaxınlarda iki il tamam olacaqdır ki, bu müqavilə imzalanıbdır" [VIIc.s.119].

***Addım-addım, qarış-qarış yol getmək*** – tədricən, yavaş-yavaş məqsədə doğru getmək; "İndi dörd ildir ki, *addım-addım*, necə deyərlər, *qarış-qarış yol gedirik* ki, xalqımızı həmin vəziyyətdən çıxaraq" [XIIc.s.162].

***Addımbaaddım irəliləmək** – ardıcıl getmək; səbatla, dözümlə irəli getmək; "Biz onu Qafqazda sülhü həqiqətən

təmin etmək arzusunu əsas tutaraq, bir neçə il əvvəl imzalamışıq və bu illər ərzində həmin istiqamətdə addımbaaddım irəliləyirik” [XXXVIc.s.198].

***Addımı görmək** – hərəkətləri izləmək, müşahidə etmək; “Hər addımımı deyəndə, bəlkə bir az düz olmaz, hər *addımı görmək* çətindir” [XLIII c.s.14].

***Adına ləkə gətirmək** – “İndi onların bəziləri naxçıvanlılar adından gedib cürbəcür qanunsuz işlər görürlər. Naxçıvanın da, naxçıvanlıların da *adını ləkələyirlər* və prezident kimi mənə də *ləkə gətirirlər*” [VIIc.s.342].

***Adını uca tutmaq** – fəxr etmək; “Azərbaycandan Türkiyəyə gedən hər bir vətəndaş gərək müstəqil respublikamızın vətəndaşı *adını uca tutsun*” [Ic.s.355].

***Adını ucaltmaq*** – ölkənin şöhrətini dünyaya bəyan etmək; ölkəni tanıtmaq; “Onlar dünya elmini, bəşər mədəniyyətini zənginləşdiriblər və eyni zamanda Azərbaycan xalqını tanıdıblar, *adını ucaldıblar*” [XVIIc.s.326].

***Adlarını tarixdən silmək** – tarixi həqiqəti gizləmək; “Vətən müharibəsi qəhrəmanlarının *adlarını tarixdən silməyə* cəhd göstərən zaman, Qələbə gününü Azərbaycanda ləğv edən adamlar belə şəxslərə mənfi münasibət göstərən zamanda Ziya Bünyadov Sovet İttifaqı Qəhrəmanının Qızıl Ulduzunu döşündə həmişə iftixarla gəzdirirdi” [VIIIc.s.449].

***Ağa qara demək*** – ağ yalan söyləmək; həqiqəti danmaq; həqiqəti deməmək; həqiqətin üstünü örtmək; “Təbiidir, *ağa qara demək* çətin bir şey deyil, ancaq *ağa qara deyən* insan nə istəyir?” [XLIIIc.s.14].

***Ağı qaradan seçmək*** – yaxşını pisdən ayırmaq; obyektiv olmaq; yaxşını pisdən, xeyiri şərdən, müsbəti mənfidən fərqləndirmək; – tükü tükdən seçmək, buğdanı qılçıqdan ayırmaq; “Xalq ağı qaradan seçməyi, yaxşını pisdən ayırmağı öyrənmişdir” [Ic.s.495].

***Ağ vərəqdən başlamaq*** – başlanğıcdan start götürmək; "Yəni kim hansı müəssisəni özəlləşdirirsə, o, necə deyərlər, *ağ vərəqdən başlayacaqdır*" [XXXc.s.192].

***Ağ yalan*** – təkzibolunmaz dəlillərlə olan yalan; "Yenə də deyirəm – bu, *ağ yalan* olduğuna görə mən ona cavab verməyə ehtiyac bilməmişəm" [IVc.s.467].

***Ağıla gətirmək*** – düşünə bilmək; fikirləşmək; "Təəssüf, indi dünya elə bir vəziyyətdədir ki, hazırda elə hadisələr baş verir ki, bir neçə il bundan əvvəl onları, ümumiyyətlə təsəvvür etmək, *ağıla gətirmək* olmazdı." [XXXVIc.s.194]

***Ağıla gətirə bilmək*** – düşünə bilmək; təsəvvür yarada bilmək; "Bu məktəbi yaradanda heç vaxt ağlıma gətirə bilməzdim ki, 30 ildən sonra mən yenə də bu məktəblə birlikdə onun yubileyini keçirəcəyəm" [XLIVc.s.273].

***Ağılla hərəkət etmək*** – hərəkət etmək; real həqiqətlərə uyğun hərəkət etmək; "Bəziləri isə başa düşsün ki, insan *ağılla hərəkət etməlidir*" [XXXc.s.95].

***Ağıl-kamala çağırmaq*** – üz tutmaq, müraciət etmək, düz yola dəvət etmək; "Fürsətdən istifadə edərək, erməni xalqına, Azərbaycan vətəndaşları olan Dağlıq Qarabağın erməni sakinlərinə *üz tutub*, onları *ağıl-kamala çağırıram* " [I c.s.349].

***Ağıl-zəka göstərmək*** – düzgün qərar qəbul etmək; müdriklik göstərmək; "Mən əminəm ki, gürcü xalqı aprelin 9-da düzgün qərar qəbul edəcək, müdriklik, *ağıl-zəka göstərəcək* və seçkilər gürcü xalqının milli mənafelərinə uyğun olan nəticələr verəcəkdir" [XXVIc.s.51-52].

***Ağızdolusu danışmaq*** – reallığa söykənməyən populist danışıq; "Halbuki, özləri azadlıqdan, hürriyyətdən və haqq-ədalətdən dəm vurur, bunlardan *ağızdolusu danışırlar* axırı nə oldu – hamılıqla oğurluğa qurşandılar" [Ic.s.58].

***Ağlına düşmək*** – qəbul etmək; uyğunlaşmaq; "Çünki insanlar var ki, demokratiya nədir, *ağlına düşməyibdir*" [XXXIV c. s.321].

***Ağlına gəlməmək*** – təsəvvür edə bilməmək; xatırlamamaq, bir şey haqqında fikirləşməmək, düşünməmək; ~beyninə düşməmək, yada salmamaq, fikrinə düşməmək, xəyalına gəlməmək; "Heç adamın ağlına gəlmirdi ki, belə şey olacaqdır" [XXVIIc.s.296].

***Ağlını başına yığmaq*** – məsuliyyət hiss etmək, özünü səfərbər etmək, qanunlara riayət etmək; ağıllanmaq, fikirləşmək, düşünüb-daşınmaq, ölçüb-biçmək, götür-qoy edib nəticə çıxarmaq; "Müraciət edirəm ki, onlar *ağıllarını başlarına yığsınlar*, hərəkətlərindən *əl çəksinlər*" [IIc.s.357].

****Ağlını itirmək*** – normal məntiqə uyğun olmamaq; 1. Dəli olmaq, səfehləmək; ~ağlı başından çıxmaq, başı pozulmaq, başına at təpmək 2. Çətin vəziyyətdə nə edəcəyini bilməmək; ~başını itirmək; "O ağlını itirmiş adamlar heç olmasa qoy ağıllarını yerinə qoysunlar" [XVIc.s.109].

****Ağlını yerinə qoymaq*** – normal düşüncəyə, məntiqə qayıtmaq; "O ağlını itirmiş adamlar heç olmasa qoy *ağıllarını yerinə qoysunlar*" [XVIc.s.109].

***Ağrı-acı çəkmək*** – məhrumiyyətlərə dözmək, itkilərlə qarşılaşmaq; "Biz sadəcə, buna dözməliyik, bu dövrün əzab-əziyyətini, *ağrı-acısını çəkməliyik* ki, gələcəyimiz daha gözəl, parlaq olsun"[XIIIc.s.82]

***Ağrısını çəkmək*** – günahı olmadan bir yükü boynuna götürmək; "Onun da ağrısını mən sonra çəkdim"[XLc.s.305].

***Ağzına su almaq*** – susmaq, lazımi məqamda mövqeyini bildirməmək; dinməmək, danışılan məsələyə münasibət bildirməmək; "Ancaq burada tamamilə doğru deyildi ki, baş nazir gündə üç dəfə müşavirə yığanda, orada boş-boş sözlər danışanda, axmaq işlərlə məşğul olarkən onun yanında oturan müavinlər ya *ağızlarına su alırdılar*, ya da ki, "baş üstə, baş üstə" deyirdilər" [IIc.s.385].

***Ağzınadək dolmaq*** – boş yer qalmamaq; çox sıx olmaq; "Bu insanların gecə yatmamasına, istirahət etməməsinə bax-

mayaraq ayın 5-də Azadlıq Meydanı insanla *ağzınadək dolmuşdu*" [XXc.s.319].

***Ağzından süd qoxusu gəlmək*** – təcrübəsizlik; dövlətçilikdə təcrübəsi olmamaq; peşəkar olmamaq; hələ uşaq kimi qalmaq, təcrübəsiz olmaq; ~dimdiyinin sarısı getməmək, dınq eləyib yumurtadan çıxmaq; "Hətta Xalq Cəbhəsi hakimiyyəti vaxtında bəzi şəxslər meydana çıxdı və universitet partasından gətirilib Prezident Aparatında məsul vəzifələrə qoyulan həmin adamlar, necə deyərlər, ağzından süd qoxusu gələn gənc insanlar və dərd də orasıdır ki, naxçıvanlılar gəlib Naxçıvanda bizimlə döyüşürdülər, mübahisə aparırdılar ki, Azərbaycan unitar dövlətdir və Naxçıvanın muxtariyyəti ləğv olunmalıdır" [XLIIc.s.21].

***Ağzını yummaq*** – bəhanələrin qabağını almaq; faktlarla susdurmaq; "Amma bunu nə qədər tez başlasaq, bu işin qarşısını almaq istəyənlərin *ağzını* o qədər tez *yumacağıq*" [XXIVc.s.158].

***Ağır yol keçmək (1)*** – çətinliklərdən keçmək; "Ancaq bilməlisiniz, mən Bakı–Ceyhan üçün *ağır yollardan keçdim*." [XLIIc.s.68]

***Ağır yol keçmək (2)*** – keşməkeşlərlə qarşılaşmaq; "Ancaq bu gün iftixar hissi ilə demək olar ki, Azərbaycan xalqı uzun illər böyük, *ağır yol keçərək* öz milli azadlığını, dövlət müstəqilliyini əldə etdiyi kimi, Azərbaycanın təhlükəsizlik orqanları da artıq geniş bir yola çıxmışlar" [XVc.s.110].

****Ağır sahə*** – iqtisadiyyatda, təsərrüfatda pozulma; idarəetmədə çətinlik olan sahə; "Dedim ki, get ora, *ağır sahədir*, burada oğurluq olub, qanunsuzluqlar var" [IIc.s.386].

****Ağırlığı uzaqlaşdırmaq*** – məsuliyyəti, yükü öz üzərinə götürmək; "Bu sahəni İlham Əliyev öz üzərinə götürübdür, *ağırlığı* bizdən *uzaqlaşdırıbdır*" [XLIIIc.s.102].

****Ağrı-acını çəkmək*** –mənfilikləri, pislikləri hiss etmək; mənfiliklərdən yaxa qurtara bilməmək; mənfiliklərin qoyduğu

izi hiss etmək; "Xalqımız onun *ağrı-acısını* indiyə qədər də *çəkir*" [XLIIc.s.335].

***Ağrısını çəkmək*** – poblemlər yaşamaq; "Onun da *ağrısını* mən sonra *çəkdim*" [XLc.s.305].

***Ağzının südü qurumamaq*** – həyatda heç bir iş görməmək, yerindən yenicə qalxmaq; "Ancaq nə edək, yerindən yenicə qalxmış, – Azərbaycanda, – deyirlər ki, hələ *ağzının südü qurumamış*, – həyatda heç bir iş görməmiş, universitetdən, yaxud hansısa bir təhsil müəssisəsindən diplom alıb-almayıb yenicə çıxmış bir gənc durub Azərbaycanın taleyi ilə oynayır" [XIXc.s.151].

***Ah-vay etmək*** – ciddi iş görmək əvəzinə şikayət etmək; "Burada oturub *ah-vay etməkdən*, yaxud qeybətlə məşğul olmaqdansa, ayrı-ayrı məsələlərə cürbəcür qiymət verməkdənsə, gedib hərə bir cəbhə bölgəsində, ordu hissəsində adamların əhvali-ruhiyyəsini, vətənpərvərlik hissini qaldırsa müdafiə qüvvələrinin möhkəmlənməsində iştirak etdiklərini göstərə bilərlər " [Ic.s.241].

***Axıb gəlmək*** – qısa müddətə çoxlu sayda insanın toplaşması; "Heç bir partiyaya mənsub olmayan, – şübhəsiz ki, Yeni Azərbaycan Partiyası orada idi, – yüz minlərlə adam iki saatın içərisində President Sarayının qarşısına axıb gəldi" [XVIII c. s.238].

****Axın başlanmaq*** – gəlişi çoxalmaq; "Görüş iştirakçılarına məlumat verim ki, indi Azərbaycan müstəqil dövlətdir, müstəqil dövlət kimi fəaliyyət göstərir, çoxpartiyalı sistem əsasında demokratik parlament seçilmiş, xarici sərmayələrin ölkəmizə böyük *axını başlanmışdır*" [XXc.s.86].

***Axıra çatdırmaq*** – işi sonadək qurtarmaq; "Dedi ki, əgər bir işi başlamısınızsa, *axıra çatdırın*" [XXVIIc.s.327].

***Axıra çatdırmaq*** – sonadək həll etmək; nəzərdə tutulan məsələni vaxtında həll etmək; "Ancaq biz öz iradəmizi itirmədik, başladığımız işi *axıra çatdırdıq*." [XXIIIc.s.148]

***Alətə çevrilmək*** – başqaları tərəfindən istifadə olunmaq, öz sözü olmamaq; "Ola bilsin ki, bəzən ayrı-ayrı adamlar təsir altına düşür, bir paraları isə özləri də hiss etmədən ayrı-ayrı şəxslər, qüvvələr tərəfindən *alətə çevrilir*, istifadə olunur" [IIc.s.351].

***Alnıaçıq, üzüağ durmaq*** – qüsursuz, eyibsiz durmaq; "Mən iyirmi il bundan qabaq sizin qarşınızda idim, indi bu gündə sizin qarşınızda *alnıaçıq, üzüağ durmuşam*." [Vc.s.218]

***Alnıaçıq gəlmək*** – günahı olmamaq; "Mən demək istəyirəm ki, sizin yanınıza doqquz ildən sonra *alnıaçıq, üzüağ gəlmişəm*. " [XXXIXc.s.129]

***Altdan-altdan iş aparmaq*** – gizli şəkildə iş aparmaq; "Amma mən şəxsi həyatımı, ailəmi, övladlarımı bir tərəfə qoydum, xalqın mənafeyi üçün özümü odun içinə atdım" [XVIIc.s.319].

***Altına qoymaq*** – heç kəsə verməmək; xalqın xeyrinə sərf etməmək; " Pulları yığır, aparır *altına qoyur*" [XXXVc.s.43].

***Altına yığmaq*** – özününküləşdirmək; başqasına verməmək; yalnız özünü düşünmək; "Amma sən bu imkanları özünün *altına yığmısan*" [XLIVc.s.200].

***Alt-üst olmaq*** – ciddi şəkildə dağılmaq; "Birdən-birə bunların hamısı alt-üst oldu. Bunu həmin məqsədi güdən ayrı-ayrı ekstremistlər *alt-üst etdilər*"[XVIc.s.225].

***And-aman etmək*** – özünü təmizə çıxarmaq; özünə bəraət qazandırmaq; "Feyruz Mustafayev burada indi *and-aman edir* ki, mən Heydər Əliyevi belə istəyirəm, belə istəmişəm" [IIc.s.386].

****Aparatı zibillənmək*** – cinayətkar ünsürləri işə cəlb etmək; "Çünki ötən müddət ərzində həm Nazirlər Kabineti, həm də onun *aparatı xeyli zibillənmiş*, – mən bu sözü tam cəsarətlə deyirəm, – çirklənmişdir" [IIIc.s.398].

***Appendisit olmaq*** – artıq olmaq; kəsilib atılmaq; "Azərbaycanın bəzi rəhbərləri demişdilər ki, Naxçıvan bizim üçün bir *appendisitdir*, onu kəsib atmaq lazımdır" [XXIIc.s.208].

***Aradan qaldırmaq*** – həll etmək; maneəni dəf etmək, qaydaya salmaq; "Ancaq bunların da hamısını biz birgə işimiz, əməkdaşlığımız nəticəsində *aradan qaldırdıq*" [XXXVc. s. 432].

***Aranı qarışdırmaq*** – münasibətləri bilərəkdən korlamaq; gərginlik yaratmaq; diqqəti yayındırmaq; "Hətta sonra mənə məlumat verdilər, bu kombinatda işləyən bəzi qüvvələr – hansılar ki, həm buradan qanunsuz gəlir götürürdülər, həm də *aranı qarışdırırdılar* – görəndə ki, burada real bir şirkət meydana çıxıbdır və bunlar real iş görə bilərlər, bəyan etdilər ki, onlar özləri bu kombinatı özəlləşdirəcəklər" [XXIVc.s.395].

***Aradan götürmək*** – zərərsizləşdirmək; yox etmək, öldürmək, mane olan qüvvələri təmizləmək; "Bilirsiniz ki, biz onları *aradan götürdük*" [XIIIc.s.366].

***Arxasında durmaq*** – müdafiə etmək; havadarlıq etmək, dayaq olmaq; ~hayan durmaq; "Amma 1993-cü ildə məlum hadisələr baş verdiyi zaman xalq həmin hakimiyyətin *arxasında durmadı*, onu dəstəkləmədi" [XXXVIc.s.321].

***Arzuları çin olmaq*** – arzuları reallaşdırmaq, arzuları yerinə yetirmək; "Ancaq sonrakı dövr və bu proseslərin davamı göstərdi ki, bizim *arzularımız çin olmadı*, yerinə yetmədi və biz bu işlərlə məşğul olmaq məcburiyyətində qaldıq" [Ic.s.64].

***Ara açılmaq*** – sərhədləri götürmək; sədləri götürmək; yaxınlaşmaq; sıxıntını, utancaqlığı aradan qaldırmaq; ~pərdəni götürmək; "Amma indi *ara açılmış*, bir-birimizlə əlaqələrimiz genişlənmişdir" [XXVIIIc.s.119].

***Aradan çıxmaq (1)*** – qaça bilmək; qaçmaq, qaçıb gizlənmək, əkilmək, təhlükədən qurtulmaq, xilas olmaq; ~gözdən oğurlanmaq, canını qurtarmaq; "Əslində isə bu adam 8 milyon dolları götürüb *aradan çıxmışdır*" [I c.s.276].

***Aradan çıxmaq (2)*** – səhnədən getmək; yox olmaq; "Mən istəyirəm sizin kimilər çox olsun ki, o mürtəce xarakterli xasiyyətli jurnalistlər *aradan çıxsınlar*" [XXXVIIIc.s.394].

***Aradan qaldırmaq*** – nöqsanları, çatışmazlıqları yox etmək; maneəni dəf etmək, qaydaya salmaq; "*Aradan qaldırmaq* lazımdır, xəbərdarlıq edirəm" [VIIc.s.152].

***Aranı qarışdıra bilmək*** – kiminsə işlərinə mane olmaq, cəncəl, qalmaqal salmaq; tərəflər arasında münaqişə yaratmaq; "Hər bir təxribatdan, hər bir gözlənilməz hadisədən bəzi qüvvələr istifadə edə bilərlər, *aranı qarışdıra bilərlər*, yenə də müharibə başlaya bilər" [IIc.s.376].

***Aralı düşmək*** – eyni dəyərləri bölüşə bilməmək, fikirləri bölüşə bilməmək; "Ancaq bir-birimizdən nə qədər uzaqda olmuşuq, nə qədər *aralı düşmüşük*, bir-birimizin həsrətini çəkmişik" [VIIIc.s.15].

***Arxa durmaq*** – kömək etmək; havadarlıq etmək, dayaq olmaq, müdafiə etmək; – hayan durmaq; Özbəkistan və Azərbaycan xalqları arasında,özbək və Azərbaycan xalqları arasında münasibətlərin qədim tarixi var, bütün dövrlərdə xalqlarımız dost olmuş, bir-birinə *arxa durmuş*, mədəni, mənəvi dəyərlərlə qarşılıqlı surətdə faydalanmışdır" [VIc.s.322].

***Arxa qapıdan girmək*** – qeyri-qanuni yola əl atmaq; qeyri-qanuni yoldan istifadə etmək; layiq olmadığı yeri tutmağa çalışmaq; "Azərbaycana *arxa qapıdan girmək* lazım deyildir" [XXXVc.s.111].

***Arxada qalmaq*** – keçmişə aid olmaq; "Allaha şükürlər olsun ki, o illər *arxada qalıbdır*" [XIVc.s.232].

***Arxada möhkəm durmaq*** – müdafiə etmək, ciddi cəhdlə müdafiə etmək; "Ancaq Naxçıvan əhalisi, xüsusilə nehrəmlilər o vaxt mənim *arxamda möhkəm dururdular*" [XXIIc.s.265].

***Aşağı düşmək*** – azalmaq; tempin azalması; "Həm də bütün hallarda bu keçid dövrü keçmiş Sovet İttifaqına mənsub

olan ölkələrin hamısında istehsalın səviyyəsinin kəskin şəkildə *aşağı düşməsinə* səbəb olmuşdur” [Vc.s.116].

***Aşağı düşmək*** – azalmaq; “Sənaye, kənd təsərrüfatı istehsalı, ümumdaxili məhsul və başqa iqtisadi göstəricilər ilbəil *aşağı düşürdü*” [XVIIIc.s.421].

****Aşağı laylardan çıxarmaq*** – qədim tarixi köklərini araşdırmaq; “Bizim millətimizin zəngin tarixini nə qədər çox araşdırıb, *aşağı laylardan çıxarıb* təbliğ edə bilsək, Azərbaycan xalqının nə qədər böyük tarixə malik olduğunu göstərə bilərik və inanıram ki, biz sizinlə birlikdə bunu edəcəyik” [XXXIXc.s.164].

***Aşağıda durmaq*** – dəyəri olmamaq; “Maddi vəziyyət, sərvət, bu və ya başqa şeylər xeyli *aşağıda durur*” [XVIIc.s.356].

***Aşağıya düşmək*** – vəzifədən düşmək; aşağı vəzifəyə enmək; “Amma sonra oradan *aşağıya düşmüşəm*, gedib Naxçıvanda bir komada yaşamışam.” [XIc.s.359]

***Aşığın sözü qurtaranda – “neynim neynim deyər”*** – yeni söz tapa bilməmək; yeni mütərəqqi fikir irəli sürə bilməmək; “Azərbaycanda bir məşəl var: aşığın sözü qurtaranda “neynim-neynim” deyər” [XIc.s.403].

***At oynatmaq*** – heç kimi saya salmamaq; qanunlara riayət etməmək; özünü hökmran kimi aparmaq, ağalıq etmək, istədiyini etmək, mənəm-mənəmlik etmək; ~ meydan sulamaq; “Burada *at oynadırlar*” [XXXIXc.s.180].

***Araya qoymaq*** – xalqı agah etmək; məlumatı yaymaq; ~ lağa qoymaq “Həmişə çalışırlar yaxşı yerdə bir nöqsan tapıb *araya qoysunlar*” [XXXVIIIc.s.51].

****Arxa çevirmək*** – etibarsızlıq etmək; “Sevdiyim, inandığım insanların 95% faizi birdən-birə mənə *arxa çevirdi*” [Ic.s.54]

****Arxada qalmaq*** – 1) keçmişdə qalmaq; vaxtı keçmək; “Bu mərasimlər artıq *arxada qalıbdır*” [XXc.s.132]. 2)

***Arxada qalmaq*** – aktual olmamaq; "Zənnimcə bu söz-söhbətlər artıq *arxada qalmışdır* və indi hamı başa düşür ki, pambıq istehsalı Azərbaycan üçün lazımdır" [Ic.s.488].

***Arxasında durmaq*** – müdafiə etmək; "Amma 1993-cü ildə məlum hadisələr baş verdiyi zaman xalq həmin hakimiyyətin *arxasında durmadı*, onu dəstəkləmədi" [XXXVIc.s.321].

****Ayaq ata bilməmək*** – təzəcə yerimək; inkişafa təzə başlamaq; "Biz yenicə doğulmuş bir cocuq, bəbə kimi, hələ *ayaqlarımızı ata bilmirdik*, ancaq Türkiyə bizim qolumuzdan tutmuşdu, bizə yardım etmişdi və öz təcrübəsini bizə göstərmişdi" [XLIIc.s.64].

****Ayaq qoymaq (1)*** – güzarı düşmək; ərazidə olmaq; "Amma o, Azərbaycana heç *ayağını qoymayıbdır*" [XLIIc.s.68].

***Ayaq qoymaq (2)*** – dərsə başlamaq; ilk dəfə tədrisə başlamaq; "Onların bir qismi – bizim lap körpə uşaqlarımız məktəbə bu gün *ayaq qoyur*, digərləri isə bir sinifdən o biri sinifə keçir" [XXIXc.s.413].

***Ayağa dura bilmək*** – inkişaf edə bilmək; "Məhz bunlara görə də Azərbaycan Ordusu yaranmağa başladığı ilk gündə *ayağa dura bilməyibdir*" [VIIc.s.376].

***Ayağa qalxmaq*** – dirçəlmək; inkişaf etmək; "Hesab edirəm ki, Adam Smit İnstitutu bundan sonra da Azərbaycana diqqət göstərəcək və bizə, necə deyərlər, *ayağa qalxmaqda*, seçdiyimiz demokratik yolda iqtisadi cəhətdən inkişaf etmiş ölkələrlə birlikdə addımlamaqda kömək edəcəkdir" [Vc.s.31].

***Ayağı dəymək*** – ərazidə olmaq; "Mən təşəkkür edirəm ki, siz Qarsa *ayağım dəyən* dəqiqədən mənə və məni müşayiət edənlərə çox gözəl qonaqpərvərlik, hörmət göstərirsiniz" [XXXIXc.s.316].

***Ayağı yer almaq*** – ürəklənmək, özünü inamlı hiss etmək, yerini möhkəmlətdikcə dili uzun olmaq, özünə güvənmək, qürrələnmək; bir qədər lovğalanmaq; "Sizin *ayağınız* o qədər də *yer almasın*, mən rayonun mərkəzinə girəndə baxdım, hətta

mənim fikrim deyil – görürəm burada Usubov da gülür – İlham ilə də söhbət edirdim, sizin rayonun mərkəzi Gəncədən daha yaxşı təəssürat yaratdı" [XLI c. s.150].

***Ayağından çəkmək*** – inkişafına mane olmaq; "Dedi-qodu, ədavət, bir-birinin *ayağından çəkmək*, bir-biri ilə münaqişə aparmaq, bir-birinə paxıllıq etmək və özü öz millətini ləkələmək" [XIc.s.363].

***Ayaq üstə qalxmaq*** – dirçəlmək; inkişaf etmək; inkişafa start vermək; "Çox şey dağıldı, amma bir-iki ildən sonra kəndlilər *ayaq üstə qalxdılar*" [XXXVIc.s.74].

***Ayaq üstündə möhkəm dayanmaq** – Etibarlı şəkildə öz suverenliyini qorumaq. "İndi Azərbaycan müstəqil dövlət kimi *ayaq üstündə möhkəm dayanan* və öz suverenliyinin, öz dövlət müstəqilliyinin, öz milli azadlığının keşiyində möhkəm dayanan bir dövlətdir" [XIIIc.s.237].

***Ayaqları üzərində möhkəm durmaq;** "Çünki müstəqil dövlət kimi, Azərbaycan öz *ayaqları üzərində möhkəm durubdur*" [XXVIIc.s.332].

***Ayaqlaşa bilmək*** – eyni bir sürətlə getmək; "Onların vəsaiti olsun, onlar başqa şirkətlərlə bir sürətlə gedə, *ayaqlaşa bilsinlər*" [XXXVIc.s.272].

***Ayaqüstü görüşmək** – geniş söhbət edə bilməmək, azacıq söhbət etmək; qısa söhbət etmək; ~atüstü görüşmək; "Mən prezident Corc Buşla Praqada konsertdə – orada balet göstərdilər – *ayaqüstü görüşdük*, bir balaca söhbət etdik" [XLIIc.s.389].

***Ayaqüstü keçirmək** – xəstəliklə bağlı yataq rejimində olmamaq; "Amma mən soyuqdəyməni, qrip xəstəliyini bir neçə dəfə *ayaqüstü keçirmişəm*" [XIXc.s.79].

***Aydın görə bilmək** – real vəziyyəti düzgün qiymətləndirmək; obyektiv qiymətləndirmək; "Amma bəzilərinin də, onların gözlüyü qaradır, yaxud da nədirsə, onlar *aydın görə bilmirlər*, açıq görə bilmirlər" [XXXVIc.s.39].

***Ayrı düşmək*** – siyasi, iqtisadi, mənəvi əlaqələrin olmaması; “Biz uzun müddət bir-birimizdən ayrı düşmüşdük” [IVc.s.414]. *Ayrı düşmək* – ayrılmaq; “Üç il yarımdır ki, mən sizdən ayrı düşmüşəm” [VIIc.s.468].

***Ayrı-seçkilik etmək*** – fərqli yanaşmaq; bir şeyə müxtəlif münasibət göstərmək; “Ermənilər həmişə bəhanə axtarırdılar ki, guya biz orada *ayrı-seçkilik edirik*, azərbaycanlılara yaxşı, guya ermənilərə pis baxırıq” [XXIc.s.17].

****Az qala zərrəbinlə yoxlamaq*** – qeyri-adi dərəcədə ciddi yoxlamaq; xırda təfərrüatına qədər yoxlamaq; “On illər ərzində hər bir mətbu nəşrin buraxılışını nəzarət altında saxlayan, ictimaiyyətə yönəldilmiş hər bir sözü *az qala zərrəbinlə yoxlayan* qlavlit mənim fərmanımla qəti şəkildə ləğv edilmişdir” [XXVIIc.s.213].

****Az yaşamaq*** – az ömür sürmək; mövcudluğu qısa müddətli olmaq; “Bu cümhuriyyət, bu dövlət *az yaşadı*, ancaq xeyli işlər gördü” [XXVIIc.s.369].

## *Bb*

***Bada getmək*** – puç olmaq, zay olmaq, məhv olmaq, heçə enmək; ~ boşa çıxmaq, hədər getmək “Yaxud hər hansı bir aqrotexniki tədbir düzgün həyata keçirilməsə, onda əvvəlki bütün işlər *bada gedəsidir*” [Ic.s.491].

***Badalaq vurmaq*** – paxıllıq etmək; mane olmaq; zəif mövqedən istifadə etmək; aldatmaq, birinin işini pozmaq, əleyhinə xəlvəti plan hazırlamaq; ~ hiylə gəlmək, kələk gəlmək, ayağının altını qazmaq, tələ qurmaq, işin qabağına kötük itələmək. “Azərbaycanda söz vardır “*badalaq vurmaq*” istəyənlər var” [XXXIVc.s.51].

****Bağlı olmaq*** – sıx əlaqədə olmaq; “Azərbaycan Rusiya ilə bir çox onilliklər və hətta yüzilliklər ərazidə *bağlı olublar*” [Vc.s.331].

***Bağrına basmaq*** – sevgi ilə qarşılamaq; doğma övladı kimi qarşılamaq; "Naxçıvan məni qucaqladı, *bağrına basdı*" [VIIc.s.469].

***Baha başa gəlmək*** – çox ağır nəticələr vermək, nəticəsi ağır olmaq; ~ baha oturmaq, xərc aparmaq; "Buna görə də o vaxt Sovetlər İttifaqı rəhbərliyinin, o cümlədən SSRİ-nin o zamankı rəhbəri şəxsən Qorbaçovun buraxdığı səhv Azərbaycana da, Ermənistana da, bütün Qafqaza da, – məgər təkcə Qafqazamı? – çox *baha başa gəldi*" [XXc.s.37].

****Balıq özünü suda hiss etdiyi kimi*** – rahat hiss etmək, öz evindəki kimi hiss etmək; "Mən görürəm ki, siz özünüzü bu auditoriyada *balıq özünü suda hiss etdiyi kimi* hiss edirsiniz" [IXc.s.210].

***Barmağı olmaq*** – müdaxilə etmək, bir işin gizli iştirakçısı olmaq (adətən mənfi mənada), üzdə görünməsə də hadisə və proseslərə təsir etmək, bir məsələyə aidiyyatı olmaq; "Çünki hamının bu işdə *barmağı vardı* – biri o tərəfdən, biri bu tərəfdən" [IXc.s.400].

***Barmaqla göstərilmək*** – tanınmış adam olmaq, məşhur olmaq, yaxşı və pis əməlləri ilə tanınmaq; "Xüsusən də xalq içərisində tanınmış adamlar, xalq arasında *barmaqla göstərilən*, həmişə xalqın hörmətini görmüş, həmişə dövlətin qayğısı ilə yaşamış adamların biganə qalmağa mənəvi haqqı yoxdur" [IIc.s.343].

***Barmaqla saymaq*** – az təsadüf olunmaq, nadir olmaq, sayı çox az olmaq; "Yenə də deyirəm, onlar çox deyillər, onları *barmaqla saymaq* olar" [XLIIIc.s.210].

****Basmaqəlib ifadə*** – standart ifadələr; qeyri-səmimi ifadələr; "Mən heç zaman *basmaqəlib ifadələrdən* istifadə etməmişəm [XXVIIIc.s.348].

***Baş çəkmək (1)*** – gedib görüşmək, vaxtaşırı görüşmək, yanına gedib hal-əhval tutmaq, yoxlamaq; ~ baş vurmaq; "O burada olubdur, biz onunla Azərbaycanda Rusiya mədəniyyəti

günləri keçirdik, mən Moskvada ona tez-tez baş çəkirəm" [XXXc.s.267].

***Baş çəkmək (2)*** – vəziyyətlə maraqlanmaq; "Təəssüf olsun ki, o insanlar Naxçıvana heç bir xidmət etməyiblər, Naxçıvanın ağır, əziyyətli dövründə Naxçıvana heç *baş çəkməyiblər*, gəlməyiblər" [VIIc.s.490].

***Baş çıxarmaq*** – anlamaq, bilmək, bacarmaq, öhdəsindən gəlmək, idarə edə bilmək, vəziyyətdən çıxa bilmək; "Bizim Azərbaycanda bir xalq məsəli var: belə şəraitdə *baş çıxarmaq* böyük qəhrəmanlıqdır" [XXXVIc.s.264].

***Baş girləmək*** – (1) bir təhər keçinmək, çox kasıb yaşamaq, ciddi bir işlə məşğul olmamaq; ~ baş dolandırmaq (2) vaxtını boş keçirmək, avaralanmaq; ~ gününü sovmaq; "Amma indiyə qədər siz orada oturub, necə deyərlər, *başınızı girləmisiniz*, bu təşkilatın lazımı avadanlıqla təchiz edilməsi ilə məşğul olmamısınız" [XXXIc.s.108].

***Baş götürüb getmək*** – uzaqlaşmaq, xarici ölkəyə getməyə məcbur olmaq; ~ baş alıb getmək, baş götürüb qaçmaq; "Siz böyük insan, böyük musiqiçi, ictimai xadim olmaqla yanaşı, bir çox illər ərzində təqiblərə məruz qalmış, öz ölkəmizdən *baş götürüb getməyə* məcbur olmusunuz" [XXXVIIc.s.425] .

***Baş qaldırmaq (1)*** – siyasi səhnəyə təzədən gəlmək, üsyan etmək, kütləvi etiraza qalxmaq, hərəkətə keçmək, dirçəlmək, ortaya çıxmaq, oyanmaq; "Bu faciənin günahkarlarına bəraət qazandırmaq istəyirlər. Bu faciənin günahkarları artıq *baş qaldırıblar*" [XXXVIc.s.224].

***Baş qaldırmaq (2)*** – yenidən qanunları pozmaq; residiv əməllərə yol vermək; "Ancaq indi yenə *baş qaldırmışlar*" [IIIc.s.264].

***Baş qarışmaq*** – imkan tapmamaq; vaxt məhdudiyyəti; "Doğrudanda belə oldu ki, *baş qarışdı*, elə bir hadisə olmadı ki, mən o işi televiziya qarşısında görüm" [XIIIc.s.95].

***Baş tutmaq (1)*** – həyata keçmək, alınmaq, düzəlmək, nəticə vermək; "Mən də çox şadam ki, nəhayət, Roma papası, zati-müqəddəsləri II İohann Pavelin Azərbaycana səfəri baş tutdu" [XXXVIIIc.s.368].

***Baş tutmaq (2)*** – reallaşmaq; "Onların niyyətlərinin heç birisi *baş tutası* deyil" [Ic.s.80].

***Baş tutmaq (3)*** – müəyyən bir nəticəyə çatmaq; "Güman edirəm ki, söhbətimiz baş tutacaqdır" [Ic.s.390]

****Baş ucaltmaq*** – xalqı ləyaqətlə təmsil etmək; şəxslər, dövlətlər arasında müsbət xüsusiyyətləri ilə seçilmək; "Eyni zamanda xalqın *başını ucalda* bilən adam olsun, xalqın səviyyəsini yüksəldə bilən adam olsun" [IVc.s.193].

***Başa çatdırmaq*** – yekunlaşdırmaq, qurtarmaq, tamamlamaq; ~ başa vurmaq, başa çıxmaq; "Biz özəlləşdirməni üç il müddətində *başa çatdırmaq* istəyirik" [Vc.s.59].

***Başa düşmək*** – anlamaq, qavramaq, dərk etmək; ~ ağlı kəsmək, başı çıxmaq, baş açmaq, baş tapmaq; "Sualınızı *başa düşdüm*" [VIIc.s.44].

****Başa iş gəlmək*** – problemlərlə üzləşmək; əsassız olaraq maneçiliklər törətmək; "Hamıda bilir ki, biz birinci neft müqaviləsini imzalayanda – artıq mən dedim – başımıza iş gəldi" [XIIc.s.96].

***Başa salmaq (1)*** – anlatmaq, qandırmaq, izah etmək, düz yola dəvət etmək; həqiqəti anlatmaq;-– "Bəlkə onlar aldanıblar, onları *başa salmaq* istəyirəm" [XIIc.s.97].

***Başa salmaq (2)*** – aydınlaşdırmaq; real vəziyyəti aydınlaşdırmaq ~ gözünü açmaq; "Dedim ki, gedin onu *başa salın*, Bakıya gəlsin, belə şey olmaz, prezidentdir" [XLc.s.297].

***Baş-başa danışmaq*** – bilavasitə danışıqlar aparmaq; "Ona görə də, biz dünyanın hər bir ölkəsinə gəlib, dövlət başçısı ilə *baş-başa danışıb* öz sözümüzü deyirik, fikrimizi ifadə edə bilirik və ölkəmizin mənafelərini qoruya bilirik" [XXIXc.s.92].

***Başdansovdu öyrənmək** – ciddi öyrənməmək; səthi öyrənmək; “Çünki rus dilində təhsil alıb, rus dilində işləyib, indi Azərbaycan dilini *başdansovdu öyrənir*, tamam yaxşı bilmir” [XXXVIc.s.13].

**Başgicəllənməsi olmaq** – lovğalıq etmək; təkəbbürlülük etmək; “Amma eyni zamanda gərək çalışasınız ki, mənim bu təriflərimdən başgicəllənməsi olmasın” [XXXc.s.359].

**Başı açılmaq** – sərbəstləşmək, başı bəladan qurtulmaq, asudə olmaq, tədbirləri başa çatdırmaq, asudə vaxt; ~başı ayazımaq, başı ayılmaq; “Bu işlərdən yalnız dünən başım açıldı, hava həqiqətən xoş, mülayimdir, bizdə deyildiyi kimi, indi ilin ən yaxşı çağıdır” [XVIIc.s.297].

***Başı aşağı əyməmək** – məğrur olmaq, xəcalət hissi keçirməmək; “Bu gecə vaxtı sizin buraya toplaşmağınız da onu göstərir ki, həyatımız nə qədər çətin olsa da, nə qədər əziyyət içində yaşasaq da qəddimizi əymirik, *başımızı aşağı dikmirik*” [IIc.s.361].

**Başı daşa dəymək** – etdiyi hər hansı hərəkətdən peşman olmaq, uğursuzluğa düçar olmaq, həqiqəti dərk etmək, situasiyanı anlamaq, həqiqətin harada olduğunu bilmək; “Yəqin, Azərbaycan ağır vəziyyətdə olarkən onun və onun kimilərinin *başları daşa dəydi*, fikirləşdilər ki, Heydər Əliyevə müraciət etmək lazımdır” [XXIVc.s.46].

**Başı dik tutmaq** – alnıaçıq olmaq, gördüyü bir işlə fəxr etmək, qürur duymaq, məğrurluq; əyilməzlik etmək; “İnsanın *başı dik olmalıdır*, amma burnu yox” [XXXIXc.s.127].

**Başına bəla olmaq** – əngəl törətmək, niyyətlərini həyata keçirə bilməmək; “Həm də Bakıdakı rəhbərlər – çünki Naxçıvan onların *başına bəla olmuşdu* – həm də təəssüflər olsun ki, özümüzün içimizdəki dağıdıcı adamlar Naxçıvanı dağıtmaq istəyirdilər” [XXIIc.s.274].

**Başına çarə qılmaq** – çətin vəziyyətdən çıxış yolu axtarmaq, tədbir görmək, əlverişsiz vəziyyətdən çıxmaq; ~ gün

ağlamaq; "Çünki əgər bir imperiya dağılıbsa, imperiyanı təşkil edən respublikaların, necə deyərlər, hərəsi öz başına çarə qılmalı idi, qıldılar da" [XXXVIc.s.222].

***Başına iş gəlmək*** – bədbəxt hadisə ilə üzləşmək, müsibətlə qarşılaşmaq, xoşagəlməz hadisə baş vermək, gözlənilmədən çətin və çıxılmaz vəziyyətə düşmək; "Məni narahat edən bu idi ki, onlardan kiminsə *başına bir iş gəlməsin*" [XLIc.s.21].

***Başına qalmaq*** – həddindən çox olmaq; təyinat yerini tapa bilməmək; "İndi deyəndə ki, ət, süd, yağ, pendir artıqlaması ilə istehsal olunur, başına qalıb, satmağa imkan yoxdur, çünki çıxarıb başqa yerdə satmaq mümkün deyildir, – mən buna nə qədər sevinirəm" [XXIIc.s.278].

***Başına yığmaq*** – 1) bir qrup adamı ətrafına yığmaq; ~ başına toplamaq, mərkəzi mövqedə durmaq, aparıcı olmaq, ətrafına cəm etmək; 2) əzbərləmək, yadında saxlamaq; "Dostumuz Süleyman Dəmirəl bu beynəlxalq təşkilatlarda yenə də bizim hamımızı *başına yığır*" [XXVIc.s.176].

***Başında durmaq*** – rəhbərlik etmək; aparıcı almaq; lider olmaq; idarə etmək, dövlətin yüksək vəzifə kürsülərində oturmaq, rəhbərlik etmək, başçılıq etmək; "İndi də fürsətdən istifadə edərək onu da demək istəyirəm ki, İkinci Dünya müharibəsindən sonra Türkiyənin *başında duran* adamlar böyük Atatürkün vəsiyyətlərinə sadiq olaraq çox düzgün xarici siyasət aparırdılar" [IXc.s.313].

***Başını bulamaq*** – narazılığını bildirmək, imtina etmək, başını sağa-sola tərpətməklə narazı olduğunu bildirmək, imtina etmək; "Birisindən soruşdum, *başını buladı*" [XIXc.s.126].

****Başını əngələ salmaq*** – özünü, yaxud başqasını işə salmaq, təhlükə ilə üzləşmək, mürəkkəb, qarışıq məsələlərə baş vurmaq; ~ başına iş açmaq, işə düşmək; "Biri də deyibdir ki, get, özünü işə salma, *başını əngələ salma*" [XIIIc.s.271].

***Başını qayaya vurmaq*** – ağılsız hərəkət etmək; ~ başını divara vurmaq, başını daşa döymək; "Biz bunların hamısını həyata keçirdiyimiz, dövlətimizi qoruyub saxladığımız, bu dövləti yaşatdığımız halda hələ ki, dövlətə heç bir xeyir verməmiş, ancaq müxalifətçiliklə, hay-küylə məşğul olmuş hansısa qüvvələrin indi Azərbaycan dövlətinə təzyiq göstərməsi ona bərabərdir ki, gedib *başını qayaya vurasan*" [XXIXc.s.329].

***Başını sığallamaq*** – himayəyə götürmək, havadarlıq etmək, üzgörənlik etmək, güzəştə getmək; "Onun *başını sığallayan* adamların hamısı cavab verəcəkdir. Buna heç kəsin şübhəsi olmasın" [Ic.s.109]

****Başını ucaltmaq*** – müsbət mənada tanıtmaq, yaxşı bir işlə, əməllə göstərilən etimadı doğrultmaq; "Biz isə xoşbəxtik ki, xalqımızın belə zəngin mədəniyyəti, musiqisi, incəsənəti var və bunlar həm xalqımızın özünə mənəvi qida verir, həm də onu dünya xalqları içərisində fərqləndirir, tanıdır, *başını ucaldır*" [XLIIIc.s.65].

****Başının üstünə vurmaq*** – bayrağı hündür yerə sancmaq; "Bu bayrağı sessiyanın salonuna gətirdik, *başımızın üstünə vurduq*" [XXIIc.s.205].

***Başlı-başına buraxmaq (1)*** – azadlıq vermək; sərbəst buraxmaq; iradələrinə zor etməmək; "Yəni bilirəm ki, bu artistlər xüsusi məxluqdur. Onların işinə qarışmaq olmaz. Onları gərək başlı-başına buraxasan" [XLIIIc.s.92].

***Başlı-başına buraxmaq (2)*** – nəzarət etməmək, ~ ipini boş buraxmaq; "Əgər istifadə etmirsə, başlı-başına buraxıbsa, orada müdirin heç bir haqqı yoxdur" [XIVc.s.40].

***Başlı-başına qoymaq*** – rəhbərsiz qoymaq, taleyin ixtiyarına buraxmaq; "Camaatı başlı-başına qoyub dağda yerləşən Kələki kəndinə getdi, orada gizləndi, öz vəzifəsini yerinə yetirmədi, fərarilik etdi" [XIIIc.s.350].

***Başqa çərçivəyə keçməmək** – başqa sənət sahəsinə keçməmək; “Ona görə ki, öz işini – sənətini özünün dərk etdiyi çərçivədə o qədər sevir, o qədər qiymətli və vacib hesab edirdi ki, ondan başqa çərçivəyə keçmək istəmirdi” [IXc.s.145].

***Başsız qalmaq*** – sahibsiz qalmaq, rəhbərsiz qalmaq, idarə olunmamaq, himayə və ya qayğıdan məhrum olmaq; “Təəssüflər olsun ki, həmin bina neçə illərdir *başsız* qalıbdır” [XIVc.s.40].

***Başlı-başına buraxmaq*** – nəzarətsizlik; hesabat verilməmək; qanunları saymamaq;

“Altı aydan sonra, 1995-ci ilin martında Xüsusi Təyinatlı Milis Dəstəsi – belə bir dəstə, görünür, hər yerdə var, bizdə də DİN tərkibində belə bir dəstə yaradılmışdı – vaxtilə tamamilə başlı-başına buraxılmış həmin dəstə öz funksiyasını yerinə yetirmək əvəzinə, reketliklə, adam öldürməklə məşğul olur və bu yolla varlanırdılar ” [XXXVc.s.219].

***Başının üstünü almaq*** – qaçmağa fürsət verməmək, yaxalamaq, qənimət kimi baxmaq; “Əgər keçmişdəki kimi, burada yenə OBXSS (red: sosialist əmlakını dağıdanlarla mübarizə şöbəsinin rusca tərcüməsi )yaransa, o da hər bir firmanın *başının üstünü alacaqdır*” [XXXIXc.s.360].

***Başı qarışmaq*** – bir şeylə məşğul olmaq, işsiz qalmamaq, vaxt məhdudluğu olmaq, sərbəst vaxt tapa bilməmək; “Sizin də imkanınız olmur, *başınız qarışıqdır*, mənim də imkanım olmur” [XIIIc.s.5].

***Baş-başa danışmaq** – bilavasitə danışıqlar aparmaq; “Ona görə də, biz dünyanın hər bir ölkəsinə gəlib, dövlət başçısı ilə baş-başa danışıb öz sözümüzü deyirik, fikrimizi ifadə edə bilirik və ölkəmizin mənafelərini qoruya bilirik” [XXIXc.s.92].

***Başsız qalmaq*** – rəhbərsiz qalmaq; lidersiz qalmaq; “Məhz bunların nəticəsində, ancaq buna görə, Azərbaycanın o vaxt ki, iqtidarları – 1988-ci ildən başlayaraq 1993-cü ilə qə-

dər – yalnız özləri haqqında düşündüklərinə görə, yalnız öz hakimiyyətini bərkitmək üçün, yaxud birinin o birisinin əlindən hakimiyyəti alması üçün daxili mübarizə apardıqlarına görə Azərbaycanın vətənpərvər, canını torpaq yolunda şəhid etməyə hazır olan yüz minlərlə insanı *başsız qaldı*” [XXIIc.s.215].

***Başında dəlləklik öyrənmək*** – bir şeyi kiminsə üzərində öyrənməyə çalışmaq, təcrübə etmək, eksperiment etmək; “Dedim harada görünüb ki, xalqın *başında dəlləklik öyrənəsiniz*. Onun üzərində eksperimentlər aparasınız” [Ic.s.59].

***Başında durmaq*** – rəhbərlik etmək, başçılıq etmək, müəyyən bir sahəni idarə etmək; “Əgər kənd müəllimi, deyək ki, iri bir üzümçülük təsərrüfatına rəhbərlik edirsə, dünənki bazar alverçisi isə bütöv bir sahənin *başında durursa*, buna nə ad verəsən, burada nədən danışasan?” [Ic.s.49].

****Bazara döndərmək*** – qaydalara riayət olunmamaq; özbaşınalıq; “Ona görə də Nazirlər Kabinetini *bazara döndərmişdi* və böyük cinayətkarları gətirib buraya doldurmuşdu” [IIIc.s.396].

****Bazarı itirməmək*** – rəqabətə davam gətirmək, bazarı əldə saxlamaq; “Gərək hər gün düşünəsən ki, *bazarı itirməyəsən*” [XXXVIIIc.s.149].

***Bel bağlamaq*** – güvənmək, inanmaq, etibar etmək, arxalanmaq, istinad etmək, söykənmk; “Biz gələcəkdə də belə siyasi fəaliyyətə *bel bağlayacağıq*” [I c. s.215].

***Belinə oturmaq*** – saymamaq; işləməyə imkan verməmək; “Heç kəs düşünməsin ki, bəli, biz yığışdıq Təvəkkülü çıxartdıq, indi bu gəldi, gəlin onun *belinə oturaq*” [XLIVc.s.208].

***Beyninə gəlmək*** – təzə bir fikir kimi düşünmək; “İndi nəsə *beyinlərinə gəlir*, elə bilirlər ki, onlar Amerika kəşf ediblər” [XXXIIIc.s.304].

***Beynini yönəltmək*** – fikirləri, ideyaları istiqamətləndirmək; “Ancaq sadəcə, mən indi bunu izah edirəm ki, bəli, o

vaxt biz hamımız belə tərbiyə olunmuşduq, hamımızın *beyni belə yönəldilmişdi*” [XXXVIIc.s.155].

***Beyindən söz gəlmək** – təfəkkürdən gəlmək, təfəkkürə söykənmək; “Siz də, hamınız da bilirsiniz ki, mənim dediyim sözlərin də hamısı öz *beynimdən gələn sözlərdir*” [XIIIc.s.214].

***Beyinlərini zəhərləmək** – mənfi ictimai-siyasi proseslərin təsirinə düşmək; yoldan çıxmaq; “Çünki, o illərdə bəzi şəxslər həqiqətən vətənpərvərlik göstərərək gedib torpaqlarımızı müdafiə etmişdilər və hərbi peşəni, silahı öyrənmişdilər, amma Azərbaycanın daxilində gedən mənfi ictimai-siyasi proseslər həmin gənclərin bir çoxunu yoldan çıxarmışdı, onların *beynini zəhərləmişdi*” [XXVIIIc.s.330].

***Beynindən çıxarmaq*** – bir şeyi unutdurmaq, yadından çıxarmaq, köhnə fikirləri atmaq, yeniliklə ayaqlaşmaq; “Siyasəti, iqtisadiyyatı *beyninizdən çıxarın*. Keçmişdə yazdığınız kitablarınızın hamısını kənara qoyun” [XXXIXc.s.104].

***Beynini doldurmaq*** – qızışdırıcı mövqe yaratmaq, bir şeyi çox deyib təlqin etmək, təsir etmək; ~ beyninə salmaq, qulağını doldurmaq; “Oxucu faktları riyakarcasına saxtalaşdıran, kriminal əhvalatlardan ləzzət alan, özlərindən toxuduqları uydurmalarla adamların beynini dolduran bu qəzetlərin təsiri altına düşür” [XXVIIc.s.216].

***Beynini fəth etmək** – şüurunda müsbət dəyişiklik etmək, təsirinə salmaq; “Səməd Vurğun şeirinin böyüklüyü, eyni zamanda gözəlliyi ondan ibarət idi ki, onun hər kəlməsi, hər sətri hər bir azərbaycanlının qəlbinə çatırdı, onun *beynini fəth edirdi*, onu öz təsiri altına salırdı” [IXc.s.17-18].

***Bərbad hala salmaq** – pis vəziyyətə qoymaq; yarıtmaz şəklə salmaq; “Ona göstərilən etimadı nəinki doğrultmayıb, həm də tapşırılan sahəni *bərbad hala salmış*, batırmışdır” [IIIc.s.171].

****Bəzək-düzək vurmamaq*** – artıq-əskik hərəkətlərə yol verməmək; təhrif etməmək; “Biz tarixi qiymətləndirməli və tarixə vicdanla və obyektiv yanaşmalı, heç nəyə *bəzək-düzək vurmamalıyıq*” [VIc.s.370].

***Bəladan çıxmaq*** – ağır ictimai-siyasi vəziyyətdən qurtulmaq; “Mən inanıram ki, biz bu *bəladan da çıxacağıq*, mütləq çıxacağıq” [XXXVIc.s.228].

****Bənd-bərəni bağlamaq*** – bütün yolları bağlamaq, inkişafa mane olmaq, hər tərəfi kəsmək; “Yenə də *bənd-bərəni bağlayaq* və deyək ki, həmin iqtisadiyyatı saxlamaq lazımdır” [Ic.s.26].

***Bir araya gəlmək*** – həmfikir olmaq, birləşmək, eyni mövqedən çıxış etmək, birgə fəaliyyət göstərmək; “Beləliklə, biz bu gün yenidən *bir araya gəldiyimiz* zaman mən Türkiyə xalqına, Cümhuriyyətinə və onun rəhbərlərinə Azərbaycan xalqının hörmət və ehtiramını bildirirəm” [VIc.s.354].

****Bir fakt gətirmək*** – bir faktı diqqətə çatdırmaq, söyləmək; “Əlbəttə, mən bir il əvvəl imzalanmış sənədlərin əməli surətdə həyata keçirilməsini səciyyələndirən konkret faktlarla vaxtınızı almaq istəmirəm və yalnız *bir fakt gətirdim*” [VIIIc.s.417].

****Bir kökdən gəlmək*** – eyni mənbədən qaynaqlanmaq; “Biz bir-birimizin mədəniyyətini, tarixi köklərini, adət-ənənələrini, milli-mənəvi dəyərlərini daha çox öyrənirik və onların nə qədər oxşar olduğunu, hamısının *bir kökdən gəldiyini* bir daha görürük” [XXXIIIc.s.295].

****Bir qədər səngimək*** – azalmaq; tempin aşağı düşməsi; “Sonra Çeçenistanda hadisələr *bir qədər səngidi* və bu mövzu bir növ unuduldu, biz də arxayınlaşdıq” [XXIIIc.s.32].

****Bir qəlibə yerləşdirmək*** – bir quruluşa uyğunlaşdırmaq; “Dünya belədir. İndi dünyada bütün ölkələri bir qəlibə yerləşdirmək olmaz” [XXVIIc.s.46].

***Bir şeyi calamaq** – süni yolla birləşdirmək; qeyri-təbii yolla birləşdirmək; “Təbiidir ki, bununla heç kimə heç *bir şeyi calamaq* istəmirəm” [XXVIIIc.s.119].

***Bir yerə yığışmaq** – müəyyən bir ərazidə birlikdə yaşamaq; ~ bir yerə kül tökmək “Mən demirəm ki, bu 40 milyon azərbaycanlının hamısı *bir yerə yığışsın*, bu heç də lazım deyil” [VIIc.s.17].

***Bir yerə yığmaq*** – bir ideya ətrafında birləşdirmək; “Ancaq dövləti idarə etmək, xalqı birləşdirmək, xalqın hamısını *bir yerə yığmaq* – onlar buna qadir deyildilər” [XXXVIc.s.320].

***Bir-biri ilə toqquşmamaq** – münaqişədə olmamaq; çəkişməmək; “Ancaq ümummilli məsələlərin həllində, Azərbaycanın milli mənafelərinin qorunmasında Azərbaycanın bütün vətəndaşları həmrəy olmalıdır, bir olmalıdır, *bir-biri ilə toqquşmamalıdır*” [XXXVIc.s.444].

***Bir-birimizə bağlamaq*** – doğma olmaq, ayrılmamaq; “Adət-ənənələrimizin, mənəvi, dini ənənələrimizin eyni olması, bir-birinə bənzərliyi bizi *bir-birimizə bağlayıb* və doğma edibdir” [VIIIc.s.400].

***Bir-birindən ayrı düşmək** – ayrı-ayrı ölkələrdə yaşamaq; sürgündə yaşamaq; “Bu qohumlar, dostlar uzun illər *bir-birindən ayrı düşmüşlər* və görüşmək həsrəti ilə yaşamışlar” [XXVc.s.58].

***Bir-birinə dayaq olmaq** – Bir – birinə kömək etmək; “Nəhayət, azərbaycanlılar da bir yerə toplaşa bilərmiş, bir – birinə dayaq ola bilərmiş və öz vətənlərini – Azərbaycan torpağı haqqında düşünə bilərmişlər” [Ic.s.430].

***Bir-birinə qovuşmaq** – sıx münasibət yaratmaq; “Azərbaycan öz dövlət müstəqilliyini elan edən kimi, müstəqil dövlət olaraq dünyaya bəyanat verən kimi, sərhədlər açılan kimi Türkiyə və Azərbaycan bir daha *bir-birinə qovuşdu* və əbədiyyətə qədər qovuşdu” [XXIIc.s.242].

****Bir-birini yıxmaq*** – bir-birini məğlub etmək; “Onlar bunları, bunlar da onları *bir – birini yıxmaq* istədilər, axırda Azərbaycan məğlub oldu” [VIc.s.46].

****Birmənalı cavab vermək*** – tərəddüd etməmək, düzgün mövqe tutmaq, ikiüzlülük etməmək, ikili mövqe nümayiş etdirmək; “Müsbət və ya mənfidir deyə *birmənalı cavab vermək* olmaz” [VIIIc.s.318].

****Birmənalı yanaşmaq*** – bir fikrin üstündə dayanmaq, mövqeyini dəyişməmək; “Düzdür, bu qərarımıza heç də maraqlı olmayan tərəflərin hamısı *birmənalı yanaşmadılar*” [Ic.s.352].

***Boğaza gəlmək*** – bezdirmək, usandırmaq, ~ cana doymaq, təngə gəlmək, cana yığmaq, cana gətirmək, zinhara gətirmək, ürəyini çəkmək, gen yerini dar etmək, başını keçəl etmək, beynini xarab etmək; “Hətta mənə deyirlər ki, bəzi sahibkarlar belə yoxlamalardan, müdaxilələrdən o qədər *boğaza gəlirlər* ki, haqlı işlərini bağlayırlar” [XXXVIIIc.s.154].

***Boğaza yığmaq*** – dözülməz şərait yaratmaq; “Zərəri də odur ki, siz iş adamlarını artıq *boğaza yığmısınız*” [XXVIc.s.426].

***Boğazımdan tutmaq*** – imkan verməmək; başqa bir yol verməmək; “Mənim *boğazımdan tutmuşdular* ki, bunu etmə” [XXVIIc.s.285].

***Boğazından tutmaq*** – ciddi tələb etmək; tələb edərək güzəştə getməmək ~ boğazından yapışmaq; “Əgər sən müxalifətdə olanda hakimiyyətdəki adamın *boğazından tutmuşdunsa* ki, 20 Yanvar hadisəsində günahkarsan, filan-beşməkansan, indi hakimiyyət sənin əlindədir, aç bu məsələni, açmadılar” [IXc.s.399].

***Boğazlarında qalmaq*** – axıradək mənimsəyə bilməmək, istəyinə, arzusuna nail olmamaq; ~ gözündə qalmaq, ürəyində qalmaq (mənfi mənada) “Onların oğurladıqları sümük kimi öz *boğazlarında qalmalıdır*” [Ic.s.493].

***Borclu borclunun sağlığın istər*** – borcu qaytarmaq hissi; "Azərbaycanda belə bir söz var: *borclu borclunun sağlığın istər*" [XXXIc.s.80].

****Borcundan çıxa bilməmək*** – xidmətlərinin əvəzini ödəməkdə çətinlik çəkmək; "Ancaq hesab edirəm ki, onun fəaliyyətinə, yaradıcılığına nə qədər yüksək qiymət versək də, yenə də onun *borcundan çıxa bilmərik*" [XXIIc.s.262].

****Boş yerdə qalmaq*** – quru yerdə qalmaq; kasıblamaq; iqtisadiyyatı tam mənada zəifləmək; "Əgər biz müstəqilliyi bundan ötrü əldə etmişiksə ki, olan-qalanı da dağıdaq, özümüz bir şey yaratmayaq, qurmayaq – axı belə getsə, müəyyən bir vaxtdan sonra hər şey dağılacaq və biz *boş yerdə qalacağıq*" [Ic.s.268].

****Boş-boş sözlər danışmaq*** – məna kəsb etməyən sözlər danışmaq; "Ancaq burada tamamilə doğru deyildi ki, baş nazir gündə üç dəfə müşavirə yığanda, orada *boş-boş sözlər danışanda*, axmaq işlərlə məşğul olarkən onun yanında oturan müavinlər ya ağızlarına su alırdılar, ya da ki, "baş üstə, baş üstə" deyirdilər" [IIc.s.385].

****Boşlayıb getmək*** – bəhanə etməmək; razılaşmaq; "Ona görə də Baş katib Brejnev səni qəbul edəcəkdir, odur ki, gəl bütün bunları *boşla getsin*" [XXXVIc.s.159].

***Boya-başa çatmaq*** – yetkinlik yaşına çatmaq, böyümək, yetişmək; ~ ərsəyə çatmaq; "Bizim əzizimiz Müslüm də bax, bu mühitdə doğulmuş, *boya-başa çatmış* və belə böyük müğənni, böyük musiqiçi və böyük vətəndaş olmuşdur" [XIIc.s.357].

****Boyalı nəticələr vermək*** – fərqli nəticələr vermək, qədərindən artıq nəticələr gözləmək; ~ boynuna götürmək; "Biz heç vaxt belə fikirdə deyildik ki, ağır, çətin bir şəraitdə keçirilən bu ümumxalq tədbiri çox hamar keçəcək, çəhrayı rənglərlə *boyalı nəticələr verəcək* və hamısı tam müsbət olacaqdır" [Vc.s.11].

***Boynuna almaq (1)*** – etiraf etmək; səhvlərini etiraf etmək; "Gəldi, oturdu, bütün günahlarını *boynuna aldı*." [XLc.s.297]

***Boynuna almaq (2)*** – məsuliyyəti üzərinə götürmək, söz vermək; "Baş nazir Surət Hüseynov bu məsələni öz üzərinə götürmüşdür və Əlikram Hümbətovla yaxın əlaqələri olduğuna görə bu məsələni sülh yolu ilə həll olunmasını *boynuna almışdır*" [Ic.s.104].

***Boyun qaçırmaq (1)*** – bir işə qarışmamaq, bir işə qoşulmamaq, məsuliyyətdən qaçmaq, məsuliyyətdən imtina etmək, qanunlara əməl etməmək; "Orduya səfərbərlikdən yayındığına görə, vətəndaşlıq borcunu yerinə yetirməkdən boyun qaçırdığına, ordu sıralarından qaçdığına görə məsuliyyətə alınmış gənclərimiz var"[IVc.s.374].

***Boyun qaçırmaq (2)*** – fərarilik etmək, ~ özünü qırağa çəkmək, kənar durmaq, yaxasını qırağa çəkmək, yükü üzərindən atmaq; "Ayrı-ayrı adamlar rüşvət verərək orduda xidmət etməkdən boyun qaçırırlar" [Ic.s.494]

****Böyük işlər görmək*** – yaddaqalan, xalqın inkişafı yolunda görülən işlər görmək; "Əziz qardaşım, 80 yaşın tamam olarkən fəxr edə bilərsən ki, sən şərəfli bir ömür yaşamısan, *böyük işlər görmüsən*, xalqına sədaqətlə xidmət etmisən və xalqın üçün gözəl əsərlər yaratmısan" [XIIIc.s.214].

****Bugünkü günümüzə yaraşmaq*** – bugünkü günümüzə uyğun gəlmək; "Bu, bizim *bugünkü günümüzə yaraşarmı*? " [IXc.s.181].

****Buxova çevrilmək*** – hərəkət etməyə imkan verməmək, ~ buxov vurmaq; "Bu fərq isə get-gedə çoxaldı, 40 – cı illərdə insanları mübarizəyə qaldıran, səfərbər edən sovet quruluşu, sistemi artıq *buxova çevrildi*, işləmədi" [VIIIc.s.46].

****Burnu yelli olmaq*** – lovğa, təkəbbürlü olmaq; "Ancaq gənc, təcrübəsiz, necə deyərlər, *burnu yelli* adamlar idi" [VIIc.s.482].

***Burnunu dik tutmaq*** – özünü təkəbbürlü aparmaq; lovğalanmaq, ~ özünü çəkmək, burnu göylə getmək; "Heç vaxt *burunlarını dik tutmasınlar*" [XXXIXc.s.127].

***Burnunun ucundan o tərəfi görməmək*** – uzaqgörən olmamaq; proqnozlaşdıra bilməmək, hadisələri düzgün qiymətləndirməmək, nəticə çıxarmağı bacarmamaq; "Mən dəfələrlə demişəm ki, bəziləri dünyanı anlamayan, *burnunun ucundan o tərəfi görməyən* adamlar indi hər şeyi pisləyirlər" [VIIIc.s.334].

****Bünövrə qoymaq*** – əsasını təşkil etmək; əsasını qoymaq; zəmin yaratmaq "Hesab edirəm ki, bütün Gürcüstanın da, Azərbaycanın da, Ukraynanın da Qərb, Avropa ölkələri ilə Avropa birliyi, ABŞ-la əməkdaşlığı üçün yaxşı *bünövrə qoymuşdur*" [XXc.s.21].

### *Cc*

****Camaata sırımaq*** – xalqı qeyri-düzgün informasiya ilə aldatmaq; "Onu da nəzərə alsaq ki, bəziləriniz bir xırda şeyi eşidib onun üzərində on beş versiya yaradırsınız. Hər bir versiyanı da *camaata sırımaq* istəyirsiniz" [XXXIIIc.s.303].

***Can atmaq*** – çalışmaq, cəhd göstərmək, bir şeyi əldə etməyə və ya bir işi gerçəkləşdirməyə çalışmaq, davamlı səy göstərmək, cəhd etmək, istəmək; ~ ürəyi atlanmaq; "Hər kəs dövlət tərəfindən, dövlət başçısı tərəfindən göstərilən etimada həm sadiq, layiq olmalıdır, həm də bu etimadı doğrultmağa *can atmalıdır*" [IIc.s.119]. ***Can atmaq*** – cəhd etmək; mübarizə aparmaq; "Əgər bunlar olmasaydı, yüz illərlə tarixi olan Rusiya imperatorluğu Birinci Dünya müharibəsi nəticəsində və dünyada əmələ gəlmiş bu qarışıq vəziyyətdə dağılmasaydı – bunu düzgün demək lazımdır – o vaxtkı Xalq Cümhuriyyətini yaradan insanlar nə qədər *can atsaydılar*, onlar Azərbaycanın müstəqilliyini elan edə bilməzdilər" [XXXVIc.s.221].

***Can atmamaq*** – çalışmamaq, istəməmək; "Bax, belə bir vəziyyətdə mən həmin vəzifələri öz üzərimə götürdüm. Təkrar edirəm, mən buna *can atmırdım*, mən bunu istəmirdim" [Ic.s.24].

***Can qoymaq*** – əzab-əziyyət, cəfa çəkmək, əlindən gələni əsirgəməmək, çox əziyyət çəkmək; ~ dəridən-qabıqdan çıxmaq, ürəyini qoymaq; "Necə deyərlər, *canımı qoymuşam* ki, Azərbaycanda suya qənaət edilsin, su itməsin" [XXVIIc.s.251].

***Can qurtara bilməmək*** – vərdişlərdən əl çəkə bilməmək; "Köhnə binada kababdan, ləvəngidən *can qurtara bilmirsiniz*, çünki oranın kökü elə qoyulubdur" [XIXc.s.251].

****Can-başla yanaşmaq*** – sevgi ilə yanaşmaq; məsuliyyətlə yanaşmaq; "Onlar işə daha da *can-başla yanaşmalıdırlar*" [IVc.s.218].

****Canfəşanlıq etmək*** – səs-küy qoparmaq, gözdən salmağa cəhd etmək; "Mənim Amerikaya rəsmi səfərim ərəfəsində erməni təşkilatları orada nə qədər *canfəşanlıq etdilər*, nə qədər fəaliyyət göstərdilər" [XIIIc.s.289].

***Canı yanmaq*** – kömək etmək istəyi olmaq, bir işə sevgi ilə yanaşmaq, istəmək, acımaq; ~ rəhmi gəlmək, ürəyi yanmaq, yazığı gəlmək; "Həmin təklifləri irəli sürənlər Azərbaycana *canı yanan* adamlardır" [Ic.s.236].

***Canımızı qurtara bilməmək*** – "Deyirdi ki, burada milçəkdən, ağcaqanaddan, həşəratlardan *canımızı qurtara bilmirdik*" [XLIVc.s.205].

****Canına işləmək*** – alışmaq, ayrı düşə bilməmək, öyrəşmək, təsir etmək, sirayət etmək; "Bundan heç ayrılmaq da istəmirlər, elə bil ki, *canına işləyibdir*" [VIc.s.225].

***Canını dişinə tutmaq*** – çətinliklərə dözmək, məcburən dözmək, könülsüz olmaq, həvəssiz olmaq, bir işi candərdi görmək, özünü nəyəsə dözməyə məcbur etmək; "Birinci dəfə gəlib gördüm ki, *canlarını dişlərinə tutub* oturublar" [XXXVIIIc.s.126].

***Canını qurtara bilməmək** – cəzadan azad ola bilməmək; “Cinayətkarlar tapılacaq, cəzalandırılacaq və o qaçmış adamlar da Azərbaycan xalqının əlindən canlarını qurtara bilməyəcəklər” [IIc.s.281].

***Canını qurtarmaq** – şəxsən özünü qorumaq, öz hayına qalmaq, xilas olmaq, təhlükədən qurtulmaq; ~ yaxasını qurtarmaq, başını qurtarmaq, cəngindən qurtarmaq, işin içindən çıxmaq; “Öz canı haqqında düşünən və xırda bir çətinlikdə ancaq qaçmaqla *canını qurtarmaq* istəyən insanlar – bunlar heç vaxt xalqın hörmətini, xalqın etimadını qazana bilməzlər” [XXXVIc.s.325].

***Canlarını qurban vermək*** – canından keçmək, bir şey uğrunda özünü fəda etmək, yolunda ölümə getmək; ~ başından keçmək, başını vermək; “Azərbaycanın mərd, igid oğulları, vətənpərvər insanları respublikamızın müstəqilliyini, suverenliyini, ərazi bütövlüyünü qorumuş, qoruyub saxlamaq üçün mübarizə etmiş və *canlarını qurban vermişlər*” [VIIc.s.376].

***Cavabını almaq** – yalanı ifşa etmək; həqiqəti ortaya qoymaq; susdurmaq; həqiqəti aşkarlamaq; “Onlar *cavablarını aldılar*, özü də təkcə xaricdəki bədxahlarımız deyil, bəlkə də hətta, təəssüflər olsun, düşmənlərimiz də” [XXIIc.s.20].

***Cənnətə düşmək** – bütün məsuliyyətlərdən kənarda olmaq, qayğılardan uzaq olmaq, qayğısız həyat yaşamaq; “İtaliya Xarici İşlər nazirinin müavinindən əlavə, İtaliyanın Avropa Şurasındakı daimi səfiri, İtaliyadan Avropa Şurasında çalışan bir neçə yüksək vəzifəli şəxs də gəlmişdi – mən onlara dedim və bu sözü bir neçə dəfə təkrar etmişəm ki, Avropa Şurasına daxil olmaq bizim üçün bal yemək, *cənnətə düşmək* deyildir” [XXIXc.s.7].

***Cəsarətlə durmaq** – cəsarətlə qorumaq; “Əminəm ki, onlar üzərlərinə düşən şərəfli vəzifəni yerinə yetirəcək, inanıram ki, silahlı qüvvələrimiz Azərbaycanın dövlətçiliyinin,

torpaqlarımızın, müstəqilliyimizin qorunmasının keşiyində həmişə *cəsarətlə duracaqlar*" [XVc.s.419].

***Cəsarətlə qaldırmaq** – gündəmə çıxarmaq, məsələləri ortaya qoymaq; "Bunlar həyatımızın mənfi halları ilə bağlı kəskin mənəviyyat məsələlərini çox *cəsarətlə qaldıran* filmlərdir" [VII c. s.445].

***Cığır açmaq*** – yeni yol açmaq, inkişaf yoluna qədəm basmaq, yenilik etmək, yeni istiqamətin əsasını qoymaq; "Biz bu *cığırı*, yolu *aça-aça* gedirik" [XIVc.s.273].

***Cızığından çıxmaq*** – xoşagəlməz hərəkətlər etməyə başlamaq, qudurmaq, qaydalara əməl etməmək; qanunları pozmaq; ~ pis yola düşmək, etikanı pozmaq, yolundan çıxmaq, həddini aşmaq; "İnsan heç vaxt *cızığından çıxmamalıdır*" [XXXIXc.s.127].

***Cibindən getmək** – zərərə düşmək, xeyir götürməmək; "Hektarın məhsuldarlığının 7-10 sentner səviyyəsinə düşməsi, ən əvvəl kəndlinin, təsərrüfatın, rayonun *cibindən gedibdir*" [Ic.s.489].

***Cibini doldurmaq*** – varlanmaq, pullanmaq, kimisə varlandırmaq, dövlətin əmlakını mənimsəmək; "Demək, vəzifədə olan şəxs həm özü yaxşı şəraitdə yaşayır, həm də qanunsuz olaraq *cibini doldurur*" [XXIVc.s.312].

***Ciddi addımlar atmaq** – inkişafa doğru hərəkət etmək; "Bir sözlə, biz demokratik cəmiyyət quruculuğu yolunda ciddi addımlar atmışıq və atırıq" [VIIIc.s.403].

***Cinayətkarlardan təmizləmək** – cinayətkarları zərərsizləşdirmək; cinayət törədənləri qanuni şəkildə cəzalandırmaq; "Ancaq biz bunların hamısının qarşısını aldıq, Azərbaycanı *cinayətkar dəstələrdən təmizlədik*, ölkəmizdə sağlam mühit yaratdıq və ictimai-siyasi sabitliyi tam təmin etdik" [XXVIIIc.s.37].

## *Çç*

***Çağırışa səs vermək** – reaksiya vermək, müsbət cavab vermək; “Hesab edirəm ki, Almaniya şirkətləri mənim *çağırışıma səs verəcəklər*” [VIIc.s.44].

***Çalışıb-vuruşmaq** – analiz etmək, hərtərəfli düşünmək; “Çünki məsələ çox ciddidir, mürəkkəbdir və bu məsələni həll etmək üçün gərək çox *ölçüb-biçək*” [IIIc.s.57].

***Çaş-baş qalmaq*** – anlaşılmaz vəziyyətə düşmək; Dəqiq fikrə gələ bilməmək, aydınlaşdıra bilməmək, siyasi situasiyanı aydın təsəvvür edə bilməmək; “Camaat, əhali, xüsusən o bölgədən olan əhali *çaş-baş qalıbdır*” [Ic.s.80]., “Azərbaycan Respublikası rəhbərlərinin dövlət orqanlarının mövqeyi məlum olduğuna görə, xalq da *çaş-baş qalmışdır*” [Ic.s.105].

***Çəkişib-bərkişmək** – mübarizə yollarında mətinləşmək, təcrübə toplamaq, bərkə-boşa düşmək; “Amma bu yolda gedən adamlar bir tərəfdən *çəkişib-bərkişiblər*, bir tərəfdən də qanunları az-çox öyrəniblər” [VIIc.s.230].

***Çəhrayı eynəkdən baxmaq** – olduğu kimi görməmək, rəngləri qarışdırmaq; “Ümumiyyətlə, bu onilliyi qeyd edərkən heç də hər şeyi *çəhrayı eynəkdən baxmamalıyıq*” [XXXVIc.s.227].

***Çəpərləri yarmaq** – maneələri dəf etmək; maneələri aşmaq; maneələri keçmək; “Bax, bütün maneələri, *çəpərləri yarıb keçmək* lazım idi və mən mübarizə apardım” [Vc.s.212].

***Çərçivədə qalmaq*** – öz hüdudları daxilində qalmaq; məhdudlaşmaq; “Amma onların hamısı, əksəriyyəti, demək olar ki, müəyyən xalqların, yaxud millətlərin, ölkələrin *çərçivəsində qalır*” [XXXVIc.s.283].

***Çərçivədən çıxmaq*** – müəyyən olunmuş qaydalara məhəl qoymamaq, qanunlara əməl etməmək; nəzarətdən çıxmaq; “Çünki onlar artıq *çərçivədən çıxmışdılar* və başqa-başqa

dairələrdən o qədər idarə olunurdular ki, görünür Əbülfəz Elçibəy də burada heç bir iş görə bilmirdi” [XXVc.s.420].

***Çıxdaş olmaq*** – seçilmək, keyfiyyət fərqinə görə seçmək; “Yəni loru dildə desək, bir az *çıxdaş olubdur*” [XLIVc.s.8].

***Cızma-qara yazmaq*** – mahiyyətsiz, mənasız estetik zövqü oxşamayan əsərlər yazmaq; “... kitabını çap etdirməyə kimin pulu var, buyurub gəlsin, roman adıyla *cızma-qara yazsın*, beləliklə də həqiqi yazıçılar, doğrudan da xalqın ədəbiyyatını yaradanlar kənarda qalsın”[XIIIc.s.8].

***Çin olmaq*** – arzuları həyata keçirmək; “Bu gün, 20 ildən sonra mən böyük iftixar hissi ilə deyirəm ki, bizim o ümidlərimiz, *arzularımız çin oldu*, yerinə yetdi” [Vc.s.209].

***Çirkli pulları yumaq*** – qeyri-qanuni qazanılmış pulları rəsmiləşdirmək; “Məmnunluq hissi ilə qeyd etməliyəm ki, Azərbaycan Respublikası beynəlxalq terrorizm, mütəşəkkil cinayətkarlıq, narkotik vasitələrin və psixotrop maddələrin qeyri-qanuni ticarəti, *çirkli pulların yuyulması*, silah qaçaqmalçılığı və insan alveri ilə mübarizə sahəsində qəbul edilmiş bütün əsas beynəlxalq sənədlərin iştirakçısıdır” [XXXVIIIc.s.192].

***Çiyin-çiyinə işləmək*** – birgə işləmək, bərabər şəkildə çalışmaq, yaxın dost və həmfikir olmaq; ~ çiyin-çiyinə vermək, köməkləşmək, birgə hərəkət etmək; “Mən gedəndən sonra 5 il *çiyin-çiyinə işlədiyim* – bundan əvvəl isə Siyasi Büro üzvlüyünə namizəd olmuşam – Siyasi Büro üzvlərinin heç biri ilə əlaqəm yox idi, hər şey kəsildi, tək qalmışdım” [XLIVc.s.260].

***Çiyinləri üstündə qurulmaq*** – “Gələcək bilikli, elmli insanların *çiyinləri üzərində qurulacaqdır*” [XIIc.s.113].

***Çiyin-çiyinə işləmək*** – birgə işləmək, bir yerdə fəaliyyət göstərmək; “Vaxtilə mənimlə çiyin-çiyinə işləmiş adamlardan bir çoxu da mənimlə görüşməkdən çəkinirdi” [IIIc.s.178].

***Çiyin-çiyinə vermək*** – birgə fəaliyyət göstərmək, köməkləşmək, yaxın dost və həmfikir olmaq; ~ baş – başa vermək, kürək-kürəyə vermək; "Əsrlər boyu xalqlarımız bir olmuş, *çiyin-çiyinə vermişlər*, Azərbaycan ilə Türkiyə arasında əlaqələri dostluq, qardaşlıq əlaqələri adlandırmışlar" [Ic.s.366].

****Çalın-çarpaz xətt çəkmək*** – qarşısını tam almaq; "Amma mən istefaya çıxan kimi, onun karyerasının üstündən *çalın-çarpaz xətt çəkdilər*" [Ic.s.47].

****Çiyinlərdə ağır yük olmaq*** – məsuliyyətin çox olması; "Çünki niyə, mənim *çiyinlərimdə ağır yük var*. Azərbaycan xalqının, müstəqil Azərbaycanın prezidenti kimi, məsul bir yük var. Mən bu yükü üzərimə götürərkən, çiyinlərimə alarkən dərk edirdim ki, bu asan məsələ, asan iş deyil."

****Çox qırılmaq*** – tələf olmaq, məhv olmaq, həlak olmaq; "Dediyim kimi, bir hissədən 160 nəfər həlak olubdur. Düzdür, o tərəfdə erməni quldurları, erməni silahlı qüvvələri 3-4 dəfə *çox qırılıb*" [Ic.s.502].

****Çox qışqırmaq*** – edilən xidməti şişirtmək, ~ başa qaxmaq; "Bilirsiniz, heç kəs deyə bilməz ki, mənim filan vaxt filan xidmətim olubdur, filan vaxt meydanda bir az *çox qışqırmışam*, mənim qanunu pozmağa ixtiyarım var" [XIIIc.s.278].

***Çoxşaxəli etmək*** – müxtəlif istiqamətlərdə iş yaratmaq; "Mən bütün başqa görüşlərdə olduğu kimi, burada bir daha hiss etdim ki, Böyük Britaniya və Şimali İrlandiya Birləşmiş Krallığı Azərbaycanla əlaqələri daha da genişləndirmək, yüksəklərə qaldırmaq, *çoxşaxəli etmək* istəyir" [XVIc.s.481].

***Çölə atmaq*** – vəzifədən çıxarmaq; çıxarıb başqa işlə təmin etməmək; "O vaxt çıxartdılar, *atdılar çölə*" [XLIVc.s.204].

***Çölə tökmək*** – evdən qovmaq, yurd-yuvasından etmək, şəraitsiz yerə tökmək; pis şəraitdə məskunlaşdırmaq; ~ bayıra atmaq, çöllərə salmaq; "Dağlıq yerdə yaşayan adamları yük

vaqonlarına doldurub, dəmir yolu ilə gətirib Azərbaycanın Muğan, Mil zonasına – *çöllərə tökdülər*" [XLIc.s.175].

***Çöllük-biyabanlıq*** – həyat şəraiti olmamaq; "Mən ilk dəfə buraya gələndə bu yerlər *çöllük – biyabanlıq* idi" [Vc.s.216].

## *Dd*

***Daban-dabana zidd olmaq*** – antaqonist olmaq, bir-birinə əks olmaq, diametral əks olmaq, əksliklərin ziddiyyət təşkil etməsi; "Əgər mövqelər *daban-dabana ziddirsə*, özü də bir tərəfdə güc, təcavüz, işğal, digər tərəfdə isə təcavüzün qurbanı durursa, necə razılığa gəlmək olar?" [XLIVc.s.56].

***Dabanını yalamaq*** – yaltaqlıq etmək; ayaqlara düşmək; "Əli Təhməzov vardı, az qalırdı Surət Hüseynovun *dabanını yalasın*" [IVc.s.497].

****Dağı-dağ üstə qoymaq*** – qeyri-adi iş qabiliyyəti olmaq, yekəxana danışmaq, özündən razı olmaq; " Ona görə ki, siz özünüz haqqında elə fikirdəsiniz ki, guya siz böyük hünər göstərib, *dağı-dağ üstə qoymusunuz*" [Ic.s.190].

****Dal qapıdan girmək*** – qeyri-qanuni yola əl atmaq; "Yenə də deyirəm, əsas qapıdan girmək əvəzinə, "*dal qapıdan" girib*"[XXXVc.s.111].

****Dalbadal gəlmək*** – bir-birinin ardınca gəlmək, bir-biri ilə yarışmaq, bir-birinə imkan verməmək; "Artıq dünyanın ən böyük neft şirkətləri Azərbaycana üz tutur, onların prezidentləri *dalbadal ölkəmizə gəlirlər*" [IIIc.s.261].

****Damğa vurmaq*** – iftira yaxmaq, olmayan şeyi demək; "Ancaq eyni zamanda, mən dəfələrlə demişəm, heç kəsə *damğa vurmaq* olmaz" [IIc.s.562].

***Damğanı götürmək*** – formalaşmış mənfi fikri aradan qaldırmaq, iftiranı aradan qaldırmaq; "Siz gərək elə çalışasınız ki, o *damğanı götürəsiniz*" [XXXIXc.s.355].

***Danışıqlar aparmaq*** – diplomatik söhbətlər etmək; "Ermənistan – Azərbaycan münaqişəsinin sülh yolu ilə həll edilməsi məqsədi ilə mən Minsk qrupunun sədri, İtaliyanın nümayəndələri ilə dəfələrlə görüşüb *danışıqlar aparmışam*" [XVIc.s.7].

***Dara düşmək*** – ağır, çətin vəziyyətə düşmək, çətin yaşamaq, ehtiyacı olmaq, maddi cəhətdən sıxıntı çəkmək; "Bunun naminə biz müsəlman ölkələrinin inkişafına mane olan əngəlləri aradan qaldırmalı, bir-birimizə yardım əli uzatmalıyıq, parçalanmanın və təklənmənin qarşısını almalıyıq, *dara düşmüş* qardaşlarımıza birlikdə kömək etməliyik" [IIIc.s.19].

****Darmadağın etmək*** – tamamilə məhv etmək; dirçəlmək imkanı verməmək; bərpası mümkün olmamaq; "Naxçıvanlılara azərbaycanlılara türklərə qardaş yardımını göstərdilər və orada erməniləri *darmadağın etdilər*" [XXXIXc.s.297].

***Dartıb gətirmək*** – gətirib həbs etmək; "Kim gəlib təslim olmasa, biz onları Surət kimi tutub, *dartıb gətirəcəyik*" [IXc.s.124].

***Daşı-daş üstə qoymaq*** – quruculuq işi ilə məşğul olmaq; "Onlar Sumqayıtın həyatı üçün nə ediblər, hansı ağacı əkiblər*,hansı daşı-daş üstə qoyublar,* hansı tədbiri görüblər k*i*, Sumqayıt daha da yaxşı, gözəl olsun?" [VIc.s.387].

***Daş qoymaq*** – kömək etmək; "Mənə elə gəlir ki, biz Gürcüstanla Azərbaycan arasında dostluq münasibətlərinin inkişaf etdirilməsi binasının möhkəmlənməsinə hər dəfə yeni bir davamlı *daş qoyuruq*" [XXXVIc.s.187].

***Daş üstə daş qalmamaq*** – yerlə-yeksan etmək, xarabalığa çevrilmək, hər şeyi dağılmaq, yerlə yeksan edilmək; ~ xaraba qalmaq, viran qalmaq, "Orada *daş üstündə daş qalmayıbdır*" [XXVIIc.s.230].

****Dayanıb durmaq*** – hərəkətsiz qalmaq; inkişafdan qalmaq; hadisələrə biganə qalmaq; "Çünki heç vaxt bir yerdə *dayanıb-durmaq* olmaz, axı indi dünya çox dinamik inkişaf

edir, regionumuzda müxtəlif proseslər gedir, ona görə də biz bütün çağırılara cavab verməliyik və bu baxımdan biz həmişə Gürcüstanla birlikdə olmuşuq, eləcə də Gürcüstan Azərbaycanla birlikdə olmuşdur"[XXXVc.s.358].

***Dəf etmək** – aradan qaldırmaq; öhdəsindən gələ bilmək; – "Nəzərə alsaq ki, ötən yeddi ildə biz bütün bu maneələri və çətinlikləri, hər halda, *dəf edə bilmişik*, deməli, daha böyük təcrübə toplamışıq, mətinləşmişik, ayaq üstündə daha möhkəm durmuşuq" [XXXVIc.s.194].

***Dərin dərya olmaq** – dərin məzmuna malik olmaq; tariximizin qədim köklərini əks etdirmək; "Çünki mən özüm də etiraf etməliyəm ki, "Dədə-Qorqud"un bu qədər *dərin dərya olduğunu* təsəvvür edə bilmirdim" [XXVc.s.334].

***Dərin quyuya salmaq** – xalq üçün əlçatmaz etmək; xalqdan gizləmək; xalqdan xəbərsiz saxlamaq; "Amma onun əsərlərini elə "*dərin quyuya "salmışdılar* ki, insanlar onu o qədər də yaxşı tanımırdılar."[XXXIXc.s.159]. ***Dərin quyuya salmaq*** – problemlər yaratmaq; həlli çətin problemlər yaratmaq; "Amma bu azadlıqlardan yalnız və yalnız xalqın mənafeyi naminə istifadə olunmalıdır, xalqı daha *dərin quyuya salmaq* üçün yox" [IIc.s.245].

***Dəryaya atmaq** – proqnoz verilməyi çətin olan işə girişmək; "Moskvadan Naxçıvana gələndə belə fikirdə idim ki, mən özümü *dəryaya atıram"* [XXVIc.s.359].

***Dəstxəti olmaq** – üslubu olmaq, özünəməxsus olmaq, heç kəsə oxşamamaq; "Başqa sözlə desək, onun özünəməxsus *dəst-xətti* vardır" [IIc.s.249].

***Dəstələri yaxalamaq** – həbs etmək, məsuliyyətə cəlb etmək; "Sizə məlumdur ki, təxminən son bir ay içərisində Azərbaycanın Milli Təhlükəsizlik Nazirliyi və Daxili İşlər Nazirliyi tərəfindən bir neçə belə qruplar, *dəstələr yaxalanıblar*, həbs ediliblər, məsuliyyətə cəlb olunublar" [VIIIc.s.192].

***Dəyirmanına su tökmək*** – başqasının mövqeyini gizli ya açıq şəkildə müdafiə etmək, öz xalqının mənafeyini düşmən ayağına vermək; ~ düşmən dəyirmanına su tökmək, özgə dəyirmanına su tökmək, düşmən işinə kömək etmək, düşmənin işini daha da sürətləndirmək; "Nə mübarizəyə qoşulub, nə müxalifətə cavab verib, nə onların yalanını, böhtanını ifşa edib, amma bəzən də onların *dəyirmanına su tökür*" [XXIc.s.327].

****Dəyişikliyi alqışlamaq*** – dəyişikliyi bəyənmək; dəstəkləmək; "Deməli, onlar bu məsələni həll etməlidirlər və buna qadirdilər, odur ki, biz bu *dəyişikliyi alqışladıq* və buna böyük ümidlər bəsləyirik" [XIc.s.92].

***Didərgin düşmək*** – yurdundan, el-obasından qovmaq, ərazini zorla, pərakəndə şəkildə tərk etmək; "Xüsusən, sizin yanınıza, yerindən-yurdundan *didərgin düşmüş*, varını-yoxunu itirmiş insanlarla, böyük itkilər vermiş insanlarla görüşə gəldiyinə mən ona təşəkkür edirəm" [Vc.s.469].

***Dil – boğaza qoymamaq*** – çox danışmaq, fasilə vermədən təkrar-təkrar danışmaq, məntiqsiz danışmaq, çoxlu səhvlərə yol vermək; ~ dilotu yemək, dil boğaza sığmamaq; "Elə hey danışır, *dil – boğaza qoymurdular*" [Ic.s.58].

***Dil tapmaq (1)*** – məsələnin həllində yaxasını kənara çəkmək; öz arasında problemi həll etmək; "Əgər böyük dövlətlər bəyanat verirlərsə ki, biz Azərbaycanın ərazi bütövlüyünü tanıyırıq, sonra da Azərbaycanın ərazisinin 20 faizinin Ermənistan silahlı qüvvələrinin işğalı altında olmasını görür və buna göz yumurlarsa və hətta deyirlərsə ki, özünüz *dil tapın*, danışın, deməli, bunlar ikiüzlülük edir, məsələyə ikili standartlarla yanaşırlar" [XLc.s.81].

***Dil tapmaq (2)*** – diplomatik əlaqə yarada bilmək, anlaşmaq, ümumi razılığa gəlmək, qarşılıqlı anlaşmaya nail olmaq, bir-birilə razılaşmaq; ~ yola getmək; "Lakin onlar İranla *dil tapa* bilməyiblər. Mən də onlara demişəm ki, siz gedin İranla *dil tapın*."[XXXc.s.70]

***Dilə tutmaq*** – tovlamaq, şirin sözlərlə birini razı salmağa, bir şeyi əldə etməyə çalışmaq, razılığa nail olmaq; ~ dil tökmək, dilini işə salmaq, dilə basmaq; "Bakıdan yanıma tez-tez adamlar gəlir, *dilə tuturdular* ki, siyasətə qayıdım" [Ic.s.59].

***Dinimizi əlimizdən almaq*** – dini hüquqlardan məhrum olmaq; dini adət-ənənələri qadağan etmək; "Demək, *dinimizi əlimizdən almışdılar*. Dinimizi əlimizdən alanda bizim adət-ənənələrimizin də çoxunu – dinlə bağlı olduğuna görə – qadağan etmişdilər" [XXIXc.s.86].

***Dilə gətirmək*** – demək; danışmaq; "Başqa məhsulların istehsalı da o qədər aşağı düşüb ki, onları *heç dilə gətirmək* istəmirəm" [IIc.s.585].

***Dilə tutmaq*** – xahiş etmək, razılaşdırmaq, yola gətirmək; "İkincisi, mən hakimiyyətə özüm gəlməmişəm, məni dəvət etmişlər. Məni təkidlə *dilə tutmuşlar*" [Ic.s.23].

****Dilə vurmaq*** – dadmaq; "İçkini də rəmzi olaraq *dilimə vurmuşam* – sağlıq deyiləndə badəni ancaq qaldırmaqla kifayətlənmişəm" [Ic.s.46].

****Dili əritmək*** – dili assimilyasiyaya məruz qoymaq; "Amma eyni zamanda, bir *dili başqasının içərisində əritmək* lazım deyil" [VIIc.s.22].

****Dili saymamaq*** – dilə hörmət etməmək; dövlət işlərində dildən istifadəyə imkan verməmək; "Bizi əzirdilər, *dilimizi saymırdılar*" [XLc.s.80].

***Dilinə söz düşmək*** – həmişə eyni sözləri təkrarlamaq; "Bizim müxalifətin də *dilinə belə bir söz düşübdür*: Heydər Əliyev deyir ki, demokratiya üçün zaman lazımdır"[XLc.s.15].

****Dili əlindən almaq*** – xalqı öz dilində yazıb – oxumaqdan məhrum etmək; "Çünki millətin *dilini əlindən alsan*, onu öz dilindən məhrum etsən, o millət çox şey itirər" [XLIIIc.s.377].

***Dilin kökü** – danışıq dillərinin mənşəyi; “Bizi bir-birimizə bağlayan nədir? *Dilimizin kökü*” [XLIIIc.s.367].

***Dilinə almaq*** – birisi haqqında danışmaq; birisi haqqında fikir söyləmək düşünmək; “Elə üç nəfər adamı *dilinizə almısız*” [XXXVIIc.s.216].

***Diqqətini cəlb etmək*** – marağına səbəb olmaq; maraqlanmaq; “Sonrakı onilliklərdə Azərbaycanın neft yataqları dünyanın böyük şirkətlərinin nəzər-*diqqətini cəlb etmiş* və XIX əsrin sonu – XX əsrin əvvəlində Bakı dünyada ən böyük neft hasil edilən bölgəyə çevrilmişdi” [XXXIXc.s.8].

***Diqqətlə yanaşmaq*** – əhəmiyyət vermək; “Lakin mən hər bir fikrə, təklifə hörmətlə, *diqqətlə yanaşıram* və güman edirəm ki, bunlar gələcək üçün faydalı olacaqdır” [Ic.s.248].

***Dişimizə vurmaq*** – sınamaq, yoxlamaq, sınaqdan keçirmək, təyin etmək; ~ sınaqdan çıxarmaq; “Loru dildə desək, biz çox şeyi *dişimizə vurduq* və nəyin nə olduğunu artıq anlamağa başladıq” [Ic.s.166].

***Diz çökdürmək*** – tabe etdirmək; öz prinsiplərini qəbul etdirmək; diqtə etmək; “Azərbaycan respublikasını *diz çökdürmək*, öz iddialarını həyata keçirmək istəyir” [Ic.s.401].

***Diz üstə çökdürmək*** – müstəmləkə olmaq; müstəqilliyi itirmək; “Xarici düşmənlərimiz, ayrı-ayrı ölkələrdə Azərbaycanın müstəqilliyinin əleyhinə olan adamlar satqınlıqdan, xəyanətkarlıqdan o qədər istifadə edərək ölkəmizi yenə də *diz çökdürməyə* çalışırlar” [IVc.s.198].

***Doğma ev hesab etmək** – özünü azad, rahat hiss etmək; “Çünki burada o qədər təntənəli mərasimlər, tamaşalar, görüşlər keçirilibdir ki, insanlarımız bura alışıb və buranı özlərinə *doğma ev hesab edirlər*” [XIVc.s.16].

***Doğma köklərə qayıtmaq** – köhnə ənənələri bərpa etmək, adətlərə qayıtmaq; “Azərbaycanda Qurban bayramının bu qədər geniş və bu qədər təmtəraqlı qeyd olunması onu göstərir ki, xalqımız artıq öz *doğma köklərinə, ənənələrinə qayıdır* və bunlara sadiqdir” [VIc.s.212].

***Doğru yol tutmaq** – prinsipial mövqe tutmaq, qanuni yolda olmaq; “Siz bunu qiymətləndirirsiniz, biz də kənardan buna diqqət yetiririk ki, siz *doğru yol tutdunuz* və bir nəfərin namizədliyi üzərində dayandınız” [XXVIIc.s.401].

***Donub qalmaq** – inkişafdan, hərəkətdən qalmaq; “Ona görə ki, heç nə bir yerdə *donub qalmır*, hər şey inkişafda, hərəkətdədir” [XVc.s.334].

***Donub qalmamaq** – inkişafda olmaq, yerində qalmamaq; “Fərq ondan ibarətdir ki, dünyada heç bir şey yerində *donub qalmır*” [XXXc.s.172].

***Dostluq və əməkdaşlıq körpüsü** – dostluq əlaqələri; “Elə bir *dostluq və əməkdaşlıq körpüsü* yaratmışdır ki, bu körpü uzun illərdən, onilliklərdən və əsrlərdən bəri xalqlarımızı birləşdirir, bizi yaxınlaşdırır və dostluq münasibətləri üçün, səmərəli əməkdaşlıq üçün şərait yaradır” [IVc.s.131].

***Dostluq telləri** – dostluq əlaqələri, dostluq münasibətləri; “Rusiya və Azərbaycan xalqlarını birləşdirən *dostluq telləri* möhkəm və pozulmazdır” [IIc.s.514].

***Dönüb getmək** – bir dəfəlik getmək, ölkəni tərk etmək; “Bəli, əgər biz ölkəmizdə ictimai-siyasi sabitliyi təmin etməsəydik, Azərbaycanı dağıdan, parçalayan qüvvələri aradan çıxarmasaydıq, onları ləğv etməsəydik, respublikamızda vətəndaşların rahat yaşaması üçün lazımi şərait yaratmasaydıq, xarici şirkətlər buraya gəlməzdilər, gəlsəydilər də qısa müddətdə buradan *dönüb gedəcəkdilər*” [XXIIc.s.10].

***Dönük çıxmaq*** – yolundan, əqidəsindən dönmək, etibarsız olmaq; ~ ilqarından dönmək, gözünü duz-çörək tutmaq; “Mən bunu açıq deyim, – çünki o vaxtlar, kommunist rejimi dövründə mənimlə işləyən kadrların bir çoxu, nə təhər deyim, *dönük çıxdı*” [XIIIc.s.43].

***Döşündə daşımaq** – ürəyinin başında gəzdirmək, sevgisini nümayiş etdirmək, pencəyin yaxasında gəzdirmək; “Mən bunu həmişə belə hesab etmişdim və Ziya Bünyadov da bu

hisslərlə yaşayaraq, o Qızıl Ulduzu *döşündə daim daşıyırdı*" [VIIIc.s.450].

***Döşünə döymək*** – lovğalanmaq, təkəbbürlülük etmək, öyünmək; ~ sinəsinə döymək, döşünə vurmaq, mənəm-mənəm demək; "Ona görə də indi kiminsə *döşünə döyməsi* mənasızdır" [IIc.s.95].

****Dövlət işinə bağlamaq*** – dövlət işi ilə məşğul olmaq, həyatını dövlət işinə həsr etmək; "Ona görə ki, mən sadəcə, özümü yenidən *dövlət işinə bağlamaq* istəmirdim" [XXIVc.s.45].

****Dünyanı gəzmək*** – dünyada tanınmaq; "Yaxud, açıq danışaq, "Çapayev" filmi o vaxtlar bütün *dünyanı gəzdi,* bizim kimi gənclərə nə qədər böyük təsir buraxdı" [Vc.s.185].

****Dünyanın gözü*** – "Bu qədər haqsızlıq bütün *dünyanın gözü* qarşısında baş verir" [XLc.s.17].

***Dünyaya gətirmək*** – doğmaq, dünyaya göz açmaq; "Mən Yusifi doğmuş, *dünyaya gətirmiş,* bəsləmiş, böyütmüş, onu tərbiyə etmiş Xavər xanımı təbrik edirəm" [Vc.s.197].

****Dünyaya səs qaldırmaq*** – dünyaya bəyan etmək; "1990-ci ildə bu faciə baş verən kimi, mən yanvar ayının 21-də Moskvada öz etirazımı bildirdim, *öz səsimi dünyaya qaldırdım* və o vaxtdan da mən Azərbaycan xalqına edilmiş bu təcavüzü xalqımızın həyatında ən dəhşətli bir səhifə hesab edirəm" [XIXc.s.50].

***Dünya yaratmaq*** – çox iş görmək; "İndi bizim nazirliklərdəki bürokratlar – təkcə bürokrat deyil, bəlkə onlara hələ başqa ad da vermək lazımdır – bəzi nazirlər keçmişdəki kimi, indi də elə bilirlər ki, Naxçıvan üçün bir iş edəndə, nə bilim, *dünyanı yaradırlar*" [XLIIc.s.26].

***Dünyanın dəyişməsi*** – quruluşu əvəzləmək, sovetlər birliyinin dəyişməsi; "İndi bir tərəfdən yaxşı oldu ki, *dünya dəyişdi*, hər şey açıldı, biz harada nəyin olub-olmadığını bildik" [VIIIc.s.334].

***Düşmən gözü ilə baxmaq*** – düşmən hesab etmək; məhv etməyə hazır olmaq; "Bununla da bizim partiya indi müxa-

lifətdə olan və bu gün Azərbaycan iqtidarına *düşmən gözü ilə baxan* bütün partiyalardan fərqlənir” [XXIVc.s.52].

***Düyünə düşmək*** – nəyinsə həllində çətinliklə qarşılaşmaq, həll edilə bilməmək, çətinə düşmək, həlli çətin olmaq; ~ dolaşığa düşmək, işi çətinə düşmək, dalana düşmək; “Amma Ermənistan Respublikasının pozucu mövqeyi ilə əlaqədar olaraq danışıqlar daim *düyünə düşmüş* və heç bir müsbət nəticə verməmişdir” [XXc.s.25].

***Düz getmək*** – düşünülmüş hərəkət etmək; “Bu proseslərdən doğru yol tapmaq, *düz getmək* üçün həm çox düşünülmüş, həm də cəsarətli hərəkət etməliyik” [IIc.s.8].

****Düz yol*** – qanunlara riayət olunması; “Əgər onlar doğrudan da, müstəqil Azərbaycanın dövlətçiliyinə sadiqdirlərsə, müstəqil Azərbaycan uğrunda çalışmaq istəyirlərsə, *düz yola* gəlsinlər” [IIc.s.358].

***Düz yol*** – qanuni yol, qanunlara tabe olunan düzgün istiqamət; “Mən onu dəfələrlə *düz yola* dəvət etdim” [IIIc.s.396].

***Düzələsi adam olmamaq*** – islah oluna bilməmək; “Amma baxıb görəndə ki, yox, bunlar *düzələsi adam deyil*, yaxud sadəcə, bacarıqsız adamdır, bacarığı bundan yuxarıya qalxa bilməz, – şübhəsiz ki, belə adamları dəyişirik” [XXIc.s.94].

****Düşmənçilik hissi aşılamaq*** – başqa dövlətə qarşı düşmən mövqe təbliğ etmək; “Bizim “xalq cəbhəsi” Rusiyaya *düşmənçilik hissləri aşılamağa* çalışdı, lakin bu, baş tutmadı” [XXIXc.s.301].

***Dünyasını dəyişmək*** – ölmək, vəfat etmək; ~ dünyadan köçmək, canını tapşırmaq, canını bağışlamaq; “Mən Moskvaya gedəndə, o, artıq *dünyasını dəyişmişdi*”[XXXVc.s.422].

****Dünyanın dövranı uzun olmaq*** – tələsməmək; özünü itirməmək; “Ona görə mən onlara dedim, bilirsiniz, *dünyanın dövranı uzundur*, həyat hələ qabaqdadır, siz nahaq elə başa düşürsünüz ki, Heydər Əliyev artıq fəaliyyətdən uzaqlaşıbdır, yox” [XXc.s.343].

****Dünyaya göstərmək*** – beynəlxalq mətbuata açıqlanmaq; “Çünki onlar qorxurlar, bilirlər ki, əgər seçkilərə getsələr, nəyə qadir olduqlarını, yəni sosial bazalarının nədən ibarət olduğunu bütün *dünyaya göstərəcəklər*” [XVIIIc.s.12].

***Dünya görmək*** – həyat təcrübəsi qazanmaq, təcrübəli olmaq, dünya siyasətinə bələd olmaq; “Mənim həm təcrübəm var, həm də *dünya görmüşəm”* [XXXIIIc.s.306].

****Dünyaya yenicə gəlmiş körpəyə bənzəmək*** – yenicə yaranmaq; “Bunlar da *dünyaya yenicə gəlmiş körpəyə bənzəyən*, yaranmaqda olan Azərbaycan ordusuna böyük zərbələr vurmuşdur” [XXVIIIc.s.329].

***Dünyasını dəyişmək*** – vəfat etmək; ölmək; “Yadımdadır, mən Azərbaycanda işləyərkən indi *dünyasını dəyişmiş* həyat yoldaşım bəzən deyərdi: “Bura bax, sən ki respublikanın rəhbərisən, sənə heç kim nəzarət etmir”[XXIVc.s.98].

***Düşmən gözü ilə baxmaq*** – xoşlamamaq; nifrət etmək; uğurlara sevinməmək;

“Təbiidir ki, Azərbaycana *düşmən gözü ilə baxan*, yaxud da ki, qısqanan dairələrin fəaliyyəti nəticəsində yenə də Azərbaycanı dünya miqyasında gözdən salmaq istəyirlər” [XXXVIc.s.136].

***Dərd-qəm içində yaşamaq*** – acınacaqlı vəziyyətdə olmaq; “O vaxt insanlar *dərd-qəm içində yaşayırdı*” [IXc.s.39].

***Dərdinə qalmaq*** – birinin dərdini, fikrini çəkmək, onun haqqında düşünmək, çətin məqamda təskinlik vermək, başqasının problemlərinə biganə olmamaq; ~ fikrini çəkmək; “Ancaq məsələnin içinə girəndə, həmin adamın məqsədini araşdıranda görürsən yox, bu heç islahatçı da deyil, millətin, ölkənin *dərdinə də qalan adam* deyil, – o, sadəcə, zahirən özünü islahatçı göstərərək radikal addımlar atır, lakin şəxsi məqsədini güdür” [XXIIIc.s.389].

***Dilə vurmaq*** – “İçkini də rəmzi olaraq *dilimə vurmuşam* – sağlıq deyiləndə badəni ancaq qaldırmaqla kifayətlənmişəm” [Ic.s.46].

***Dinə bağlı olmaq** – dindarlıq etmək; “Həqiqətən çox mövhumatcıl bir kənddir, *dinə çox bağlı* kənddir” [XXIIc.s.265].

***Dünyanın gözü*** – dünyada kütləvi informasiya vasitələrinin diqqətində olmaq; “Bu qədər haqsızlıq bütün *dünyanın gözü* qarşısında baş verir” [XLc.s.17].

***“Dərin quyuya” salmaq*** – xalq üçün əlçatmaz etmək; xalqdan gizləmək; xalqdan xəbərsiz saxlamaq; “Amma onun əsərlərini elə “*dərin quyuya ”salmışdılar* ki, insanlar onu o qədər də yaxşı tanımırdılar”[XXXIXc.s.159].

***Dinə qayıtmaq*** – dini dəyərlərə əməl etmək; “Biz indi öz *dinimizə qayıtmışıq*”[IIIc.s.79].

“***Dərin quyuya” salmaq*** – xalq üçün əlçatmaz etmək; xalqdan gizləmək; xalqdan xəbərsiz saxlamaq; “Amma onun əsərlərini elə “*dərin quyuya ”salmışdılar* ki, insanlar onu o qədər də yaxşı tanımırdılar.”[XXXIXc.s.159]. *Dərin quyuya salmaq* – “Biz bir fəaliyyət göstərməyib, keçmişdəki kimi nöqsanlara, səhvlərə yol versək, özünüzü daha *dərin quyuya salarıq*” [IIIc.s.404].

***Dünyadan küsmək*** – pessimist ovqata düşmək, həyata, yaşamağa ümidini itirmək; “Yenə də deyirəm, o qədər ağır vəziyyətdə yaşayan, o qədər çətinliklər keçirmiş, qayğısız, diqqətsiz qalmış insan gərək *dünyadan küsəydi*, nə gələcək, nə də başqa şey haqqında düşünməyəydi” [VIIc.s.258].

***Düz yola gəlmək*** – qanuna tabe olmaq; “Onun rəhbərliyi altında olan polislərin hər birinə müraciət edirəm: *düz yola gəlin*, ayılın, hələ gec deyildir” [IIc.s.342].

***Dünyanı eşitmək** – həyatda baş verənləri hiss etmək. “İnsan öz evində, otağında oturaraq, radio və televiziya ilə bütün *dünyanı eşidir*, görür, dünyanın, Azərbaycanın hər bir guşəsini hiss edir, ölkəmizin gündəlik, hər saatlıq, hər dəqiqəlik həyatının nəbzini hiss edir” [VIIIc.s.394].

****Dünya iqtisadiyyatına bağlamaq*** – dünya iqtisadiyyatına inteqrasiya etmək; "Yeni Azərbaycan Partiyasının amalı, məqsədləri, qəbul etdiyi proqramla müstəqil Azərbaycan Respublikasında demokratik prinsipləri bərqərar etmək, Azərbaycanı *dünya iqtisadiyyatına bağlamaqdır*" [XIIIc.s.273].

***Dünyaya yaymaq*** – dünyanı məlumatlandırmaq; "Azərbaycanın elmini, mədəniyyətini yüksəkliklərə qaldırmaqdır, respublikamızın adını, şanını-şöhrətini *dünyaya yaymaqdır*"[VIIIc.s.394]

***Düz yolda olmaq*** – düzgün siyasi xətt yeritmək; "Demək, biz *düz yoldayıq*" [XXXVIIc.s.8].

****Dünyaya çatdırmaq*** – dünya ictimaiyyətini məlumatlandırmaq; "YUNİSEF-ə müraciət edərək demək istəyirəm ki, bu təşkilat gərək Azərbaycan Respublikasının ağır şəraitdə yaşamasını, bütün *dünyaya çatdırsın*, bildirsin"[IIIc.s.7].

***Düşünüb-daşınmaq*** – fikirləşmək, tələsməmək, sayıq olmaq; "Bununla belə, yenə də deyirəm ki, bu hal, bu hadisə bizi sayıqlığa, *düşünüb-daşınmağa* dəvət edir" [IIc.s.285].

***Düz-əyri etimad göstərmək*** – nə tam düz, nə də tam əyri olmaq; "Xalq ona *düz-əyri, etimad göstərmişdi*" [IVc.s.32].

****Dünyaya göstərmək*** – dünya xalqlarına nümayiş etdirmək; "Müxtəlif dövrlərin və xalqların sizin ifanızda səslənən musiqisi ülvi bəşəri dəyərlərə sədaqəti ilə ürəkləri fəth edən əsl sənətin gücünü bir daha *dünyaya göstərdi*" [IXc.s.79].

****Dünyanı dolaşmaq*** – dünya ölkələri arasında tanınmaq, məşhurlaşmaq; "Amma onu filmə çevirib, rus dilinə tərcümə edəndən sonra və Rəşid özü həmin mahnıları rus dilində gözəl ifa edəndən sonra bütün *dünyanı dolaşdı*" [XXXVIc.s.283].

****Dünyaya açmaq*** – geniş kütlələrə açmaq, dünyaya tanıtmaq; "Demək olar ki, Azərbaycan musiqisini, mədəniyyətini, incəsənətini, mahnısını *dünayaya açdı"* [XXXVIc.s.285].

****Düz addım atmaq*** – doğru qərar qəbul etmək; "Biz hesab edirik ki, iki il bundan öncə *düz addım atmışıq*, doğru qərar qəbul etmişik" [VIc.s.312].

## *Ee*

***Ehtirasların soyuması*** – mübarizə aparmaq hissinin soyuması; "Bir müddətdən sonra bizdə *ehtiraslar soyudu*" [XIIIc.s.121].

***Elmi fikirlər daşımaq*** – özündə elmi fikirləri əks etdirmək; "Onun bütün əsərləri şeir, poeziya, ədəbiyyatı nümunələri olmaqla bərabər, eyni zamanda böyük fəlsəfi ideyalar, *elmi fikirlər daşıyır*" [VIIIc.s.24].

***Enişli-yoxuşlu yol olmaq*** – çətinliklərlə dolu yol almaq, inkişafda spiralvarilik; "Mən bir də qeyd etmək istəyirəm ki, sahibkarlıq yolu Azərbaycanda bütün keçmiş Sovetlər İttifaqında çox *enişli-yoxuşlu yoldur*" [VIIc.s.230].

***Enişli-yoxuşlu yollardan keçmək*** – Çətinlikləri dəf etmək, maneələri aşmaq; "Çox *enişli-yoxuşlu yollardan* keçdik" [XXXIVc.s.238].

***Eyni dildə danışmaq*** – eyni fikirdə olmaq, eyni mövqedən çıxış etmək; "Amma mən sizin *eyni dildə danışmaq* fikrinizdən anlayıram ki, yəni eyni fikirdəsiniz" [XXXIc.s.196].

***Eyni gözlə baxmaq*** – heç kəsi üstün tutmamaq, ayrı seçkilik etməmək, fərqli baxmamaq, eyni münasibət göstərmək, fərqli baxış olmamaq; ~ hamıya bir gözlə baxmaq, bir kəfənə qoymaq; "Amma bunlarla bərabər, Azərbaycan vətəndaşlarının bütün təbəqələri Azərbaycanın həyatının bütün sahələrində iştirak edirlər və iştirak edəcəklər və mən Azərbaycan prezidenti kimi Azərbaycan vətəndaşlarının hər birinə *eyni gözlə baxıram* və bundan sonra da eyni gözlə baxacağam" [XXIVc.s.66].

**Əə**

***Əl vurmamaq*** – girişməmək, müdaxilə etməmək, maraqlanmamaq, biganəlik etmək, maraq göstərməmək; ~ işə qarışmamaq, 2) alqışlamamaq, əl çalmamaq; "Xəbərin var idi, amma gedib oraya *əlini vurmamışdın*" [XLc.s.252].

****Əl-ələ vermək*** – bir-birinə kömək etmək, birgə çalışmaq; "Ancaq əgər siz də yeni icra başçısına etibar edirsinizsə, inanırsınızsa, gərək onunla birlikdə *əl-ələ verib* bu işləri görəsiniz" [XLIc.s.149].

****Əyin-baş tapmaq*** – paltar, geyimlə təmin etmək; "Biz onlardan ötrü sığınacaq yeri, *əyin-baş tapa* bilmirik " [Ic.s.216].

****Əsəbləri cilovlamaq*** – səbirli olmaq; müvazinəti itirməmək; özündən çıxmamaq; əsəbləri nizama salmaq; "Bir qədər həyəcanlı danışdığım üçün üzr istəyirəm, mən öz əsəblərimi cilovlamağı bacaran adamam, lakin indiki halda bunu edə bilmirəm, buna görə də sizinlə belə həyəcanlı tonda danışıram" [XLIc.s.362].

****Əcaib görsənmək*** – uyğunsuzluq; uyğun görsənməmək yersiz görsənmək; "Mən ona order verəndə, bu, bir az *əcaib görsənir*" [XXXVc.s.92].

****Ədavətləri kənara qoymaq*** – düşmənçiliyi aradan götürmək, ədavət toxumu əkməmək, Vətən yolunda bir olmaq; ~ nifaq salmamaq; "Bu yolda hamı həmrəy, bir olmalı, bütün ədavətlər bir kənara qoyulmalıdır, bu yolda hamımız Vətənin siravi əsgəri olmalıyıq " [IIc.s.13].

***Əldə etmək*** – nail olmaq, tapmaq; ~ ələ gətirmək; "Dövlət müstəqilliyini *əldə etdikdən* sonra, öz milli konstitusiyasını qəbul etdikdən sonra Norveç xalqı çox böyük inkişaf yolu keçmişdir və dünyanın iqtisadi cəhətdən inkişaf etmiş dövlətləri sırasındadır" [VIIc.s.291].

***Əldə saxlamaq*** 1) ev şəraitində saxlamaq 2) sahibliyini qorumaq, əldən verməmək 3) üzdə, əl altında hazır vəziyyətdə saxlamaq 4) öz tərəfinə çəkmək üçün qabaqcadan düşünülmüş şəkildə güzəştə gedərək ələ almaq; hakimiyyəti qorumaq, hakimiyyəti möhkəmləndirmək; "Yaxşı, hakimiyyətə gəlmişdiniz, əgər bacarırdınızsa *əlinizdə saxlayaydınız*, kim sizə mane olurdu? " [IVc.s.180].

***Əyri yolla getmək*** – qanundan kənar yolla getmək; ~ əyri yola düşmək, pis yola düşmək; "İnsan bir *əyri yolla gedirsə*, o əyri yoldan çəkinmək çətin olur" [XVc.s.17].

***Əl vurmamaq*** – maraqlanmamaq, biganəlik etmək, maraq göstərməmək; "Xəbərin var idi, amma gedib oraya *əlini vurmamışdın*" [XLc.s.252].

***Əlində əsir olmaq*** – müqavimət göstərməmək; haqq səsini qaldıra bilməmək; 1) çətin, çıxılmaz vəziyyətdə qalmaq, çarəsiz qalmaq 2) imtina edə bilməmək; "Yaxşı, Elçin Əfəndiyev, sənə nə olub ki, Surət kimi yaramaz adamın *əlində əsir olmuşdun*?" [IIc.s.387].

***Əlinə almaq*** – mənimsəmək; "Yaxşı, sən bunları *əlinə almısan*, özəlləşdirmisən, götürdüyünü götür" [XLIVc.s.201].

****Əyə bilmək*** – iradəsini sındırmaq, iradəsini zəiflətmək; "Ancaq bunların heç birisi Kəlbəcərin o məğrur dağlarını, qayalarını, meşələrini, çeşmələrini, bulaqlarını heç vaxt endirə bilməz, *əyə bilməz*, sındıra bilməz, eləcə də güman edirəm ki, kəlbəcərlilərin iradəsini sındıra bilməz" [VIc.s.41].

****Əlləşib çalışmaq*** – məhdud imkanlar əsasında çalışmaq; "Bilirsiniz, biz öz içərimizdə əlləşib çalışırıq" [VIIc.s.96].

***Əl uzatmaq*** – maddi və mənəvi cəhətdən kömək etmək; 1) müdaxilə etmək, işə qarışmaq; ~ əl aparmaq, əl qatmaq 2) yardım etmək, qayğısına qalmaq, maddi kömək etmək, borc vermək; "Amma bu təbii qanunlar içərisində də bir olmaq, daha da sıx olmaq, bir-birinə dayaq olmaq, *əl uzatmaq* üçün imkanlar çoxdur" [VIIc.s.18].

***Ələ götürmək*** – məşğul olmaq; "Bu məsələni öz əlinizə götürün" [XXIIc.s.272].

***Əyintiyə yol verməmək*** – qanunu pozmamaq; "Öz vəzifəsini yerinə yetirərkən heç bir qəbahətə, əyintiyə yol verməsin" [IIc.s.105].

***Əlyeri tapmaq*** – qeyri-qanuni yollar araşdırmaq, neqativ hallar axtarmaq; "Bu üsulun tətbiqi zamanı bəzi qüvvələrin yenə də *əlyeri tapıb*, qeyri-qanuni hallara yol verməsinin qarşısını almaq gərəkdir" [IIc.s.217].

***Əlinə keçirmək*** – tam ixtiyarı olmaq, mənimsəmək, idarəçiliyi əlində saxlamaq; "Hətta Moskvadan şikayət edirdilər ki, siz bu məktəbləri *əlinizə keçirmisiniz* " [XXXIVc.s.389].

***Əyri yoldan əl çəkmək*** – qanunsuzluq etməmək; "Salonda oturan, yaxud dəhlizdə, kənarda duran adamları bütün günü başa salmaq istəyirdik ki, əyri yoldan əl çəkin" [XXIIc.s.389].

***Əl çəkməmək*** – başını boşlamamaq, başını buraxmamaq; ~ daşını atmamaq, vaz keçməmək, əl götürməmək; inadkarlıq etmək; prinsipiallıq göstərmək; "Amma öz işlərindən *əl çəkməyiblər*" [XLII c. s.228].

***Əlinin altına keçmək*** – əlinin altında olmaq, müstəmləkə olmaq; "Ancaq bu cümhuriyyət o dövrün şəraitinə görə 23 ay yaşadı, sonra isə Azərbaycan sovet hakimiyyətinin *əlinin altına keçdi*" [XXIIc.s.322].

***Əlindən gələni etmək*** – maksimum kömək etmək; mümkün olan hər şeyi etmək; əlindən gələni əsirgəməmək; "Onların hər biri Türkiyə ilə Azərbaycan arasındakı əlaqələrin daha da inkişaf etməsi üçün əlindən gələni etməyə hazırdır" [XXXVIIc.s.225].

***Əziz balası kimi baxmaq*** – həddindən çox doğma münasibət bəsləmək; ~ əziz tutmaq, göz üstə saxlamaq; "Şəxsi mülkiyyətə keçəndən sonra insanlar həmin torpağa əziz balası kimi baxacaqlar" [VIIc.s.214].

***Əmin-amanlığı qorumaq** – rahatlığı qorumaq; "Azadlığı, sülhü, *əmin-amanlığı qorumaq* yolunda hər bir qafqazlıya Şeyx Şamil müdrikliyi, qətiyyəti və fədakarlığı arzulayıram" [XIIIc.s.140].

***Əldə kağız olmamaq** – şifahi danışmaq, sərbəst fikirləri auditoriyaya yönəltmək; "Siz də, hamımız da bilirsiniz ki, mənim dediyim sözlərin də hamısı öz beynimdən gələn sözlərdir, heç vaxt *əlimdə kağız olmayıbdır*" [XIIIc.s.214].

***Əlləri kəsmək** – təcavüzü dəf etmək; "Dərs olmalı idi ki, Azərbaycan bütün daxili problemləri kənara qoyub xarici qüvvələrin respublikamıza uzatdığı *əlləri kəsə* bilsin, onların bu qəsbkar meyillərinin qarşısını ala bilsin" [VIc.s.79].

***Ələkdən-süzgəcdən keçirmək*** – diqqətlə yoxlamaq, saf-çürük etmək; ciddi araşdırmaq; ~ xəlbirdən keçirmək; "Özünüz bir komissiya düzəldin, yığışın, müzakirə eyləyin, hər bir cümləni, sətri *ələkdən-süzgəcdən keçirin* ki, düzgün, ədalətli olsun" [VIc.s.44].

***Əl-qolu bağlanmaq** – fəaliyyət göstərə bilməmək; "O vaxt bu sahədə çalışan vəzifəli şəxslər, o cümlədən də Nazirlər Kabineti nazirliklər, müəssisə rəhbərləri çox şikayətlənirdilər ki, onların *əl-qolu bağlanıb*" [IIc.s.30].

***Əsər-əlamətin yoxluğu** – heç bir izi qalmamaq; "Əvvəlki vahimə və narahatlıqdan, keçmişdə mövcud olmuş cinayətkarlıq şəraitindən *əsər-əlamət yoxdur*" [Vc.s.126].

***Əsrlər boyu yaşamaq** – əbədilik yaşamaq, uzunmüddətə mövcud olmaq; "Mən sizin hamınızı bu münasibətlə təbrik edirəm və ümidvar olduğunu bildirmək istəyirəm ki, Türkiyə – Azərbaycan əlaqələrinin gözəl gələcəyi var və Türkiyədə Azərbaycan səfirliyi əsrlər boyu yaşayacaqdır" [IXc.s.299].

***Əsərlər yaratmaq** – əsərlər yazmaq; əsərləri ortaya qoymaq; "İlyas Əfəndiyev Azərbaycan teatrına çox böyük töhfələr veribdir, böyük xidmətlər göstəribdir, çox dəyərli *əsərlər yaradıbdır*" [XIIc.s.157].

***Əlini ağdan qaraya vurmamaq*** – heç bir iş görməmək, bikar durmaq; ~ əli cibində gəzmək, əlini qulağının dibinə qoymaq, əlini əlinin üstünə qoymaq, barmağını da tərpətməmək, canına əziyyət verməmək, tənbəllik, işləməmək; "Ən dəhşətlisi bu idi ki, adamlar daha əlini ağdan qaraya vurmur, işləmirdilər" [XIIc.s.158].

***Əyə bilmək*** – iradəsini sındırmaq; iradəsini zəiflətmək; "Ancaq bunların heç birisi Kəlbəcərin o məğrur dağlarını, qayalarını, meşələrini, çeşmələrini *əyə bilməsinlər*, parçalamasınlar" [Ic.s.94].

***Əlindən gələni etmək*** – bacardığını etmək; "İslam aləminin qlobal miqyaslı məsələlərinin həllində çoxtərəfli əməkdaşlığın inkişaf etdirilməsi üçün Azərbaycan Respublikası əlindən gələni etməkdədir" [XIIIc.s.339].

***Əldən getmək*** – itirilmək, 1) əldən– ayaqdan getmək 2) məhv olmaq, xarab olmaq; ~ puça çıxmaq, əldən çıxmaq 3) itirilmək, yox olmaq ~ əldən çıxmaq; "Kəndlərimiz *əldən gedir* və bu, son illərdə Azərbaycanın həyatının adi bir amili olmuşdur" [ic.s.101]

***Əl atmaq*** – cəhd göstərmək, təşəbbüs göstərmək; 1) girişmək, təşəbbüs etmək, hər hansı vasitədən istifadə etmək 2) yardım etmək, maddi kömək etmək; ~ əl yetirmək "Beləliklə Azərbaycanı parçalamaq, talış köklü Azərbaycan vətəndaşlarını respublikanın başqa hissələrinə qarşı qoymaq kimi hallara *əl atdılar*" [Ic.s.103].

***Əliboş dağılmamaq*** – bir şeyə nail olmamaq, bir şeyə nail olmadan evə getməmək; "Yəni mən prinsipcə bunun əleyhinə deyiləm, istənilən vaxt toplaşmaq olar, amma düşünmək lazımdır, necə etməli ki, bu beşlik həqiqətən görüşüb, *əliboş dağılmasın*" [XXXIc.s.29].

***Əllərini qızdırmaq*** – rüşvət almaq; əlinə pul dəymək; "Xatirimdədir, 70-ci illərdə biz qanun pozuntusunun, yaxud da müəllimlərin vəzifədən sui-istifadə etməsinin, rektorların

bu işdə *əllərini qızdırmasının* və sairənin qarşısını almaq üçün çox işlər görürdük" [XXXc.s.358].

***Əldən vermək*** – itirmək, əldə saxlaya bilməmək, əlindən getmək, vəzifəni təhvil vermək, işdən çıxmaq; "Ancaq bu tənqidlərdən ölçü, nəticə çıxarmasa ola bilər, gələcəkdə bu vəzifəni də *əldən verə* bilər" [VIIc.s.152].

***Əlindən gələni etmək*** – mümkün olan hər şeyi etmək; "Qürur hissi ilə qeyd etmək istəyirəm ki, müstəqil Azərbaycan Respublikası və onun dövləti öz böyük oğlunun – böyük Füzulinin xatirəsini bu günün imkanları çərçivəsində qeyd etmək üçün əlindən gələni etmişdir" [VIIIc.s.31].

***Əl-ələ vermək*** – birgə fəaliyyət göstərmək; "Əminəm ki, *əl-ələ verib* işləyəcəyik" [Ic.s.62].

***Əzab-əziyyət çəkmək*** – çətinliklərlə üzləşmək; "Qafqazın bütün ölkələri, bütün xalqları *əzab-əziyyət çəkirlər*" [VIIc.s.461].

***Əl çəkməmək (1)*** – inadkarlıq etmək; prinsipiallıq göstərmək; "Amma öz işlərindən *əl çəkməyiblər*" [XLII c. s.228].

***Əl çəkməmək (2)*** – qanunsuz işləri davam etdirmək; "Ancaq ondan sonra da daxildə hakimiyyət uğrunda qanunsuz mübarizə, silahlı mübarizə aparan dəstələr öz əməllərindən *əl çəkmədilər*" [XXIIc.s.99].

***Əl tutmaq*** – yardım göstərmək, maddi kömək göstərmək, ~ yardım əli uzatmaq, kömək əli uzatmaq, əlindən tutmaq, qolundan tutmaq, kömək etmək, dəstək olmaq; "Ona görə də qürbətdə yaşayan insanlar gərək bir-birinə daha da çox dayaq olsunlar, bir-birinə daha da çox *əl tutsunlar*" [XXXVIc.s.444].

***Əli qana batmaq*** – qatil olmaq, qətl törətmək, insan ölümünə bais olmaq, cinayət törətmək; "Biri o birisinə deyir ki, sənin əlin qana batıb, o biri bu birisinə deyir ki, sənin *əlin qana batıbdır*" [XXIIIc.s.139].

***Ələ keçirmək*** – tutmaq, sahib olmaq, mənimsəmək, qanunsuz yolla hakimiyyətə gəlmək; zorakılıqla hakimiyyətə

gəlmək; ~ ələ gətirmək, cənginə keçirmək, girinə keçirmək, pəncəsinə keçirmək; "Həm o hakimiyyət – 1988-ci ildə Azərbaycanda olan hakimiyyət, həm ondan sonrakı hakimiyyət – 1990-cı ilin yanvar faciəsində tökülən qanlar üzərində Azərbaycanda hakimiyyətə gəlmiş qüvvələr, həm də ondan sonra hakimiyyəti *əlinə keçirmiş* Xalq Cəbhəsi, müsavat-hamısı günahkardır" [XXIVc.s.63-64].

***Əlindən gələni etmək*** – imkan daxilində bacardığı qədər bütün imkanlardan, mövcud olanlardan istifadə etmək; "Biz özümüzə onunla təskinlik verə bilərik ki, sizin tərəfinizdən, Türkiyə Cümhuriyyəti, Türkiyə hökuməti tərəfindən Əbülfəz Elçibəyin xəstəlikdən xilas olması üçün əlinizdən gələni etmisiniz" [XXIXc.s.361-362].

***Əldə olunmaq*** – nail olmaq; müəyyən nəticəni almaq; "Bir baxın, "Şahdəniz" yatağının işlənməsi, nəticə *əldə olunması*, qəti rəqəmlərin və qazın ixrac marşrutunun müəyyənləşdirilməsi, sazişin hazırlanması və imzalanması işləri neçə illərdir – 1996-cı ildən 2001-ci illədək davam edir" [XXXVIc.s.212].

***Əsgər olmaq*** – qanunlara tabe olmaq; əlavə fikirlərə düşmədən bilavasitə qanunlara tabe olmaq; "Ona görə də hesab edirəm ki, hər bir partiya üzvü Azərbaycanın dövlət siyasətinin, Azərbaycan prezidentinin siyasətinin həyata keçirilməsində, müdafiə olunmasında, onun kütlə arasında, vətəndaşlar arasında düzgün təbliğ edilməsində mübariz insan, mübariz *əsgər olmalıdır*, kənarda durmamalıdır" [XXIc.s.327].

***Əl-qol açmaq*** – qanunları saymamaq, cəzasız qalmaq; ~ əl-ayaq açmaq, sərbəstləşmək, istədiyi kimi sərbəst hərəkət etmək; "Bir paraları da onlardan istifadə edərək, öz məqsədlərinə nail olmaq üçün bunlara kömək etdiklərinə görə onlar *əl-qol açmışlar*" [IIc.s.283].

***Əlinə keçmək*** – mənimsənilmək; "Bir çox sahələrdə ixrac olunmuş malların dəyərinin heç 10 faizi də respublikaya qa-

yıtmamış, haradasa qalmışdır, ayrı-ayrı adamların əlinə keçmişdir" [Ic.s.253].

***Əl çalmaq*** – bəyənmək; alqışlamaq; xalqın ehtiramını almaq; "Əl çala bilərsiniz, doğrudan da o, layiqli adamdır" [XXXIXc.s.127].

***Əli qana batmaq*** – ölüm hadisələrinə görə ittiham olunmaq, ağır cinayətdə iştirak; "...Onları dəstəkləyən adamların əli Azərbaycan xalqının oğullarının həlak olması ilə əlaqədar qana batıb" [Ic.s.108].

## *Ff*

***Fantaziya hesab etmək*** – inanmamaq; yalan hesab etmək; real olmamaq; "Buna inanmayanlar, bunu *fantaziya hesab edənlər* vardı" [XXXIXc.s.8].

***Fəaliyyəti dondurmaq*** – müəyyən müddətə fəaliyyət göstərməmək; "Minsk qrupu tərəfindən bu barədə verilən izahat – Ermənistan və Azərbaycan prezidentləri arasında birbaşa görüşlər başlandığına görə onlar öz *fəaliyyətlərini* bir az *dondurmağa* məcbur olublar – mənə elə gəlir ki, əsassızdır" [XXIVc.s.6].

***Fəvvarə kimi püskürmək*** – hamıya əyan olmaq; nümayiş etdirmək; "Dostluğumuz, qardaşlığımız böyük bir *fəvvarə kimi püskürdü* və bütün dünyaya nümayiş etdirdi ki, Türkiyə ilə Azərbaycan keçmişdə də bir olub, bu gün də birdir, gələcəkdə də bir olacaqdır" [IXc.s.287].

***Fırtınalardan çıxmaq*** – ən çətin sınaqlardan çıxmaq; çətinliklər görmək; "Siz artıq *fırtınalardan çıxmısınız*" [IIc.s.527].

***Fikirlə gəlmək*** – müəyyən bir ideya daşıyıcısı olmaq; formalaşmış münasibətlə gəlmək, fikir yürütmək, mülahizə söyləmək, yeni və fərqli söz demək; "Güman edirəm, indi siz Azərbaycana və bölgəyə hansısa *fikirlə gəlmisiniz* və bunları

dinləmək, fikir mübadiləsi aparmaq, təbiidir ki, çox yaxşı olardı" [XXXVIIIc.s.8].

***Fikirləri dağıtmaq** – uzaqlaşdırmaq; "Xüsusən 1988-ci ildən yaranmış mənfi *fikirlərin dağılmasına* gətirib çıxarıbdır. Deyə bilmərəm ki, biz bunları tamamilə dağıda bilmişik" [XVc.s.10].

**Fikirləri pozmaq** – fikirlərdə çaşqınlıq yaratmaq; fikrini döndərmək; "Ancaq bəzən cəmiyyətimizdə qəzetlər vasitəsilə ayrı-ayrı adamların *fikirlərini pozmaq* istəyirlər, onları aldatmaq istəyirlər və onlarda müəyyən şübhə yaratmaq istəyirlər" [XXc.s.400].

**Fikri tutmaq** – müəyyən bir fikri qəbul etmək, fikri məqbul hesab etmək; "Dünən belə bir fikir söyləndi. Bu *fikri mən tutdum*, bunu çox əhəmiyyətli hesab edirəm və güman edirəm ki, bu fikrin, bu təklifin üzərində də işləmək lazımdır" [VIIc.s.394].

**Fikri yayındırmaq** – əsas mövzudan uzaqlaşdırmaq, qəsdən birinin diqqətini başqa şeyə yönəltmək; ~ başını qatmaq, fikrini dağıtmaq; "Siz də yəqin düşünürsünüz ki, Heydər Əliyev tarixdən danışır ki, *fikrinizi yayındırsın*" [Vc.s.192].

## *Gg*

**Gecə-gündüz işləmək** – sutkanın çox hissəsini işləmək, gecəsi-gündüzü olmamaq, çalışmaq, işləmək, daim hərəkətdə olmaq; "Yenə də *gecə-gündüz işlədim*" [XXIVc.s.96].

**Gecəni-gündüzə qatmaq** – çox çalışmaq, sutka ərzində çalışmaq, çox işləmək, həddindən artıq çalışmaq, gecə də, gündüz də işləmək; "Özü də təkcə bu gün yox, hər gün belədir, *gecəni gündüzə qatıb* çalışırdı" [Ic.s.46].

***Gedib çıxmaq** – müəyyən məkana çatmaq; "Belə ki, biz özümüz o qədər xurmanı yeyə bilmərik, insanlara fayda gətirəcəyi yerlərə isə xurma *gedib çıxmır*" [XXIIIc.s.27].

***Geniş yola çıxmaq*** – sıxıntılardan azad olmaq; müstəqil siyasət yeritmək; "Bizim xoşbəxtliyimiz ondan ibarətdir ki, biz bu faciələri yaşayaraq, çətinliklərin öhdəsindən gələrək, problemləri həll edərək indi artıq *geniş yola çıxmışıq*" [XVc.s.110].

***Geri çəkilmək*** – öz mövqeyini qorumamaq, sözündən dönmək, qəbul olunmuş prinsiplərdən dönmək; verilən sözə əməl etməmək, öz mövqeyini qorumamaq; "Amma Ermənistan Mehridən suveren dəhliz vermək istəmir. Yəni əvvəlki sözündən *geri çəkilir*" [XXXIXc.s.112].

***Geri düşmək* –** inkişafı təmin edə bilməmək, iqtisadi imkanı məhdudlaşdırmaq, gəliri azalmaq; ~ ziyana düşmək, dala düşmək; "Təəssüf ki, çox təəssüflər olsun ki, keçən il biz nəinki irəliyə gedə bilmədik, hətta müəyyən sahələrdə əvvəlki illərə nisbətən *geri düşdük*, yəni inkişafı təmin edə bilmədik" [VIc.s.56].

***Geri qalmaq*** – köhnəfikir olmaq, müasir tələblərə uyğunlaşa bilməmək, az inkişaf etmək; "Bu baxımdan digər ölkələrlə müqayisədə Yaponiya ilə münasibətlərimiz *geri qalırdı*" [XXIIc.s.149].

***Geri salmaq*** – inkişafdan saxlamaq, inkişafa mane olmaq; 1) maddi ziyan vurmaq, zərər çəkməsinə səbəb olmaq, ~ ziyana salmaq 2) irəliləməsinə, inkişafına mane olmaq; "Sonra qısa müddət ikinci icra başçısı oldu, o da işləri apara bilmədi, bunlar Goranboy rayonunu müəyyən qədər *geri saldılar*" [XLIc.s.159].

***Geridə qalmaq*** – inkişafdan qalmaq; "Bilirsiniz, keçmişdə belə bir əhvali-ruhiyyə vardı ki, guya bizim dağ rayonlarımız *geridə qalmışdır*, orada camaatın mədəni, yaxud bilik səviyyəsi o qədər də yüksək deyildir" [VIc.s.47].

***Geriliyə yol vermək*** – işdə geri getmək; plan üzrə irəli gedə bilməmək; "Əgər hazırda biz iqtisadiyyatımızın bir qismini hələ özəlləşdirə bilməmişiksə, bu ona görə deyil ki, biz

bu məsələdə hansısa bir *geriliyə yol veririk* – yox, bu iş planla gedir və planla da gedəcəkdir" [XXVIIc.s.36].

***Geriyə yol olmamaq** – keçmiş quruluşa yolun olmaması; "Amma nə qədər ki, Heydər Əliyev Azərbaycanda prezidentdir, Azərbaycanda geriyə yol yoxdur" [XXIXc.s.257].

***Gələcəyini işıqlı görmək** – problemlərdən azad görmək, problemləri həll olunmaq; "Ancaq ən əsası odur ki, biz bu azadlığı əldə etmişik, bu müstəqilliyi qazanmışıq və xalqlarımızın, ölkələrimizin *gələcəyini gözəl, işıqlı görürük*" [VIIIc.s.429].

***Giley-güzara səbəb olmaq** – narazılığa səbəb olmaq; "Respublika rəhbərliyinin ünvanına da *giley-güzar səbəb olmuşdur*" [IIc.s.104].

***Görkəmli yer tutmaq** – mühüm vəzifələrdə olmaq; "Kəlbəcərlilər Azərbaycanın hər yerində, xüsusən, Bakıda ölkəmizin ictimai-siyasi, mədəni, elmi həyatında özlərinə məxsus *görkəmli yer tutmuşlar* və ölkəmizin inkişafında öz xidmətlərini göstərmişlər" [IXc.s.112].

***Götür-qoy etmək** – məsləhətləşmək, düşünmək, ~ ölçübbiçmək, çək-çevir etmək; "Biz bu məsələni necə həll etməyi yenə də *götür-qoy etdik*" [VIIc.s.248].

***Göydən düşmək (1)*** – çox arzu edilən, istənilən və təsadüfən ortaya çıxan, əldə edilən bir şey haqqında, ağlasığmazlıq, həqiqətə uyğun olmamaq; "Mən ona da dedim və dəfələrlə demişəm, – bu demokratiya elə bir şey deyil ki, göydən düşsün, sən də onu götürüb hər yerdə tətbiq edəsən." [IVc.s.468].

***Göydən düşmək (2)*** – təcrübə olmadan nail olmamaq; "Amma bu da göydən düşmür. Bunun üçün Amerikanın və başqa inkişaf etmiş ölkələrin təcrübəsi lazımdır" [XXXVc.s.115].

***Göydən tökülmək*** – havayi gəlmək, zəhmətsiz gəlmək; ~ göydən düşmək "Təsəvvür edin, bizim büdcəmiz də ilbəil böyük sürətlə artır, bunların heç biri göydən tökülmür, kənardan

gəlmir.”[XLIIIc.s.18]. ***Göydən tökülmək*** – havayı gəlmək; “Elə bilirsiniz o pullar *göydən tökülür*?” [XLIVc.s.12].

***Göydən tökülməmək*** – havayı olmamaq; zəhmətlə başa gəlmək; zəhmətlə qazanılmaq; “Amma axı sovet hökumətinin də pulu xalqın pulu idi, *göydən tökülməmişdi*” [XXIIIc.s.392].

****Göz ağartmaq*** – qorxutmaq; təsir etmək; hədələmək; “Ona görə ki, siz burada sərbəst danışa biləsiniz, ayrı-ayrı nazirlər, hüquq mühafizə orqanlarından, vergi orqanlarından başqa orqanlardan sizə təsir edə bilməsinlər, göz ağartmasınlar” [XXXVIIIc.s.155].

***Göz altına almaq*** – xəlvətcə bəyənmək, kimisə nəzarətdə saxlamaq, həbs etmək, tutmaq; “Gedib indiki bu binanı *göz altına aldı*”[XXXVIc.s.290].

****Göz bəbəyi kimi qoruyub saxlamaq*** – sədaqətli olmaq; “Sizi əmin edirəm ki, biz Azərbaycanın dövlət müstəqilliyini *göz bəbəyimiz kimi qoruyub saxlayacaq* və onu heç vaxt əldən verməyəcəyik” [IXc.s.292].

****Göz dağı olmaq*** – daim xatırlamaq; diqqətində saxlamaq; “Həmin demaqoq doğru danışsa da, doğru danışmasa da, həmin müəssisə rəhbərinin qarşısında *göz dağı olacaqdır*” [XXXVc.s.224].

****Göz dikməmək*** – başqasının haqqına girməmək; “Bir daha bildirirəm ki, biz öz torpaqlarımızı müdafiə edirik, başqalarının torpaqlarına *göz dikməmişik*, heç bir ölkənin torpağını zəbt etməmişik və etmirik” [Ic.s.305].

***Göz qabağında olmaq*** – üzdə, aşkarda, hamının görə biləcəyi yerdə olmaq, faktlara əsaslanmaq; qaçılmaz olmaq; əlavə sübuta ehtiyacı olmamaq; “Türkiyə bütün sahələrdə inkişaf etmiş bir dövlətdir və onun nailiyyətləri *göz qabağındadır*” [XIIc.s.382].

***Göz yaşı tökmək (1)*** – faciəyə dözməmək; ciddi təsirlənmək, ağlamaq; “*Göz yaşı tökürdü*, deyirdi insan belə vəziyyətdə yaşaya bilərmi?” [XXVc.s.218].

***Göz yaşı tökmək (2)*** – aman istəmək, güzəşt istəmək; "İndi də güzəşt istəyir, *göz yaşı tökür*" [XVc.s.20].

***Göz yummaq (1)*** – ciddi əhəmiyyət verməmək, nəzərə almamaq, boş buraxmaq, güzəştə getmək, ikili standartla yanaşmaq; haqq işi görməmək; ədalətli olmamaq; ~ dərinə getməmək; "Əgər biz istəyiriksə ki, dünyada vətəndaş cəmiyyəti yaradaq, dünyada hüquqi dövlət quraq, demokratiya yaradaq – bu da həm ATƏT-in, həm Birləşmiş Millətlər Təşkilatının, həm də Avropanın böyük dövlətlərinin bəyan etdiyi siyasətdir – onda onlar bu haqsızlığa niyə *göz yumurlar*?" [XLc.s.17].

***Göz yummaq (2)*** – fəaliyyətsizlik; laqeydlik; etnasızlıq; vəzifəsini yerinə yetirməmək; "Lakin mən onlara dedim ki, burada yüz minlərlə insanın hüquqları tapdanmışdır, siz isə buna göz yumursunuz" [XXXVc.s.218].

***Göz üstə saxlamaq*** – əzizləmək, göz bəbəyi kimi qorumaq, xüsusi diqqət göstərmək, qayğı göstərmək, xalqın xeyrinə qorumaq; ~ əziz tutmaq; "Əgər biz bunları göz üstə saxlamasaq, belə insanları cəmiyyət – bizim 8 milyonluq əhalimiz var – *göz üstə saxlamasa*, mədəniyyətimizi inkişaf etdirə bilmərik" [XLIIIc.s.210].

***Gözə çarpmaq*** – diqqət mərkəzində olmaq, nəzərdən qaçmamaq, ara-sıra görünmək, nəzəri cəlb etmək; "Bu həmişə *gözə çarpır*" [XXXVIIc.s.429].

****Gözəgəlimli olmaq*** – diqqəti cəlb edən; diqqət mərkəzində olmaq; "Çünki bu, kütləvi istehsaldır, onların gözəl, iri, *gözəgəlimli olması* üçün müxtəlif vasitələrdən istifadə edilmişdir, keyfiyyəti isə itir" [XXXVIc.s.252].

***Gözdən qaçmamaq*** – diqqətdən yayınmaq; nəzərdə olmaq; "Mən bir daha xəbərdarlıq edirəm: qoy heç kəs güman etməsin ki, belə əməllər *gözdən qaçacaq*, yaxud bunlara görə cəza verilməyəcəkdir" [IIc.s.109].

***Gözdən qaçmaq*** – ~ gözdən yayınmamaq, gözdən oğurlanmaq; diqqətdən kənarda qalmaq, yayına bilmək; 1) qaçıb gizlənmək, yayınmaq, gözə görünməmək 2) diqqət edilməmək, əhəmiyyət verilməmək; "Mən bir daha xəbərdarlıq edirəm – qoy heç kəs güman etməsin ki, belə əməllər *gözdən qaçacaq*, yaxud onları görən yoxdur, bunlara görə cəza verilməyəcəkdir" [IIc.s.109].

***Gözdən qoymamaq*** – daim nəzarətdə saxlamaq, bütün hərəkətlərinə fikir vermək, izləmək, təqib etmək ~ göz qoymaq, göz-qulaq olmaq; "Qəzet və efir partiya və hökumətin fərmanlarını, direktivlərini auditoriyaya çatdırır, növbəti təbliğat-təşviqat müddəalarını adamların şüuruna yeridir, "sosialist yarışı"nın gedişinə nəzarət edir, "xalq düşmənləri"ni gözdən qoymurdu" [XXVIIc.s.212].

***Gözlərini açmaq*** **–** hadisələrə düzgün qiymət vermək, bəsirət gözünün açılması; 1) ayıltmaq, bilmədiyini öyrətmək ~ başa salmaq 2) ayılmaq, ~ özünə gəlmək 3) diqqət etmək, fikir vermək; "Onlara bildirmək istəyirəm ki, *gözlərini açsınlar*, ayılsınlar, ağı-qaradan seçə bilsinlər" [Ic.s.96].

***Göz-qaşını çıxartmaq*** – cəzalandırmaq; "Biz də bu işlərdə prinsipial olmalıyıq, siz də o adamların, necə deyərlər, basıb *göz-qaşını çıxartmalısınız*" [VIIc.s.489].

****Gözümçıxdıya salmaq*** – sıxışdırmaq, narahat etmək, incitmək, təzyiq altında saxlamaq, təqib etmək, hər bir əhəmiyyətsiz məsələyə görə danlamaq, dözülməz iş şəraiti yaratmaq; ~ göz verib işıq verməmək "Mən kinli adam deyiləm, heç kəsi də *gözümçıxdıya salmaq*, təqib etmək fikrim yoxdur" [Ic.s.47].

****Gözünün qarşısına almaq*** – qabaqcadan proqnozlaşdırmaq, hadisələri öncədən görmək; "Mən o vaxt *gözümün qarşısına alırdım* ki, bu həm iqtisadi, həm sosial cəhətdən, çox cəhətlərdən çətin, ağır olacaqdır" [XIIIc.s.88].

***Gözünə alnına basmaq*** – öpmək, alnına sıxmaq; Peyğəmbərin namaz qıldığı minbərin pilləsində oturub, Quranı öpüb *gözümə, alnıma basdım* [IIc.s.82].

***Göz yummaq*** – özünü görməməzliyə vurmaq; biganə olmaq; "Amma burada hamı vahid mövqe ilə çıxış etməli və elə olmamalıdır ki, bu separatizmə qarşı çıxmaq lazımdır, başqa separatizmə isə *göz yummaq* və ya onu hətta təşviq etmək və ona kömək etmək olar"[XXc.s.37].

***Gözü qorxmaq*** – "Biz Avropa Şurasına daxil olanda bizi o qədər o tərəfə – bu tərəfə çəkdilər ki, *gözümüz qorxub*" [XXXIVc.s.157].

***Gözü o yanda – bu yanda olmaq*** – əlavə gəlir yeri axtarmaq, maaşından əlavə pul əldə etmək, gözü orda-burda olmaq, baxışları ilə daim nə isə axtarmaq; "Fərman verəcəyəm və sizin maaşınızı bir az da artıracağam ki, bundan da yaxşı işləyəsiniz, bundan da yaxşı yaşayasınız ki, *gözünüz o yanda– bu yanda olmasın*" [XXXIXc.s.361].

****Gözünü dünyaya açmaq*** – dünya ilə müasirliklə tanış olmaq; dünyanı dərindən dərk etmək; "Əgər Cəlil Məmmədquluzadə kimi şəxsiyyət dünyaya gəlməsəydi, əgər "Molla Nəsrəddin" jurnalı yatmış insanları qaranlıqdan çıxarmağa çalışmasaydı, əgər onun "Ölülər" əsəri insanların *gözünü real dünyaya açmasaydı* xalqımız bu qədər inkişaf edə bilməzdi" [XXIIc.s.261].

****Götür-qoy etmək*** – analiz etmək, dərindən düşünmək; ~ ələkdən keçirmək, ölçüb-biçmək; "Çox *götür-qoy etmişəm* və xeyli müddət bundan qabaq belə qərara gəlmişəm ki, bu orden bax, bizim şəxsiyyətlərimizə çatmalıdır" [IIIc.s.364].

***Göz qabağında olmaq*** – xalqdan gizli olmamaq; şəffaf olmaq; "Ola bilər, başqa sahələrə nisbətən ictimaiyyət bu nöqsanları daha da tez görür, hiss edir, çünki sizin işiniz *göz qabağındadır*" [Vc.s.340].

***Göz qoymaq*** – hiss etdirmədən diqqətlə baxmaq, müşahidə etmək, nəzarət etmək, nəzarət altında saxlamaq; ~ gözdən qoymamaq, “Sovet İttifaqı dövründə Moskvadakı və yeri gəlmişkən, Ermənistandakı bəzi siyasətçilər Sovet İttifaqının rəhbərliyini qorxudub deyirdilər ki, Azərbaycana *göz qoymaq* lazımdır, çünki İran Azərbaycanı ələ keçirə bilər, çünki onların dili birdir, çünki orada da azərbaycanlılar var” [XVIc.s.215].

***Gözaltı nəzər salmaq*** – gözaltı etmək, müəyyən məqsədlə kimisə və ya nəyisə hədəfə almaq, nəzərdə tutmaq, nəsə planlaşdırmaq; “Lakin sonralar gənclik illərində, hələ subay olduğum vaxtlarda da bazar günləri şəhərə çıxır, baxırdım, bəzən *gözaltı qızlara da nəzər salırdım*” [XXXVIc.s.250].

****Gözü tərəzi olmaq*** – səhvə yol verməmək; dəqiq qiymətləndirmək; “Bizim Azərbaycanda yaxşı bir söz var: xalqın *gözü tərəzidir*” [XVc.s.181].

****Gözükölgəli olmamaq*** – asılı olmamaq; eyib işi olmamaq; qanunsuz bir işi olmamaq; “Bir də ona görə ki, o, heç kəsin qarşısında *gözü kölgəli deyildi*, heç vaxt heç kəsə xəyanət etməmişdi” [XXIVc.s.223].

***Gözümün qarşısında olmaq*** – unutmamaq; həmişə xatırlamaq; “Həyatımın bəzi hissələrini bəlkə də indi xatırlaya bilmirəm, amma müəllimlərimi heç vaxt unutmamışam, hər bir müəllimim bu dəqiqə də *gözümün qarşısındadır*” [XXIXc.s.413].

****Gözünün üstündə qəbul etmək*** – can-başla, məmnuniyyətlə qəbul etmək“Azərbaycan xalqı sizi bax, belə sevgi ilə, belə məhəbbətlə, hörmətlə qarşılayır, sizi qucaqlayıb öpür, sizi *gözünün üstündə qəbul edir*” [IIIc.s.390].

****Gur danışmaq*** – populist danışmaq; “Bu barədə *gur danışan* adamlar özləri çox şeylərin günahkarlarıdır” [XVIIc.s.430].

****Güclü addım atmaq*** – inkişafda ciddi irəliləyişə nail olmaq; “Məsuliyyətimiz Azərbaycanda demokratik dövlət quru-

culuğu sahəsində yeni bir *güclü addım atmaqdan*, Azərbaycanda prezident seçkilərini müasir tələblərə, demokratik prinsiplərə uyğun keçirib xalqın istədiyi adamın prezident seçilməsini təmin etməkdən ibarətdir” [XVIc.s.251].

***Gün sona çatır** – iş günü sona yetmək; “Artıq gün *sona çatır*” [XIIIc.s.199].

***Gündən-günə artmaq** – irəliyə doğru artmaq; “İnsanlarda sevinc nikbinlik, gələcəyə inam hissi *gündən-günə artır*” [IXc.s.39].

***Günlərə çıxmaq*** – bu günlərədək yaşamaq; “Naxçıvan yaşadı və Naxçıvan bu *günlərə çıxdı*” [XXIIc.s.207].

### *Hh*

***Hadisələri izləmək** – baş verənləri mətbuatla müşahidə etmək, mətbuatla, televiziya ilə məlumat almaq; mütəmadi məlumat almaq; “Biz o vaxt çox böyük məyusluqla və kədərlə sizin ölkənin başına gələn *hadisələri izləyirdik* və təbiidir ki, qardaş, dost xalq kimi sizinlə bir yerdəydik” [XXXVIc.s.153].

***Hakim dil etmək** – həyatın bütün sahələrində dili aparıcı etmək; “Biz müstəqil Azərbaycanda Azərbaycan dilini dövlət dili etdiyimiz kimi, cəmiyyətimizə də, xalqımızın içində də Azərbaycan dilini mütləq hakim dil etməliyik.” [XXIXc.s.415]. *Hakim dil etmək* – aparıcı dil etmək, əsas dil etmək; “Bizim birinci nailiyyətimiz o olmalıdır ki, öz dilimizi Azərbaycanda hakim dil etməliyik” [XIIIc.s.136].

***Hakimiyyətə yiyələnmək** – qeyri-qanuni yolla hakimiyyəti ələ keçirmək, zorakı yolla hakimiyyətə gəlmək; “Öz torpağını, öz ölkəsini qorumaq üçün silahı olan bir çox adamlar sonra bu silahdan öz şəxsi məqsədlərinə çatmaq, silahlı yolla *hakimiyyətə yiyələnmək* üçün istifadə etməyə başladılar və şübhəsiz ki, bu, istər terror əməlləri törədilməsi ilə, istərsə də

silahlı yolla dövlət çevrilişi həyata keçirmək cəhdləri ilə bağlı idi” [XXIVc.s.440].

***Hakimiyyəti ələ keçirmək** – qeyri-qanuni yolla hakimiyyəti zəbt etmək; “Bunlardan istifadə edən xarici və daxili qüvvələr Azərbaycanda hakimiyyəti ələ *keçirmək* cəhdləri göstərirdilər” [XVc.s.400].

***Hakimiyyəti yıxmaq** – hakimiyyəti devirmək, məğlub etmək; “Xalq Cəbhəsi də öz hərbi dəstələrini oradan çıxarıb Azərbaycanın bu meydanlarına Prezident sarayının, parlamentin, Ali Sovetin önünə gətirib ki, bəli, burada mübarizə aparsınlar, *hakimiyyəti yıxsınlar*” [VIc.s.245].

***Haqq qazanmaq*** – hüquq əldə etmək; “Biz müstəqil ölkəyik, müstəqil dövlətik, öz tariximizə, mədəniyyətimizə, milli mənəviyyatımıza istədiyimiz münasibəti, layiqli münasibət göstərmək imkanına malikik və bu *haqqı qazanmışıq*” [VIIIc.s.32].

***Haqq-hesab çəkmək*** – 1) hesabat tələb etmək, sorğu-suala tutmaq, problemi və münaqişəni həll etmək, mübahisəyə son qoymaq; ~ mizan-tərəzi qurmaq, məsələni çürütmək 2) qisas almaq, intiqam almaq; “Bəzi müxalifət qəzetləri iqtidarla və rəqib radikal partiyaların liderləri ilə barışmaz mübarizəyə başlayaraq, siyasi duel, digər partiyalarla açıq-aşkar *haqq-hesab çəkmək* vasitəsinə çevrilmişdir” [XXVIIc.s.214].

***Haqq-hesabı düz aparmaq** – maliyyə məsələlərini düzgün yerinə yetirmək; “Amma gəlin haqq-hesabı düz aparaq. Düzü düz, əyrini əyri” [XXXIVc.s.42].

***Halva yemək*** – bir işi asanlaşdırmaq, hazır çəkildə təqdim etmək, asan olmaq, havayı olmaq, rahatca yemək; rahat iş görmək; ~ halva eləyib ağzına qoymaq; “Çünki əsgər olmaq *halva yemək*, yaxud anasının hər gün bişirdiyi plovu yemək deyildir. Elə bütün ordularda əsgərlik asan məsələ deyildir” [XXVIIIc.s.334].

***Hamar olmamaq*** – maneələrlə, əngəllərlə dolu olmaq; rahat olmamaq; ~ əziyyəti çox olmaq; "Əgər Sovetlər İttifaqının süqutu və Azərbaycanın dövlət müstəqilliyi əldə etdiyi, təbii ki, Rusiyanın öz suverenliyini elan etdiyi, ölkələrimiz arasında diplomatik münasibətlər yaradıldıqdan sonrakı dövrdə Rusiya-Azərbaycan münasibətlərinin tarixinə nəzər salsaq, açıq deməliyəm, siz tarixi yaxşı bilməlisiniz, heç də hər şey hamar olmamışdır" [XLIc.s.308].

****Hamar yola çıxmaq*** – maneələri az olan inkişafa çatmaq; "Lakin dostlar kimi, qardaşlar kimi bütün bunları müşahidə edərək həmişə inanmışıq ki, Gürcüstan *hamar yola çıxacaqdır* və çıxdı da" [VIIIc.s.429]. *Hamar yola çıxmaq* – rahatlığa yetişmək; "Əminəm ki, biz hamımız onu uğurla dəf edəcəyik və xalqlarımızın müstəqilliyini və gözəl gələcəyinin hamar yoluna çıxacağıq" [VIIc.s.450]

***Havadan götürmək*** – rəqəm və faktlara söykənməmək; "Şübhə doğurursa, dəqiqləşdirin, o bu rəqəmi *havadan götürməyib* ki, hə?" [VII c.s.451].

***Hay-küyə uymaq*** – yalanlara inanmaq, qızışmaq; ~ küyə getmək; "Oranın 60 min nəfər əhalisi *hay-küyə uyaraq*, öz yerlərindən qaçıb getmişdi" [Ic.s.402].

***Harada aş, orada baş*** – çağrılmayan yerdə peyda olmaq, təklifsiz yerə getmək; ~ hazırın naziri olmaq; "Azərbaycanda bir misal var: "*harada aş, orada baş*" [XLc.s.297].

***Haray çəkmək*** – yalandan informasiya yaymaq, qışqırmaq, bağırmaq, çığırmaq; ~ hay-küy qaldırmaq, hay-küy salmaq, haray-həşir salmaq; "Çeçenistanda müharibə gedərkən Moskvada gah televiziya ilə, gah qəzetlərdə, gah da ayrı-ayrı şəxslərin bəyanatlarında ardı-arası kəsilmədən *haray çəkirdilər* ki, Əfqanıstandan, Pakistandan, Türkiyədən, nə bilim İrandan, daha haralardan silah Çeçenistana Azərbaycan vasitəsilə gətirilir" [XXIIc.s.29].

***Havadan asılı qalmaq*** – qeyri-müəyyən vəziyyətdə qalmaq, həll olunmamış vəziyyətdə olmaq, reallığa çevrilməyən iş, əməl, yerinə yetirilə bilməyən söz; ~ havada qalmaq; "Əgər əsas məsələ həll olunmasa, münaqişə aradan qaldırılmasa, Azərbaycanın işğal edilmiş torpaqları azad olunmasa, verilən sözlər *havadan asılı qalacaqdır*" [XXXIVc.s.245].

***Haray-həşir salmaq*** – özünü qorumaq məqsədi ilə yalan bəyanatlar vermək. "Bax bunların hamısı dövləti dağıdanların, indi müxalifətə keçərək qəzetlərdə *haray-həşir salanların* Azərbaycan xalqına, Azərbaycan Respublikasına, Azərbaycan dövlətçiliyinə vurduqları zərbədir" [I c.s.276].

***Haraya gəlmək*** – hüquqlarını müdafiə etmək; köməyə gəlmək; "1994-cü ildə müharibəni saxlayandan sonra biz bu münaqişəni sülh yolu ilə həll etmək istəyirik, amma bizim *harayımıza gələn* yoxdur" [XXVIIc.s.20].

****Havadarlıq mövqeyi tutmaq*** – birtərəfli mövqe tutmaq; ədalətsiz mövqe tutmaq; "Sovetlər İttifaqının rəhbərliyi bu münaqişəni nizama salmaq iqtidarında olmadı, daha doğrusu, sadəcə olaraq, bunu istəmədi, bu münaqişədə birtərəfli mövqe, Ermənistan barəsində *havadarlıq mövqeyi* tutdu" [XXVIIIc.s.305].

***Hay-küy salmaq*** – əsassız böhtanlar demək; xalqın fikrini özünə cəmləmək; "Bizim bəzi müxalifət dairələri var, onların dünyada heç nədən xəbərləri yoxdur, ancaq *hay-küy salırlar*: "ay nə bilim, ordu zəifdir", "ordunun vəziyyəti pisdir" və sair" [XXXIXc.s.192].

***Havadan götürmək*** – əsassız olaraq söyləmək; "Mən bunu *havadan götürməmişəm*, Türkiyədə görmüşəm" [XLIIIc.s.378].

****Heç dilə gətirməmək*** – çox aşağı olmaq; "Başqa məhsulların istehsalı da o qədər aşağı düşüb ki, onları *heç dilə gətirmək* istəmirəm" [IIc.s.585].

***Hesabı düz aparmaq** – iqtisadi-maliyyə məsələlərinə düzgün yanaşmaq; “Ona görə gəlin, hesabımızı həmişə düz aparaq” [XXXIVc.s.42].

***Heykəl ucaltmaq** – heykəl qoymaq; “Bu gün isə burada, Puşkinin Böyük Pyotrun əsəri adlandırdığı bu şəhərdə Nizamiyə *heykəl ucaldılmışdır*” [XXXIXc.s.40].

***Həkimlər hazırlamaq** – həkim kadrları ilə ölkəni təmin etmək; kadrlar yetişdirmək; “Qısa bir zamanda tibb fakültəsi böyüdü, inkişaf etdi, azərbaycanlılar məhz azərbaycanlıların özündən *həkimlər hazırladı*” [XVIIc.s.371].

***Hər addımı görmək** – hərəkətləri nəzarətə almaq, bütün hərəkətlərin, əməllərin şahidi olmaq; “Hər addımı deyəndə, bəlkə bir az düz olmaz, *hər addımı görmək* çətindir” [XLIIc.s.14].

***Hər ağızdan bir avaz gəlmək** – işə kömək etməyən müxtəlif fikirlər söyləmək; ~ ağzına gələni danışmaq; “Əvvəllər *hər ağızdan bir avaz gəlirdi*, müxtəlif fikirlər, müxtəlif baxışlar vardı, bəzən onlar qeyri-məqbul olurdu, hərə öz mövqeyinin üstün olduğunu sübut etmək istəyirdi” [XVIIc.s.16].

***Hər şeyi unutmaq** – həyatın acı reallığından uzaq olmaq, qayğısız olmaq, dünyanın ağırlıqlarını unutmaq; “Amma uşaqlara baxanda öz övladlarıma, öz nəvələrimə baxanda, sizlərə baxanda *hər şeyi unuduram*” [XIIIc.s.395].

***Hər şeyin təzəsi, dostun köhnəsi*** – çətin vaxtlarda sınanmaq; “Bu veteran mənim köhnə dostumdur. *Hər şeyin təzəsi, dostun köhnəsi*” [XLIc.s.142].

***Hər yerə səpələnmək** – müxtəlif regionlarda yaşamaq; “Doğrudur, indi azərbaycanlılar dünyanın *hər yerinə səpələniblər*” [XIc.s.350].

***Hərarətli ürək** – işə can yandırmaq;“Vaxtilə belə bir məşhur kəlam var idi ki, soyuq baş, hərarətli ürək, təmiz əllər olmalıdır” [XVc.s.126].

***Hərə öz başını dolandırmaq*** – mürəkkəb şəraitdə özünü qorumaq, ilk növbədə özü haqqında düşünmək, hakimiyyətsizlik, dövlətə bel bağlamamaq, qanunsuzluq, dövlətə inamsızlıq, güc strukturlarına inamsızlıq etmək; "Onda anlayırdı ki, Azərbaycanda hakimiyyətsizlikdir, gərək *hərə öz başını dolandırsın*" [XXXIXc.s.353].

****Hərc-mərclik yaratmaq*** – qanunsuzluq yaratmaq; xalqla iqtidar arısında münasibətləri pozmaq; "O bəlalar vaxtilə Azərbaycanda daxili sabitliyi pozub, qarma-qarışıqlıq, *hərc-mərclik yaradıb* və bizə 1993-cü ildə elə bir miras qoyublar ki, cəmiyyətimizin belə cinayətkarlardan təmizlənməsi üçün bunları aradan qaldırmağa neçə illər lazımdır" [IVc.s.185-186].

****Hərarətli çıxış etmək*** – emosional, yaddaqalan çıxış etmək; səmimi, qəlbləri oyandıran çıxış etmək; "Birliyin əmək veteranı, mənim dostum Cahangir Quliyev burada çox *hərarətli çıxış etdi*" [XXVIIIc.s.16].

***Həsrətlə baxmaq*** – uzaqdan baxmaq, əlçatmaz olmaq, istədiyinə çatmamaq, arzu etdiyi bir şeyə nail ola bilməmək; gözündə qalmaq, ürəyində qalmaq; ~ həsrət qalmaq; "Bizim vətəndaşlarımız ayrı-ayrı ölkələrdə mobil telefonlardan istifadə edilməsinə əvvəllər *həsrətlə baxırdılar*" [XXc.s.7].

***Həyata qatılmaq*** – aid olmaq, bilavasitə iştirak etmək; ~ həyata keçmək; "Çünki, mən artıq sizin universitetin *həyatına qatılıram* və sizin universitetin həyatı mənim üçün doğma iş olur " [IXc.s.352].

***Həyatdan getmək (1)*** – vəfat etmək; həlak olmaq; ölmək; "Həyatdan getmiş yaxınların, xalqımızın qəhrəman oğul və qızlarının – Azərbaycanın azadlığı müstəqilliyi və ərazi bütövlüyünün müdafiəsi uğrunda öz canlarını vermiş şəhidlərin xatirələrinin bu əziz bayram günlərində yad etmək gözəl bir ənənəyə çevrilmişdir" [XXIVc.s.159].

***Həyatdan getmək (2)*** – Eyni zamanda onu da demək yerinə düşərdi ki, 500 il ərzində – Füzulinin sağlığında da, o *həyatdan gedəndən* sonra da Füzuli yaradıcılığı Füzuli şəxsiyyəti haqqında bu qədər yüksək səviyyəli tədbirlər keçirilməmişdir [VIIIc.s.31].

****Həyatı ağırlaşmaq*** – hər cəhətdən tənəzzül etmək; "1993-cü ildə Azərbaycanda vətəndaş müharibəsi başlandı. Ölkəmiz parçalanmaq təhlükəsi qarşısında qaldı. Respublikamızın *həyatı tamamilə ağırlaşdı*" [XXIV c. s.201].

***Həyatına son qoymaq*** – həlak olmaq, vəfat etmək; "Bu müharibə bir çox azərbaycanlıların da, ermənilərin də *həyatına son qoymuşdur*, çoxlu qan tökülmüşdür" [XXIVc.s.413].

***Hoydu-hoyduya basmaq*** – danışmağa imkan verməmək; əcaib səslər çıxarmaq; dolamaq, ~ hoydu-hoyduya götürmək, məsxərəyə qoymaq, araya qoymaq, ələ salmaq, lağa qoymaq; "Bütün zal məni *hoydu-hoyduya basdı* və axşam iclasına da rəhmətlik Bayram Bayramovu hazırladılar, o da gəlib çıxış etdi" [XLc.s.117].

***Hörmət gətirməmək*** – nüfuzuna xələl gətirmək; ciddiyyətini şübhə altına almaq; "Amma Birləşmiş Millətlər Təşkilatının üzvü olan Ermənistan BMT Təhlükəsizlik Şurasının qəbul etdiyi qərarların heç birisini yerinə yetirməyibdir. Belə çıxır ki, Təhlükəsizlik Şurası qərar qəbul edir, amma yerinə yetirmir. Bu da Birləşmiş Millətlər Təşkilatına *hörmət gətirmir*" [XXIXc.s.55].

***Hüsn-rəğbət oyatmaq*** – hörmət hissi yaratmaq; "Amerika Birləşmiş Ştatlarının, onun prezidentinin bu məsələlərə münasibəti və prinsipial mövqeyi bizdə böyük *hüsn – rəğbət oyadır*" [IVc.s.80].

# *Xx*

***Xalq malını dağıtmaq*** – xalqın əmlakını satmaq, əmlakı səpələmək; ~ xalqın cibinə girmək; "Nizam-intizamdan, qayda-qanundan danışarkən son illərdə respublikamızda xüsusilə geniş yayılmış halın – dövlət, *xalq malını dağıtmaq* meyillərinin, rüşvətxorluğun qarşısını almaq lazımdır" [Ic.s.492].

****Xalqı birləşdirmək*** – xalqı bir etmək; xalqın hisslərini bir amala, bir məqsədə yönəltmək; "İstədim, Naxçıvanda *xalqı həqiqətən birləşdirim* ki, parçalanmasın" [XXIIc.s.276].

****Xalqı çaşdırmaq*** – xalqın fikrini yayındırmaq, fikrini normal yoldan döndərmək; "Bəzən ayrı-ayrı qruplar *xalqı çaşdırmaq* üçün cürbəcür məlumat yaymağa can atır, xalqın mənafeyinə zidd fikirlər söyləyirlər" [IIc.s.28].

****Xalqı qaldırmaq*** – xalqı mübarizəyə səsləmək, xalqı səfərbər etmək, xalqı təbliğ etmək; "Yəni o mənada ki, indi bizim içərimizdə bəzi adamlar var, hesab edirlər ki, onlar *xalqı qaldırıblar*, xalqı meydana çıxarıblar, onlar guya Sovet hakimiyyətinə qarşı mübarizə aparıblar, onlar Azərbaycanın müstəqilliyinə nail olublar" [XXVIIIc.s.312].

****Xalqı parçalamaq*** – xalqı hissələrə, təbəqələrə bölmək; "Çünki onlar *xalqı artıq parçalayırdılar*" [XXIIc.s.276].

****Xalqımızı tanıtmaq*** – dünyaya göstərmək, dünyanı məlumatlandırmaq; "Mən neçə ildir çalışıram, işləyirəm, bir məqsədim var: *xalqımızı tanıtmaq*" [VIIIc.s.341].

****Xalqın çabalaması*** – istiqaməti itirmək; çıxılmaz vəziyyətə düşmək; "Təsəvvür edin, üç il bundan əvvəl, iyunun 4-də respublikamız, *xalqımız çabalayırdı*, təhlükə qarşısında, qan içində, vətəndaş müharibəsi içində idi" [VIc.s.419].

****Xalqın içinə atmaq*** – xalqın arasında olmaq; xalqdan ayrı olmamaq; "Çünki burada, Azərbaycanda, Bakıda vəziyyət o qədər ağır, gərgin idi ki, mən sadəcə, xalqın bu çağırışına səs verərək gəldim, özümü *xalqın içinə atdım*" [XVIc.s.11].

***Xalqın gözündən salmaq*** – xalqın yanında hörmətdən salmaq; “Qalan fərarilərə müraciət etdim, bildirdim ki, özünüzü *xalqın gözündən salacaqsınız*” [Ic.s.403].

***Xarab olmaq (1)*** – mənfi xüsusiyyətlər qazanmaq; qeyri-etik davranışlar qazanmaq; ~ zay olmaq; “Vəzifə alan adamlar var, bir azdan sonra görürsən ki, vəzifə onları *xarab edir*” [XXXIXc.s.127].

***Xarab olmaq (2)*** – inkişafdan qalmaq; “Amma bu gün də yüz il bundan əvvəlki, kimi, adamlar çayxanada oturub deyirlər ki, dünya, hər şey *xarab olur*” [XVIIIc.s.330].

***Xata-bəladan xilas olmaq*** – təhlükələrdən xilas etmək; “Sonrakı illərdə Azərbaycanı başqa *xata-bəlalardan xilas etdik* və 1995-ci ildə Azərbaycanda ictimai-siyasi sabitlik yaratdıq” [XXVIc.s.63].

***Xatirinə salmaq*** – yaddaşını təzələmək; yadına salmaq; ~ yaddaşında canlandırmaq; “Onların mühafizəçisinə göstəriş verdim, dedim ki, *xatirinə sal*” [Vc.s.189].

***Xeyirlə şər yan-yanadır*** – xeyirlə şərin dialektik vəhdəti; “Amma bununla yanaşı, bu əsərin əsas ana xətti olan *xeyirlə şər yan-yanadır*, o həyatı zibilləyən mənfi cəhətlər var və təəssüf ki, onlar azalmayıb, əksinə artıb və artmaqdadır” [XIIIc.s.170].

***Xələl gətirmək*** – münasibətləri pozmaq, nöqsanlı hərəkəti ilə ziyan vurmaq, ~ kölgə salmaq; “Mən prezident İslam Kərimovla tam razıyam ki, dostluğumuza bundan sonra heç nə *xələl gətirməyəcək*, onu heç kim poza bilməyəcəkdir” [VIIc.s.441].

***Xəta baş vermək*** – anlaşılmazlıq olmaq; düzəlməsi mümkün olan səhvlərin baş verməsi; “Keçmişdə bir-iki *xətalar baş vermişdir*” [XLIIIc.s.271].

***Xətt çəkmək*** – “Amma mənim gözdən salınıb qəzəbə düçar olmağım onun da karyerasının üstündən *xətt çəkdi*” [Ic.s.47].

****Xırda-xuruş adamlar*** – az, azacıq, kiçik; "Amma ölkə böyük olanda, xalq, millət böyük olanda, belə xırda-xuruş işlərlə elə *xırda-xuruş adamlar* məşğul olur" [XXXIXc.s.58].

****Xırda-xırda irəliləmək*** – aşağı templə irəliləmək; aşağı sürətlə irəliləmək; yavaş-yavaş irəliləmək; "Məhz buna görə də deyirəm ki, *xırda-xırda da olsa biz irəliləyirik* və bunlar hamısı ümid verir ki, məsələlərin sülh yolu ilə həll edilməsinə nail ola biləcəyik" [Vc.s.82].

****Xırda-xırda unutmaq*** – tədricən unutmaq; zaman-zaman unutmaq; "Çünki dilini unudan adam, şübhəsiz ki, milli keyfiyyətlərini də *xırda-xırda unudur*" [XVIIc.s.228].

****Xırda-xuruş satmaq*** – kiçik alverlə məşğul olmaq; "Xatirimdədir, o vaxtlar, yəni müharibə illərində mənə dərs verən müəllimlərdən bəziləri gedib bazarda *xırda-xuruş satırdılar*, çünki dolana bilmirdilər" [IIc.s.107].

****Xor baxmaq*** – etinasızlıqla yanaşmaq, xalqın milli adət-ənənələrinə hörmətsizlik etmək; "Amma bəzən nədənsə meyxanaya *xor baxırdılar*" [VIIc.s.259].

***Xoruzun quyruğu görünmək*** – yavaş-yavaş aşkara çıxmaq, əsas mətləbi duymaq, hadisənin üstü açılmaq, hadisənin ilkin əlamətlərini görmək; ~ cidanın ucu çuvaldan çıxmaq; "Bax burada, necə deyərlər, *xoruzun quyruğu görünür*" [IIc.s.530].

## *İi*

***İç üzü açılmaq*** – mənfi xasiyyəti, əsl siması tanınmaq, xarakterləri məlum olmaq; "Meydana gündə bir siyasətçi çıxıb, ancaq sonra *iç üzləri açılıbdır*" [Ic.s.149].

****İçdən gəlmək*** – iradədən asılı olmayaraq gəlmək; düşünülmüş şəkildə olmamaq; "Güman edirəm, heç onun da iradəsindən, mənim də iradəmdən asılı olmayan, ancaq *içimizdən*

*gələn* hissiyyatlar göstərdi ki, biz sanki, yüz ildir dostuq" [XXXIXc.s.248].

***İçimizdə yaşatmaq*** – unutmamaq, qoruyub saxlamaq; "Amma bu hisləri biz *içimizdə yaşatmışıq*, qoynumuzda saxlamışıq, hətta ən ağır dövrlərdə də öz dinimizə etiqad bəsləmişik" [IIIc.s.20].

***İxtiyarı ələ almaq*** – səlahiyyətə, hakimiyyətə yiyələnmək, vəzifə səlahiyyətlərindən istifadə etmək; "Bax, onda mən *ixtiyarı öz əlimə alıb* yüksək vəzifəli adamların uşaqlarının Azərbaycan Dövlət Universitetinin hüquq fakültəsinə qəbul edilməsinə qadağan qoydum" [IXc.s.100].

***İki stul üzərində oturmaq*** – bir vəzifə ilə qane olmamaq, bir vəzifə kürsüsü ilə kifayətlənməmək; "Bizim sıralarımızda bəzi adamlar var ki, *iki stul üzərində oturmaq istəyir* – həm o tərəfdə, həm də bu tərəfdə. Bunlarla da qutarmaq lazımdır" [IIc.s.122].

***İkibaşlı siyasət aparmaq*** – riyakarlıq, ikiüzlülük etmək, münaqişədə olan tərəfləri razı salmaq üçün onların hər biri ilə zahirən xoş münasibətdə olmaq; ~ ikili standart; "Təəssüflər olsun ki, buradakı bəzi müvafiq orqanlar bu məlumatları mənə verməmişdilər, çünki onlar *ikibaşlı siyasət aparırdılar*" [IVc.s.35].

***İkiqat, üçqat sevinmək*** – həddindən çox sevinmək; "Buna görə də mən bu gün sizinlə görüşümdən *ikiqat, üçqat sevinirəm*" [XXVIIIc.s.10].

***İqtidar-müxalifət mədəniyyəti yaratmaq*** – sivil, anlaşılıqlı iqtidar-müxalifət münasibətlərini formalaşdırmaq; "Azərbaycanda *iqtidar-müxalifət mədəniyyəti yaradaq*" [XIIIc.s.281].

***İqtisadiyyatı canlandırmaq*** – inkişaf etdirmək; "Bizim həyata keçirdiyimiz islahatlar Azərbaycan *iqtisadiyyatını çox canlandırıbdır*" [XVIc.s.464].

***İlham almaq*** – ruhlanmaq, həvəslənmək, zövq almaq; rahat olmaq; zehni cəhətdən dincəlmək; “Amma bu gün burada çox yaxşı əhvali-ruhiyyədəyəm, sizdən *ilham alıram*” [XLIIc.s.263].

***İlk addım*** – bir işdə təşəbbüsçü olmaq, birinci səfər; ilk səfər; “Respublikamızda da mən *ilk addımı* Allah evinə, məscidə atmışam, sizin qarşınızda çıxış edirəm” [IIc.s.83].

***İmkan əldə etmək*** – imkan reallaşdırmaq; imkan qazanmaq, ~ imkan tapmaq; “Tarixin səhifələrini sizə xatırladaraq, onu demək istəyirəm ki, Azərbaycan yalnız dövlət müstəqilliyini əldə etdikdən sonra öz aqibətinin, öz sərvətlərinin sahibi olmuş və ölkəmizin ən zəngin sərvəti olan qaz və neft ehtiyatlarından müstəqil, sərbəst istifadə etmək *imkanı əldə etmişdir*” [XXIIc.s.8].

***İpini çəkmək*** (kinayəli söz) – pis yoldan, pis əməldən qaytarmaq, intizama çağırmaq; ~ həddini bildirmək, noxtasını çəkmək, düzgün hərəkətə dəvət etmək; “Bir adam bunun *ipini çəkəydi* ki, axı belə işlər görmək olmaz” [VIIc.s.155].

***İradəni qırmaq*** – fikrindən döndərmək; əqidəsindən döndərmək; “Heç kəs də *iradəmi qıra bilməyəcək*” [IIc.s.109].

***İradəsini qırmaq*** – təzyiq etmək və qorxutmaqla tutduğu yoldan, mübarizədən çəkindirmək, məqsədindən döndərmək; ~ əzmini qırmaq; “Bunların hamısını tamamilə həyata keçirmək üçün Azərbaycan xalqının *iradəsini qırmaq*, xalqımızı əzmək lazım idi” [Ic. s. 338].

***İradəsini sındırmamaq*** – iradəsindən döndərməmək; “Amma bunların heç birisi Ziya Bünyadovun *iradəsini sındırmayıbdır*” [VIIIc.s.450].

***İrəli çəkmək*** – etimad göstərmək, inkişafı üçün imkan yaratmaq, vəzifəsini artırmaq; ~ qabağa çəkmək, qapı açmaq; “Nə üçün belə adamları göndərmirik, nə üçün belələrini *irəli çəkmirik*” [XVc.s.26].

***İrəli sürmək*** – tələb və təklifləri səsləndirmək; "Müzakirələrdə bu məsələləri nizama salınması üçün Nazirlər Kabinetinin rəhbərliyinə təkliflər vermişəm və tələblər *irəli sürmüşəm*" [VIIc.s.110].

****İrəliyə doğru aparmaq*** – inkişaf etdirmək; "Öz xalqını ağıl-zəka ilə, müdrikliklə *irəliyə doğru aparır*, öz ölkəsinə rəhbərliyi təmin edir və belə mövqeyə nail olmuşdur" [VIIIc.s.67].

***İş aparmaq*** – vəzifəni yerinə yetirmək; "Mən də səndən tələb edirəm ki, *işi apar*" [XIIIc.s.442]. ***İş aparmaq*** – vəzifəni yerinə yetirmək; 1) müəyyən bir ideyanı yaymaq və ya hər hansı məqsədə nail olmaq üçün çalışmaq, təbliğat, təşviqat aparmaq; 2) cinayət əməli ilə bağlı təhqiqat aparmaq, əməliyyat-istintaq işlərini icra etmək; "Amma kimin dəstək verib-verməməsi əhəmiyyətli deyil, mən öz *işimi aparıram*" [VIIIc.s.333].

***İşarə vurmaq*** – sözü, fikri üstüörtülü, eyhamla demək, bildirmək; məsləyə toxunmaq; eyham etmək; ~ söz atmaq; "Səfir bu barədə bir balaca *işarə vurdu*" [XXVIIc.s.205].

****İşdən kənarlaşdırmaq*** – vəzifədən çıxarmaq; uzaqlaşdırmaq; "Mənim xatirimdədir iki il bundan öncə əvvəlki icra hakimiyyəti başçısı orada vəzifəsindən sui-istifadə etdiyinə görə biz onu *işdən kənarlaşdırdıq*, yeni adamı təyin etdik" [XVIIIc.s.188].

****İşdən sıxılmaq*** – yorulmaq; usanmaq; tükənmək; ~ əli işdən soyumaq; "Bəzən olur, əsəbiləşirəm, bəzən *iş məni sıxır*" [XLIIc.s.263].

****İşdən soyutmamaq*** – işin tempini aşağı salmamaq; "Amma eyni zamanda bunlar bizi heç də *işimizdən soyutmamalıdır*, əksinə, əldə olunan nailiyyətlər əsasında biz işimizi bundan sonra daha da sürətləndirməliyik" [VIIc.s.393].

****İşdən yapışmaq*** – işi sevmək, işə can yandırmaq; "İdmançılar İlham Əliyevi özlərinə başçı, prezident seçəndən

sonra o elə böyük həvəslə, elə böyük ruh yüksəkliyi ilə, elə məhəbbətlə bu *işdən yapışıbdır* ki, onu bundan heç cür ayırmaq mümkün deyildir" [XLIIc.s.260].

***İşə qarışmaq (1)*** – müdaxilə etmək; "Şəhərin işlərinə qarışmağa heç kəsin ixtiyarı yoxdur" [XIIIc.s.442].

***İşə qarışmaq (2)*** – müdaxilə etmək; "Ancaq mən bu işə qarışmadım və siz də gərək bunu üzrlü hesab edəsiniz, incimәyəsiniz" [IIc.s.524].

****İşə qatmaq*** – prosesə cəlb etmək; "Deyib ki, məni bu *işə qatmayın*"[XIIIc.s.271].

***İşə salmaq*** – təhlükəli işə girişməmək; "Biri də deyibdir ki, get, özünü *işə salma*, başını əngələ salma" [XIIIc.s.271].

***İşi axsamaq*** – geri qalmaq, çatdıra bilməmək, işi yaxşı getməmək, inkişafdan geri qalmaq; "80-ci illərin əvvəllərində dəmir yolunun *işləri müəyyən qədər axsayırdı*" [XVIIIc.s.336].

***İşin başında durmaq*** – tədbirə başçılıq etmək; "Mərhum Turqut Özal və prezident Süleyman Dəmirəl bu *işin başında durublar*, təşəbbüs ediblər" [XXVIc.s.216].

***İşinə qarışmaq*** – başqasının işinə müdaxilə etmək; təsir etməyə çalışmaq; "Mən bir də deyirəm ki, bütün hüquq-mühafizə orqanları, başqa orqanlar sahibkarların *işinə qarışmasınlar*. Hərə öz işini görsün, vergisini versin. Qalan işlərə qarışmaq lazım deyil" [IIc.s.524].

***İtib getmək*** – yoxa çıxmaq; tapıla bilməmək, əriyib getmək, qeyb olmaq; 1) başqa şeylər içində, arasında əriyib getmək, qeyb olmaq; 2) bir yerə gedib geri dönməmək, yox olmaq; "O vaxt siz də deyirdiniz, indi burada çıxış edənlər də deyirlər ki, Həmid Araslı, Bartold bir şey yazıblar, nəşr etdiriblər, amma o da *itib gedibdir*" [XXVc.s.333].

***İtib-batmaq*** – yoxa çıxmaq; görünməz olmaq; ~ itib getmək; "Əlbəttə, haradasa, nəsə *itib batmayıbsa*" [VIc.s.371].

***İynə salmağa yer olmamaq*** – sıxlıq; insanların çox olması; "Bir neçə saatın içərisində o meydanda *iynə salmağa yer yox idi*" [XVc.s.42].

****İz qoymaq*** – ölkənin həyatında yaddaqalan işlər görmək; "Keçən görüşlərimizdə mən sizə bildirmişdim ki, Azərbaycanda yəhudilər əsrlər boyu, bəlkə minilliklər boyu yaşayıblar, çox dəyərli *izlər qoyublar*" [XXXc.s.22-23].

## *Kk*

***Kara gəlmək*** – lazım olmaq, gərəkli, yararlı olmaq, köməyi, xeyri dəymək; ~ işə yaramaq; "Lakin əvəzində Türkiyə və İran rəhbərləri ilə olan köhnə şəxsi əlaqələr *kara gəldi*" [Ic.s.52].

****Kartdan istifadə etmək*** – məsələdən istifadə etmək; "Vaxtilə onlar bu *kartdan istifadə edib* özləri üçün bir imic yaratdılar" [XVIIIc.s.192].

***Keçmişə qayıtmaq*** – keçmiş tarixə səyahət etmək; keçmiş tarixi analiz etmək; keçmişi qurdalamaq; ~ köhnə palan içi sökmək; "Mən *keçmişə qayıtmaq* istəmirəm" [XXVIIc.s.274].

****Keçmişi vərəqləmək*** – keçmiş tarixi yada salmaq; öyrənmək; "Ümid edirik ki, müstəqilliyini əldə etmiş hər bir xalq, millət daha çox inkişaf edəcək, bir-birinə qovuşacaq və bunlar hamısı tarixi *keçmişimizi bir daha vərəqləyərək* bizi daha da irəliyə aparacaqdır" [Vc.s.177].

****Kəc baxmaq*** – lazımsız bir şeyə baxmaq kimi baxmaq, inamsız baxmaq; "Bəziləri indi də buna bir az kəc baxırlar, "bu yubileylər nəyə lazmdır, indi bizim həyatımız çətindir, ağırdır", deyirlər" [XIIIc.s.113]. *Kəc baxmaq* – kinayə ilə baxmaq; istehza etmək; "Bəzən şəhərdə onlara bir az *gəc baxır*, yaxud başqa cür yanaşırdılar" [VIc.s.47].

****Kədərə bürünmək*** – kədərlə əhatə olunmaq; həddindən çox kədərlənmək; "Xatirimdədir, 1961-ci ildə onun vəfatı

haqqında məlumat yayılarkən Azərbaycan böyük *kədərə büründü*" [VIIc.s.298].

***Kələk gəlmək*** – yalan vədlər vermək; məqsədinə çatmaq üçün yalan danışmaq, aldatmaq, gizli plan hazırlamaq, ~ kələk işlətmək, hiylə gəlmək, hiyləyə əl atmaq, fənd işlətmək, kəf gəlmək, badalaq gəlmək, fırıldaq işlətmək, nömrə gəlmək; "Biz orada iş apararkən mətbuatda, yeri gəlmişkən, o cümlədən də Rusiya mətbuatında nə qədər müxtəlif yazılar dərc edilirdi, deyirdilər ki, görürsünüzmü, Əliyev adamlara *kələk gəlir*, Azərbaycanın nüfuzunu qaldırmaq üçün Xəzər dənizində böyük neft ehtiyatları olduğu barədə əfsanə yaradır, əslində isə belə şey yoxdur" [XXIIc.s.20].

****Kənar etmək*** – vəzifədən çıxarmaq; uzaqlaşdırmaq; "Bacarıqsız, perspektivi olmayan, yaxud buraya təsadüfi düşmüş adamları bu işdən *kənar etmək* lazımdır və güclü kadr ehtiyatı yaratmaq lazımdır" [XVc.s.33].

***Kənara qoymaq*** – nəzərə almamaq, diqqət yetirməmək, başqa bir məsələyə vaxt ayırmaq, güzəştə getmək; ümummilli mənafe naminə güzəştə getmək; "Amma mən bunların hamısını *kənara qoymuşam* ki, olan-olub, keçən-keçib, gəlin əməkdaşlıq edək" [XVIIc.s.84].

****Kənara qoymaq*** – hal-hazırda həll etməmək; "Kadr siyasətini də *kənara qoyun*" [Ic.s.256]

***Kənarda durmaq*** – seyrçi mövqeyində durmaq; ~ məsuliyyət altına girməmək, uzaq durmaq; ~ başını ağrıtmamaq; "Amma onlar *kənarda durmuşdular* ki, qoy vursunlar, görək nə olar, sonra nə edərik" [XXIIIc.s.85].

****Kənarda hürmək*** – siyasətimizi pisləmək, siyasətimizi gözdən salmaq, siyasətimizi aşağılamaq; "Amma bizim narahatçılığımız yoxdur və heç kəs də bizə mane ola bilməz. Ancaq indi *kənarda bir az hürənlər* var" [XXXVc.s.29].

****Kənarda qalmaq*** – ictimai-siyasi hadisələrə biganə olmaq; siyasi mübarizəyə daxil olmamaq, qarışmamaq; "O za-

man mən də *kənarda qalmadım*, öz sözümü dedim, münasibətimi bildirdim" [IVc.s.242].

***Kənd təsərrüfatını batırmaq** – inkişafı dayandırmaq. "Axırda *kənd təsərrüfatını batırdılar*" [Ic.s.447].

***Kəskin qoymaq** – ciddi qoymaq; "Biz məsələni *kəskin qoymuşuq* ki, bu, araşdırılmalıdır, verilən silahlar Ermənistandan Rusiyaya qaytarılmalıdır" [XIc.s.102].

***Kimisə görmək** – rüşvət vermək, pul təklif etmək; "Gətirib kiməsə, keçmişdə evlər idarəsi deyirdilər, ona pul verir, biri rayon icraiyyə komitəsini, başqasını görür, hərəsi qanunsuz bir iş görür" [Vc.s.484].

***Kor-koranə dəstəkləmək** – "Bilirəm ki, siz həmişə bizim xəttimizi dəstəkləyirsiniz həmişə obyektiv və ədalətli mövqe tutursunuz. Yəni siz bizim xəttimizi *kor-koranə dəstəkləmirsiniz*, məhz obyektivlik, ədalətlilik mövqeyindən dəstəkləyirsiniz. Əminəm ki, biz sizinlə bundan sonra da belə əməkdaşlıq edəcəyik" [XXIIIc.s.132].

***Kor-koranə getməmək** – faktlara, rəqəmlərə, mühakiməyə əsaslanmaq; "Mən hesab edirəm ki, həm Azərbaycan dövləti, həm də dünyanın bizimlə əməkdaşlıq edən böyük neft şirkətləri bu yolu *kor-koranə getməmişlər*" [XXVc.s.292].

***Kor-koranə həyata keçirmək** – elmi və təcrübi müddəaları nəzərə almamaq; "Əgər biz bunları nəzərə almasaq və hesablaşmasaq, onda bu islahatları *kor-koranə həyata keçirəcəyik*" [IIIc.s.62].

***Kor-koranə tətbiq etmək** – əsaslandırılmamış şəkildə, elmi-nəzəri biliklərə əsaslanmadan tətbiq etmək; "Ancaq dünya təcrübəsini də götürüb *kor-koranə tətbiq etmək*, inanin ki, istənilən nəticəni verməz" [Ic.s.168].

**Kök atmaq** – dərinə getmək; "Ancaq əziz qardaşlar siz bilin ki, Azərbaycanda bu xəstəlik, – buna ruslar "zaraza" deyirlər, – o qədər dərin *kök atmışdı* ki, silahı olan adamlar he-

sab edirdilər ki, bu silahın gücü ilə gəlib hakimiyyəti ələ keçirəcəklər" [IXc.s.319].

***Kök salmaq*** – dərinə getmək; çıxarılması çətin olmaq; "Bir çoxları hesab edirdilər ki, bəzi mafioz qüvvələr orada o qədər *kök salıblar ki*, onları oradan çıxarmaq mümkün deyil." [XXIXc.s.381]. *Kök salmaq* – özünə yer tutmaq; möhkəmlənmək; formalaşmaq; "Biz hamımız bir sistemdə yaşamış, bu ruhda tərbiyə almışıq və təbii ki, bütün bunlar dərin kök salmışdır" [XXXVIc.s.101]. Kök salmaq – məskunlaşmaq; "Siz o yerlərdə *kök salacaqsınız*, oralarda qalacaqsınız" [XLc.s.78].

****Kökə qayıtmaq*** – xalqın keçmişinə qayıtmaq; "Əsərdə *kökə qayıtmaq* məsələsi var, mən onun mənasını belə anlayıram ki, kökümüzə olan o müsbət cəhətləri götürmək lazımdır" [XIIIc.s.199].

****Kökü elə qoyulmaq*** – əsası elə qoyulmaq; "Köhnə binada kababdan, ləvəngidən can qurtara bilmirsiniz, çünki oranın *kökü elə qoyulubdur*" [XIXc.s.251].

****Kökü kəsilmək*** – birdəfəlik yox etmək; məsələni birdəfəlik həll etmək; "Gərək beynəlxalq terrorizmin *kökü tamamilə kəsilsin*" [XXXVIIc.s.104].

****Kökünü kəsmək*** – problemi birdəfəlik həll etmək, problemi yox etmək, qarşısını almaq; "Biz bunların qarşısını almışıq bundan sonra da alacağıq, *kökünü kəsəcəyik*" [VIIIc.s.392].

***Kömək əli uzatmaq*** – yardım etmək; ~ yardım əli uzatmaq; "Eyni zamanda dost dosta gərək *kömək əlini uzatsın*" [IVc.s.116].

****Küçələrdə qalmaq*** – miqdarca çox olmaq; həmişəkindən çox olmaq; "Hazırda kənddə o qədər mal, heyvan saxlayırlar ki, ət *küçələrdə qalıbdır*" [XXXc.s.296].

****Küçəyə çıxa bilməmək*** – qorxmaq, həyatı təhlükədə olmaq; "Beş-altı il bundan əvvəl vətəndaş *küçəyə çıxa bilmirdi*" [XXXIXc.s.353].

***Küçəyə salmaq*** – didərgin, sərgərdan etmək, işdən çıxarmaq; iş yerindən uzaqlaşdırmaq; ~ evsiz-eşiksiz qoymaq; "Burada verilən məlumatlar məni çox sevindirir ki, müəssisədə işləyən adamların heç birisini, necə deyərlər, *küçəyə salmadılar*" [XXIVc.s.396].

****Kükrəyib üzə çıxmaq*** – qarşısı alınmamaq; sürəkli şəkildə üzə çıxmaq; "Milli azadlıq istəyi, arzusu, qəlblərdə uzun müddət yaşayan bu arzular həmin illər bütün bu proseslərin nəticəsində *kükrəyib üzə çıxmış* xalqın iradəsinə dönmüşdür" [IIIc.s.126].

***Kürəyimə dirənmək*** – həyatı təhlükədə olmaq; "Yəni mən danışıq aparırdım, onlar da mənim arxamda dayanmışdılar, avtomatı da mənim *kürəyimə dirəmişdilər*, indi görün, mən hansı bir şəraitdə danışıq aparmışam" [XXVIIc.s.343].

***Kürəyini yerə verməmək*** – məğlub olmaq; "Əgər bir azərbaycanlı ilə bir ermənini təkbətək meydana salsan, azərbaycanlı *kürəyini heç vaxt yerə verməz*, heç vaxt" [VIc.s.43].

****Kütləyə çatdırmaq*** – əhalini, ictimaiyyəti məlumatlandırmaq; "Eyni zamanda suallara cavab verərək imkan oldu ki, Ermənistan-Azərbaycan münaqişəsi haqqında fikirlərinizi, vəziyyəti geniş *kütləyə çatdıraq*" [XXIVc.s.377].

## *Qq*

***Qabağa çıxmaq*** – 1) rəhbərlik etmək, bələdçilik etmək; ~ yol göstərmək; 2) nəzərdə tutulduğundan, gözlənildiyindən çox qazanc götürmək; ~ irəli düşmək; çətin dövrdə mübarizənin önündə olmaq; ~ qabağa düşmək; "Bəs niyə *qabağa çıxmadı*, Azərbaycanı o fəlakətdən qurtarmadı, vətəndaş müharibəsinin qarşısını almadı, qan tökülməsini dayandırmadı" [XVIIIc.s.66].

***Qabağa getmək*** – irəliləmək, inkişaf etmək, artmaq, qabaqlamaq; vəzifəyə irəli çəkilmək; "Ona görə də indi fikir-

ləşəsən ki, bu *qabağa getdi,* sabah nə olacaq, o birisi gün nə olacaq – buna hələ çox var” [XXIc.s.328].

***Qabağa qaçmaq*** – ***1)*** tələsmək, qabaqlamağa çalışmaq, irəliyə can atmaq; “Siz niyə *qabağa qaçırsınız*?” [XXXVIIIc.s.212]. ***2)*** proqnoz vermək; “Görünür, onlar düzgün edirlər, çünki *qabağa qaçmaq* lazım deyil, minimumdan danışmaq gərəkdir, bundan artıq olanlar isə yenə bizə qalacaqdır”[XXXVIc.s.212].

****Qabağında dura bilmək*** – müqavimət göstərə bilmək, layiqli cavab vermək; “Bir ildən sonra Surət kimi bir quldurun, banditin hərbi dəstəsinin *qabağında dura bilmədilər*” [XIIIc.s.283].

****Qabaqda getmək*** – inkişaf cəhətdən irəlidə olmaq; “Ona görə gərək biz də Azərbaycanda çalışaq ki, bu inkişafda öz yerimizi tapaq, sürəti yavaş-yavaş artıraq və *qabaqda gedənlərin* səviyyəsində olaq” [XXVIIc.s.296].

****Qaçıb dağılmaq*** – hakimiyyəti idarə edə bilməmək; hakimiyyəti tərk etmək; “Əgər onlar iqtidarda olduqları zaman Azərbaycanı idarə edə bilmədilərsə, hərəsi bir tərəfə *qaçıb dağıldısa*, indi şərtlər qoymağa nə haqları vardır?” [XVIIc.s.84].

***Qan aparmaq*** – qanaxmadan huşunu itirmək, halı pisləşmək, güclü qanaxmaya məruz qalmaq; “Buradakı həkimlər mənə kömək etdilər, yoxsa *qan* məni tamamilə *aparırdı*” [XXIIc.s.182].

***Qan qaralmaq*** – əhvalı təlx olmaq, dilxor olmaq, bikefləmək; ~ kefi korlanmaq, əhvalını pozmaq; “Amma haqqında söhbət açdığım kədərli hallar, əlbəttə, *qan qaraldır*” [XXIc.s.157].

****Qan sızan yara*** – sağalmayan yara; hələ həlli tapılmamış problem; “Bu, qəlbimizdə, bədənimizdə daim qanı tökülən, *qan sızan yaradır*” [IXc.s.399].

***Qan tökülməmək*** – ölməmək, yaralanmamaq; “Amma eyni zamanda atəş yoxdur, müharibə getmir, *qan tökülmür*, döyüşlər yoxdur, insanlar sakit yaşaya bilirlər” [VIIc.s.224].

****Qana bulamaq*** – məhv etmək, ~ qana bulamaq; “Onlar həmin əməlləri gizlətmək üçün çirkin niyyətlərinə nail olmaqdan ötrü xalqı, milləti, torpağı *qana bulamağa*, torpağı satmağa, xalqa xəyanət etməyə nəinki hazırdırlar, hətta bunu həyata keçirirlər” [I c. s.101].

***Qanadı altına almaq*** – himayəsinə almaq, kömək etmək; qorumaq; “Əgər əvvəldən prezident kimi mən Yeni Azərbaycan Partiyasını tam dəstəkləmiş olsaydım, siz elə mənim *qanadım altında* yaşayacaqdınız” [IIc.s.526].

***Qanı yerdə qalmamaq*** – qatili tapılmaq və ya cəzasız qalmamaq, qisası, intiqamı, qanı alınmaq; ~ qanı batmamaq; “Mən bu gün bəyan edirəm ki, şəhidlərimizin *qanı yerdə qalmayacaq*, onların xatirəsi qəlbimizdə əbədi yaşayacaq, gənclərimiz və gələcək nəsillər onların qəhrəmanlıqlarından nümunə götürəcəklər” [Ic.s.203].

***Qanını yerdə qoymamaq*** – qisas almaq, ədaləti bərpa etmək; “Mən inanıram ki, siz şəhidlərin *qanını yerdə qoymayacaq*, Azərbaycanın torpaqlarını şərəflə müdafiə edəcək, respublikamızın ərazi bütövlüyünü təmin etmək üçün əlinizdən gələni əsirgəməyəcəksiniz” [Ic.s.565].

****Qanundan yan keçmək*** – incə şəkildə qanunu pozmaq; demokratik olmayan qanunu pozmaq; “O zaman, biz sosialist dövləti rejimində yaşayarkən kim xaricə yaşamağa gedirdisə, üstəlik bunu *qanundan yan keçməklə* edirdisə, o, cinayətkar sayılır, yaxud da dövlətin və cəmiyyətin yanında heç bir hörməti olmayan adama çevrilirdi” [Vc.s.386].

****Qapı açılmaq*** – sərhədlər açılmaq; “Stalin öləndən sonra *qapılar* müəyyən qədər *açıldı*, insanlar xaricə getdilər-gəldilər, iqtisadi əlaqələr genişləndi” [VIII c. s.45].

***Qapı açmaq*** – xeyirxahlıq etmək, kömək göstərmək; dəvət etmək, dostluq münasibətinə hazır olmaq; “Burada qeyd edildiyi kimi, ilk dəfə Bakıda, Azərbaycanın paytaxtında Amerikanın səfirliyi öz *qapılarını açdı*” [XXXVIIIc.s.35].

****Qapıb aparmaq*** – ümumi malı qanunsuz aparmaq, oğurlamaq; “İndi bu müəssisələrin özəlləşdirməsini götürüb necə istəyirsən elə et, kim necə *qapıb aparırsa-aparsın*?” [XXIIIc.s.392].

****Qapıda saxlamaq*** – bürokratiklik etmək; süründürməçilik etmək; “Ondan sonra siz hər bir naziri gətirib *qapınızda saxlayasınız*, yaxud deyəsiniz ki, mənim bu gün vaxtım yoxdur, sabah gəlin”[XXXIXc.s.127].

***Qapıları açmaq*** – dəvət etmık; münasibətlər yaratmaq; “Ona görə də biz *qapılarımızı açmışıq* ki, bizimlə əməkdaşlıq etmək istəyənlər ölkə mizə gəlsinlər” [Vc.s.174].

***Qapılarını açmaq*** – münasibətlərdə problemi olmamaq; “Azərbaycan öz iqtisadiyyatını bazar münasibətləri prinsipləri əsasında qurur və *qapılarını dünyaya açmışdır*” [XIc.s.76].

***Qapısı açıq olmaq*** – qonaqsevərlik; qonaqpərvər olmaq; “Doğrudan da belədir, *qapısı açıq idi* və gələn adam da orada mütləq yemək yeməli, çay içməli idi” [XLIIIc.s.70].

****Qara eynəklə görmək*** – yaxşı olanı görməmək; “İkincisi, öz ölkəmizin daxilində elə adamlar var ki, onlar müxalifətdə olduqlarına görə Azərbaycanda baş verən hər şeyi *qara eynəklə görürlər* və hər bir şeyi də pis qiymətləndirirlər” [VIIIc.s.144].

****Qara fəhləlik etmək*** – aşağı səviyyəli işlərlə məşğul olmaq; “Mən onları qınayaraq deyirdim ki, bu nə olan işdir, siz, sizin vətəndaşlarınız (Yuqoslaviya – red.) Almaniyaya gedirsiniz, adamlarınız *qara fəhləlik edir*, başqa ideologiyanın təsiri altına düşürlər və sair və sair” [XXVIIIc.s.256].

***Qara günün ömrü az olar*** – ağır, gərgin günlərin sayı azalacaq; “Güman edirəm ki, *qara günün ömrü az olacaq*, xal-

qımız ağ günlərə çıxacaq” [Ic.s.102]. *Qara günün ömrü az olar* – çətin günlərin bir sonu olur; “Ancaq mən dəfələrlə demişəm və bu gün də deyirəm – xalqımız dərdə dözümlü xalqdır və bu dərdə də dözür, inanır ki, *qara günün ömrü az olar*” [XIIIc.s.393].

***Qara yaxmaq*** – real gerçəkliyi deməmək; olmayanı demək; həqiqəti gizlətmək, kimisə yanlış olaraq günahlandırmaq, ünvanına yalanlar söyləmək, ləkələmək; ~ əsl həqiqəti gizlətmək, şər atmaq; böhtan atmaq; görülən işləri gözdən salmaq; görülən işlərin müsbət tərəflərini qeyd etməmək; “Ayrı-ayrı müxalifət qüvvələr bu vəziyyəti tənqid edirlər, yaxud da ki, buna *qara yaxmaq* istəyirlər” [Vc.s.310].

***Qara yaylıq bağlamaq*** – yas saxlamaq; paxıllıqdan yas tutmaq; nailiyyətlərə sevinməmək; “İndi gedin o ağlayanlara, *qara yaylıq bağlayanlara*, sonra “yürüş edənlərə” deyin ki, onları İstanbul küçələrində görmədik. Onlar harada idilər? Gəlib burada nümayiş keçirmək istəyirdilər” [XXIIIc.s.183].

***Qaranlığa batmaq*** – elektrik işığı olmamaq; “Ancaq Ermənistan-Azərbaycan münaqişəsi başlayandan sonra Naxçıvanın Bakı ilə, Azərbaycanın başqa bölgələri ilə əlaqələri getgedə çətinləşdi və nəhayət, dəmir yolu bağlanandan və bütün kommunikasiyalar, yəni elektrik xətləri, qaz xətləri kəsiləndən sonra Naxçıvan nəinki blokada şəraitinə düşdü, tamamilə *qaranlığa batdı*” [XLIIc.s.21].

***Qardaş qanı tökülmək*** – vətəndaşların arasında müharibə; “Bu zaman insanlar gəlib dedilər ki, Azərbaycan dağılır, *qardaş qanı tökülür* vətəndaş müharibəsi başlayıbdır, mən Bakıya gəlməliyəm” [VIIIc.s.50].

***Qarmaqlar uzanmaq*** – yağlı tikə kimi baxılmaq; müstəqilliyinə son qoyulmaq; “Bilin, Azərbaycan elə bir yerdədir ki, ölkəmizə hər tərəfdən *qarmaqlar uzanıbdır*” [XXIXc.s.280].

***Qarnı dolu olmaq** – maddi cəhətdən tox olmaq; "Bir az loru dildə desək, onda *qarnımız daha dolu idi*" [XXXIc.s.245].

***Qaş düzəltdiyi yerdə vurdu gözünü də çıxartdı*** – problemin birini həll etmədən digərinə tuş gəlmək; "Ancaq qəbul edilən qərar Azərbaycana zərbə vurdu, necə deyərlər *qaş düzəltdiyi yerdə vurdu gözünü də çıxartdı"* [XXc.s.345].

***Qat-qat artmaq** – çoxalmaq; sayı artmaq; "Beləliklə, bizim görkəmli idamançıların sayı indikinə nisbətən *qat-qat artsın*" [XLIIc.s.10].

***Qat-qat çətin olmaq** – dəfələrlə çətin olmaq; "Ona görə ki, səhiyyədə özəl sektoru yaratmaq, sahibkarlığı yaratmaq bəlkə də ticarətdən, yaxud da kənd təsərrüfatından, sənayedən və iqtisadiyyatın başqa sahələrdən *qat-qat çətindir*" [XXIc.s.162].

***Qat-qat yaxşı olmaq** – dəfələrlə yaxşı olmaq; "Ştatların ixtisarı nəzərdə tutulan yeni strukturu təklif edə bilməyiniz və təklif etdiyiniz struktur, şübhəsiz ki, əvvəllər olduğundan daha yaxşı işləyə bilər və başqalarının təklif etdiyindən *qat-qat yaxşıdır* – bu sevindirir" [XXIc.s.155].

***Qaynayıb-qarışmaq** – ayrılmaz, ayrılması mümkün olmayan; "Biz bir-birimizə *qaynayıb qarışmışıq* və bu proses davam edəcəkdir" [Ic.s.381].

***Qarnı ağrımaq*** – işə ürəksiz yanaşmaq, işləmək istəməmək, təmannalı olmaq; paxıllıq etmək; "İkincisi, sənin nə dərdinə, sənin niyə *qarnın ağrıyır* ki, biz bunu nə cür qaytaracağıq?" [XXIIc.s.209].

***Qalxıb – düşmək** – sənətdə inkişaf etmək; "Yaxud da ki, bir də *qalxırlar*, bir də *düşürlər*" [XIXc.s.125].

***Qanı qaralmaq*** – əhvalı pozulmaq; kefi olmamaq; "Bizim xırda-xuruş adamların da üzünü görmürlər ki, *qanları qaralsın*" [XXXIXc.s.59].

***Qanı yerdə qalmamaq*** – cinayətkarları cəzalandırmaq, ədaləti bərpa etmək; "Qoy bilsinlər ki, Ziya Bünyadovun *qanı yerdə qalmayacaqdır*"[VIIIc.s.460]!

***Qara yaxmaq (1)*** – "Əgər müxalifət qüvvələri, müxalifətdə olan partiyalar, ayrı-ayrı şəxslər Azərbaycanın bugünkü gününə, iqtidarın gördüyü işlərə bu qədər *qara yaxmasaydılar*, bu qədər böhtanlar yağdırmasaydılar, bizim partiyanın üzvlərini, iqtidarı, o cümlədən prezidenti bu qədər təhqir etməsəydilər, bəlkə də bunları deməyə o qədər də ehtiyac yox idi" [XLIIIc.s.14].

***Qara yaxmaq (2)*** – Bəzi kütləvi informasiya vasitələrində edildiyi kimi, Azərbaycana *qara yaxmaq* lazım deyildir" [XXIXc.s.310].

****Qarış-qarış gəzmək*** – yaxşı bələd olmaq; dərindən bələd olmaq; dərindən tanımaq; "Mən isə bütün bu yerlərin hamısını *qarış-qarış gəzmişəm*" [XXVIIc.s.285].

***Qarmaqarışıqlıq olmaq*** – "Amma eyni zamanda bu beş il müddətində də bizim daxilimizdə o qədər *qarmaqarışıqlı olubdur*, o qədər cürbəcür cinayətkar hərəkətlər olubdur ki, bunlar imkan verməyibdir" [VIIIc.s.356].

***Qarşısında durmaq*** – müqavimət göstərə bilmək, dayanmaq; "Birinci müqavilədən sonra cürbəcür ölkələr tərəfindən bizə həddindən artıq təzyiqlər etdilər, ancaq bunun da *qarşısında durduq*" [IXc.s.324].

***Qaşınmayan yerdən qan çıxarmaq*** – lazımsız işlərlə məşğul olmaq; "Ancaq siz *qaşınmayan yerdən qan çıxarırsınız*" [XXVIc.s.427].

****Qat-qat çətin olmaq*** – həddindən çox çətin olmaq; "Çünki bu qanunun qəbul edilməsi nə qədər ağır, çətin idisə, onun həyata keçirilməsi, yəni parlamentə seçkilərin keçirilməsi ondan *qat-qat çətindir*, ağırdır" [IVc.s.172].

****Qaya kimi durmaq*** – maneə olmaq; ciddi maneə olmaq; "Bunun da səbəbi o idi ki, mən o vaxt orada Qorbaçovun və

onun tərəfdarlarının qarşısında, Qarabağ məsələsinin ermənilərin xeyrinə həll olunmasının qarşısında böyük bir *qaya kimi durmuşdum*” [XXXIXc.s.307].

***Qaynar nöqtə yaranmaq*** – münaqişəli bölgələr yaranması; “Qarabağ münaqişəsi SSRİ ərazisində ilk münaqişə idi, indi isə baxın, nə qədər *qaynar nöqtə yaranmışdır*” [IIc.s.23].

***Qaynayıb qarışmaq*** – “Həmin illərdə Azərbaycanın daxilində, xalqın içərisində, millətin, bütün Azərbaycan vətəndaşlarının daxilində baş qaldıran vətənpərvərlik hisslərinin, milli azadlığa yönəlmiş hisslərin *qaynayıb qarışaraq* meydana çıxmasının nəticəsidir” [IIc.s.518].

***Qeyri-konstruktiv mövqe tutmaq*** – dağıdıcı mövqe tutmaq; barış mövqeyi tutmamaq; “Ona görə əldə edilməyib ki, Ermənistan tərəfi *qeyri-konstruktiv* mövqe *tutub*, Dağlıq Qarabağ kimi kiçik bir yerə dövlət müstəqilliyi statusu əldə etmək istəyir” [XXc.s.68]. ***Qeyri-konstruktiv mövqe tutmaq*** – dağıdıcı mövqe tutmaq; əməkdaşlığa zidd mövqe tutmaq; “Lakin erməni tərəfi bu dəfə də *qeyri-konstruktiv mövqe tutdu* və sənədin qəbul edilməsinə konsensus vermədi” [XIIc.s.35].

***Qəbirdən qaldırmaq*** – ölünü diriltmək; ölüyə yenidən can vermək; “O, keçmişə aid idi ki, bir Şeyx Nəsrullah peyda olubdur, ölüləri *qəbirdən qaldırır*” [XXVIIIc.s.314].

***Qəbrin üstünü götürmək*** – qəbirüstü abidə qoymaq; qəbrin üstünü sahmana salmaq; məzarın düzəldilməsini sona çatdırmaq; “Ancaq təəssüf ki, sonrakı illərdə məqbərə də tikilməyib, hətta *qəbrin üstü də götürülməyib*” [IVc.s.6].

***Qədəm qoymaq*** – addım atmaq; ilk addım atmaq; başlamaq; “Azərbaycan demokratik, hüquqi dövlət quruculuğu yoluna, bazar iqtisadiyyatına, bazar münasibətlərinə əsaslanan demokratik vətəndaş cəmiyyəti formalaşdırmaq yoluna *qədəm qoyubdur*” [Vc.s.23].

***Qədir-qiymətini bilmək*** – əhəmiyyətini qiymətləndirmək; əsl mənasını bilmək; “Bu, Azərbaycan xalqının həya-

tında görkəmli tarixi hadisədir və dövlət müstəqilliyindən ötən az illər ərzində xalqımız azadlığın qədir-qiymətini, müstəqilliyin *qədir-qiymətini bilmişdir* və Azərbaycanın dövlət müstəqilliyi dönməz olmuşdur" [XXVIIIc.s.304].

***Qəlbimizdə yaşamaq*** – unudulmamaq; "Hesab edirəm ki, nəinki biz, mənim nəvələrim də, onların davamçıları da bu hislərlə yaşayacaq və bizim hamımız üçün əziz, unudulmaz Zərifə xanım həmişə *qəlbimizdə yaşayacaqdır*" [XXc.s.5].

***Qəlbinin hökmü ilə getmək*** – müstəqil şəkildə, azad şəkildə getmək; "İndi Polşa tamamilə azad ölkədir, müstəqil dövlətdir və Polşa xalqı öz *qəlbinin hökmü ilə istədiyi yolla gedir*"[XIIc.s.33].

***Qəlblərə hakim kəsilmək*** – təsirdən çıxa bilməmək; şiddətli dərəcədə sevmək; "Əsl rus ruhuna malik olan bu şəhərə zəka və *qəlblərə hakim kəsilən* bənzərsiz mənəvi mühit xasdır" [XXXIXc.s.40].

***Qəlbləri fəth etmək*** – auditoriyaları cazibəyə salmaq; özünə bağlamaq, ram etmək, özünü sevdirmək, ~ qəlbinə girmək; "60-cı illərdə sizi gənclərin sevimlisinə çevirmiş istedadınız bu gün də Yer kürəsinin bütün guşələrində adamların *qəlbini fəth edir*" [XIIc.s.5].

***Qələmə vermək (1)*** – bir adamın yaxşı və ya pis cəhətlərini tanıtmaq, təqdim etmək, diqqətə çatdırmaq; mətbuatda öz fəaliyyətini şişirtmək; əsassız olaraq fəaliyyəti artıq göstərmək; "Biz bunları həyata keçirdiyimiz və bir çox nailiyyətlər əldə etdiyimiz halda, bəziləri özlərini bu sahədə böyük bir alim, yaxud da ki, dahi bir şəxs kimi *qələmə verərək* müəyyən tələblər irəli sürürlər"[XVc.s.120].

***Qələmə vermək (2)*** – əleyhinə danışmaq; haqqında pis danışmaq; "Yenə də deyirəm, əgər prezident kimi mən sizi qanadım altına alsaydım, sizə əlverişli şərait yaratsaydım, tapşırsaydım ki, sizə yaxşı bir bina da versinlər, o zaman sizin yaxşı işlərinizi də belə *qələmə verəcəkdilər* ki, prezident kömək

etdiyinə görə belədir, yoxsa, özləri elə bir şey deyillər" [IIc.s.526].

***Qələmə vermək (3)*** – həqiqəti gizlətmək, həqiqi olanı qiymətləndirməmək; "Düzdür, burada müxalifətdə olan qüvvələr yenə də bunu belə *qələmə verdilər* ki, guya Azərbaycan orada heç bir nailiyyət əldə etməyib, əksinə, guya çox uduzub" [XIIIc.s.288].

****Qəti şəkildə həll etmək*** – heç bir bəhanəyə yol vermədən həll etmək; "Mən bu müddətdə görülmüş işlərdən razıyam və inanıram ki, siz bu gün də işləyəcəksiniz, sabah da işləyəcəksiniz, sənədlərin layihələrini lazımi səviyyəyə çatdıracaqsınız və digər məsələləri də müzakirə edəcəksiniz ki, Moskvaya səfərim zamanı biz onları *qəti şəkildə həll edə bilək*" [XXXVIIc.s.18].

****Qəzəbi coşdurmaq*** – qəzəbi artırmaq, hiddətləndirmək; qəzəbi tutmaq; ~ bərk hirslənmək, hiddətlənmək, acıqlanmaq; "Xalqımızın böyük oğlu Ziya Bünyadovun vəhşicəsinə qətlə yetirilməsi hamımızı kədərləndirib, *qəzəbimizi coşdurub*, hiddətləndiribdir" [VIIIc.s.448].

***Qınına çəkilmək*** – gözləmə mövqeyində olmaq; gizlənmək, özünü göstərməmək, özünə qapanmaq, heç bir işə qarışmamaq; ~ kölgəyə çəkilmək; "Bəzi adamlar öz *qınına çəkilib* gözləyirdi ki, nə təhər olacaq, kiminlə birləşəcəyəm, kim gələcək, kim gedəcək" [IIIc.s.292].

****Qıra bilmək*** – ayırıb məhv etmək; ayrı-ayrılıqda sındırmaq; "Bu onu göstərir ki, bir olsanız, sizi heç kəs *qıra bilməz*, heç kəs *qıra bilməz*, heç kəs dağıda bilməz, heç kəs sizə qalib gələ bilməz" [XXVIc.s.190].

***Qiymətdən salmaq*** – dəyər verməmək; aşağılamaq, ~ gözdən salmaq; "Yaxşı olar ki, bu heç olmasın, nəinki ondan istifadə edib, bizim gördüyümüz işləri gəlib *qiymətdən salsınlar*" [XVIIc.s.434].

****Qoçuluq etmək*** – özbaşınalıq etmək, qanunları saymamaq; "Heç kəs fikirləşməsin ki, indiyədək belə işlər bağışlan-

mışdır, yaxud da kim isə *qoçuluq etmişdir* və qoçuluq davam edəcəkdir” [II s. 35].

***Qol-qanad açmaq*** – güclü inkişaf etmək, şaxələnmək, yayılmaq, böyümək; “Qazaxıstan xalqı tərəqqi etmiş, *qol-qanad açmış*, özünün bütün ərazisinin, bütün çöllərinin, bütün torpaqlarının sahibi olmuşdur” [IVc.s.163].

***Qol-qanad vermək*** – ilham vermək, ruhlandırmaq, qüvvətləndirmək, daha da canlandırmaq; “Bu şəhər rus torpağının bir çox istedadlı övladının yaradıcılıq təxəyyülünə *qol-qanad vermiş* və onların amallarını gerçəkləşdirmişdir” [XXXIXc.s.41].

****Qol-qıçı çırmalamaq*** – cəsarətlə işə girişmək, ciddi çalışmaq; “Amma irəliyə getmək üçün, necə deyərlər, gərək *qolumuzu da, qıçımzı da çırmayıb* çox cəsarətlə hərəkət edək” [IIc.s.489].

****Qolu zorba olmaq*** – vəzifəsinə güvənib güc nümayiş etdirmək; “Əgər kimsə, hər hansı bir adamsa – ya pulu çoxdur, yaxud vəzifəsi böyükdür, *qolu zorbadır* – gəlib ağacı kəsirsə, qorxmayın, çəkinməyin, siz ondan güclüsüz” [IXc.s.410].

****Qoymağa yer olmamaq*** – çox olmaq; həddindən çox olmaq; “Amma indi Azərbaycanda o qədər çörək var ki, onu *qoymağa yer yoxdur*” [XLIIIc.s.15].

****Qoynumuzda saxlamaq*** – “Amma bu hisləri biz içimizdə yaşatmışıq, *qoynumuzda saxlamışıq*, hətta ən ağır dövrlərdə öz dinimizə etiqad bəsləmişik” [IIIc.s.20].

****Qoyunlarına almaq*** – doğma insan kimi qəbul etmək; “Burada məni qucaqladılar, *qoyunlarına aldılar,* burada məni yaşatdılar” [XXIIc.s.243].

****Qucağına almaq*** – sakin etmək; yaşamağa şərait yaratmaq; “Ermənistan silahlı qüvvələri tərəfindən işğal edilmiş ərazilərimizdən didərgin düşmüş, elindən-obasından zorla çıxarılmış vətəndaşlarımızın böyük bir hissəsini bu şəhər *qucağına alıbdır*, qəbul edibdir və onlar burada müvəqqəti olaraq məskunlaşıblar, yaşayırlar” [VIc.s.385].

***Qulaq ardına vurmaq** – eşitməmək; “Mən belə düşünürəm ki, əgər dünya birliyi münaqişəyə arxa çevirsəydi və onu tamamilə *qulaq ardına vursaydı*, onda bu vəziyyəti yaxşılığa doğru dəyişdirməzdi” [Ic.s.218].

***Qulaq asmaq*** – dinləmək; eşitmək; “Güman edirəm, bu təntənəli mərasimi televiziya vasitəsilə respublikada seyr edirlər, *qulaq asırlar* və onlar da bizimlə bərabərdilər” [XLIIc.s.14].

***Qulağa gəlib çatmaq** – məlumat eşitmək; “Mənim *qulağıma gəlib çatır*” [XXIc.s.183].

***Qulağımızın dibində olmaq*** – məsafəcə lap yaxında olmaq; bir addımlığında olmaq; ~ əl uzatsan çatar; “Bilirsiniz, demək istəyirəm ki, Sumqayıt, necə deyərlər, bizim *qulağımızın dibində olan* şəhərdir” [XLIIIc.s.191].

***Qulağını açıb eşitmək** – məsuliyyətə çağırmaq, özünü yığışdırmaq; “Onlar *qulaqlarını açıb eşitsinlər*: belələrini görürük, şəxsən mən də görürəm” [IIc.s.123].

***Quldur yuvası** – cinayətkarların toplaşdığı idarə, müəssisə; “Nazirlər Kabineti artıq cinayətkarlar yuvasına, *quldurlar yuvasına* dönmüşdü” [IIc.s.385].

***Qulp qoymaq*** – bəhanə gətirmək; yayındırmaq; qəmiş qoymaq; nöqsan axtarmağa çalışmaq, qərəzli yanaşmaq, irad üçün bəhanə tapmaq, bir işin gedişinə, düzəlməsinə mane olmaq, müdaxilə edib əngəl törətmək; ~ mız qoymaq, sözə quyruq bağlamaq; “Orada da biri razılıq verir, digər bürokrat – bəlkə onların bəziləri elə indi Nazirlər Kabinetində oturublar, bizim rəhbərliyimiz altında da işləyirlər – Azərbaycanda bir söz var, *qulp qoyurdu*” [XLIIc.s.22].

***Qura bilmək** – təşkil etmək, nizama salmaq; “...Siz Azərbaycanın bugün kü vəziyyətini daha yaxından öyrənərək, burada öz işlərinizi daha da yaxşı *qura biləsiniz*” [VIIc.s.17].

***Qurban vermək*** – şəhid vermək; vətən yolunda itki vermək, qarşıya qoyulan məqsədə çatmaq üçün özünün və ya

başqasının malından, canından keçməsi; "Bu illər ərzində çox-lu *qurbanlar vermişik*, qanlı müharibə getmişdir" [Vc.s.330].

***Quru yerdə qalmaq (1)*** – müflisləşmək, hər nəyi varsa əlindən çıxmaq, kasıblaşmaq; pis vəziyyətdə qalmaq; kasıb vəziyyətdə yaşamaq; heç nəyi olmamaq; "Əgər bütün bunlar olmasaydı, məsələn, nəinki 70-80 – ci illərdə, hətta əvvəlki onilliklərdə bütün bunlar olmasaydı, onda Azərbaycan müstə-qil dövlət olduqdan sonra *quru yerdə qalmış* olardı." [XXXVIc.s.157].

***Quru yerdə olmaq (2)*** – heç bir iş görməmək; "Çünki dörd il bundan əvvəl mən buraya ilk dəfə gələndə bu sahədə heç bir iş görülmürdü, necə deyərlər, hər şey tamam *quru yer-də idi*" [XVIc.s.477].

****Quyruğuna bağlamaq*** – başqa dövlətin arxasınca get-mək; müstəqil xətti olmamaq; müstəqil olmamaq; "Biz özü-müzü bir ölkənin quyruğuna bağlaya bilmərik. Biz heç kəsin *quyruğuna bağlanan* bir xalq deyilik" [XVIc.s.412].

****Quyunun dibinə getmək*** – çıxılmaz vəziyyətə düşmək; "Necə deyərlər, adam yolunu azanda, əyri yola düşəndə lap *quyunun dibinə gedir*" [XVc.s.19].

****Quyuya düşmək*** – daha da çətinə düşmək; "Çünki nə qədər qorxsaq, o qədər də yerimizdə dayanacaq, *quyunun o qədər də dərinliyinə düşəcəyik*" [IIc.s.489].

****Quzu olmaq*** – sakit olmaq, qanunlara riayət etmək, mü-layim olmaq, heç kimlə işi olmamaq; "Ona görə də biz deyə bilmərik ki, azərbaycanlıların hamısı burada *quzudurlar*, heç bir şey etmirlər, yəni qeyri-qanuni heç bir hərəkətə yol ver-mirlər" [IXc.s.76].

## *Ll*

***Layiqli cavab vermək** – düşmənlə lazımı səviyyədə döyüşmək; “Mən əminəm ki, bizim ordumuz bu gün Azərbaycanın müstəqilliyinə, suverenliyinə, ərazi bütövlüyünə qarşı yönəldilmiş hər hansı bir qəsdə *layiqli cavab verməyə* hazırdır” [VIIc.s.38].

***Ləhcəni korlamaq** – dilə yad kəlmələr daxil etmək; xəlqilikdən uzaq, kənar sözləri dilə gətirmək; “Dedim bəli, doğudakı dil çox aydındır, amma İstanbuldakı *ləhcəni siz bir az korlamısınız*, o qədər yaxşı deyil” [XXXIXc.s.248].

***Ləkə gətirmək*** – hörmətinə, nüfuzuna zərbə dəymək, ~ ləkə salmaq; “İndi onların bəziləri naxçıvanlılar adından gedib cürbəcür qanunsuz işlər görürlər. Naxçıvanın da, naxçıvanlıların da adını ləkələyirlər və prezident kimi mənə də *ləkə gətirirlər*” [VII c.s.342].

***Ləkə vurmaq (1)*** – tarixdə mənfi rəy qazanmaq; “ Bu parlament sistemi dövlətin yaşamasına imkan vermədi və ayrı-ayrı qruplar, partiyalar arasında çəkişmələr, çarpışmalar, intriqalar özü-özlüyündə bu dövlətin adına *ləkə vurdu*” [Ic.s.154].

***Ləkə vurmaq (2)*** – gözdən salmaq; qiymətdən salmaq; hörmətdən salmaq; “Siz bununla mənim dediyim gözəl sözlərə böyük *ləkə vurmuş* olacaqsınız” [XXXIXc.s.127].

## *Mm*

****Mal-dövlət dalınca getmək*** – maddi sərvət toplamaq; maddiyyatı əsas hesab etmək; "Amma mən bu gün belə anladım ki, Elçinin məqsədi ondan ibarət olubdur ki, ölkənin bu ağır vaxtında, çətin vaxtında xalqın hamısının birləşib millət haqqında, torpaq haqqında düşünməsinin əvəzinə bəziləri yenə də *mal-dövlət dalınca gedir* və bu, mənəvi əxlaqsızlıqdır"[XXVIIIc.s.314].

****Maraq oyanmaq*** – maraq yaranmaq; "Ancaq eyni zamanda hesab edirəm ki, hər bir insan – yaşlı da, cavan da, gənc də, qadın da, kişi də bu tamaşaya diqqətlə baxdıqca onların hamısında böyük *maraq oyanacaq*" [XIIIc.s.168].

****Meydan açılmaq*** – fəaliyyət üçün imkan yaratmaq, mübarizəyə çağırmaq, fəaliyyət sahəsini genişləndirmək; "Sağlam, təmiz, pak bazar iqtisadiyyatı yolu ilə gedən iş adamlarına Azərbaycanda geniş yer veriləcəkdir, xarici şirkətlərə, sərmayəçilərə geniş *meydan açılacaqdır*" [VIIIc.s.206].

***Meydan sulamaq*** – özünü hökmran kimi aparmaq, ağalıq etmək, istədiyini etmək, mənəm-mənəmlik etmək; ortalığa çıxmaq; ortalığı qarışdırmaq; diqqət mərkəzinə düşmək; ~ at oynatmaq, qılınc oynatmaq; "Rəhim Qazıyev, İsgəndər Həmidov, Hümbətov kimiləri, başqaları meydana çıxıb, *meydan sulayıblar*, vəzifə tutublar, ağalıq ediblər, hakimiyyətdə olublar. Ona görə ki, bizim ziyalılarımız, hörmətlə adamlarımız mövqesiz olublar, çəkiniblər, gizləniblər, özlərini qoruyublar, xalqa qayğı göstərməyiblər, qorxublar" [IVc.s.192].

***Meydana çıxmaq*** – üzə çıxmaq; yenidən aşkarlanmaq, göstərmək, ~ ortalığa çıxarmaq; "Amma bu (malyariya) yenidən *meydana çıxdı*" [XXVIc.s.105].

***Məqalə vermək** – məqalə dərc etmək; “Əgər səhv etmirəmsə, sizin qəzet Azərbaycan haqqında yaxın keçmişdə maraqlı bir *məqalə vermişdi*” [XIc.s.21].

***Mənəvi qida almaq** – estetik zövq almaq; “Ona görə də bu gün mən buradan böyük *mənəvi qida aldım*” [IIIc.s.366].

***Mənliyini tapdalamaq*** – milli mənəviyyatını aşağılamaq, qüruruna, şəxsiyyətinə xətər gətirən davranışa yol vermək; ~ ləyaqətinə toxunmaq, qürurunu qırmaq (sındırmaq); “Amma Ermənistan bir milyon azərbaycanlının hüququnu pozubdur, *mənliyini tapdalayıbdır*” [XXXc.s.296].

***Mənsəbdə gözü yox olmaq** – vəzifə istəyi olmamaq; “Ancaq heç bir vəzifədə, heç bir *mənsəbdə gözü yox idi*” [IXc.s.145].

***Mərtəbələrə qalxmaq** – vəzifə cəhətdən yüksəlmək; “Əminəm ki, o, bu yolda hələ bir çox *mərtəbələrə qalxacaqdır*”[XXIXc.s.409].

***Məsələ qaldırmaq*** – problem səsləndirmək, problemi söyləmək; “Mən tapşırıram ki, Mahmud İsmayılovun *qaldırdığı məsələyə* baxın” [VIIIc.s.372].

***Məsələ qaldırmaq (1)*** – məsələni müzakirəyə çıxarmaq; ~ gündəmə gətirmək; “O, əgər bu *məsələləri bir daha pozitiv mövqedən qaldırsa*, təbiidir ki, Konqresdə də fikir artıq dəyişir və dəyişəcəkdir” [XXVc.s.111].

***Məsələ qaldırmaq (2)*** – problemi diqqətə çatdırmaq; “Demək istəyirəm ki, o vaxt, parlamentin sədri olarkən, prezidentin səlahiyyətlərini icra edərkən mən sentyabrda Moskvaya gəldim və *məsələ qaldırdım,* Boris Nikolayeviçlə, başqa insanlarla görüşdüm və bir aydan sonra biz MDB-nin tərkibinə daxil olduq” [XLIc.s.264].

***Məsələ qalxarkən** – məsələni müzakirəyə qoymaq; “Bu *məsələ əvvəlcə qalxarkən* və bu təşəbbüs irəli sürülərkən mən buna dəstək vermişdim” [XIVc.s.170].

***Məsələnin irəli getməsi*** – problemin həllində irəliləyiş; “Bu baxımdan, bilirsiniz ki, ümumiyyətlə, dünyada və böyük ölkələrdə belə fikir var ki, Minsk qrupunun danışıqları ilə yanaşı, bəlkə birbaşa danışıqlar da *məsələnin irəli getməsinə* müəyyən kömək edə bilər” [XXIc.s.199-200].

***Məsələyə baxmaq*** – məsələni həll etmək; problemi həll etmək; “Güman edirəm ki, indi Avropa Şurasının Nazirlər Komitəsi də bu *məsələyə baxacaq* və biz bu il Avropa Şurasının tamhüquqlu üzvü ola biləcəyik” [XXIXc.s.47].

***Milli kökdən ayrılmamaq*** – milli-mənəvi dəyərləri unutmamaq; milli dəyərlərə söykənmək; “O heç vaxt öz *milli köklərindən ayrılmamışdır*” [XXXVIc.s.281].

***Milli mənliyini sındırmaq*** – milli şüurunda deformasiyalar yaratmaq; “Respublikaya böyük qoşun dəstələri yeridilərək Azərbaycanın *milli mənliyini sındırmağa* çalışıblar”

***Minnət qoymaq*** – etdiyi hörmət və yaxşılıq müqabilində kimisə özünə borclu saymaq; ~ başına qaxmaq, başına vurmaq, başa qaxanc etmək; “İstəyirəm ki, siz də biləsiniz, o da bilsin ki, bizə *minnət qoyursa*, bu əbəsdir” [XLIc.s.365].

***Möcüzələr yarada bilmək*** – əsil sənət inciləri yarada bilmək, görkəmli əsərlər yarada bilmək; “Yalnız və yalnız böyük entuziastlar *möcüzələr yarada bilərlər*” [XIIIc.s.223].

***Möhkəm dayanmaq*** – sabit mövqe göstərmək; “Bu mövqedə *möhkəm dayanmışıq*” [XXIIIc.s.38].

***Mövqedə dayanmaq*** – eyni bir mövqeni müdafiə etmək; prinsipiallığı dəyişməmək; “Ümid edirəm ki, siz bundan sonra da bu *mövqedə dayanacaqsınız*” [XXVIIIc.s.134].

***Mövzunu çeynəmək*** – mənasız söhbətləri təkrar etmək; “Gələcəkdə də bunu cəmiyyət, vətəndaşlar deyəcəkdir, ayrı heç kəs deyə bilməz. İndi bu *mövzunu, necə deyərlər, çeynəmək,* hərənin bundan özü üçün, nə bilim xal qazanmaq, mənfəət götürmək istəməsi – bu, düzü məni narahat edir” [XXIc.s.331].

***Mövzunu qaldırmaq*** – mövzunu müzakirəyə təqdim etmək; “Bu yaxınlarda, martın 28-də Moskvada MDB dövlət başçılarının görüşü zamanı müstəqil dövlətlərin bir çoxunun prezidentləri MDB məkanında hərbi münaqişələrin olmasını yolverilməz sayaraq, qapalı iclasda bu *mövzunu qaldırdılar*” [IXc.s.203].

***Münasibət göstərmək*** – “Bunu ona görə demək istəyirəm ki, təəssüflər olsun ki, hələ bizə qərəzli *münasibət göstərənlər* də vardır” [XXVIc.s.200].

***Münasibətlərə kölgə salmaq*** – münasibətləri pozmaq; münasibətləri korlamaq; münasibətləri şübhə altına almaq; “Doğrudur, kimsə bu *münasibətlərə kölgə salmaq* istəyir, kimsə fitnəkarlığa əl atır” [XXIVc.s.412].

***Müsbət iz qoymaq*** – inkişafın əlamətlərini görmək; “Almaniyanın məşhur şirkətləri hələ əsrin əvvəlində Azərbaycanda fəaliyyət göstəriblər və öz işlərinin *müsbət izlərini qoyublar*” [VIIIc.s.23].

## *Nn*

***Narahat etmək*** – qəbrin yerini dəyişmək; “İndi onu *narahat edib* başqa bir yerə köçürmək nə qədər düzgün olar?”[XXVIIc.s.303].

***Naşı əllərə vermək*** – təcrübəsiz adamlara tapşırmaq; “İkincisi də, bu cür müasir, qiymətli avadanlığı alıb onları *naşı əllərə versəniz*, istifadə etmək əvəzinə, onları xarab edərsiniz”[XLIVc.s.26].

***Neft gözləmək*** – neft hasil etmək; “Birinci müqavilədən 740-750 min ton *neft gözləyirik* və bu, Bakı-Ceyhan kəməri ilə ixrac ediləcəkdir” [XLIVc.s.103].

***Nə şiş yansın, nə kabab*** – heç bir tərəf zərər çəkməsin; “Azərbaycanda belə bir söz var: *nə şiş yanmalıdır, nə kabab* ” [XXXIc.s.81].

***Nəfəs almağın mümkün olmaması** – atmosferin həddindən çox çirklənməsi; "Çünki neft tullantıları, kükürd və başqa kimyəvi maddələr buranın havasını o qədər gərginləşdirmişdi ki, bu yerdə *nəfəs almaq mümkün deyildi*" [XXVIIIc.s.7].

***Nəfəsi ilə qızdırmaq** – soyuq olmaq, qızdırılmamaq; "Heç olmasa işləyəndə adamlar onu öz *nəfəsi ilə az-çox qızdırırdılar*" [IIc.s.522].

***Nəfəsim gedib-gələnəcən*** – ölənəcən, mövcud olanacan; "Bu ifadələri mən neçə illərdir işlədirəm, nə qədər ki, *nəfəsim gedib-gəlir*, işlədəcəyəm" [XXIXc.s.326].

***Nikbin baxmaq** – irəliyə ümidlə baxmaq; "Biz hələ inkişaf mərhələsindəyik. Amma gələcəyimizə çox *nikbin baxırıq*" [XXXIVc.s.157].

***Nikbin olmaq** – gələcəyə ümidli olmaq, gələcəyə inamlı olmaq; "Mən də nikbinəm. Baxmayaraq ki, mən həyatda, bilirsiniz, çox çətin yollardan keçmişəm, amma həmişə *nikbin olmuşam*. Heç vaxt ruhdan düşməmişəm" [XXXIVc.s.174].

***Nöqsanları şişirtmək** – olan bir şeyi dəfələrlə artırmaq; süni olaraq böyütmək, bilərəkdən nöqsanları çoxaltmaq; "Doğrudur, bəzi qüvvələr ayrı-ayrı *nöqsanları şişirdərək*, Azərbaycan ordusu haqqında mənfi fikir yaratmağa çalışırlar" [XXXVc.s.61]. "Adətən nailiyyətlərə o qədər fikir vermirlər, ancaq nöqsanları dərhal tuturlar, qeyd edirlər və bəzən şişirtməyə çalışırlar" [Vc.s.340].

***Nöqtə qoymaq –** "Düşünürəm ki, bununla da biz müzkirələrə son qoyduq, *nöqtə qoyduq*" [XXVIc.s.24].

***Nüfuzdan salmaq** – siyasi səhnədən uzaqlaşdırmaq; "Amma 70 yaşım tamam olanda Naxçıvanda idim, təklənmişdim, məni *nüfuzdan salmağa* can atırdılar" [XVc.s.265].

## *Oo*

***O tərəf-bu tərəfə baxmaq** – vahid mövqeyi olmamaq; "Güman edirəm ki, əgər bunlar tam xəyanətkar deyildirsə sadəcə olaraq həm *o tərəfə*, həm *bu tərəfə baxanlardırsa*, onlar da özləri üçün nəticə çıxaracaqlar" [IIIc.s.301].

***O tərəf-bu tərəfə çəkmək (1)** – qərəzli şəkildə yoxlamaq; qərəzli araşdırmalar aparmaq. "Ona nəsə etmək istədilər, *o tərəf-bu tərəfə çəkdilər*, cəzalandırmaq istədilər" [XIIc.s.159].

***O tərəf-bu tərəfə çəkmək (2)*** – bürokratik sənədlər tələb etmək; "Biz Avropa Şurasına daxil olanda bizi o qədər *o tərəfə-bu tərəfə çəkdilər* ki, gözümüz qorxub" [XXXIVc.s.157].

***O tərəfdən-bu tərəfdən keçmək** – düz hərəkət etməmək, düzgün istiqamət götürməmək; "Yaxşı olar ki, qanuni yolla gedəsən, az qazanasan: nəinki qanunu *o tərəfdən – bu tərəfdən keçəsən*, bir az çox qazanasan" [VIIc.s.230].

***O hava ilə yaşamaq** – o fikirlə yaşamaq; "Bəziləri bu gün də hələ o fikirlə, *o hava ilə yaşayırlar* ki, Azərbaycanda yenidən hakimiyyəti güclə, silahla devirmək, ələ almaq olar" [XXVc.s.21].

***Obyektiv gözlə baxmaq** – məsələnin həllinə qərəzsiz yanaşmaq; subyektivliyə yol verməmək; "Bizim üçün ən əziz odur ki, siz Azərbaycana tam *obyektiv gözlərlə baxırsınız*" [XXVIc.s.200].

***Oda-alova atmaq*** – çətin vəziyyətə salmaq, bəlaya düçar etmək, təhlükə ilə qarşı-qarşıya qoymaq; təhlükəyə məruz qalmaq; ~ işə salmaq; "Mən öz Vətənimə oğulluq borcumu yerinə yetirdim, sədaqətimi bir daha nümayiş etdirdim, özümü *oda-alova atdım*" [XVIIIc.s.73].

***Oxu daşa dəymək*** – niyyətin həyata keçirilə bilməmək, məqsədinə nail olmamaq, niyyəti, cəhdi baş tutmamaq, uğursuzluqla nəticələnmək, ciddi maneəyə rast gəlmək; ~ oxu boşa çıxmaq, aşı daşa çıxmaq, külüngü daşa dəymək; " Mənə qarşı

iki dəfə qəsd etdilər, iki dəfə məni öldürmək istədilər. Amma *oxları daşa dəydi*, niyyətləri baş tutmadı" [Ic.s.59].

***Olan-qalanı da dağıtmaq** – "Əgər biz müstəqilliyi bundan ötrü əldə etmişiksə ki, *olan-qalanı da dağıdaq*, özümüz bir şey yaratmayaq, qurmayaq – axı belə getsə, müəyyən bir vaxtdan sonra hər şey dağılacaq və biz boş yerdə qalacağıq" [Ic.s.268].

***Olan olub, keçən keçib** – geriyə qayıda bilməmək; "Artıq *olan olub, keçən keçib*"[IIIc.s.396].

***Ona-buna qara yaxmaq** – insanların gördüyü işləri düzgün qiymətləndirməmək; görülən işləri gözdən salmaq; "Bir var bu müstəqilliyi əməli surətdə, dövlət başında duraraq həyata keçirmək və bütün təzyiqlərin hamısına sinə gərmək, bir də var ki, kənarda durub, küçədə "müstəqillik, müstəqillik" deyə qışqırıb heç bir şey etməmək və *ona-buna da qara yaxmaq*" [IVc.s.174].

***Onun-bunun ümidinə qalmaq** – başqa insanlardan kömək istəmək, köməyə ehtiyacı olmaq; "Ola bilər, belə bir adam fikirləşsin ki, ömürlük şikəstdir, otursun və *onun-bunun ümidinə qalsın*" [IIIc.s.119].

***Onurğa sütunu olmaq** – əsasını təşkil etmək; "Bu gün də Azərbaycanın neft sənayesi iqtisadiyyatımızın dayağıdır, Azərbaycan sənayesinin demək olar ki, *onurğa sütunudur*" [IIc.s.239].

***Ora-bura paylamaq** – plansız şəkildə dağıtmaq; "Anlamalısınız ki, çıxarılan neftin və istehsal olunan neft məhsullarının hər bir litri Azərbaycan xalqı üçün əhəmiyyətlidir və onları *ora-bura paylamaq*, satmaq olmaz" [VIIc.s.139]

***Oradan-buradan atəş açmaq** – nizamsız şəkildə atəş açmaq; "Müharibə etmək sadəcə, *oradan-buradan atəş açmaq* deyildir" [XXVIIIc.s.328].

***Ortaya düşmək*** – 1) özünü xalqa lider kimi göstərmək; xalqın, cəmiyyətin diqqətini özünə yönəltmək; populist

çıxışlarla diqqəti özünə cəlb etmək; 2) bir işi görməyə təşəbbüs etmək, fəallıq və səy göstərmək, vasitəçilik etmək; "İndi belə adamlar *düşüblər ortaya*" [XXIIIc.s.140].

***Ortaya qoymaq*** – prinsiplərə əməl etmək; səmimi olmaq; gizlətməmək; ~ araya qoymaq; "Əsas da beynəlxalq hüquq normalarını, Helsinki aktını, dövlətlərin sərhədlərinin toxunulmazlığı və ərazi bütövlüyü prinsipini *ortaya qoymaq* lazımdır. Əgər bütün dövlətlər bunu səmimiyyətlə *ortaya qoysalar* və Ermənistandan bunu tələb etsələr, onda məsələni həll etmək mümkündür" [XXIXc.s.17].

****Oyundan kənar vəziyyətdə qalmaq*** – siyasi, iqtisadi danışıqlarda kənarda qalmaq; "Amma coğrafiya belədir ki, Azərbaycan "*oyundan kənar vəziyyətdə qala bilməz*" [XXXVIIc.s.123].

****Oyundan kənar vəziyyətdə qoymaq*** **–** layihələrdən kənarda saxlamaq; siyasi danışıqlardan kənarda saxlamaq; "Sonra mən araşdırdım, bir az da narazı oldum ki, Azərbaycanı "*oyundan kənar" vəziyyətdə qoyublar*" [XXXVIIc.s.123].

## *Öö*

***Ölçü götürmək*** – tədbir görmək, məsələni vaxtında həll etmək, cəzalandırmaq; "Mən baş nazir Artur Rasizadəyə tapşırıram ki, o, bu məsələlərə nəzarət etsin və bu layihənin həyata keçirilməsi üçün Azərbaycanın sənaye müəssisələrindən, şirkətlərindən, zavodlarından istifadə edilməsində əgər bir problem yaranarsa, bunlara vaxtında baxıb, lazımi *ölçü götürsün*" [IXc.s.9].

***Ölçüb-biçmək*** – nə dediyini və nə etdiyini bilmək, hesablamaq, nəzərə almaq; ~ həddini aşmamaq, cızığından çıxmamaq; "Ancaq bir *ölçüb-biçmək* lazımdır ki, sən hakimiyyətə gələndən sonra bu yükü daşıya biləcəksən, yoxsa daşıya bilməyəcəksən?" [IVc.s.178].

***Ömrü boyu qalmaq*** – bütöv ömür boyu bir yerdə yaşamaq; "Az insan tapılar ki, onlar doğulduqları yerlərdə bütün *ömürləri boyu qalsınlar*" [XVIc.s.45].

****Ömrü uzadılmaq*** – müddəti artırılmaq; " "Əsrin müqaviləsi" adı verilmiş bu müqavilə 30 il müddətinə bağlanıb, görünür ki, bunun *ömrü* bir-iki dəfə *uzadılacaqdır*" [XIc.s.340].

***Ömür sürmək*** – mövcud olmaq; yaşamaq; ~ yaşa dolmaq, həyat sürmək, dövran sürmək; "Bu cümhuriyyət, hökumət 23 ay *ömür sürmüşdür*" [VIc.s.307].

****Ört-basdır etmək*** – Məsələnin əsl mahiyyətini gizlətmək; "20 Yanvar faciəsi bu dörd il müddətində *ört – basdır edilib*, bu faciənin günahkarları ondan sonra da Azərbaycanda rəhbər vəzifələrdə olublar və həmin faciəni ört-basdır etmək üçün bir komissiya yaradıblar" [Ic.s.330].

****Öz dövrünü yazmaq*** – yaşadığı dövrü əsərlərindən əks etdirmək; "Şərqdə həmişə şeir böyük hörmətə layiq olubdur və hər bir şair öz dövrünün aşiqi olubdur, *öz dövrünü yazıbdır*" [IXc.s.20].

***Öz işlərini görmək*** – tədricən təsir göstərmək, təsirinə salmaq; "Tutaq ki, Rəhim Qazıyev artıq Müdafiə naziri deyildi, amma bütün ordu hissələrini gəzirdi, "*öz işlərini görürdü*" [XLc.s.300].

****Öz mənliyini qorumaq*** – milli düşüncəni qorumaq; "Xalqımız əsrlər boyu böyük sınaqlardan çıxıb və öz torpağını, *öz mənliyini qoruyub* indiyə qədər saxlaya bilibdir " [VIIc.s.191].

****Öz üzərinə götürmək*** – başqasını məsuliyyətdən qurtarmaq; ağırlığı uzaqlaşdırmaq; "Bu sahəni İlham Əliyev *öz üzərinə götürübdür*, ağırlığı bizdən uzaqlaşdırıbdır" [XLIIIc.s.102].

****Öz yerini tutmaq*** – öz əsl mahiyyətini göstərmək; "Hətta 1993-cü ildən başlayaraq əsl həqiqət *öz yerini tutmağa* başladıqda belə bir sıra beynəlxalq təşkilatların qətnamələri və

qərarları qəbul edildikdən sonra da Ermənistan bu mühüm sənədlərə daim etinasızlıqla yanaşmışdır” [XIc.s.37].

***Özbaşına etmək*** – məsləhətləşməmək; “Gömrük komitəsi bunu *öz başına edə* bilməz” [XXXVc.s.45].

***Özbaşnalıq olmaq*** – qanunlara əməl etməmək, qayda-qanunu pozmaq; “Mən imkan verə bilmərəm ki, Azərbaycanda *özbaşnalıq olsun*” [VIIIc.s.372].

***Özünə umac ova bilmir, başqasına əriştə kəsir*** – öz problemlərini həll edə bilmədiyi halda başqalarına kömək etmək – “Ona görə əsas prinsip budur ki, heç bir ölkə başqa bir ölkənin daaxili işlərinə qarışmamalıdır. Əgər sən öz ölkənin işlərini həll edə bilirsənsə, həll et. Azərbaycanda bir məsəl var: *özünə umac ova bilmir, başqasına əriştə kəsir*” [XXXIVc.s.320].

***Özünə gələ bilməmək*** – 1) ağır təəssüratların təsiri altında olmaq; 2) ayılmamaq, ~ gözünü açmamaq, hala gəlməmək, huşa gəlməmək; 3) rahatlaşmamaq, gərginlikdən çıxmamaq; 4) əvvəlki vəziyyətə qayıtmamaq, sağlamlığını bərpa etməmək; “Hissiyyatları o qədər idi ki, *özünə gələ bilmirdi*” [XXVc.s.218].

***Özündən kəsmək*** – öz ehtiyaclarını ödəmək əvəzinə başqasına kömək göstərmək; özünün ehtiyacı olduğu halda qohumlara kömək etmək; “Çünki hər ata, hər ana xalq arasında deyildiyi kimi, boğazından kəsib uşaqlarına yedirdir, *özündən kəsib* uşaqları geyindirir” [XLIIIc.s.99].

***Özünü ələ ala bilmək*** – qüvvələrini səfərbər edə bilmək, çətin vəziyyətdə özünü itirməmək, fikrini, iradəsini toplamaq, sakitləşməyə çalışmaq; ~ özünü yığışdırmaq, hislərini cilovlamaq; “Təəccüblənmək olar ki, insan bəzən bir az xəstə yaxud da bir çatışmazlığı olanda onda bədbəxtlik əmələ gəlir, *özünü ələ ala bilmir*” [XXXIc.s.60].

***Özünü əngələ salmaq*** – qanunsuz hərəkət etmək; qanunu pozmaq; ~ özünü işə salmaq; “İndi kimsə, haradasa *özünü*

*hansısa əngələ salırsa*, yaxud qanunsuz hərəkət edirsə, təbiidir ki, buna münasibət olmalıdır” [XLIIc.s.370].

***Özünü işə qurban etmək*** – işə həddindən çox can yandırmaq; işi həyatı hesab etmək; “Haqqına demək lazımdır ki, mən həmişə *özümü işə qurban etmişəm*” [XXXc.s.93].

***Özünü öldürmək*** – 1) ciddi çalışmaq; gecə-gündüz yatmadan çalışmaq; 2) kimi isə hədsiz çox istəmək, onun qulluğunda durmaq, ona pərəstiş etmək; ~ əldən-ayaqdan getmək; “Əgər bir dəfə alınmadısa, alınmadı, Rəşid Behbudovdan ötrü özümü gedib orada öldürməliydim?! Amma etdim, *özümü öldürdüm* – yəni məcazi mənada deyirəm – ancaq nail oldum” [XXXIXc.s.101].

***Özünü qabağa vermək*** – aktiv olmaq; öncül mövqedə olmaq; hamıdan birinci tərpənmək, irəli çıxmaq, fərqlənmək, təşəbbüskar olmaq; “Partiya burada artıq *özünü qabağa verməlidir* və iqtidarın, dövlətin kölgəsində durmamalıdır” [XXVIIc.s.74].

****Özünü pis vəziyyətə qoymaq*** – çıxılmaz vəziyyətə düşmək; “İndi sən belə bir sual verəndə *özünü də pis vəziyyətə qoyursan*, məni də məcbur edirsən ki, sənə belə sərt cavab verim” [XLc.s.39].

****Özünü yığışdırmaq*** – səfərbər olmaq; qanunları pozmamaq; qanunlara əməl etmək; “*Özünü yığışdır, yığışdır*” [XLIVc.s.207].

****Özü-öz həyatını qurmaq*** – müstəqil olmaq, asılı olmamaq; “Bu beş il onu göstərdi ki,bizim ölkəmiz müstəqil ola bilər, xalqımız azad, sərbəst heç bir başqa dövlətdən asılı olmayaraq yaşaya bilər, *özü öz həyatını qura bilər*” [VIIIc.s.188].

****Özünü o yerlərlə bağlamaq*** – o yerlərə mənəvi cəhətdən bağlanmaq; “Mən Məkkədə, Kəbənin önündə müsahibə verərkən demişdim və bunu bir daha təkrar edirəm ki, müqəddəs

yerləri ziyarət etmək, *özümü o yerlərlə bağlamaq* mənim illərlə ürəyimdə gəzdirdiyim ən böyük arzum idi” [IIc.s.82].

***Ölçüb-biçmək*** – analiz etmək, hərtərəfli düşünmək; “Çünki məsələ çox ciddidir, mürəkkəbdir və bu məsələni həll etmək üçün gərək çox *ölçüb-biçək*” [IIIc.s.53].

****Özü-özünü dağıtmaq*** – öz müstəqilliyinə son qoymaq; öz quruluşunu sona yetirmək; “Sovet İttifaqı kimi fövqəldövləti, – əgər o, *özü-özünü dağıtmasaydı*, heç kəs dağıda bilməzdi” [XXIIc.s.275].

****Öz kökünü axtarmaq*** – “Xalq gərək daim *öz kökünü xatırlasın*, tarixini öyrənsin, milli mədəniyyətindən, elmindən heç vaxt ayrılmasın” [IIc.s.92].

****Özününküləri də kənarda qoymamaq*** – öz yaxınlarına vəzifə vermək; “Biri tanışını, digəri qohumunu, bəziləri uşaqlarını instituta düzəltmək istəyir, rektorlara təsir göstərirdilər, onlar da bundan sui-istifadə edərək *özününküləri də kənarda qoymurdular*” [IIc.s.105].

****Öz addımını atmaq*** – ölkənin öz sözünü deməsi; “Qafqazda, o cümlədən Cənubi Qafqazda, sülh yaranması üçün *öz addımımızı ataq*, öz payımızı verək” [Vc.s.437].

****Özbaşınalıq etmək*** – qanunlara hörmət etməmək, qanunları pozmaq; “Təəssüf ki, bəzi yerlərdə qanunlar pozulur, bəzi yerlərdə adamlar *özbaşnalıq edirdilər*, bəzi yerlərdə də vəzifəli şəxslər öz mövqelərindən şəxsi mənafeləri naminə sui-istifadə edirlər” [IIc.s.120].

****Ört-basdır etmək*** – gizlətmək; xalqdan gizli saxlamaq; “Günahkarlar kənarda qaldılar, öz şəxsi məqsədləri, mənafeləri üçün, xalqın tarixi faciəsini *ört-basdır etməyə* çalışdılar” [IIIc.s.123].

****Özündən kəsib dostuna vermək*** – dost ölkəyə yardım göstərmək; “Bəzən belə də olur: dost *özündən kəsib dostuna verir*” [XXIXc.s.136].

***Öz-özünü aldatmaq*** – real işlərlə məşğul olmamaq; "Yəni biz harada mümkündür, real əməkdaşlıq edirik və bundan sonra da edəcəyik. Amma biz *özümüz-özümüzü aldadarıq*, niyə gedib real olmayan işlərlə məşğul olmalıyıq" [XXIc.s.373].

***Özünü saxlaya bilməmək*** – "Mən sadəcə, özümü saxlaya bilmirəm, gərək bunları deyəm" [XXIIc.s.201].

***Özünü kənara çəkmək*** – məsuliyyətdən özünü uzaqlaşdırmaq; "Yəni, mən də bu siyasəti həyata keçirənlərdən biri idim, *özümü kənara çəkmirəm*" [XXIXc.s.228].

***Öz boğazından kəsib qardaşına vermək*** – öncə qardaşın yaşayışını nəzərdə tutmaq; "Azərbaycanda özündən kəsib dostuna vermək – dost ölkəyə yardım göstərmək; "Bəzən belə də olur: dost özündən kəsib dostuna verir." [XXIXc.s.136]

***Öz taleyinin sahibi olmaq*** – müstəqil siyasət yeridə bilmək; "Şübhə etməyin ki, Azərbaycan xalqı bu ağır sınaqdan da çıxacaq, öz torpaqlarını azad edəcək, öz müstəqilliyini qoruyub saxlayacaq, xalqımız özünün bütün ərazisində *öz taleyinin sahibi olacaqdır*" [Ic.s.395].

***Özbaşına qalmaq*** – sərbəst qalmaq, nəzarətsiz qalmaq; sahibsiz qalmaq; "Siz kənd təsərrüfatı mütəxəssisi kimi, təsəvvür edə bilərsiniz, indi o torpaqlar neçə illərdir *özbaşına qalıbdır*" [XXXVc.s.269].

***Özünü yığışdırmaq*** – 1) məsuliyyətli olmaq; məsuliyyət hiss etmək; 2) fikrini, qüvvəsini toplamaq; ~ özünü ələ almaq; 3) qəzəb, narazılıq doğurmamaq üçün öz hərəkətinə, davranışına fikir vermək; ~ özünü düzəltmək; "Adətən, fotoqraflar şəkil çəkəndə bir az *özünü yığışdırır*" [XXXVc.s.95].

***Öz evlərinə qayıtmaq*** – torpaqları işğaldan azad etmək; "Əminəm ki, Ermənistan – Azərbaycan münaqişəsi sülh yolu ilə həll ediləcək, Azərbaycanın işğal edilmiş torpaqları azad olunacaq, respublikamızın ərazi bütövlüyü bərpa ediləcək və

yerindən-yurdundan didərgin düşmüş soydaşlarımız *öz evlərinə qayıdacaqdır"* [XVIIIc.s.98].

***Ötüb keçmək** – arxada qoymaq; arxada qalmaq; "Ancaq məmnuniyyətlə deyə bilərəm ki, biz bunların hamısını ötüb keçmişik" [XXIc.s.52].

***Özünə yer tapmaq** – özünü təsdiq etmək; "Əgər onun fundamental, köklü orta təhsili varsa, o, cəmiyyətdə özünə yer tapacaq, çalışacaq, özünü, ailəsini yaşadacaqdır" [XXIc.s.253].

***Özünü saxlamaq*** – 1) bir işi görməkdən vaz keçmək; ~ nəfsinə hakim olmaq, nəfsini gözləmək; 2) hirsini, acığını biruzə verməmək, toxtamaq; ~ hirsini basmaq, acığını boğmaq, hirsini boğmaq, səbrini basmaq, hövsələsini basmaq; 4) səhhətinə diqqət etmək; tibbi profilaktikaya düzgün əməl etmək; özünə baxmaq; "Onun çox gözəl səhhəti var, *özünü gözəl saxlayır*" [XXXIXc.s.249].

## *Pp*

***Palıd ağacının təməlini qoymaq** – davamlı bünövrə qoymaq; uzunömürlü, saf bir bünövrə qoymaq; "Biz böyük bir ağacın-*palıd ağacının təməlini qoymuşuq*" [XXIXc.s.158].

***Papağı fırlatmaq*** – tez, sürətlə, qısa bir zamanda, illəri tez ötürmək; "Papağını fırladacaqsan bir də görəcəksən ki, üç il keçdi."[XXXIXc.s.249]

***Papağını qabağına qoyub fikirləşmək*** – situasiyanı analiz etmək; öz qüvvəsini qiymətləndirmək, yaxşı-yaxşı düşünmək, hərtərəfli düşünmək, götür-qoy etmək; "Amma bunun üçün indi siyasət aləminə çıxan, siyasətlə məşğul olmaq istəyən adamlar və hakimiyyət iddiasında olan adamlar gərək – Azərbaycanda bir söz var, – papağını qoysun qabağına və dərindən fikirləşsin: sən bu suya girə bilərsən, ya girə bilməzsən?" [XVc.s.179]

***Paraşütlə düşmək*** – qəflətən gəlmək; gözlənilmədən gəlmək; “Mən onda elə gələcəyəm ki, sizin bundan xəbəriniz də olmayacaqdır, göydən paraşütlə düşəcəyəm” [XVc.s.294].

***Parlayıb solmaq*** – sənətdə zirvələr fəth etmək və populyarlıqdan dümək; “Ancaq bəzən yaradıcılarda belə olur ki, onlar *parlayırlar*, sonra müəyyən qədər *solurlar*.” [XIXc.s.125]

***Payını almaq*** – cəzasını almaq, etdiyi pisliyin cəzasını almaq; “Əminəm ki, bu təxribatı törədən qüvvələr öz payını alacaqlar” [IIc.s.281].

***Payını vermək*** – 1) öz bacarığını, qüvvəsini sərf etmək; 2) ciddi cəzalandırmaq, tənbeh etmək; “Yenə də deyirəm, bunun üçün Azərbaycanın hər bir vətəndaşı öz payını verməlidir” [XIIIc.s.277].

***Pərən-pərən düşmək*** – dağılmaq, mütəşəkkilliyini, birliyini itirmək, bir-birindən ayrılmaq, ayrı düşmək; gücsüzlərin qorxu altında nizamsız qaçışı; “Daha heç kəs erməni tankı görən kimi pərən-pərən düşüb qaçmır” [Ic.s.502]. *Pərən-pərən düşmək* – müxtəlif istiqamətlərə düşmək; “Ağır məqamda xalqı, ölkəni, dövləti qoyub, pərən-pərən düşərək hərəsi bir tərəfə qaçdılar” [XVIIIc.s.231]. *Pərən*-pərən düşmək – müxtəlif istiqamətlərə yayılmaq; “Gəldi, sizi vurdu dağıtdı, siz də qaçdınız, pərən-pərən düşdünüz və o müddətdə çoxları gedib Gəncədə Surətə öz sədaqətini bildirdi” [IVc.s.489].

***Pis olmaq istəməmək*** – tutduğu vəzifədə loyallıq göstərmək, prinsipsizlik göstərmək; dolayısı ilə qanunları pozmaqla “yaxşı” adam imici qazanmaq; “Bundan sonra özünü mübarizəyə də salmaq istəmir, kiminləsə də el arasında deyildiyi kimi, *pis olmaq istəmirlər*” [XXIc.s.327].

***Pis yola salmaq*** – qanunları pozmağa vadar etmək; “Ayrı-ayrı adamlar bundan sui-istifadə etməyə, onları qızışdırıb *pis yollara salmağa* çalışırlar” [IIc.s.357].

***Pis yoldan çəkindirmək*** – etik və qanuni işləri pozmaqdan uzaqlaşdırmaq; "Çünki mən hər bir insanı *pis yoldan çəkindirmək* istəyirəm" [XXXIXc.s.128].

****Pis yollara getmək*** – qanundankənar işlərlə məşğul olmaq; "Bəziləri rüşvətxorluqla məşğul olur, bəziləri başqa *pis yollara gedirlər*" [XXVIIIc.s.337].

***Pis yollara düşmək*** – tərbiyəsiz, zərərli, təhlükəli işlərlə məşğul olmaq, avaralanmaq, qanunsuz işlərlə məşğul olmaq; ~ əməli azmaq, düz yoldan çıxmaq; "Ona görə də sonrakı dövrdə gəlib *pis yollara düşdülər*" [VIIc.s.482].

***Prinsiplərə söykənmək*** – əsaslanmaq; "Güman edirəm ki, müxalifət düşərgəsində olan qüvvələrdə Azərbaycanın milli mənafeyini hər şeydən üstün tutmalıdır, Azərbaycanın dövlət müstəqilliyini hər şeydən üstün tutmalıdır, Azərbaycanın müstəqil dövlət kimi yaşamasını və inkişaf etməsini hər şeydən üstün tutmalıdır və bu *prinsiplərə* əsasən, buna *söykənərək* biz bundan sonra əməkdaşlıq edə bilərik" [XVIIIc.s.66].

****Prinsipləri tapdalamaq*** – qəbul olunmuş prinsiplərə əməl etməmək; kobud şəkildə pozmaq; "Lakin Ermənistan bu *prinsipləri tapdalamışdır*" [XXXVc.s.447].

****Prosesə nöqtə qoymaq*** – tam şəkildə rəsmiləşdirmək; "Bununla bərabər, mən belə başa düşdüm ki, noyabrın 18-də İstanbulda, ATƏT-in üzvü olan dövlətlərin başçılarının görüşü zamanı Bakı – Tbilisi – Ceyhan neft kəmərinə dair imzalanmış sazişin daha da rəsmiləşdirilməsi *prosesinə nöqtə qoymağımız* söhbətimizin ən qiymətli hissəsi olmuşdur" [XXVIc.s.23].

***Puça çıxartmaq*** – heç bir nəticəsi olmamaq, heçə çıxartmaq; imkanı reallaşdırmağı mümkün olmamaq; ~ boşa çıxmaq, hədər getmək, heçə çıxmaq; "Amma sonradan Ermənistanın prezidenti Levon Ter-Petrosyanın istefa verməsi və Ermənistanın yeni rəhbərliyinin öz mövqeyini sərtləşdirməsi bu ədalətli təməl üzərində danışıqların davam etdirilməsi imkanını *puça çıxartdı*" [XXc.s.27].

## *Rr*

***Rahat nəfəs almaq*** – asudə yaşamaq, əminlikdə olmaq; ağır, məsuliyyətli bir işdən azad olmaq, yüngülləşmək; ~ çiynindən dağ götürülmək, çiynindən yük götürülmək; "Gəncə şəhərindən indi mənə məlumatlar gəlir, insanlar deyirlər ki, biz artıq *rahat nəfəs ala* bilirik" [IIc.s.473].

***Rahat olmaq*** – sakitləşmək; "Mənim dediyim bu sözləri də, mümkün hesab edirsənsə, televiziya ilə ver, qoy camaat *rahat olsun*" [XXXc.s.95].

***Rahat-rahat söhbət etmək*** – vaxt məhdudiyyəti olmadan söhbət etmək; "Güman edirəm ki, bu rəsmi səfər zamanı bizim daha da geniş imkanlarımız olacaqdır ki, həm bir çox məsələləri müzakirə edək, həm də *rahat-rahat söhbət edək*" [XXVIIc.s.200].

***Rahat yaşamaq*** – qayğılardan uzaq olmaq; "Belə hallarda bəziləri öz Vətənini tərk edir ki, gedib *rahat yaşasın*" [XIIIc.s.37].

***Rahat yatmaq*** – arzuları yerinə yetmək, ruhları sakit olmaq; "Bütün şəhidlərimiz, təkcə yanvar şəhidləri yox, Vətən, torpaq uğrunda döyüşlərdə şəhid olan övladlarımız da *rahat yatsınlar*" [XXIVc.s.226].

## *Ss*

***Saç-saqqal ağartmaq*** – mühüm təcrübəyə malik olmaq; təcrübə qazanmaq; uzun illər işləmək, çalışmaq; ~ yaşlanmaq, qocalmaq, bir işdə böyük təcrübə qazanmaq, saqqal ağartmaq; "Mənə elə gəlir ki, Abbasov birgə Azərbaycan – Rusiya komissiyasının həmsədri olmaqla, necə deyərlər, *saç-saqqal ağartmışdır*" [XXIIIc.s.30].

***Saf-çürük etmək*** – araşdırmaq; dərindən araşdırmaq; "Mən hökmən pyesin özünün, müəllifin, sonra da tamaşanın

quruluşunun məziyyətlərini *saf-çürük etməliyəm*" [XXVIIIc.s.347].

***Sağlam mühit yaratmaq*** – xalqa, Vətənə saf əqidə ilə xidmət edən iş şəraiti; "Odur ki, indi gərək yuxarıdan aşağıya qədər Nazirlər Kabinetinin bütün sistemi bu zibildən, bu çirkdən təmizlənsin, burada mənən *sağlam mühit yaransın* və işlər respublikamızın bugünkü mənafeyinə uyğun surətdə sağlam istiqamətdə aparılsın" [IIIc.s.398].

***Sağlam yolla getmək*** – qanuni yolla getmək; qanunlara riayət etmək; "Bu partiyalar həqiqətən *sağlam yolla gedən* partiyalardır" [XXIVc.s.52].

***Sahmana salınmaq*** – səliqə yaranmaq, hər şeyi öz yerində düzgün yerləşdirmək; ~ qaydaya salmaq; nizama salınmaq; tərəflərin hüququnu qorumaq; "İki sistemin qarşıdurmasının tarixə qovuşması, demokratiya və sərbəst bazar ideyalarının üstünlük qazanıb yayılması elə bir dünyanın qurulmasına kömək etməlidir ki, orada bütün dövlətlərin mənafeləri nəzərə alınacaq və həqiqətən bərabər hüquqlu tərəfdaşlıq *sahmana salınacaqdır*" [XXXc.s.11].

***Sakit yanaşmaq*** – emosiyasız yanaşmaq; səbirlə yanaşmaq; "Bilirsiniz, prinsipcə, mən bu şayiələrə *sakit yanaşdım*" [XXXc.s.105].

***Sakit yaşamaq*** – münaqişəsiz yaşamaq; əmin-amanlıq içərisində yaşamaq; "Amma ondan sonra Ermənistanda olan millətçilər vaxtaşırı – Dağlıq Qarabağın əhalisinin özü bu barədə *sakit yaşayıbdır* – Dağlıq Qarabağın Azərbaycandan ayrılıb Ermənistana verilməsi məsələsini qaldırıblar" [XLIVc.s.239].

***Sarı simə toxunmaq*** – daha incəliklərə baş vurmaq; dərin qatlara nüfuz etmək, həssas nöqtəyə toxunmaq, incə məqama toxunmaq; "Bəli, bu sözlərin hamısını deyəndə mənim qəlbimdəki *sarı simlərə toxundunuz*" [XXXIXc.s.262].

***Saya salmaq*** – saymaq, yaxın hesab etmək, hörmət etmək; ~ hörmət qoymaq; "Mən ondan bəzən bir çox şeyləri

tələb edərkən cavab verirdi ki, nazirlikdə adətən şöbəni və mənim bu sahədə aparatda çalışan işçilərimi *saya salmırlar*" [XVc.s.32].

***Sayılan bir insan olmaq** – tanınmış, görkəmli insan olmaq; "O, həm Azərbaycanda, həm də bir çox xarici ölkələrdə tanınmış, *sayılan bir insan olmuşdur*" [IXc.s.17].

***Sehrli çubuq*** – "Heydər Əliyev *sehrli çubuq* deyil, Heydər Əliyev insandır" [XXIVc.s.64].

***Səddi keçmək** – sərhədi keçmək, ədəb-ərkan gözləməmək, böyük-kiçik yeri bilməmək, qanunları pozmaq; ~ həddini aşmaq, cızığından çıxmaq; "Ancaq prezident Klintonun əlləri bağlıdır, Konqres onun qarşısında sədd qoyub və o, bu *səddi keçə bilmir*" [IVc.s.403].

***Səhnə həyatı vermək** – əsəri səhnənin köməyi ilə yaşatmaq; "Siz bu əsərə yenidən *səhnə həyatı verdiniz* və bu gün çox gözəl də tamaşa göstərdiniz" [XVIIIc.s.326].

***Səhnədən getmək** – dövlət strukturunu tərk etmək; "Onlar *səhnədən getmişlər*" [Ic.s.250].

***Səmaya qalxmaq** – yüksək səviyyədə inkişaf etmək; "İnanıram ki, Bilkənd Universiteti bundan sonra daha da sürətlə inkişaf edəcəkdir və İhsan Doğramacının burada, bu torpaqda saldığı toxumlar əsrlər boyu böyük çinarlar kimi yüksəlib *səmaya qalxacaqlar*" [XXXIXc.s.246].

***Sərbəst görmək** – müstəqil, azad görmək; "Onlar – Səməd Vurğun da, Üzeyir Hacıbəyov da, Cəfər Cabbarlı da Azərbaycanı azad, müstəqil, *sərbəst görmək* istəyiblər" [IXc.s.21].

***Səs ucaltmaq** – yüksək səslə fikirlərini söyləmək, fikirlərini açıqcasına demək; "Yeri gəlmişkən, o vaxtlar 1987-ci ildə məni çalışdığım yüksək vəzifələrdən uzaqlaşdırmışdılar, lakin Moskvada yaşayırdım və Azərbaycana qarşı bu hərbi təcavüzlə əlaqədar öz etiraz *səsimi ucaltdım*" [IXc.s.240].

***Səsini ucaltmaq** – etiraz səsini qaldırmaq; "Həmin o yanvar hadisələri ilə əlaqədar dövlət xadimləri yox, Azər-

baycanın rəhbərləri yox, Azərbaycanın xalqını öz başına toplayan, indi bizim aramızda olan hörmətli şairmiz Bəxtiyar Vahabzadə etiraz *səsini ucaltdı*” [XXIIc.s.202].

***Səsi gur gəlmək*** – haqq işimizi müdafiə etmək, dünyaya bəyan etmək, kütləvi informasiya vasitələrində açıqca bəyan etmək; “Ancaq Azərbaycan xalqı yaxşı bilirki, bütün bu illərdə Azərbaycanı müdafiə etmək üçün Türkiyənin *səsi çox gur gəlib*” [Ic.s.360].

***Səs qaldırmaq (1)*** – fikirlər söyləmək, fikirləri bəyan etmək; “Bir vətəndaş kimi, mən bu dörd il müddətində bu barədə dəfələrlə *səsimi qaldırmışam*” [I c.s.331].

***Səs qaldırmaq (2)*** – fikrini bildirmək; məsələyə münasibət bildirmək; bəyan etmək;

“Nə vaxt səsini qaldırdın ki, Surət burada qanunsuz işlər görür, bunları edir” [IIc.s.387].

***Səmaya qalxmaq*** – yüksək səviyyədə inkişaf etmək; “İnanıram ki, Bilkənd Sifətini göstərmək – əsil xasiyyətini biruzə vermək; “Amma siz öz sifətinizi göstərdiniz” [XXc.s.344].

***Səhifə açmaq*** – tarixin müəyyən bir hissəsini tədqiq etmək; müəyyən bir hissəni öyrənmək; “Bunların əsas mənası və məqsədi zəngin tariximizin hər bir səhifəsini açmaq, geniş tədqiq etmək, onu xalqımıza və dünyaya təqdim etmək və beləliklə də tarixşünaslıq nöqteyi-nəzərindən itirdiyimiz şeyləri bərpa etməkdir” [XXVc.s.332].

***Sıçrayıb keçmək*** – inqilabi yolla, birdən-birə keçmək; “Hesab etmək olmaz ki, bəli, Sovetlər İttifaqı süquta uğradı biz müstəqillik qazanmışıq, indi biz bir sistemdən başqasına, özü də yüksək inkişaf səviyyəsinə malik olan sistemə *sıçrayıb keçmişik*” [XXc.s.421].

***Sıx bağlı olmaq*** – sıx əlaqədə olmaq; “Bu, mənim üçün xüsusilə əzizdir, çünki Bakı Dövlət Universiteti ilə nə qədər *sıx bağlı olmağım* sizə məlumdur” [XIIIc.s.232].

***Sıxma-boğmaya salmaq*** – sıxışdırmaq, incitmək, sərbəstlik verməmək; qısnağa salmaq; " Özü də o adamlar boğmuşdular ki, öz vəzifəsi naminə, öz mənsəbi naminə, öz şəxsi mənfəəti naminə xalqı *sıxma-boğmaya salmışdılar*"[Ic.s.332].

****Sındıra bilmək*** – əlaqələri aradan götürmək; əlaqələri aradan qaldırmaq; "Dostluğumuz, qardaşlığımız daim yüksəklərə qalxıb, heç bir qüvvə onu poza, sındıra bilməyibdir və bundan sonra da *sındıra bilməyəcəkdir*" [Vc.s.432].

****Siqnal gəlmək*** – məlumatlar çatmaq; şikayətlər gəlmək; "Mən bu sözləri ona görə deyirəm ki, mənə çox *siqnallar gəlir* ki, Azərbaycanda hüquq-mühafizə orqanları sahibkarlara bəzən mane olurlar, onları incidirlər, bəziləri onlardan rüşvət alırlar" [XVIIc.s.450].

***Silahı yerə qoymaq*** – təslim olmaq, müharibə etməmək, dinc dövrə qədəm qoymaq; sülhə çağırmaq; "Mən Dağlıq Qarabağın bütün sakinlərinə müraciət edərək onları *silahı yerə qoymağa* çağırıram" [I c. s.350].

****Simadan salmaq*** – görkəmini pisləşdirmək; görkəmini pis tərəfə dəyişmək; zövqsüzlüyə yol vermək; "Təəssüflər olsun ki, bizim bəzi yerli icra orqanlarımız şəhərin gözəlliyini, yaxud memarlıq üslubunu pozaraq elə tikintilərə yol verirlər ki, onlar Bakını əvvəlki simadan salır" [XXVc.s.340].

***Sinəsini qabağa vermək*** – kiminsə müdafiəsinə qalxmaq, özünü qabağa verərək mərdliklə qorumaq; ~ sinə gərmək, köksünü sipər etmək, köksünü gərmək; "Çünki xalq dövləti dəstəkləyirdi, apardığımız siyasəti bəyənirdi və ona görə də dövlətin, dövlətçiliyin mübarizəsində *sinəsini qabağa verdi*" [XXXc.s.213].

****Sıçrayışlar atmaq*** – inqilabi gedişlər etmək; süni addımlar atmaq; "Biz, həqiqətən, hansısa *sıçrayışlar*, hansısa süni addımlar *atmaq* əhvali-ruhiyyəsində deyilik" [XXVIIIc.s.142].

***Sıfır dərəcəsinə çatmaq** – yox olmaq; “Bu ilin birinci yarısında isə infilyasiya *sıfır dərəcəsinə enibdir*” [XIc.s.338].

***Sınaqdan çıxmaq** – yoxlanılmaq, təcrübədən keçirmək; “Mən isə Ömər Eldarovu tanıyıram, – o, *sınaqdan çıxmış* adamdır” [IXc.s.161].

***Sıx olmaq** – yaxın münasibətdə olmaq; “Ümidvaram ki, altı il bundan öncə təməli qoyulmuş bu bayram günü bütün dünya azərbaycanlıları tərəfindən ilbəil qeyd olunacaq və azərbaycanlıları bir-biri ilə *sıx olmaq* üçün daha da böyük fəaliyyətə dəvət edəcəkdir” [XIVc.s.15].

***Sıxıb-dağıtmaq*** – sıxışdırmaq; sıxışdırıb pərən-pərən salmaq; “Azərbaycan belə tanınmışdı ki, guya burada erməniləri *sıxıb-dağıdıbdır*, qırğınlar edibdir.” [XVc.s.9]

***Siqnallar gəlmək** – informasiyaların, xəbərlərin qəbulu; “Bizə çox *siqnallar gəlir* ki, məhs bu işlərə nəzarət etməli olan adamlar özləri cürbəcür əyri yollarla dövlət əmlakını, xalq malını dağıtmağa, mənimsəməyə çalışırlar və bütün bunlar ümumi işimizə zərbə vurur” [Ic.s.454].

***Sinə gərmək*** – kiminsə müdafiəsinə qalxmaq, özünü qabağa verərək mərdliklə qorumaq; ~ köksünü sipər etmək, köksünü gərmək, müqavimət göstərmək; “Həyat isə sizin nə dərəcədə haqlı olduğunuzu və nə dərəcədə şərəfli, prinsipial insan olduğunuzu, haqq-ədalət naminə, öz vicdanınız naminə, bütün bu çətinliklərə, məşəqqətlərə nə dərəcədə cəsurluqla *sinə gərdiyinizi* göstərdi.”[IXc.s.236]

***Soxula bilmək** – özünə yer tutmaq, yad olaraq özünü yaxın kimi göstərmək; “Bəzən dövlətçilik prinsiplərinə zidd olan ünsürlər də Milli Qvardiyanın sıralarına *soxula bilmişdir*” VIIIc.s.199].

***Son nöqtəni qoymaq** – məqsədlərinə çatmaq; “Ermənistan hakimiyyəti əsrin əvvəlindən başladığı bu siyasətə 1988-ci ildə demək olar ki, *son nöqtəni qoymağa* nail oldu və

azərbaycanlıları öz doğma yurdlarından, torpaqlarından zorla çıxardılar, qaçqın oldular" [XVIc.s.102].

***Son qoymaq*** – başa çatdırmaq; qurtarmaq; "Biz sülh danışıqları aparırıq, ona görə aparırıq ki, müharibəyə tamamilə son qoyaq" [Vc.s.146].

***Soyuq baş*** – düşünən baş; "Vaxtilə belə bir məşhur kəlam var idi ki, *soyuq baş*, hərarətli ürək, təmiz əllər olmalıdır" [XVc.s.126].

***Soyuq qəbul etmək*** – lazımi səviyyədə qəbul etməmək; "Deyəsən "Yeni Musavat" qəzetində, haradasa yazıblar ki, Heydər Əliyevi *soyuq qəbul ediblər* və guya orada əsgərlər, yəni fəxri qarovul olmayıbdır" [XXXIIIc.s.412].

***"Söhbət gedə bilməz"*** – "qətiyyən mümkün deyil" mənasında işlədilən ifadə; mümkün olmamaq; reallığa uyğun olmamaq; "Aydındır ki, sənayemiz, ümumiyyətlə, iqtisadiyyatımız keçid dövrünü yaşadığına görə istehsalın keçmişdə olduğu kimi yüksək sürətlə inkişafından *söhbət gedə bilməz*" [VIc.s.223].

***Söhbəti qızışdırmaq*** – söhbəti uzatmaq; söhbəti maraqlı etmək; tərəfləri qane etməsi; "Ancaq hiss etdim ki, bu söhbətimiz o qədər qızışır ki, bunun üçün indiyə qədər işlətdiyimiz vaxt çatmır" [XXXVIIIc.s.165].

***Söz-söhbət olmaq*** – təhrikə səbəb olmaq; "O, muxtar vilayət olduğuna görə, Azərbaycan hökuməti bu vilayəti daha yüksək səviyyədə saxlamaq istəyirdi ki, heç bir *söz-söhbət olmasın*" [XIc.s.153].

***Sözü fırlatmaq*** – eyni sözdən yapışmaq; sözü təkrar-təkrar demək; mövzunu başqa istiqamətə yönəltmək, əsas fikirdən yayınmaq, əsas məsələdən deyil, başqa şeylərdən danışmaq; ~ söhbətin ağzını əymək, söz azdırmaq, aralığa söz qatmaq; "Təəssüflər olsun, bizim mətbuat və təbiidir ki, bizim müxalifət bir dənə Qross, yaxud ona bənzər başqa familiyalı

adam gəlib bir söz deyən kimi, elə bilirlər bu, Allahdan gələn bir sözdür, onun *sözünü hey fırlayırlar, fırlayırlar*" [XLc.s.289].

***Sözü əymək*** –sözün əsl mənasını dəyişmək; sözün formasını dəyişmək; sözü düzgün deməmək; mövzunu başqa istiqamətə yönəltmək, əsas fikirdən yayınmaq, əsas məsələdən deyil başqa şeylərdən danışmaq; ~ söhbətin ağzını əymək, söz azdırmaq, "Amma mənim dediyim *sözləri əyməyəsiniz*, onları başqa formaya salmayasınız" [XLc.s.114-115].

***Sözü havadan demək*** – heç bir informasiyaya malik olmadan danışmaq; "Təbii ki, o bu *sözləri havadan demirdi*" [XLIV c.s.124].

***Sözü gətirmək*** – mətləbə gəlmək; "*Sözü nəyə gətirirəm*" [XXXIXc.s.61]

***Sözün üstündə durmaq*** – verdiyi sözə əməl etmək, fikrinə sadiq olmaq; əqidəsindən dönməmək; ~ fikrində durmaq, fikrinin üstündə durmaq, sözünə düz çıxmaq, sözünün ağası olmaq, sözünün yiyəsi olmaq, sözü bir olmaq, sözü söz olmaq, ilqarına düz çıxmaq; "Mən bir prezident kimi Azərbaycan Respublikasının bu ali dövlət vəzifəsini öz üzərimə götürərkən xalqa söz vermişəm, mən öz *sözümün üstündə durmuşam* və axıra qədər duracağam, son damla qanımadək, son nəfəsimədək sözümdən dönməyəcəyəm" [IIc.s.109].

****Suallar qalxmaq*** – yeni suallar ortaya çıxmaq; "Burada çıxış edənlər danışdıqca o qədər *suallar qalxır*, o qədər təəccüb doğuran rəqəmlər gətirilir ki, bunu heç təsəvvür etmək mümkün deyildir" [XIIIc.s.436].

****Sükanı ələ vermək*** – dövlətçiliyin idarə olunmasını ötürmək; "Biz Azərbaycanın *sükanını sizin əllərinizə verəcəyik*" [XLIIIc.s.250].

## *Şş*

***Şairlərin şairi olmaq*** – şairlər arasında seçilmək, şairlərin görkəmlisi olmaq; "Səməd Vurğun isə öz dövrünün *şairlərinin şairi olubdur*" [IXc.s.17].

***Şan-şöhrətə çatdırmaq*** – ölkənin qazandığı nailiyyətləri dünyaya yaymaq; "Ölkəmizin sənayesində, iqtisadiyyatında, həyatında özünəməxsus yer tutmuş Bakı Kondisionerlər Zavodu 20 ildir ki, Azərbaycanın *şan-şöhrətini* dünya ölkələrinə *çatdırır* və respublikamızın hörmətini daim qaldırır" [Vc.s.209].

***Şəhidliyə qalxmaq*** – müqəddəs əməllər uğrunda həlak olmaq, vətən uğrunda, din uğrunda, millət uğrunda can vermək; "Bu bayram günü onların *şəhidliyə qalxmaq* şücaətini, onların ruhunu bir dəqiqəlik sükutla yad etməyi xahiş edirəm" [XXXVc.s.66].

****Şəxsi-siyasi ad qazanmaq*** – siyasi səhnədə məşhur olmaq; seçilə bilmək; "İndi ayrı-ayrı adamlar öz şəxsi mənafelərini güdərək, cəmiyyətdə özlərinə *şəxsi-siyasi ad qazanmaq* üçün bütün dünyaya car çəkirlər ki, Azərbaycanda siyasi məhbus vardır" [XVc.s.117].

****Şəxsiyyəti açmaq*** – şəxsiyyəti öyrənib onu xalqa tanıtmaq; "Ancaq Vaqifi geniş tanıtmaq onu xalqa daha da yaxınlaşdırmaq, Vaqifin *şəxsiyyətini açmaq*, onun surətini xalqa göstərmək və Vaqifi xalqa doğma etmək – bunların hamısını Səməd Vurğun etdi" [IXc.s.18].

****Şəxsi ələ vermək*** – ayrı-ayrı şəxslərə tapşırmamaq; şəxsi adamlara həvalə etmək; "Amma indi ki, dövrdə bunların heç birini *şəxsi ələ vermək* olmaz" [XXXc.s.381].

****Şəxsi mənafelərini güdmək*** – ümumi mənafeyi düşünməmək; "Bu cür dəstələr Vətəni, torpağı müdafiə etmək əvəzinə öz *şəxsi mənafelərini güdmüşlər*" [Ic.s.102].

***Şərəfini, namusunu tapdalamaq*** – şərəfini, namusunu təhqir etmək; " Təəssüf ki, xalqın öndə gedən adamları, vəzi-

fədə olanları onun *şərəfini, namusunu*, mənliyini *tapdaladıqları* halda, xalq bu dörd ildə buna dözmüşdür" [Ic.s.331].

***Şərti şumda kəsək ki, xırmanda yabalaşmayaq*** – sonradan mübahisə, anlaşılmazlıq olmaması üçün qabaqcadan razılığa gəlmək, bütün şərtləri müəyyənləşdirmək; ~ şərt kəsmək; "Siz orada dediniz ki, yazıçıların qurultayı başlayacaq, sözünüzü, dərdinizi,arzularınızı, qayğılarınızı indi deyin, şərti şumda kəsək ki, xırmanda yabalaşmayaq" [XIIIc.s.11].

***Şux keçmək** – isti keçmək; ürəkdən keçmək; "Mən istərdim ki, sizin bu görüşünüz bir qədər şux keçsin." [XLIIIc.s.370]

***Şüarlarla yaşamaq** – real həyatdan uzaqlaşmaq, xəyallarla yaşamaq; " Bu yolun eniş-yoxuşlarını, çətinliklərini dərk etməyən adamlar, sadəcə olaraq, *şüarlarla yaşamışlar*" [Ic.s.151].

## *Tt*

***Tabaqda gətirilmək*** – boşqabda gətirilmək; hazır şəkildə gətirilmək; əziyyətsiz gətirilmək; "Ancaq bundan fərqli olaraq, 1991-ci ildə, demək olar ki, Azərbaycan üçün dövlət müstəqilliyi *tabaqda gətirilib* Azərbaycan rəhbərliyinin qarşısına qoyulduğu halda, hələ fikirləşirdilər ki, biz müstəqil dövlət olmalıyıq, ya olmamalıyıq" [XXXIVc.s.187].

***Taleyin hökm etməsi** – proqnozlaşdırılmayan məsələlərin həlli; "Lakin *tale hökm edir* – tab gətirmək və bütün zamanlarda müstəqil dövlət olmaq üçün biz bu çətinliklərdən keçməliyik" [XXc.s.409].

***Tar-mar olunmaq** – tamamilə dağıdılmaq; bərpası mümkün olmamaq; "Onlar keçən dəfə Ağdamın, o gözəl diyarın dağıldığını, hər şeyin *tar-mar olduğunu* görmüşdülər və bu barədə öz təəssüratlarını çox dərin hislərlə bizə söyləyirdilər" [XXXVc.s.231]

***Tarixdə qalmaq*** – böyük xidmətləri ilə tarixin yaddaşında qalmaq, unudulmamaq; ~ adı qalmaq, yadda qalmaq; "Bundan sonra belə imperiyalar olmayacaq və yəqin belə bir hadisə də olmayacaqdır, bu, tarixdə qalacaqdır" [XXXIXc.s.278].

***Tarixə çevrilmək*** – mövcud olmamaq, arxivlərə göndərilmək; "Doğrudur, bunların hamısı indi *tarixə çevrilmişdir*, çünki həmin sistem, həmin dövlət daha yoxdur" [IXc.s.102].

****Tarixə həkk olmaq*** – xalqın tarixini yaddaşlarda saxlamaq; "Yox. Ona görə ki, bütün bunlar *tarixə həkk olsun*" [IIc.s.89].

****Tarixə kor baxmaq*** – tarixi həqiqətləri görməmək, tarixinə, keçmişinə xor baxmaq; "Bunu nə pozmaq olar, nə də unutmaq olar. Bunu etmək istəyənlər tarixinə kor baxan, tarixinə düşmən çıxan adamlardır" [IIc.s.544].

****Tarixi qaralamaq*** – tarixi saxtalaşdırmaq. "Amma olan həqiqətləri də unutmaq, qaralamaq olmaz. Yenə də deyirəm, tarixi qaralamaq olmaz" [VIIc.s.23].

***Televiziyada görünmək*** – televiziyada çıxış etmək; "Əbülfəz Elçibəy iki il yarımdan sonra, nəhayət, *televiziyada göründü*, siz də onun danışığını gördünüz" [IVc.s.469].

****Tellərlə bağlamaq*** – müxtəlif dəyərlərlə bağlamaq; adət-ənənələrlə bağlamaq; "Bunların hamısı Türkiyə ilə Azərbaycanı elə tellərlə bir-birinə bağlayır ki, bundan sonra yüz il də, min il də bizi heç kəs heç vaxt ayıra bilməyəcəkdir" [XXXIXc.s.304].

***Tez alışmaq*** – sürətlə uyğunlaşmaq; tez adaptasiya olmaq; "Çünki insanlar həyatda yeni şeylərə *tez alışırlar*, ancaq onların harada və necə icad olunduğunu, necə işlədiyini o qədər də dərindən bilmirlər" [XXXIc.s.234].

***Təcəssüm tapmaq*** – əksini tapmaq; "Odlar ölkəsi kimi, daim torpaqlarımızın təkindəki güclü enerji ilə, xalqımızın zehnində və qollarında olan enerji ilə yaşayan ölkə kimi Azərbaycan tarixini əks etdirən kompozisiya at heykəlində *təcəssümünü tapmışdır*" [XVc.s.287].

***Təkan vermək*** – hərəkətə başlamaq; yerindən tərpənmək; "Ümidvaram ki, bu günlərdə biz münasibətlərimizə yeni *təkan verəcəyik* və bu münasibətlərin həqiqətən möhkəmlənməsi və inkişaf etməsi üçün öz tərəfimizdən bütün işləri görəcəyik" [XIIc.s.252].

***Təkər üstünə qoymaq*** – nizama salmaq; "O, həmin universiteti, necə deyərlər, *təkər üstünə qoyandan* sonra oradan çəkilərək, gedib başqasını yaradıbdır" [XXIc.s.252].

****Təkliflərə qoşulmaq*** – deyilənlərlə razılaşmaq; "Ona görə buradakı təkliflərə mən də qoşuluram, deyirəm ki, partiyanın rəhbər orqanlarının işini tam qənaətbəxş hesab etmək olar" [XXXVIIc.s.18].

***Təməl daşı*** – bünövrə, əsas, başlanğıc dövr; "Ancaq eyni zamanda bu, Azərbaycan Respublikasının, bizim ölkəmizin daim müstəqil olması üçün başlanğıc dövrüdür, *təməl daşıdır*" [VIIIc.s.188].

****Təmiz əllər*** – qanunu pozmamaq; "Vaxtilə belə bir məşhur kəlam var idi ki, soyuq baş, hərarətli ürək, *təmiz əllər* olmalıdır" [XVc.s.126]

****Təmtəraqla qarşılamaq*** – xüsusi şadyanalıqla qarşılamaq; "Dünən Bakıya gələrkən məni çox *təmtəraqla qarşıladınız*" [XXc.s.316].

***Tələyə düşmək*** – ilişmək, dolaşmaq, kiminsə hiyləsinə aldanmaq; ~tora düşmək, kəməndə düşmək, kəməndə keçmək, girə keçmək, qarmağa keçmək; "O vaxtdan biz *düşmüşük tələyə*" [XXIIIc.s.138].

***Təqib altında olmaq*** – fəaliyyəti izlənilmək; təqibə məruz qalmaq; "Bilirsiniz ki, 1987-ci ildən sonra bir neçə il böyük *təqib altında idim*, böyük təcridə məruz qalmışdım" [Vc.s.442].

****Tərəqqi ilə ayaqlaşmaq*** – səviyyəyə çatmaq, geridə qalmamaq; "Ona görə biz *tərəqqi ilə ayaqlaşmaqlıyıq*, inkişaf etmiş ölkələrin səviyyəsinə qalxmalıyıq" [XIIIc. s. 339].

****Təsir altında formalaşmaq*** – həyatda yerini tutmaq; insan kimi mənəvi cəhətdən kamilləşmək; "Gənc vaxtlarından Səməd Vurğunun şeirlərini, əsərlərini sevərək, onların *təsiri altında həm təhsil almışam, həm formalaşmışam*" [Vc.s.199].

****Təzyiq altında olmaq*** – normal fəaliyyətə mane olmaq; sıxışdırılmaq; "O vaxtlar, yəni 1990-cı ildə çox böyük *təzyiq altında idim*" [IIIc.s.178].

****Toxum salmaq*** – ideyalar vermək; real fikirləri həyata keçirmək; "İnanıram ki, Bilkənd Universiteti bundan sonra daha da sürətlə inkişaf edəcəkdir və İhsan Doğramacının burada, bu torpaqda *saldığı toxumlar* əsrlər boyu böyük çinarlar kimi yüksəlib səmaya qalxacaqlar" [XXXIXc.s.246]

****Torpaq satmaq*** – torpağın (ərazinin) itirilməsinə səbəb olmaq; ərazinin düşmən əlinə keçməsinə şərait yaratmaq; "Onlar həmin əməlləri gizlətmək üçün, çirkin niyyətlərinə nail olmaqdan ötrü xalqı, milləti, torpağı qana bulamağa, *torpağı satmağa*, xalqa xəyanət etməyə nəinki hazırdırlar, hətta bunu həyata keçirirlər" [Ic.s.101].

***Torpağa bağlanmaq*** – "Ümumiyyətlə, indi torpaqda, kənddə daha yaxşı işləyirlər və *torpağa* daha da *bağlanıblar*" [XLc.s.317].

****Torpağa tapşırılmaq*** – dəfn olunmaq; "Hüseyn Cavidin cənazəsinin Naxçıvanda *torpağa tapşırılması* haqqında qəbul etdiyimiz qərarın əsas səbəblərindən biri də o idi ki, onun qəbri adi bir qəbir olmasın" [IVc.s.5].

****Torpağa verilmək*** – dəfn olunmaq, torpağa tapşırılmaq ~ son mənzilə yola salınmaq; "Onlar keçmişdə elə orada *torpağa veriliblər*" [XXVIc.s.219].

****Tutmamış qatıq***– formalaşmayan, yerini tutmayan iş haqqında işlədilən ifadə; " Müstəqil Azərbaycan Respublikası hələ *tutmamış qatıqdır*. O gərək bərkisin, möhkəmlənsin" [Ic.s.113]

## *Uu*

***Uçuruma aparmaq*** – təhlükəli həddə yaxınlaşmaq, təhlükəli vəziyyətə düçar etmək; xilası çətin vəziyyətə salmaq; “Xalqı bu bəladan qurtarmaq üçün istifadə etmək lazımdır, xalqı daha da *uçuruma aparmaq* üçün yox” [IIc.s.245].

***Uçuruma doğru getmək*** – məhv olmaq; ölümə getmək; “O vaxt Azərbaycan od içində yanırdı, vətəndaş müharibəsi gedirdi və Azərbaycan əslində parçalanmaq həddində idi və *uçuruma doğru gedirdi*” [XXXIVc.s.360].

***Uman yerdən küsərlər*** – yəni ümid etdiyin yerdən kömək gözləmək; “ Xalqımızın belə bir məsəli var: Uman yerdən küsərlər” [Ic.s.364]. *Uman yerdən küsmək* – ərkin çatan yerdən küsmək; “Azərbaycanda bir söz var, insan uman yerdən küsər. Bu söz sizdə varmı – *uman yerdən küsərlər*?” [IXc.s.402]

***Uyuduğu yerə qayıtmaq*** – məzarda olmaq; dəfn olunmaq; “Öz torpağından didərgin salınmış hər bir adamın yeganə bir arzusu var – öz torpağına qayıtmaq, əcdadlarının *uyuduqları yerə qayıtmaq*, əcdadlarının əsrlər boyu yaşadıqları yurda, öz Vətəninə, öz torpağına qayıtmaq” [VIc.s.432].

***Uzağa çəkilmək*** – mübarizədən yayınmaq; hadisələrin mərkəzindən uzaqlaşmaq; “1987-ci ildə mən bütün işlərdən kənar olandan sonra vaxtilə mənimlə vəzifələrdə işləmiş insanlar *uzağa çəkildilər*” [XXIVc.s.53].

***Uzaq getmək*** – mənfi hərəkətləri dərinləşdirmək; “İnsan pis yola gedəndə, o, *uzaq gedibsə*, onu geriyə döndürmək mümkündür, ancaq onun özünə zərərli olacaqdır” [XXXIXc.s.128].

***Uzaqgörən danışıqlar*** – gələcəyi görməyə aid danışıqlar; “Deyərdim ki, bu danışıqlar çox cəsarətli və *uzaqgörən danışıqlardır*” [XXIIc.s.153].

***Uzaqgörənlik etmək** – qabaqcadan düşünmək; “O vaxt həmin atom elektrik stansiyasını tikməkdə uzaqgörənlik etdilər” [XXVIIc.s.287].

### *Üü*

***Üç-dörd pillə aşağı düşmək** – həddindən çox kasıblaşmaq; vəziyyəti pisləşmək; “Hərə özü üçün nəsə edir – biri zənginləşir, biri kasıblaşır, biri həddindən artıq qeyri-qanuni sərvətlər əldə edir, o birisi yaşadığı vəziyyətdən də *üç-dörd pillə aşağı düşür*” [IVc.s.292].

***Ümidlə baxmaq*** – yaxşı bir şeyin olacağına inanmaq, birinə arxayın olmaq; ~ ümidlə baxmaq; “Ancaq xalqımız dözümlü xalqdır, o, tarixən belə əzab-əziyyətlərə çox dözmüş, tab gətirmiş, amma gələcəyə həmişə böyük *ümidlə baxmışdır*” [Ic. s. 483].

***Ümidləri çin olmaq***– arzuları həyata keçmək; “ Əlbəttə, biz çalışacağıq ki, sizin bu *ümidləriniz çin olsun*. Biz çalışacağıq ki, bu *arzularınız həyata keçsin*” [Ic.s.189].

***Ümumi dil tapmaq*** – anlaşmaq, ümumi razılığa gəlmək, qarşılıqlı anlaşmaya nail olmaq, bir-biri ilə razılaşmaq; ~ yola getmək; problemi birgə həll etmək; “Əgər bu problem dövlətimizin hüdudlarından kənara çıxmasaydı, əgər bu problemin arxasında Ermənistan, – o, əslinə baxsan, bu münaqişəyə lap əvvəldən cəlb olunmuşdur, – durmasaydı, onda, əlbəttə, biz öz erməni vətəndaşlarımızla ümumi dil tapardıq, razılığa gələrdik” [XXVIc.s.73].

***Ümumi qazanda həzm olunmaq** – fərdi xüsusiyyəti itirmək; ümuminin içərisində hiss olunmamaq; “Ancaq bizim müstəqilliyimiz olmadığını görə, başqa sahələrdə olduğu kimi, idmanda da əldə edilən nailiyyətlər *Ümumittifaq qazanında həzm olunubdur*” [XXIXc.s.378].

***Ürək ağrısı*** – dərindən təəssüf etmək; "Mən *ürək ağrısı* ilə deyirəm ki, bəzən gənclər bu silahlı dəstələrə, bu cinayətkar qruplara nə üçün getdiklərini bilməyərək özlərini bədbəxt etdilər" [VIIIc.s.391].

***Ürək-dirək vermək (1)*** – cəsarətləndirmək, bir işə ruhlandırmaq, ruhlandırmaq, gələcəyə ümid vermək, mənəvi cəhətdən kömək etmək; " Bu adamlar məni axtarıb tapır, mənə *ürək-dirək verir*, gözdən salınmış xadimlə ünsiyyət üstündə özlərinin də rüsvay ediləcəyindən qorxmurdular " [Ic.s.48].

***Ürək-dirək vermək (2)*** – ruhlandırmaq; inam yaratmaq; dəstək olmaq; dayaq durmaq, təsəlli vermək, təskinlik vermək, ürək vermək; "Bu gün xatırlamaq artıq olmazdı ki, o ağır illərdə, insan hüquqları uğrunda mübarizəmizə görə Sovet İttifaqından əslində didərgin salındığımız illərdə məhz Qalina Pavlovnanın həyanlığı və dəstəyi, həmişə sizinlə birlikdə olması, sizə *ürək-dirək verməsi*, sizdə inam yaratması, təbii, sizi ruhlandırmış və bütün bunlar sizin bu sınaqdan çıxmağınızda böyük rol oynamışdır" [XXXVIIc.s.417].

***Ürəkdə gəzdirmək*** – yaddaşda saxlamaq; "Müqəddəs yerləri ziyarət etmək, özümü o yerlərlə bağlamaq mənim illərlə, on illərlə *ürəyimdə gəzdirdiyim* ən böyük arzum idi" [IIc.s.82].

***Ürəkdən danışmaq*** – səmimi danışmaq; "Bilirsiniz, bu gün xoşuma gəldi ki, Müslümün dostları, bizim incəsənət xadimləri və qonaqlarımız Müslümün yaradıcılığından çox yaxşı, çox *ürəkdən danışdılar* və onun sənətini düzgün qiymətləndirdilər" [XLIc.s.56].

***Ürəkdən etmək*** – təmənnasız etmək; sevgi ilə etmək; "Özü də bunu mən təkcə işimə, yüksək vəzifə tutduğuma görə deyil, həm də *ürəkdən edirdim*" [XXIIc.s.56].

***Ürəkdən gələn xoş sözlər*** – düşünülmüş, qabaqcadan fikirləşmiş səmimi sözlər; "Ehtiyac duyulur ki, onun haqqında

hansısa ümumi ifadələrlə deyil, *ürəkdən gələn xoş sözlər* söyləsinlər, elə sözlər ki, həqiqətə uyğun olsun” [XXVIIIc.s.348].

***Ürəkdən gəlmək** – səmimi, boyasız real söz demək; “Bir halda ki, mənim bu sözüm hər bir Türkiyə insanının, Azərbaycan vətəndaşının ürəyindən olubdur, demək, bu söz doğrudan da *ürəkdən gələn* sözdür” [XIVc.s.27].

***Ürəkdən istəmək** – söz xətrinə yox realcasına istəmək; “Biz Ukraynaya, Ukrayna xalqına böyük dostluq hisləri bəsləyirik və bunu *ürəkdən istəyirik*” [XIIc.s.25].

***Ürəkdən salamlamaq** – səmimi salamlamaq, sevgi ilə salamlamaq; “Mən sizin hamınızı *ürəkdən salamlayıram*” [XXXVc.s.82].

***Ürəyə yatmaq*** – bəyənilmək, istənilmək; ~ xoşa gəlmək, göz oxşamaq, xoş gəlmək, könül oxşamaq; estetik zövq vermək; estetik həzz almaq; riqqətə gətirmək; “İkincisi isə, nəinki *ürəyə yatırdı*, hətta riqqətə gətirirdi, buna görə də tamaşaçılar eşidən kimi, hiss edən kimi, görən kimi cuşa gəlirlər, ürəkləri yerindən oynayır və sizinlə birlikdə oxuyur, sizinlə birlikdə alqışlayır və hətta, məncə, sizinlə birlikdə atılıb-düşürdülər” [XXVIIIc.s.388-389].

***Ürəyi ağrımaq*** – biganə qalmamaq; “Üstündən 100 il keçəndən sonra yenə də adamın ürəyi ağrıyır ki, Azərbaycan oğlu o mazutun, çirkin içində, ağır şəraitdə gecə-gündüz işləyərək neft hasil edibdir.”[XXXVIc.s.128]

***Ürəyi dağa dönmək (1)*** – qürurlanmaq, böyük sevinc hissi keçirmək, fərəhlənmək, həddən çox sevinmək; “Orada Cəbrayıl rayonunun dağ kəndindən olan bir gənc – adı yadımda deyil, Moskva Universitetinin humanitar fakültələrindən birinin 4-cü kursunun əlaçı tələbəsi idi, – rus dilində çıxış edəndə ürəyim dağa döndü” [Ic.s.172].

***Ürəyi dağa dönmək (2)*** – həddindən çox sevinmək; şad olmaq; "Sizi bu gün belə mühitdə, bu gözəl şəraitdə görəndə, bir el sözü var, – ürəyim dağa dönür." [Vc.s.240]

***Ürəyi dözməmək*** – darıxmaq, istəmək, dözə bilməmək; ~ ürəyi durmamaq; "Sizin günün altında dayanmağınıza mənim *ürəyim dözmür*" [XLc.s.402].

****Ürəyi fikirlərlə dolu olmaq*** – Düşüncədə, başda çoxlu müsbət ideyalar olmaq;

"Bunu özünüz yaxşı dərk edirsiniz və güman edirəm ki, hər birimizin ürəyi hər gün bu fikirlərlə doludur" [VIIc.s.8].

***Ürəyi getmək*** – sevgi bəsləmək, çox istəmək; 1) bayılmaq, ~ huşunu itirmək; 2) həddindən şox istəmək; "Bilirəm ki, Vətəndən ötrü sizin ürəyiniz gedir, Vətəni çox istəyirsiniz" [VIIIc.s.326].

****Ürəyi tıp-tıp vurmaq*** – çox həyacanlı olmaq; narahat olmaq; "Ancaq siz Sidneydə çıxış edən zaman *ürəyimiz tıp-tıp vururdu* ki, necə, nə cür olacaq?" [XXXc.s.208]

***Ürəyi yanmaq*** – 1) istəmək, acımaq; ~ canı yanmaq, rəhmi gəlmək, qəlbi yanmaq, ürəyi ağrımaq, yazığı gəlmək; 2) bərk susamaq; ~ ciyəri yanmaq; mənafeyinə xidmət etmək; "Əgər bizim dövlətin, hökumətin hər bir strukturunun dövlətə, xalqa *ürəyi yansaydı*, birincisi, çalışardı ki, o nöqsanları buraxmasın."[XXVIc.s.288]. *Ürəyi yanmaq* – dərin təəssüf hissi keçirmək; biganə qalmamaq; "Burada da işləyəndə gedirdim, baxırdım, *ürəyim yanırdı* ki, niyə belədir?" [XLc.s.221]

****Ürəyimizdə olan yara*** – ciddi problem; həlli çətin problem; "Bu bizim ağrımızdır, *ürəyimizdə olan yaradır*" [Vc.s.43].

***Ürəyincə olmaq*** – istədiyi kimi olmaq; "Mən bir daha təşəkkürümü bildirirəm, hər şeyin Azərbaycan xalqının ürəyincə olmasını, uca Allahın ölkənizin sülh və əmin-amanlıq içində yaşamasını diləyirəm" [XLIVc.s.252].

***Ürəyinə dəymək*** – küsdürmək, inciməsinə səbəb olmaq; ~ incik salmaq, könlünə dəymək, könlünü qırmaq, xətrinə dəymək; incimək; ~ qəlbinə dəymək (toxunmaq); "Kiminsə ürəyinə dəyəcək, kimsə, əlbəttə ki, narahatçılıq keçirəcəkdir" [XLIc.s.133].

***Ürəyinə yatmaq (1)*** – xoşlamaq, sevmək, bəyənmək; ~ xoşuna gəlmək, qanı qaynamaq, ləzzət vermək, ürəyi tutmaq, ürəyi qızmaq, quşu qonmaq, döşünə yatmaq, könlü tutmaq, qəlbinə yatmaq, ruhunu oxşamaq, ruhuna yatmaq, canına yatmaq (sinmək); "O, eyni zamanda, dərin fəlsəfi fikirləri əks etdirən bir əsərdir, hər bir azərbaycanlının ürəyinə yatan, onu sevindirən şeir misralarıdır" [IXc.s.18].

***Ürəyinə yatmaq (2)*** – əhvalına uyğun olmaq; "Mirvari xanımın şeirləri həmişə bizim cəmiyyətimizin ürəyinə yatandır" [XIXc.s.254].

****Ürəklə-canla yanaşmaq*** – həvəslə yanaşmaq, sevgi ilə yanaşmaq; "Onların gördükləri iş, əldə etdikləri nailiyyət onu göstərir ki, insan bir işə həvəslə, *ürəklə-canla yanaşarsa*, həqiqətən xalqa xidmət etmək istəyərsə, o, çox işlər görə bilər." [XIIIc.s.219]

***Ürəklərə yol tapmaq*** – məhəbbətini, rəğbətini qazanmaq, özünü sevdirmək; xalqı səfərbər etmək; ~ ürəklərə girmək, ürəyini ələ almaq, ürəyinə yol tapmaq; "Mənim bu gün televiziya ilə xalqa müraciətim *ürəklərə yol tapdı*, insanlara təsir etdi, onları oyatdı və hamı başa düşdü ki, respublikamızın indi bir problemi var." [IIc.s.362]

***Üst-üstə düşmək*** – uyğun gəlmək; "Bu da təbii bir haldır ki, dövlətin, hökumətin siyasəti ilə Yeni Azərbaycan Partiyasının siyasəti, prinsipləri tam *üst-üstə düşür*, tam uyğundur" [XIIIc.s.274].

***Üst-üstə yığılmaq*** – toplanmaq, qalaqlanmaq; "Bu zərərlər *üst-üstə yığılaraq* indi respublikamızın iqtisadiyyatını da

ağır vəziyyətə salmış, xüsusən onun hərbi təcavüzün qarşısını almaq imkanlarını zəiflətmişdir" [Ic.s.250].

***Üstü açılmaq*** – bilinmək, aşkarlanmaq; ~ üzə çıxmaq, zibili çıxmaq, səsi çıxmaq; "Hakimiyyətdə olanlar qorxurdular ki, onların günahlarının *üstü açılar*" [IIIc.s.125].

***Üstündə oturmaq*** – heç kəsə verməmək, istifadə etməmək; "Torpağı alıb onun *üstündə oturdu* – nə olsun? " [IXc.s.178].

***Üstündən keçmək*** – pis cəhətləri haqqında danışmamaq, açıb-ağartmamaq; güzəştə getmək; vaxt vermək; ~ üstünü vurmamaq, üzə vurmamaq; "Mən bilirəm ki, sən bura Surət Hüseynov tərəfindən təyin edilmisən, ancaq mən bunun *üstündən keçirəm*" [XLIVc.s.195].

***Üstünə düşmək (1)*** – 1) bir şeyi həyata keçirməkdə inad göstərmək, ona nail olmağa var qüvvəsi ilə çalışmaq; 2) davamlı tənqid və təzyiq etmək; üzərinə düşmək; "Bağışlayın, bəlkə də yükün çoxu mənim *üstümə düşdü*." [XLIIc.s.68].

***Üstünə düşmək (2)*** – əhatəyə almaq; üzərinə hücum olunmaq; "Ona görə indi Fikrət Sadıqov mənim *üstümə düşübdür*" [XLIVc.s.201].

***Üstünə yıxmaq*** – məsuliyyəti başqasına aid etmək; məsuliyyətdən qaçmaq; məsuliyyətdən kənara çəkilmək; ~ başqasını günahlandırmaq; ~ boynuna atmaq (yıxmaq); "Ona görə də mən sizdən tələb edirəm ki, heç kəsin *üstünə yıxmayın*" [IVc.s.212].

****Üstünü örtmək*** – yayındırmaq; çaşqınlıq yaratmaq; əsas fikri gizləmək; əsas ideyanı gizləmək; "Onda mən bilirdim, axı, nə cür etmək lazımdır, bir az *üstünü örtmüşdüm* ki, bu, orta məktəbdir" [XLIVc.s.274].

****Üstünü örtməmək*** – səhvləri gizləməmək; "Yəni kimsə, haradasa günah edibsə, kiminsə suçu, səhvi varsa, biz onun *üstünü* heç vaxt *örtmürük* və örtməyəcəyik" [XIVc.s.285].

***Üz döndərmək*** – 1) küsmək, incimək, əlaqəni kəsmək, yaxınlıq etməmək; ~ arxa çevirmək, mehrini kəsmək; etibarsızlıq etmək, 2) xəyanət etmək; ~ üz çevirmək; "Yüksək vəzifələrə irəli çəkdiyim, təyin etdiyim, inandığım adamlar mən istefa verdikdən sonra birdən məndən *üz döndərdilər*, mənə xəyanət etdilər" [Ic.s.47].

***Üz göstərmək*** – əsl sifətini, əsl xilqətini göstərmək; mənfi münasibət, narazılıq ifadə etmək; xoş qarşılamamaq, sərt münasibət bildirmək; ~ sifətini turşutmaq, sifət göstərmək, sifət eləmək; "Dedim ki, bilirsiniz nə var, dünyanın dövranı uzundur, bəlkə siz hesab edirsiniz ki, Heydər Əliyev artıq ya öləcək, yaxud da işləməyəcək, ona görə belə *üz göstərirsiniz*" [XXc.s.342].

***Üz tutmaq*** – 1) müraciət etmək; 2) müəyyən istiqamətdə getməyə başlamaq; ~ ağıl-kamala çağırmaq, istiqamət almaq, üz qoymaq; "Fürsətdən istifadə edərək, erməni xalqına, Azərbaycan vətəndaşları olan Dağlıq Qarabağın erməni sakinlərinə *üz tutub*, onları ağıl-kamala çağırıram " [I c.s.349].

***Üz-üzə gəlmək*** – qarşılaşmaq; "Azərbaycan xalqı belə çətinliklərlə çox *üz-üzə gəlmişdir,* lakin milli qürurunu, mənliyini, mənəviyyatını, ən nəhayət, ümidini heç vaxt itirməmişdir" [IIc.s.147].

****Üzbəüz demək*** – birbaşa demək; heç bir informasiya vasitəsi olmadan demək; "Təsəvvür edin, Fransanın prezidenti kimi çox hörmətli, dünya siyasətində böyük bir yer tutan adama – mən onun qonağı olduğum halda – *üzbəüz dedim* ki, biz sizə inanmırıq" [XXIIIc.s.76].

****Üz-üzə qoymaq*** – baş-başa qoymaq, üzləşdirmək; "İşğalın nəticələri ölkəni ciddi iqtisadi və sosial problemlərlə *üz-üzə qoymuşdur*" [XLIIc.s.50].

***Üzə çıxarmaq*** – aşkar etmək; müəyyən etmək; “Bunların da hamısını, təbiidir ki, müzakirə zamanı *üzə çıxarmaq* olar” [XXXVIIc.s.153].

***Üzə çıxartmaq*** – 1) aşkar etmək, tapmaq; ~ ortalığa çıxarmaq; 2) cəmiyyətə tanıtmaq, adam içinə çıxarmaq; ~ adam arasına çıxarmaq; “Mən iqtidarın nümayəndəsi kimi – mən cəmiyyətə tanıtmaq, prezidentəm – hər bir jurnalistə çox minnətdar olacağam ki, iqtidara, prezident kimi, mənə bəlli olmayan hansısa səhvi, yəni haradasa pis görülən işi, bizə zərər verən halları siz *üzə çıxardasınız* və biz də bundan istifadə edib o nöqsanların, səhvlərin aradan qaldırılması ilə məşğul olaq” [XLc.s.138].

***Üzə çıxmaq (1)*** – xalq tərəfindən sevilmək; böyük hörmət qazanmaq; 1) daha gizlənməyib açıq yaşamağa başlamaq, cəmiyyətdə tanınmaq, adam içinə çıxmaq; adam arasına çıxmaq; 2) aşkarlanmaq, bilinmək; ~ üstü açılmaq, səsi çıxmaq; “Bu baxımdan Zəlimxan Yaqub bizim bu son illərdə çox *üzə çıxmış*, xalq tərəfindən sevilmiş və öz şeiri ilə, sözü ilə, öz fəaliyyəti ilə böyük hörmət qazanmış şairdir” [XVIIIc.s.453]. *Üzə çıxmaq* – neqativ cəhətdən məlum olmaq, aşkarlanmaq; “Başqa məsələdir ki, bir müddətdən sonra onların paxırı, fırıldaqçı olduqları *üzə çıxdı* və buna görə də belələrini vəzifədən uzaqlaşdırmaq lazım gəldi ” [Ic.s.49].

***Üzə çıxmaq (2)*** – cəmiyyət tərəfindən tanınmaq; “Onların hər biri 1988-1989-cu illərdə Azərbaycanda xalq öz hüquqlarını müdafiə etmək üçün qalxdığı zaman sadəcə, çevik olubdur, *üzə çıxıblar*” [XXIIIc.s.139].

***Üzərinə götürmək*** – məsuliyyəti özünə aid etmək; “Məhs buna görə də mən yenidən bir daha Nazirlər Kabinetinin iclasınının geniş tərkibdə keçirilməsini öz *üzərimə götürdüm*” [VIIc.s.111].

***Üzgörənlik etmək** – fərqli yanaşmaq; "Onlardan hər hansı birinə *üzgörənlik etmək* nəticə etibarı ilə hər birinə eyni münasibət bəsləməlidir" [IIIc.s.90].

***Üzüağ gəlmək*** – "Mən demək istəyirəm ki, sizin yanınıza doqquz ildən sonra alnıaçıq, *üzüağ gəlmişəm*" [XXXIXc.s.129].

***Üzünə demək** – açıq şəkildə demək; birbaşa demək; "Heç kəsin şəxsiyyətində asılı olmayaraq, vəzifəsindən asılı olmayaraq, onun səhvlərini, günahlarını burada sizin yanınızda üzünə deyirəm" [XLIVc.s.206]. *Üzünə* demək – birbaşa demək; "Ancaq mənim xüsusiyyətim bir də ondan ibarətdir ki, kimi çox qiymətləndirirəm, onun səhvinin günahını da üzünə deyirəm" [XXVIc.s.425].

***Üzünə gülmək** – xoş rəftar etmək; problemləri həll olunmaq; "Bax, buna görə də nəzərə alaraq ki, havaların belə soyuq keçməsi davam edəcək – ola bilər, bir az mülayimləşsin, yaxud ola bilər, bir az da kəskinləşsin – heç kəs arxayınlaşmasın ki, ayın 21-dək belə olacaq, birtəhər onu-bunu edim, ayın 21-i ötsün, sonra hava mənim *üzümə güləcək*" [XLIIIc.s.125].

***Üzünü də görməmək*** – həmin yerlərdə olmamaq; "Məsələn, Türkiyənin elə istirahət yerləri var ki, Azərbaycandan çoxları gəliblər, amma mən heç o yerlərin *üzünü də görməmişəm*" [XIXc.s.79].

***Üzünüzə demək olmasın** – təvazökarlıq mənasında işlənən ifadə; üzbəüz tərif olmasın; tərif kimi qəbul etməmək; real olanı demək; "Xatirimdədir, siz Danimarkada da Əfqanıstanda da işləmisiniz, sonra bu müddət ərzində bir çox sahələrdə də işləmisiniz və *üzünüzə demək olmasın*, hər yerdə də çox qeyri-adi bacarıq nümayiş etdirmisiniz və çox böyük təcrübə toplamısınız" [XVIIc.s.16].

***Vv***

****Vaxt ayırmaq*** – vaxt təyin etmək, vaxtı bölmək; “Siz Azərbaycanın dostlarısınız, mənim dostlarımsınız, Azərbaycanda sizin həmişə xüsusi yeriniz var və bu səfərinizə görə də çox məmnunam ki, siz *vaxtınızı ayırıb* Azərbaycana gəlmisiniz” [XLIc.s.77].

***Vaxtınızı almaq*** – vaxtı sərf etmək, vaxtınızı itirmək; “Ona görə də *vaxtınızı almaq* istəmirəm” [XIIc.s.251].

***Vaxt aparmaq*** – vaxtın bir hissəsinin boş yerə işlədilməsi; ~ vaxt itirmək; “Bu danışıqlar, bu dartışmalar xeyli *vaxt apardı*” [XXXVIc.s.271].

****Vaxt tapmaq*** – boş vaxt müəyyənləşdirmək; görüşməyə vaxt müəyyən etmək; “Mən onunla telefonla danışarkən, – bu İstanbuldan bir qədər əvvəl olmuşdur, – O mənə dedi ki, İstanbuldan sonra *vaxt tapacaq* və biz görüşəcəyik” [XXIIIc.s.278].

****Vaxtı çatmaq*** – “Hadisə və proseslərin yetişməsi. Çoxdan *vaxtı çatmış* açıq, prinsipial və kəskin söhbət getdi” [XIIIc.s.251].

***Vaxtını almaq*** – kimisə işdən ayırmaq, fikrini başqa tərəfə yönəltmək, vaxtı sərf etmək; “Sizin vaxtınızı, görüş iştirakçılarının *vaxtını almaq* istəmirəm” [XIIIc.s.7].

****Var-yoxu dağıdılmaq*** – hər bir şeyi dağıdılmaq, canlı və cansız hər bir şey dağıdılmaq; “Çünki onların evləri, *var-yoxları – hər şeyi dağıdılıbdır*” [XXVIIc.s.416].

****Var-yoxunu itirmək*** – həm yaxınlarını, həm də əmlakını itirmək; “Xüsusən, sizin yanınıza, yerindən-yurdundan didərgin düşmüş, *varını-yoxunu itirmiş* insanlarla, böyük itkilər vermiş insanlarla görüşə gəldiyinə görə mən ona təşəkkür edirəm” [Vc.s.469].

